*Azərbaycan Milli Elmlər Akademiyası Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun Elmi Şurasının 27 oktyabr 2017-ci il tarixli 6 №-li iclasının qərarı ilə nəşr edilir.*

*Elmi redaktor*: **Teymur Kərimli**, akademik.

*Redaktor:* **Paşa Kərimov**, filologiya üzrə elmlər doktoru

*Rəyçilər:* **Azadə Musayeva**, filologiya üzrə elmlər doktoru, professor
**Raqub Kərimov**, filologiya üzrə elmlər doktoru

***Mir Möhsün Nəvvab*. Təzkireyi-Nəvvab.**
Bakı, "Elm", 2018, 712 səh.

*Tərtib edib çapa hazırlayan və ön sözün müəllifi:*

filologiya üzrə fəlsəfə doktoru **Əkrəm Bağırov**

*Türkcə mətnlərin transfoneliterasiyası:*

filologiya üzrə fəlsəfə doktoru **Nəsrəddin Qarayev**,
filologiya üzrə fəlsəfə doktoru **Əkrəm Bağırov**

*Farsca mətn və şeirlərin filoloji tərcüməsi:*

filologiya üzrə fəlsəfə doktorları
**Əkrəm Bağırov, Nizami Məhərrəmov,**

filologiya üzrə elmlər doktoru,
professor **Kamil Allahyarov**, **Fərrux Fərmanov**

*Təkmilləşdirilmiş təkrar nəşr*

# TƏRTİBÇİDƏN

Ədəbiyyatşünas – təzkirəçi, ensiklopedik biliyə malik və öz dövrünün müxtəlif elm sahələrinə aid çoxsaylı əsərlər yazmış Mir Möhsün Nəvvabın ədəbi təzkirəsinin 1998-ci il nəşrindən iyirmi il ötdü. Müstəqilliyimizin ilk illərində kiril əlifbası ilə çap olunmuş bu əsər təkcə nəvvabşünaslığa deyil, XIX əsr Azərbaycan ədəbiyyatı və konkret olaraq Qarabağ ədəbi mühiti və o dövr şairlərinin həyat və yaradıcılığı ilə məşğul olan tədqiqatçılara, ədəbiyyatsevərlərə dəyərli bir töhfə oldu. Bu nəşrdən sonra adları bu təzkirədə xatırlanan, əsərlərindən nümunələr verilən neçə-neçə şairin əlyazma şəklində mühafizə edilən ədəbi irsi tədqiqata cəlb edildi, onlar haqqında monoqrafiyalar yazıldı, dissertasiyalar müdafiə olundu, şeirləri toplu halında çapdan çıxdı.

Ədəbiyyatşünasların stolüstü kitabına çevrilmiş və böyük bir yaradıcı heyətin zəhmətinin nəticəsi olan bu nəşrin ünvanına bu illər ərzində dəyərli rəylər və faydalı fikirlər söyləndi. Bütün bu rəy və fikirlər təqdim edilən hazırki əsərin daha dolğun və dəqiq nəşrinə kömək etdi, hər bir konkret halda avtoqraf mənbə ilə 1998-ci il nəşri tutuşduruldu, müqayisə edildi. Daha dolğun və dəqiq mətnin təqdiminə səy göstərildi.

Əsər təkrar çapa hazırlanarkən hazırki nəşrin mətni təzkirənin avtoqraf əlyazma nüsxəsi ilə bərabər 1913-cü il əski əlifbada olan müxtəsər çapı ilə də misra-misra tutuşdurulmuş, bəzi fərqlər haqqında səhifəaltı qeydlərdə münasibət bildirilmiş, fikir söylənmişdir. Bu zaman mərhum tədqiqatçı Nəsrəddin Qarayevin türk-Azərbaycan mətnləri ilə bağlı söylədiyi qeydlər də nəzərə alınmışdır. Biz hər bir halda avtoqraf nüsxənin toxunulmazlığına üstünlük vermişik və onu mətndə olduğu kimi saxlamışıq. Bu münasibət bəzi şairlərin öz dəsti-xətti ilə təzkirəyə yazdıqları şeirlərə də aiddir. Bütün hallarda, hər hansı bir şairin başqa mənbədə təqdim edilmiş şeiri ilə təzkirədəki eyni şeir arasında fərq olarsa belə, biz təzkirə variantını saxlamağı daha münasib bilmişik.

Bizim məqsədimiz M.M.Nəvvabın təqdim etdiyi avtoqraf nüsxəni və orada olmayan, lakin 1913-cü il müxtəsər nəşrinə düşmüş müəllifləri və onların təqdim edilmiş şeir örnəklərini də əlavə etməklə təzkirənin mükəmməl nüsxəsini çap etmək olmuşdur. Avtoqraf nüsxə M.M.Nəvvabın redaktəsi altında tərtib edilib və fikrimizcə bizim o mətnə texniki səhvləri düzəltməkdən başqa müdaxilə etməyə ixtiyarımız yoxdur.

Təzkirədə təqdim edilən şairlərin divan və ya topluları çapa hazırlanarkən hansı mətnin daha düzgün, daha dolğun və şairin ruhuna daha yaxın olması haqda fikir bildirməyi isə konkret divan və ya toplu tərtibçilərinin öhdəsinə buraxırıq.

Bu səbəbdən gələcək tədqiqatçıların işini asanlaşdırmaq məqsədi ilə şair bioqrafiyalarının və bəzi şeirlərin təzkirənin avtoqraf və müxtəsər çap variantlarında hansı vərəq və səhifədə yerləşdiyini qeyd etmişik.

Təzkirədə hicri tarixlərin əksəriyyəti tərəfimizdən miladi tarixə çevrilmişdir.

"Təzkireyi-Nəvvab"ın hazırkı nəşri ilə bağlı dəyərli və faydalı fikirləri həmişə dinləməyə hazırıq və o kəslərə əvvəlcədən təşəkkürümüzü bildiririk.

**P.S.**

XIX əsr Qarabağ ədəbi mühitini əks etdirən iki təzkirə yazılıb. Biri M.M.Nəvvabın hazırkı əsəri, o biri isə Məhəmməd ağa Müstəhidzadənin "Riyazül-aşiqin" təzkirəsidir.

Birinci əsər klassik ənənənin davamı kimi fars dilində yazılaraq böyük farsdilli auditoriyaya ünvanlanmış, ikincisi isə türk-Azərbaycan dilində yazılmış, İstanbulda çap edilmiş və türkdilli auditoriyaya ünvanlanmışdır. Lakin bu təzkirələrin hər ikisində Qarabağ şairləri və onların həm fars, həm də türk dilli şeirləri təqdim olunmuşdur. Bu da XIX əsr Qarabağ ədəbi mühitinin ənənəvi ədəbi şəraitindən, şair və ədiblərinin hər iki dili eyni səviyyədə bilmələri və hər iki dildə poeziya nümunələri yaratmaq bacarığından irəli gəlirdi.

Hər iki əsərin keçən əsrin axırlarında böyük çətinliklərlə çapına nail olsaq da, təəssüf ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin əvvəllər kiril əlifbası ilə nəşr olunmuş dəyərli əsərlərin yenidən latın qrafikası ilə çap edilib təmənnasız olaraq məktəb və kitabxanalara paylanması haqda verdiyi tarixi fərmana əsasən çıxan kitablar sırasına bu təzkirələr düşməyib. Fikrimizcə buna da əsas səbəb bu sətirlərin müəllifinin o zaman uzunmüddətli xarici ezamiyyətdə olması olub.

Ümid edirik ki, ikinci dəyərli təzkirənin də latın qrafikasında nəşri özünü çox gözlətməz.

Son olaraq bu təzkirənin hazırkı nəşrinin çapa hazırlanmasında, redaktə və çap olunmasında xidmətləri olmuş, köməyini əsirgəməyən bütün həmkarlarıma minnətdarlığımı bildirməyi özümə borc bilirəm.

**Əkrəm Bağırov**

*Filologiya üzrə fəlsəfə doktoru*

*5 yanvar 2018-ci il*

# ÖN SÖZ*

**Mir Möhsün Nəvvab (1833-1918)** XIX əsr Azərbaycan elmi-ədəbi- mədəni mühitinin yetişdirdiyi ən böyük simalardan biridir. Bu dövrün poeziyası, musiqişünaslığı, rəssamlığı, astronomiyası, pedoqoji fikri, ədəbiyyatşünaslığı, xəttatlığı, nəqqaşlığı və s. sahələri haqda söz deyib, fikir yürütmək istərkən Nəvvabı xatırlamamaq mümkün deyil. İyirmidən çox orijinal əsərin müəllifi olan bu ensiklopedik bilikli alim haqqında indiyə qədər müxtəlif yönlü tədqiqat işləri aparılmış, məqalələr yazmağa cəhd edilmişsə də, bütün bunlar Nəvvabı unudulmuşlar cərgəsindən qoparmamış, onu öz xalqına olduğu kimi tanıda bilməmişdir. Bunun ən umdə səbəblərindən biri, mən deyərdim ki, bir-iki istisnanı çıxmaq şərti ilə orijinal əsərlərinin geniş oxucu kütləsinin ixtiyarında olmamasıdır. Əsrimizin əvvəllərində ədibin "Vüzuhül-ərqam", "Məzlumnamə", "Divan", "Nəsihətnamə", "Təzkirə", "Kəşfül-həqiqə" kimi bəzi əsərləri nəşr edilsə də, bunlar tirajlarının azlığı və ərəb əlifbasında olduqları üçün bu gün əlyazmalara bərabər nüsxələr kimi nadirdir və geniş oxucu kudəsindən çox-çox uzaqdır. Əsərin mətni əldə olmadıqda isə deyilən ən güclü alim sözü belə uzaqlarda çaxan ildırımlara bənzər. Səsi güclü olsa da, təsiri yox kimidir. Bu cəhətdən Mir Möhsün Nəvvabın nəsihətlərini, musiqiyə aid olan risaləsini çap etdirib, təhlilinə cəhd göstərmiş alimlərimizin əməyini yalnız təqdir etmək olar. Belə bir çətin və ağır işin qulpundan yapışmağa on beş ilə yaxın bir müddətdən əvvəl bu sətirlərin müəllifi də cəhd göstərdi. O zaman, Azərbaycan Elmlər Akademiyası Əlyazmalar İnstitutunda fəaliyyətə başladığım ilk günlərdə Mir Möhsün Nəvvabın ən monumental əsərlərindən biri olan M-67 şifrəli avtoqraf təzkirə nüsxəsi üzərində iş artıq başlanmışdı. Əsərin türkcə mətnlər olan hissələrini mərhum tədqiqatçımız, filologiya elmləri namizədi Nəsrəddin Qarayev çevirib qurtarmaq üzrə idi. Ancaq bu əsərin yubiley nəşrini planlaşdıranlar unutmuşdular ki, Nəvvab XIX əsr ikidilli - fars və türk dilli ədib-alimlər şurasında gedir və bu baxımdan onun təzkirəsi də istisna deyil, Təzkirənin bütün nəsr hissəsi, şeirlərin böyük bir qismi fars dilində idi. Bütün bunları tərcümə etmək, özü də qısa bir müddətdə və alimin 150 illik yubileyinə qədər (1983) nəşr etdirmək ağır zəhmət tələb edirdi. İşin müəyyən bır qismi görüldükdən sonra vaxtın azlığı nəzərə alınaraq bir nəfərin yazdığı (!) təzkirənin tərcümə işinə əlavə qüvvələr də qoşuldu. Əvvəlcə Nizami Məhərrəmov, sonra Kamil Allahvarov və nəhayət, Fərrux Fərmanov. Tərcümə işi başa çatdıqdan sonra təzkirənin orijinal avtoqraf nüsxəsi 1913-cü il müxtəsər nəşri ilə müqayisə edildi. Məlum oldu ki, orijinalda olmayan bir qism əsərlər var ki, nəşrə düşüb və onları hazırkı nəşrimizdə nəzərə almaya bilmərik. Bu iş də görüldü. Necə deyərlər, çap və əlyazma

* Təzkirənin 1998-ci il nəşrinə yazılmış ön söz

nüsxələrinin müqayisəli mətni hazırlandı. Biz əlimizdən gələni etdik. Təzkirənin isə bu illər ərzində nəşriyyat kataloqlarına düşən adından başqa bir cümləsi də çap edilmədi. Əvvəlki illərdə nəşriyyat məmurcığazları işin çoxluğunu bəhanə edib, təzkirənin nəşrini ildən-ilə keçirdilər, sonra isə bazar iqtisadivvatı deyilən dövr gəldi və təzkirənin nəşri haqda olan söz-söhbət tamamilə kəsildi. İndi dövlətin belə kitabları çap etməyə pulu, pulu olan bir çox imkanlıların isə əksər hallarda qeyrəti çatmır. Bu sətirləri vazarkən hazır əsərin on beş ildən sonra belə, nəşrinə inana bilmirəm. Ancaq bircə onu bilirəm ki, təzkirənin nəşri istər ümumi ədəbiyyatşünaslığımıza, istərsə də Nəvvabşünaslığımıza hiss olunacaq bir töhfə, təsir edəcək bir təkan olacaq.

Əlyazmalar İnstitutunda Nəvvabın əlliyə qədər əlyazma kitabı mühafizə edilir. Əsasən avtoqraf nüsxələrdən ibarət olan bu kitablar içərisində eyni əsərin Nəvvabın öz əli ilə işlədiyi, tərtib etdiyi, köçürdüyü iki, üç və hətta dörd nüsxəsinə də rast gəlmək olar. Bütün bu əlyazmalar Nəvvabın yazdığı iyirmidən artıq orijinal, müxtəlif səpkili aşağıdakı əsərləri əhatə edir: “Vüzuhül-ərqam”, “Divani-əş’ari-farsi”, “Divani-əş’ari-türki”, “Bəhrül-həzən”, “Kifayətül-ətfal”, “Nəsihətnamə”, “Nurül-ənvar”. “Kəşfül-həqiqeyi-məsnəvi”, “Ziyaül-ənvar”, “Dəvazdəh bənd”, “Məzamir”, “Şəmsül-hidayət”, “Məzlumnamə” və sairə. “Təzkireyi- Nəvvab” əsəri də bu əsərlərdən biri, ədəbiyyatşünaslar və şeirsevərlər üçün ən qiymətlisi və dəyərlisidir. Bu təzkirənin yazılması XIX əsr Azərbaycan, ən əsas isə Şuşa ədəbi mühiti ilə sıx bağlı olub.

XIX əsrdə Azərbaycanda fəaliyyət göstərən ədəbi məclislərdən ikisi — “Məclisi-üns” və “Məclisi-fəramuşan” məhz bu şəhərdə toplanır, mədəni həyata öz təsirini göstərir, ədəbiyyatın inkişafına əvəzsiz xidmətlər edirdi. Nəvvab bu məclislərdən birinə — Asi, Fatma xanım Kəminə, Katib, Baki, Xarrat Qulu, Yusifi, Hicri və başqalarından ibarət olan otuza yaxın şair, musiqiçi və alimin topladığı “Məclisi-fəramuşan”a rəhbərlik etmişdir. Bu məclisdə müxtəlif istiqamətli söhbətlər getsə də, elmin müxtəlif sahələrindən, incəsənətdən, musiqidən söhbət açılsa da, ana xətt yenə də poeziya olaraq qalırdı. Klassik irsin araşdırılması, poeziya və ədəbi nümunələrin təhlili, başqa ədəbi məclis üzvləri ilə şeirləşmə, bu şeirləşmələrin nəticələrinin təhlili - məclisin gördüyü bu ardıcıl, təmənnasız, milli poeziyaya məhəbbət dolu, qayğılı xidmətlər “Təzkireyi-Nəvvab” kimi bir əsərin meydana gəlməsinə səbab olur. Mir Möhsün Nəvvab özünün təzkirədə etiraf etdiyi kimi, bu əsəri yaxın dostlarının xahişi ilə 1891-ci ildə yazmağa başlayıb və bitirdikdən sonra da (1892) ardıcıl olaraq üzərində işləyib. Bunu təzkirədə olan çoxsaylı qeydlər və məqsədyönlü boş buraxılmış səhifələr də sübut edir. Təzkirədə yüzə qədər Qarabağ şairi haqqında məlumat verilir, poetik irslərindən nümunələr gətirilir. Bu şairlər içərisində ədəbiyyat tariximizdə özlərinə möhkəm yer tutmuş, tanınmış şairlərlə yanaşı, səsi-sədası Şuşadan kənara çıxa bilməmiş, lakin tanınmağa layiq olan şairlərin də adları çəkilir, şeirlərindən nümunələr verilir.

Təzkirə, əsasən, iki hissədən ibarətdir. Birinci hissədə Vaqif, Vidadi, Kərbəlayi Səfi Valeh, Zakir, Cəfərqulu xan Arif Nəva, Məhəmməd bəy Aşiq, Aşıq Pəri, Abdulla bəy Asi və s. kimi 35, ikinci hissədə isə Natəvan, Mehdiqulu xan Vəfa, Fatma xanım Kəminə, Həsənəli xan Qaradaği, Mirzə Rəhim Fəna, Məmo bəy Məmai, Mirzə Həsən Yüzbaşov, Mir Möhsün Nəvvab, Mir İbrahim Nəvvabzadə, Hacı Abbas Agah, Mir Mehdi Xəzani və başqalarından ibarət 56 şair haqda məlumat verilir, əsərlərindən nümunələr göstərilir. Bu şairlərin birinci qismi müəllifin zamanında artıq öz dünyasını dəyişmişdi. İkinci qismini isə Nəvvab yaxından tanıyırdı, onlarla şəxsi və ədəbi əlaqəsi var idi. Bu şairlər Nəvvabın müasirləri idilər. Çox ehtimal ki, Nəvvab təzkirənin üçüncü hissəsini də yazmaq fikrində olub. Bu hissəyə Qarabağdan kənarda olan şairlər haqqında məlumatlar daxil edilməli idi. Təzkirənin sonunda verilən qısa yazılar, adlar və qeydlər buna sübutdur.

Təzkirədə Nəvvabın öz xəttindən əlavə, iyirmiyə qədər şairin də avtoqraf nümunələri təqdim edilir. Azərbaycan əlyazma kitabı tarixində avtoqraf nüsxələri tədqiq edən gənc tədqiqatçı G.Qayıblının öz yazılarında qeyd etdiyinə görə, təzkirələrə avtoqraf vərəqlərin daxil edilməsi ideyası nəinki Azərbaycanda, bəlkə də bütün yaxın Şərqdə Mir Möhsün Nəvvaba aiddir.

Təzkirənin maraqlı, diqqətəlayiq cəhətləri çoxdur. Məsələn, bir çox şeirlərin nə münasibətlə yazılması o dövrün ədəbi prosesini izləmək, şairlərin həyat və yaradıcılığını ətraflı öyrənmək baxımından olduqca dəyərlidir.

Müəllif bu əsərində təkcə şair və ədiblərlə kifayətlənməyib, öz dövrünün ustad xəttatları, naqqaşları, müğənni və musiqiçiləri haqda da maraqlı məlumatlar verir. Nəvvabın gözəl müşahidə qabiliyyəti, təhlil bacarığı imkan vermişdi ki. o öz təkirəsində hər bir şəxsin qısa, lakonik ədəbi portretini, görüş və maraq dairəsini çox məharətlə təsvir edib, əsərlərinə qiymət verə bilsin.

"Təzkireyi-Nəvvab" yazıldığı vaxtdan daim oxucu və tədqiqatçıların diqqət mərkəzində olmuşdur. XIX əsr ədəbiyyatı haqda söz demək istəyən, araşdırma aparan bircə alim də bu təzkirəsiz keçinməmiş, ona mötəbər bir mənbə kimi istinad etmişdir. Söz yox ki, təzkirənin bu nəşri onun oxucu və istifadə dairəsini həddən artıq genişləndirəcək və ədəbiyyatşünaslığımıza layiqli töhfə olacaq.

**Əkrəm Bağırov**

*Filologiya üzrə fəlsəfə doktoru*

*1995-ci il*

## NƏVVAB MİR MÖHSÜN AĞAMİRZADƏ QARABAĞİ

## TƏZKİRƏ

**Vər. 2a**

***Qarabağın Şuşa şəhərində 1310-cu il səfər əl-müzəffər ayında (1892-ci il, sentyabr) çərşənbə axşamı xitama yetdi.***

**Vər. 8b**

### BİSMİLLƏHİR RƏHMANİR RƏHİM

Əvvəlcə əvəzsiz və əbədi olan,
Bir Allahın adını yada salaq.
Qələm əlin atına minəndə,
Hünər meydanına incilər səpməyə başladı.
Məna gövhəri hünər xəzinəsindən,
Qərbdən doğan Günəş kimi göründü.
Söz quşu öz məna qanadlarını açaraq,
Allahın adını yad etdi.
O dünyanın taleyini həll etməklə,
Geniş yeri və zamanı yaratdı.
O özü həmişə qadir və qəyyumdur,
Həm də tək və laməkandır.
Ağıl onun vəsfini dərk etməz,
Şüur heç cür onun mövqeyinə yüksələ bilməz.
Heç kəs onun tərifini verə bilməz,
O,misilsiz varadan və əvəzsizdir.
Ona sonsuz dərəcə salam olsun,
İnsanlara xeyir verən Əhmədə (peyğəmbərə) salam olsun.
Sonra isə ona yaxın və dost olan,
Övladları və əshabələri zikr olunmalıdır.
Mənim təbimin tutisi Ondan (Allahdan) ilham alıb,
Simurq quşu tək qüvvətləndi.
Hər kəsi tərif etdimsə,
Sərçə kimi qırğının pəncəsinə düşdü.
Nəhayət, yazıb, Nəvvab lal olub,
Qaranlıq bir küncdə sakitlik tapdı.

**Vər. 9a**

## …VƏ SONRA

**Aciz bəndə Nəvvab Mir Möhsün ibn Hacı Mir Əhməd Ağamirzadə Qarabaği belə söyləyir ki, bu gözəl dövranda, mübarək 1309-cu ildə (1891) görkəmli din qardaşlarından və səmimi ruhanilərdən bəziləri belə arzu etdilər ki, tarixin səhifələrində bir yadigar kimi qalması üçün Qarabağ şairlərinin əziz adları, onların keçdikləri həyat yolu toplanıb bir təzkirə tərtib edilsin və yüksək ləyaqət və bacarığa malik olmayan mən onların gözəl adlarını zəmanə aqilləri və dövran ariflər üçün yadigar qoyum.**

**Beləliklə, onların buyurduqlarını qəbul edib, onların xahişini yerinə yetirib, mərdanə işə başladım və bu məcmuəni yazıb adını "Təzkireyi-Nəvvab" qoydum.**

**Bu növ işləri zəmanə zahidləri fikrin darlığına aid edib, işsizlik saysalar da, cəfəngiyat hesab etsələr də, buna baxmayaraq, mən bu növ işləri dövranın bəzi alim adlananların əməllərindən üstün sayır və mərhəmətli Allahdan savab umuram. Ona görə ki, məsələn, bir şair əlinə qələm alıb bədahətən və ya çox fikirləşəndən sonra aşağıdakı beyti bir kağız səhifəsinə yazsa ki:**

**Bahar gəldi, gül gəldi, bülbül gəldi,**
**Bənövşə məst olub, sünbül gəldi.**

**İndi qulaq asanlara, Allaha and verirəm ki, bu beyti deməklə yer üzündə hansı bir şəxsə xardal dənəsi boyda bir zərər dəydi və ya baharın, gülün, bülbülün, reyhan və sünbülün gəlib-gəlməməsindən peyğəmbərin şəriətinə nə ziyan oldu, nə zərər dəydi. O bir beytin yazılması üçün bir saat ömrün sərf edilməsiylə İslama nə zərər dəydi ? Aya, bu beytin məzmununu hər hansı böyük və ya kiçik günaha aid etmək olarmı? Məgər bu, Allaha, peyğəmbərə və xalqa böhtan və iftiradır? Paxıllıq, həsəd və şər hesab etmək olarmı ?**

**Baharın, gülün və bülbülün gəlməsi üçün heç kəs şahid-dəlil istəmir. İntəhası biz deyirik ki, bahar gəldi, güllər açıldı. Əgər gəlibsə, düz demişik və əgər gəlməyibsə, yəqin ki, gələcək və əgər bahar gəlib, yəqin ki, güllər və reyhanlar da gələcək. O vaxt ki güllər açılır, mütləq bülbüllər də cəh-cəh vurur.**

**Ancaq vay sizin halınıza ki, bütxanaların, meyxanaların, fisqü fücurxanaların abadlığı sizin özünüzün xarab olmağınızdandır. Allahsızlığın tüğyanı sizin pərişanlığınızdandır. Sizin müridbazlığınızdan və əfsunkarlığınızdan müqəddəs şəriətimiz alçaldı. Sizin əməllərinizdən dinimizə hərc-mərclik düşüb. Vilayətlər çaxnaşıb, minbərlər qarışıb, məclis və yığıncaqlar sizin dilinizdən qiylü qalə çevrilib. Oğullar atasıyla, qızlar anasıyla, qardaşlar bir-biriylə üzləşib. Sizin əlinizdən behiştdə olanlar dərbədər, cəhənnəmdə olanlar şikayətlidirlər. Mələklər sizin əlinizdən qaçır, insanlar özünə yer tapa bilmir. Bilmirəm ki, sizin hansı işinizi mədh edim, hansını tərifləyim və hansı işinizlə möminləri qorxudum...**

**Vər. 13b**

## DİNƏ RƏXNƏ SALAN ŞƏXSLƏRİN TƏNBİHİ HAQQINDA NƏVVABIN SÖZÜ

Şirindilli bülbül gülzarda yaxşı,
Dağ kəkliyi dağlarda yaxşı.
Sərv çay kənarında, qumru qollu-budaqlı ağaclarda,
Bayquş isə xarabalıqda və mağarada yaxşı.
Gül şaxəsi gülsifətlilər əlində,
Tikan əğyarlar ürəyində və gözündə yaxşı.
Xətlan atı tənbəllik edərsə,
Qoduq belə atdan yaxşı.
Hər övlad ataya müti olmasa,
O, övlad deyil, başı batsa yaxşı.
Tamahkarlığa bağlı olan hər kəsdən,
Bazar iti yüz dəfə yaxşı.
Uca təb, əliaçıqlılıq və səxavət sahibi,
Var-dövlət xəzinəsi olsa yaxşı.
Ey gecə-gündüz halva-çörək üçün gəzən,
Səninçün arpa-saman çeynəmək yaxşı.
Ey qarnı sabun bişirənin kürəsi olan,
İt kimi murdar leş yesən yaxşı.
Kasıbların qanını soran xacənin,
Qanı kaftara qismət olsa yaxşı.
Zülmə öyrəşən zalımdan,
Döyüşdə amansız olsa yaxşı…*
Dinsiz alimin əməlindən,
Atəşkədə xadimi yüz qat yaxşı.
Ürək və dinini heçə satan adama,
Nur yox, bəlkə nar (od) yaxşı (dır).
Şəriətə zülm qılıncı qaldıran yaramazlardan,
Şümür yaxşı(dır).
Dinə xələl gətirən hər şəxsin,
Aqibəti cəhənnəmdə olsa yaxşı.
Peyğəmbərin qanununa rəxnə salmaqdan,
İki yüz mömini öldürmək yaxşıdır.
Şəriətin ziddinə dəm vuranın,
Hər an azarda olması yaxşıdır.
Yeni şəriət yaratmaqdan dəm vuran kəsin,

---

* Mətndə üç nöqtə (...) qoyulan yerlərdə kiçik ixtisarlar edilmişdir.

Bığından kafir şəkli asılsa yaxşıdır...
Yalançı alimin boş yerə özünü tərifləməsindən,
Əlinə ud və tütək alması yaxşı.
Xalqı aldatmağa səy göstərən hər kəsin,
Dodaqları mismarlansa yaxşı.
Ey alçaq iblisin toruna düşən,
Ağlamağın arsız gülüşündən yaxşı(dır).
Nəfsin səni cəhənnəm oduna çəkir,
Qəbrin qızıl ip-sapla bəzənsə yaxşı(dır).
Allah qarşısında əfv ümidilə durmaqdansa,
Günahın tövbə və etirafı daha yaxşı(dır).
Hər iki dünyada Nəvvab,
O qadir Allahın əfvinə arxalansa yaxşı(dır).

**Xülasə, sözün yüvəni əlimdən qaçdı, mətləb uzandı... Belə ki, həyatda olmayan Qarabağ şairlərinin əhval və şeirlərini bircə-bircə cəm etdim və həyatda olan şairlərlə birlikdə, necə ki, bu təzkirədə görəcəksiniz, ayrı- ayrı, öz övlad və atasından, rəvayətlərdən toplayıb, imkan düşdükcə öz dəsti-xəttiylə təqdim etdim. Ümid edirəm ki, oxuyanların xoşuna gələcək.**

**Bundan qabaq yazılmış təzkirələr hamısı bir dildə olmuşdur. Yəni ya ərəb, ya fars, ya da türk dilində. Ancaq mən hər iki dildə yazacağam, həm farsca, həm də türkcə. Türkcə şeirləri farsca şeirlərdən ayırmağı rəva bilmədim və bir-biri ilə qarışıq yazaraq təzkirəni üç hissəyə böldüm.**

**Birinci hissə— həyatda olmayan şairlərin əhval və şerləri. İkinci hissə - həyatda olan şairlərin əhval və şerləri. Üçüncü hissə — kitabın xatiməsi, məzhəkəli şeir parçaları, satiralar və sairə əvvəlki hissələrdə adları getməyən şairlər və Qafqaz şəhərlərinin şairləri.**

غزل ترکی نواب

"Təzkireyi-Nəvvab"ın avtoqraf əlyazma nüsxəsindən
müəllifin öz şeirləri yazılmış bir səhifə

**Vər. 16a**

## B İ R İ N C İ   H İ S S Ə

***Mərhum Qarabağ şairlərinin həyatı və şeirlərindən ixtisarla verilmiş parçalar. 1309-cu ilin rəbiül-əvvəl ayında yazılıb (1891-ci ilin noyabr ayı).***

### MOLLA PƏNAH VAQİF

**Mərhum Molla Pənah Gəncə şəhərinin tabeliyində olan Qazaxın Şəmsəddin əhalisindəndir və rəhmətlik cənab İbrahim Xəlil xan Cavanşirin xanlığı dövründə Şuşa qalasına gəlib (hicri 1184-cü il, rus tarixi ilə 1766-cı il).* Mərhum xanın hüzuruna hər cəhətdən yaxın olub və onun etimadını elə qazanıb ki, onun (Vaqifin) məsləhəti olmadan mərhum xan heç bir işə başlamırnıış. Xanın vəliəhdi mərhum cənab Mehdiqulu xan ilə də Molla Pənahın arası yaxın idi. Bu səbəbdən də ətrafında olanların paxıllıq və həsəd hədəfinə çevrildi. Belə ki, mərhum İbrahim xan Balakən və Car tərəflərə gedərkən qala başsız qaldı. Mərhum xanın qardaşı oğlu Mehrəli bəyin oğlu Məhəmməd bəy fürsətdən istifadə edib, özbaşına qayda-qanun yaratmağa başladı. Nəticədə hökm verdi ki, mərrixət-təbli – zalım, qaniçən xidmətçilər Molla Pənahın ömür qəbaləsinə möhür vursunlar – onu öldürsünlər. Xidmətçilər Molla Pənahın evinə gəlib dedilər ki, Məhəmməd bəy səni çağırır. Molla Pənah çarəsiz qalxıb istər-istəməz öz oğlu Əli Ağa ilə xidmətçilərin qabağına düşüb Məhəmməd bəyin evinə tərəf yollandılar. Elə ki, gəlib hal-hazırda Hacı Əzim adını daşıyan körpünün yanına çatdılar. Molla Pənah istədi ki, Məhəmməd bəyin evinə tərəf getsin.**

**Xidmətçilər dedilər ki, “Körpüdən keç və biz hara gediriksə, sən də bizimlə gəl”. Molla dedi: “Məhəmməd bəyin evi aşağıdadır”. Dedilər: “Sözü uzatma, bizimlə gəl.” Körpünü keçən kimi, Molla Pənah öz oğlu Əli Ağaya dedi: “Ey oğul, bizi hara aparırlar!?”. Dedi: “Sən camaatı göndərdiyin yerə aparırlar ”.**

**Molla Pənahın oğlunun atasına işarəsi o idi ki. Molla Pənah qüdrət sahibi olan zaman camaatın bəzi müqəssirlərinin uca bir dağın başına göndərilməsinə bais olmuşdu ki, indi də o dağa adam atılan qaya deyirlər, onları ordan atırdılar və onlar parça-parça olurdu.**

**Xülasə, babalı danışanların boynuna, Molla Pənahı indi də qəbrinin olduğu yerə gətirdilər. İstədilər Molla Pənahı oğlu ilə qətlə yetirsinlər. Molla Pənah fəryad çəkib, hönkürtü ilə dedi ki, “Bizi qətlə yetirməkdən başqa bir çarə yoxdursa, barı əvvəl məni öldürün ki, oğlumun ölümünü görməyim”.**

**O insafsızlar, o biçarənin yalvarışlarına qulaq asmayıb, əvvəl onun oğlunu, sonra da özünü qətlə yetirdilər və orada da dəfn etdilər.**

---

* Tarix səhv çevrilmişdir. Hicri 1184-cü il miladi 1770-ci ilə bərabərdir.

**Sonradan qəbrinin üstündə daşdan və dəmirdən bir günbəz tikilib ki, o günbəzlə cənabi-seyadətpənah və səadətdəstgah Ağa Mir Fəsih Ağanın müqəddəs məzarı və məqbərəsi arasındakı məsafə yüz xan arşınına bərabərdir. Şəhər əhalisinin haman qəbir və günbəzin yerləşdiyi yerdən gediş-gəlişinin çoxluğu öz təsirini göstərmiş, qəbir dağılmış, günbəzin yarısı isə hal-hazırda qalır.**

**Deyirlər ki, bu ağköynək olmağı (təriqətdir) Molla Pənah ixtira etmişdir. Ağ köynəklərin etdikləri ibadətin bəzi mətnləri mərhumun özünündür. O, zarafat sahibi də olub, gözəl şeirləri pərakəndə halında çox yerdə qeyd edilmişdir. Divanı yoxdur. Aşağıda yazılmış şeirlər o mərhumun təbinin (ilhamının) nəticəsidir.**

**1215-ci ildə (1800-1801-ci illər) sağ imiş və təxəllüsü Vaqif olmuşdur.**

## MOLLA PƏNAH VAQİFİN KƏLAMINDAN AZƏRBAYCANCA MÜXƏMMƏS

Mən cəhan mülkündə mütləq doğru halət görmədim,
Hər nə gördüm, əyri gördüm, özgə babət görmədim,
Biətü iqrarü imanü dəyanət görmədim,
Aşinalar ixtilatında sədaqət görmədim,
Bivəfadan lacərəm, təhsili-hacət görmədim.

Xah sultan, xah dərvişü gəda bil-ittifaq,
Özlərin qılmış giriftari-ğəmü dərdü fəraq,
Cifevi-dünyayədir hər ehtiyacü iştiyaq,
Munca kim, etdim tamaşa, sözlərə asdım qulaq,
Kizbü böhtandan səvayi bir hekayət görmədim.

Hər sədavü-səs ki, dünyanı rutub əksər əqəl,
Cümlə məkrü alü fənnü fitnədir, cəngü cədəl,
Dirhəmü dinar üçündür hər şeyə yapışsa əl,
Müqtədilərdə itaət, müqtədalərdən əməl,
Bəndələrdə bimü bəylərdə ədalət görmədim.

Alimü cahil, müridü mürşidü şagirdü pir,
Nəfsi-əmmarə əlində cümlə olmuş dəstgir,
Həqqi batil eyləmişlər, işləri cürmi-kəbir,
Şeyxlər şəyyad, abidlər əbusən qəmtərir,
Hər kişidə həqqə layiq bir ibadət görmədim.

Eyliyən viranə Cəmşid Cəmin eyvanını,
Yola salmış bövlə kim, bəzm-işrətin çəndanını,
Kim qalıbdır ki, onun qəm içməyibdir qanını,

Dönə-dönə imtahan etdim fələk dövranını,
Onda mən bər əkslikdən özgə adət görmədim.

Xəlqi-aləm bir əcəb düstur tutmuş hər zaman,
Hansı qəmli könlü kim,sən eyləyibsən şadiman,
Ol sənə, əlbəttə ki, düşmənlik eylər, bigüman,
Hər kəsə hər kəs nə etdi yaxşılıq, oldu yaman,
Bulmadım bir dost kim, ondan ədavət görmədim.

Gün kimi bir şəxsə gündə xeyr versən səd həzar,
Zərrəcə etməz əda şükri-nemət aşikar,
Qalmayıbdır qeyrətü şərmü həya, namusü ar,
Dedilər ki, etibarü etiqat aləmdə var,
Ondan ötrü mən də çox gəzdim, nəhayət, görmədim.

Mən özüm çox kuzəkarı kimiyagər eylədim,
Sikkələndirdim qubari-tirəni zər eylədim,
Daneyi-xərmöhrəni dürrə bərabər eylədim,
Qarə daşı döndərib yaquti-əhmər eylədim,
Qədrü qiymət istədim qeyr-əz xəsarət görmədim.

Müxtəsər ki, böylə dünyadan gərək etməz həzər,
Bu səbəbdən ki, deyildir öz yerində xeyrü şər,
Alilər xaki-məzəllətdə, dənilər mötəbər,
Sahibi-zərdə kərəm yoxdur, kərəm əhlində zər,
İşləyən işlərdə əhkamü ləyaqət görmədim.

Hər kişi hər şeyi sevdi ani behtər istədi,
Bəzi gəncü mülkü, bəzi təxtü-əfsər istədi.
Padişahlar dəmbədəm təsxiri-kişvər istədi,
Eşqə həm çox kimsə düşdü, vəsli-dilbər istədi,
Heç birində aqibət, bir zövqü rahət görmədim.

Dövlətü iqbalü malın axırın gördüm tamam,
Həşmətü cahü cəlalın axırın gördüm tamam,
Həmdəmi-sahibcəmalın axırın gördüm tamam,
Zülfü ruyü xəttü xalın axırın gördüm tamam,
Başadək bir hüsnü surət, qəddü qamət görmədim.

Ey xoş ol kəslər, Məhəmməd Mustafanı sevdilər,
Oldular aşiq, Əliyyül-Mürtəzanı sevdilər,
Sidqü ixlas ilə pənc ali-əbanı sevdilər,
Çardəh məsum tək müşkülgüşanı sevdilər,
Daxi onlardan gözəl,yaxşı cəmaət görmədim.

Ya imam əc-cinnül-üns şəhənşahi-ümur,
Getdi din əldən, bu gündən böylə sən eylə zühur,
Qoyma kim, şeytani-məl'un eyliyə imanə zur,
Şöleyi-hüsnünlə bəxş et tazədən dünyayə nur.
Kim, şəriət məş'əlində istiqamət görmədim.

Göz ağardı, ruzigarım oldu gün-gündən siyah,
Etmədim, səd heyf kim,bir mahiruxsarə nigah,
Qədrbilməz həmdəm ilə ömrümü etdim təbah.
Vaqifə, ya rəbbəna, öz lütfünü eylə pənah,
Səndən özgə kimsədə lütfü inayət görmədim.

## YENƏ MƏRHUM VAQİFİN MÜXƏMMƏSİ

Ey səba, yarə de kim, avarə gördüm Vaqifi,
Qəm əlindən bikəsü biçarə gördüm Vaqifi,
Bağrı olmuş sərbəsər sədparə gördüm Vaqifi,
Aqibət salmış özün odlarə gördüm Vaqifi,
Gecə-gündüz müntəzir didarə gördüm Vaqifi.

Bir yanar atəş salıb pərvanə tək ə'zasinə,
Oxşuyubdur dəhrdə aşiqlərin rüsvasinə,
Nalələr kuyində eyləyib, yalvarar mövlasinə,
Baş qoyub eyləsinin ol zülfünün sövdasinə,
Bir zaman basmaz ayaq bazarə gördüm Vaqifi.

Söylə kim, başın üçün bir lütf qıl, ey gülüzar,
Sallanıb sərvi-rəvan tək kuyinə eylə güzar,
Gecə-gündüz dərd-qəm etmiş məni candan bezar,
Görməyə didarını hər dəm çəkər çox intizar,
Gözlərin qəmdən dikib yollarə gördüm Vaqifi.

## MƏRHUM VAQİFİN QƏZƏLİ

Qarabağ içrə bir şair kəlimüllahi-Musadır,
Cavanşir içrə bir mövzun bayati dəsti-beyzadır.

Qələm qədrin əsayi-əjdəha peykərçə bilməkdə,
Bəni-israilə ali-cavanşir, yəni həmtadır.

Dili rövşən gərək şadan içində sərf edən ömrün,
Çirağın səltənət gahi səvadi-şami-yeldadır.

Ümidim vardır kim, bu qəra gün getməyə başə,
Dönər bir özgə rəng ilə, bu axır çərxi-xizradır.

Məkan tutdisə Vaqif, yox əcəb bu Şişə daşında.
Məkanı lə’li-gülrəngin miyani-səngi-xaradır.

## MƏRHUM VAQİF MİRZƏ VƏLİ VİDADİYƏ YAZMIŞDIR

Kim ki, sövdayi-səri-zülfi-pərişanə düşər,
Gah zindanə, gəhi çahi-zənəxdanə düşər.

Afəti-dəhr dəyər ol kəsə kim, kamildir,
Mah hər gün ki, kəmalə yetə, nöqsanə düşər.

Mərd igidlər özünə məhbəsi meydan bilir,
Sanma hər nakəsü namərd bu meydanə düşər.

Eybdən saf çıxar, pakü mübərra görünür,
Hər tıla kim, kürədə atəşi-suzanə düşər.

Piç(ü) tabə düşənin işi, bəli, üzdə olur,
Zülf bu vəchlə ruxsareyi-cananə düşər.

Hər yaman yer ki, olur-yaxşıların mənzilidir,
Lə’l daş içrə, xəzinə dəxi viranə düşər.

Şami-qəm şadlıq əyyamına xoş ziyzərdir.
Necə kim, xali-siyəh arizi-cananə düşər.

Ey Vidadi, qəmi-hicranə giriftar olmaq,
Bir sənə, bir mənə, bir Yusifi-Kən’anə düşər.

Eşqə düşmək sənə düşməz, qocalıbsan, belədir,
Belə işlər genə Vaqif kimi oğlanə düşər.

**Vər. 20b**

## VAQİFƏ CAVABINDA VİDADİNİN QƏZƏLİ

Hər səhər bad əsər ki, arizi-cananə dəyər,
Toxunar sərvə gəhi, gah gülüstanə dəyər.

Olmasa qabil əgər, dəhr cəfa verməz ələ,
Təm biləzzət olanda necə dəndanə dəyər.

Şəm gər yansa səvadi-şəb üçün, heyf olmaz,
Şöləsi çünki onun arizi-cananə dəyər.

Ülfəti-nakəsü namərd həmin söhbət imiş,
Tut ki, bir mərd ətəgi dövləti-xaqanə dəyər.

Mən ki meydani-bəla içrə sərim top edərəm,
Ta düşə əldən-ələ, axiri çövkanə dəyər.

Nə qədər olsa qoca, gərçi Vidadi xəstə,
Genə Vaqif kimi, əlbəttə, yüz oğlanə dəyər.

## VİDADİNİN ÖZ ARVADINI YADA SALIB AĞLAMASI MÜNASİBƏTİLƏ VAQİFLƏ DEYİŞMƏSİ

***Vaqif***

Ey Vidadi, sənin bu puç dünyada,
Nə dərdin var ki, zar-zar ağlarsan?
Ağlamalı günün axirətdədir,
Hələ indi səndə nə var, ağlarsan?

***Vidadi***

Vaqif, nə çox yan-baş, ayaq atarsan,
Mənə dersən nə bu qədər ağlarsan?
Sanin da başında məhəbbət beyni,
Əgər olsa, eylər əsər, ağlarsan!

***Vaqif***

Ta cəsədin cüda olmuyub candan,
Bil özünü artıq sultandan, xandan,
Ha belə ayrılıq nədir ki, ondan,
Bu qədr çəkibsən azar, ağlarsan?

***Vidadi***

Ağlamaq ki, vardır, məhəbbətdəndir,
Şikəstəxatirlik mərhəmətdəndir,
Əsil bunlar cümlə mürüvvətdəndir,
Olsa ürəyində, bədtər ağlarsan!

***Vaqif***

Kimdir indi bu dövrdə ol adəm,
Birisi yanından heç olmuya kəm,
Qaralırsan bulud kimi dəmadəm,
Ağ yağı tək yaşın yağar, ağlarsan.

***Vidadi***

Billəm, çox uşaqsan, ürəyin toxdur,
Ləhvü ləəb ilə həvəsin çoxdur,
Qocalıq əsəri könlündə yoxdur,
Hələ sonra əqlin kəsər, ağlarsan!

***Vaqif***

Toy-bayramdır bu dünyanın əzabı,
Əqli olan ona gətirər tabı,
Sən təki oğlana deyil hesabı,
Hər şeydən eyləyib qübar ağlarsan!

***Vidadi***

Oğlan, sən uşaqsan, cavansan hələ,
Təzəcə cisminə düşüb vəlvələ,
Yenicə dəyənək alıbsan ələ,
Qaim tut, nagəhan düşər, ağlarsan.

***Vaqif***

Kəndini əlindən aldıran fələk,
İnəklərə buzov saldıran fələk,
Yarü yoldaşını öldürən fələk,
Məgər səni böylə qoyar, ağlarsan?!

***Vidadi***

Neylərsən söyləmiş buzov, inəyi,
Bizim ilə etmək belə hənəyi,
Həsrətqulu bəyin ağ dəyənəyi,
Alıbsan əlinə, məgər, ağlarsan?

***Vaqif***

İç qatığı, ye darının cadını,
O Cəmşidi-Cəmin... arvadını,

İstəmə dövranın dadlı zadını,
Sənə olur o zəhirmar, ağlarsan!

***Vidadi***

Ey mənə göstərən qatığı, cadı,
Onu yeyən tapar külli-muradı,
Dünyanın sənə də ləzzəti, dadı,
Bir gün olur axır zəhər, ağlarsan!

***Vaqif***

Nə qədər dirisən, ölü deyilsən,
Qocalıban yaylar təki əyilsən,
Padşahsan, əgər özünü bilsən,
Neçün olub candan bizar, ağlarsan!

***Vidadi***

Elə ki, taxıldı burnuna çeşmək,
Qocalıq əl verib, dəxi nə şişmək,
Uşaqlar içinə düşər gülüşmək,
Sənin də acığın tutar, ağlarsan!

***Vaqif***

Yetmişdə ki, belə nəm gələ gözə,
Kəsməyə arasın, baxmaya sözə,
O zaman ki, yaşın yetişir yüzə,
Gör ki, onda nə bişümar ağlarsan.

***Vidadi***

Sarı Çoban oğlu gəlsin yanına,
Axun deyib canın qatsın canına,
Onun şövkətinə, sənin şanına,
O yaxşı müxəmməs düzər, ağlarsan.

***Vaqif***

Çökər bir gün qabağına Əzrayıl,
Deyər: "Ey kor bəndə, qəflətdən ayıl",
Görərsən bir əcəb şəklü həmavil,
Ürəyinə qanlar damar, ağlarsan.

*Vidadi*

Əzrayıl ki, çəngəl çalar canına,
Dönüb-dönüb baxarsan hər yana,
Ol zamanda sənin o əfğanına,
Nə bir gəlin, nə qız yetər, ağlarsan!

*Vaqif*

Onun ki, çəngəli əzayə düşər,
Çaxnaşar cəsədin, lərzəyə düşər,
Tamam sümüklərin vay-vayə düşər,
Dirikən dərini soyar, ağlarsan.

*Vidadi*

Axirət sözünü salma vadına,
Mütləq dürüst deyil etiqadına,
Məhşər günü kimsə yetməz dadına,
Fəryadın fələkə çıxar, ağlarsan.

*Vaqif*

Yanarsan, təpəndən çıxar tütünün,
Tutulur boğazın, kəsilir ünün,
Hələ vardır bundan bədtər pis günün,
Üqbayə edəndə səfər, ağlarsan.

*Vidadi*

Mömin olub qəlbin olsaydı səlim,
Bilirdin xudanın olduğun kərim,
Mənə kərəm eylər əzizi-həkim,
Sən çəkərsən xofü-xətər, ağlarsan.

*Vaqif*

Çün gedərsən o qaranlıq, dar yerə,
Qonşu olmaz, çağıranda səs verə,
Bir kimsə tapılmaz qapıdan girə,
Görərsən dörd tərəf divar, ağlarsan.

*Vidadi*

Mömінəm, zikrimdir daim ilahi,
Uzaqdır könlümdən külli-mənahi,

Əfv olur möminin cümlə günahi,
Sənin də könlündən keçər, ağlarsan.

***Vaqif***

Zahir olur iki şəxsi-qəzəbnak,
Əllərində şeşpər, çabükü çalak,
Onları görəndə zəhrin olur çak,
Qutun qurur, nitqin batar, ağlarsan.

***Vidadi***

Münkir sözü, sual sözü, sin sözü,
Söz bir gərək, nə danışmaq min sözü,
Dünya, axirətdən belə din sözü,
Əlin yoxdur, bəs müxtəsər ağlarsan.

***Vaqif***

Bu yanından çıxar o zalım şeytan,
Su göstərən, səndən ta ala iman,
Nə Ömər tapılar onda, nə Osman,
Hər biri bir yerdə yatar, ağlarsan.

***Vidadi***

Məzarın, məhşərin haqdir cəhəti,
Məhrum qalmaz Məhəmmədin ümməti,
Sən ki, tərk edibsən təmam sünnəti,
Çox çəkərsən qəzəb, qəhər, ağlarsan.

***Vaqif***

Çünki işin çəp düşübdür əzəldən,
Fayda verməz elədiyin əməldən,
Mələk verir dəftərini sol əldən,
Günahını  bir-bir sayar, ağlarsan

***Vidadi***

Əvvəl bu bəylərdir peyğəmbərə yar,
Ömərdir İslamı edən aşikar,
Osmani-Zinnureynü Heydəri-kərrar,
Olarlar saqiyi-kövsər, ağlarsan.

*Vaqif*

O gündən ki, qaçar pədərdən püsər,
Cisminə çulqaşır yalov sərbəsər,
Su verməz içəsən saqiyi-kövsər,
Kəbab kimi bağrın yanar, ağlarsan.

*Vidadi*

Əbu Bəkrü Ömər, Osmanü Əli,
Cümlə həştü çəhar imamü vəli,
Nemanü Şafei, Malik, Hənbəli,
Onları cəmiyi gəzər, ağlarsan.

*Vaqif*

Ol zaman ki, qaynar kəllədə beyin,
İmam Ə'zəm danar sözün, hər şeyin,
Heç üzə mən baxa bilmənəm deyin,
Səni görgəc gözün yumar, ağlarsan.

*Vidadi*

Allahın ki, heç çəkməzsən minnətin,
Tərk edibsən Məhəmmədin sünnətin,
Nə görərsən məsumların hörmətin,
Əgər ağlamazsan, əgər ağlarsan.

*Vaqif*

Əqlin olsun, on iki imama inan.
Fayda verməz sonra olmaq peşiman,
Yəqin bil ki, qurulacaqdır mizan,
Əməlin qarşında durar, ağlarsan.

*Vidadi*

Pirin o dəlücə Həsəni-Kaşi,
Əvvəl-axır yana ləşdar yoldaşi,
Onun da heç zaddan çıxmazdı başi,
Sənin başın sonra çıxar, ağlarsan.

*Vaqif*

Demə ki, dadıma yetər maliki,
Düşər dərdə səndən betər maliki,

Varıb ilim-ilim itər maliki,
Yaşınıb, bir yerdə yatar, ağlarsan.

***Vidadi***

Həşrətək qalırsan ahü zar ilə,
Həsrət ilə, çox-çox intizar ilə,
Kələz ilə, əqrəb ilə, mar ilə,
Ağzınadək qəbrin dolar, ağlarsan.

Həsəni-Kaşinin başın kəsərlər,
Kəsib onu cəhənnəmdən asarlar,
Qızdırıb-qızdırıb oda basarlar,
Onu görüb əqlin çaşar, ağlarsan.

***Vaqif***

Çox kimsələr qıl körpüdən asılır,
Sünnilərin qaravulu basılır,
Ömər qaçar bir bucaqda qısılır,
Dinə bilməz, mat-mat baxar, ağlarsan.

Qapılarda çox toxuna-toxuna,
Ömərdən, Osmandan gəzmə şaxına,
Onlarsız ki, heç qoymazlar yaxına,
Döyə-döyə öldürərlər, ağlarsan.

***Vaqif***

Şafeinin olmaz o qədər suçu,
Əvvəldən axirə ayrıdır köçü,
Amma fəriştələr gəlir bu üçü.
Tutar bir-birinə çatar, ağlarsan.

***Vidadi***

Şafeini imamlardan ayırma,
Umar xanı görüb riya qayırma.
Bu sözləri ləzgi içrə buyurma,
Səni qalmıqlara satar, ağlarsan.

***Vaqif***

Qıl körpüdən çünki, sürçər ayağın,
Cəhənnəm xofindən yarılar bağrın,

Qorxma, yenə Əli olur dayağın,
Əgər anıb həştü çəhar ağlarsan.

***Vidadi***

Şiə xəlqi tamam dolar duzəxə,
Qalırlar duzəxdə od yaxa-yaxa,
Məhaldır ki,biri duzəxdən çıxa,
Cümlə olur zirü zəbər, ağlarsan.

***Vaqif***

Vaqif, əgər əzabı var üqbanın,
Sən neçün xofini çəkərsən anın?
Tutubsan ətəyin şahi-mərdanın,
O gülər-gülərsən,ağlar-ağlarsan.

***Vidadi***

Əhli-sünnət vəl-cəmaət peyvəstə,
Gedərsən cənnətə dəstəbədəstə,
O gündə şad olur Vidadi xəstə,
Səni yanlış görüb gülər, ağlarsan.

**Vər. 28a**

## MƏRHUM VAQİFİN DİLBƏR HAQQINDA MÜXƏMMƏS-MÜSTƏZADI

Ey zülfi siyəh, sinəsi əbyaz, gözü alə,
Nə türfə cavansan!
Ağzın kimi yox qönçə, yanağın kimi lalə,
Gülzari-cinansan!
Görsə üzünü məh yetər, əlbəttə, zəvalə,
Xurşidi-cəhansan!
Heç bəndə sənə olmuya, ya Rəb ki, həvalə,
Sən afəti-cansan!
Söz yox, bu zənəxdanü rüxə, bu xətü xalə,
Xubluqda əyansan!

Dibaçeyi-lövhə qələmi-katibi-qüdrət,
Yazmış səni əvvəl.
Heç adəmə üz verməmiş əsla belə surət,
Pürzinətü seyqəl.
Zülfün sözü hər nüsxədədir, ey pərıtəl’ət,
Bir şərhi-mütəvvəl.
Göydə yetirər müttəsil ahə, günə xiclət,

Hüsnündəki məş’əl.
Müjganın urar tənə oxun göydə hilalə,
Xub qaşı  kamansan!

Rəftari-qədin eylədi sayə kimi pamal,
Şümşadı çəməndə.
Qan ağladır ol, qönçeyi-xəndanı məhü sal,
Ləlindəki xəndə.
Sultani-cəhan sərvərisən, sahibi-iqbal,
Aləm sənə bəndə.
Güftarın edər tutiyi-şəkkərşikəni lal,
Hər nitqə gələndə.
Sən Xosrov olubsan, bəli, hər şəhdi-məqalə,
Şirini-zəmansan!

Sənsən, sənəma, cümleyi-xubanə şəhənşəh,
Yox sən kimi dilbər.
Bürqə üfüqündən ki, üzün bir çıxa nagəh,
Xurşidə bərabər.
Salır özünü ziri-niqabə şəfəqü məh,
Manəndeyi-əxtər.
İnsan ola bilməz bu sifət pakü münəzzəh,
Cəm ola sərasər,
Sən cinsi-mələksən, yetişibsən bu kəmalə,
Ya ruhi-rəvansan?

İsni-əşərə çakərü kəmtər ola, Vaqif,
Sərdardır ə’la.
Xaki-dəri-övladi-peyəmbər ola, Vaqif,
Neylər dəxi dünya?
Ol gündə ki, həngameyi-məhşər ola, Vaqif,
Tut dəməni-mövla.
Fəryadrəsin Heydəri-Səfdər ola, Vaqif,
Xof eyləmə əsla!
Sən qərqsən hərçənd ki, dəryayi-vəbalə,
Tövfiq bulansan.

## VAQİFİN QOŞMASI

Bulud zülflü, ay qabaqlı gözəlin,
Duruban başına dolanmaq gərək.
Bir evdə ki, belə gözəl olmasa,
O ev bərbad olub, talanmaq gərək.

Sərxoş durub sarayından baxanda,
Ağ gərdənə həmayillər taxanda,
Qaşa vəsmə, gözə sürmə yaxanda,
Canım eşq oduna qalanmaq gərək.

Çıxa sarayından canlar alan tək,
Xişmə gələ gəh-gəh qəhri olan tək,
Dal gərdənə qıvrım saçı ilan tək,
Tərpənəndə hər yan bulanmaq gərək.

Vaqif, sənin işin müdam ah olsun,
Səg rəqibin ömrü qoy kütah olsun,
Həmdəmsiz kimsənə istər şah olsun,
Gədadır o kimsə dolanmaq gərək.

**Vər. 29b**

## VAQİFİN VİDADİYƏ CAVABI

Ey Vidadi, yenə xan qulluğunda,
Qaim olub, nə qiyamət eylərsən?
Yaman gözdən Allah özü saxlasın,
İxlas ilə, kişi, xidmət eylərsən.

Bizim hərəmlərdir Quran oxuyan,
Üstündən, başından ənbər qoxuyan,
Olar deyil ölkən,* çatı toxuyan,
Kimin işin kimə nisbət eylərsən?

Belə dursan o qapıda qışü yaz,
Yetişərsən bir çörəyə sərəfraz,
Doğru budur, bundan əyilsən bir az,
Yəqin bil ki, çox xəyanət eylərsən.

Sizdə ki, bir övrət qurar bir palaz,
Boşalıb olanda ərişi nasaz,
Çağırıb çaxdırır hər yerinə paz,
Bunu ona bir mərifət eylərsən.

Xoş halına sənin, uzun dırnaqlı,
Baldırı çirməkli, yalın ayaqlı,

* Örkən

Yorğanı, yastığı tozlu-torpaqlı,
Həmdəm ilə hər dəm söhbət eylərsən.

Burnun silə-silə qatığı çalar,
Axşamadək eyməsini it yalar,
Altına yıxılcağ çır-çır çığırar,
Eşqin yatar, qət'i-şəhvət eylərsən.

Bit öldürüb, gedər xəmir yoğurur,
Mamaçılıq eylər, uşaq doğurur,
Söz xəbər alanda bar-bar bağırır,
Qulaqların batar, heybət eylərsən.

Axşam-sabah durar əlində çatı,
Buzov bağlar, gəlib tumarlar atı,
Palçığa bulanar suru-sufatı,
Öylə zada sən də ülfət eylərsən.

Əllərin, yüzlərin yuduqları yox,
Yaşlarında doğru dedikləri yox,
Hazır çobandırlar, düdükləri yox,
Onlar ilə hər dəm söhbət eylərsən.

Belə olur tərakəmə oymağı,
Övrət bilməz kişisindən doymağı,
Özgəyə yedirir yağı, qavmağı,
Qatığına sən qinaət eylərsən.

Günün qulağı ta oradan batar,
Mitilin bürünüb çaşta tək yatar,
Ev zadını tamam özgəyə satar,
Əgər yanın bir dəm xəlvət eylərsən.

## MƏRHUM VAQİFİN MÜRƏBBEİ

Sevdiyim, ləblərin yaquta bənzər,
Sərasər dişlərin dürdanədəndir.
Sədəf dəhanından çıxan sözlərin,
Hər biri bir qeyri xəzanədəndir.

Mən ha səni nuri-ilahi sannam,
Camalının şöləsinə dolannam,

Atəşinə mərdü mərdanə yannam.
Bu xasiyyət mənə pərvanədəndir.

Bir namə yazmışam can üzə-üzə,
Badi-səba, apararsan gül yüzə,
Soruşsa yar: "Bu kimdəndir bizə?"
Söyləgilən: "Sizin divanədəndir."

Xumar-xumar baxmaq göz qaydasıdır,
Lalə tək qızarmaq yüz qaydasıdır,
Pərişanlıq zülfün öz qaydasıdır,
Nə badi-səbadən, nə şanədəndir.

Müştaqdır sənə gözü Vaqifin,
Yolunda payəndaz yüzü Vaqifin,
Sənsən fikri-zikri, sözü Vaqifin,
Qeyri söz yanında əfsanədəndir.

**Vər. 31a**

## VAQİFİN HƏZLİ

Bayram oldu, heç bilməzəm neyləyim,
Bizim evdə dolu çuval da yoxdu.
Dügiylə yağ ki, çoxdan tükənib,
Ət heç ələ düşməz, motal da yoxdu.

Allaha bizmişik naşükür bəndə,
Bir söz dedim dəxi qoymazlar kəndə,
Xalq batıb noğulü şəkərü qəndə,
Bizim evdə axta zoğal da yoxdu.

Bizim bu dünyada nə malımız var,
Nə də evdə sahibcamalımız var,
Vaqif, öyünmə ki, kamalımız var,
Allaha şükr olsun, kamal da yoxdu.

## VAQİFİN XRİSTİAN QIZININ TƏRİFİNƏ DAİR MÜXƏMMƏSİ

Naz ilə ta ol büti-tərsa kəlisadən çıxar,
Sərxoşü xəndan bipərva kəlisadən çıxar,
Şahdır, guya geyib diba, kəlisadən çıxar,
Açıban təl'ət günəşasa kəlisadən çıxar,
Şölə salmış aləmə ta kim, kəlisadən çıxar.

Ləhzə-ləhzə eylədikcə mahruxsarı zühur,
Ləm'ə-ləm'ə ziri-bürqdən düşər dünyayə nur,
Ani bir kərrə görən dindən olur, əlbəttə, dur,
Necə kim, cənnət sarayından çıxar qilmanü hur,
O şəkil bu düxtəri-tərsa kəlisadən çıxar.

Şanəvəş seyqəl verib zülfi-bənəfşə nisbətə,
Pərdə mütləq tutmuyub simavü sədrü surətə,
Qıl tamaşa gərdənə, seyr elə qəddü qamətə,
Qaşü göz, qəmzə, məazallah, dönübdür afətə,
Etməyə din mülkünü yəğma kəlisadən çıxar.

Gül kimi nərmilə nazik pirəhəıdə ağ bədən,
Bilmənəm ya şölədir, ya xərməni-bərqi-səmən.
Dişləri qəltan sədəf, çün ağzıdır lə'li-Yəmən,
Ağ qabağda bir gəz anın tağİ-əbrusin görən,
Meyli-məscid eyləməz haşa, kəlisadən çıxar.

Vaqifəm, ta ki, sataşdı gözüm onun qaşına,
İstədi mehrabü minbərdən xəyalım daşına,
Şimdi bildim ki, nə gəlmiş Şeyx Sən'an başına,
Ya budur ki, Tiflisi ğərq eylərəm göz yaşına,
Ol sənəm vəsli mənimçün, ya kəlisadən çıxar.

## QOŞMA

Ey Kə'bəm, Kərbəlam, Məkkəm, Mədinəm,
Hər zaman kuyində ziyarətimdir.
Qiblə deyib qaşlarına baş əymək,
Gecə-gündüz mənim ibadətimdir.

Bağlamışam din, imanı zülfünə,
Mənim kimi heyran hanı zülfünə,
Tapşırıb gedirəm canı zülfünə,
Yaxşı saxla, səndə əmanətimdir.

Sənsən mənim ayım, günüm, hilalım,
Dövlətim, iqbalım, cahım, cəlalım,
Gözəl üçün daim fikrü xəyalım,
Sözün dildə şirin hekayətimdir.

Sonalar xəcildir siyəh telindən,
Tutilər lal olur şirin dilindən,
Şikəstə Vaqifəm, sənin əlindən
Hər kimə ki, yetsəm, şikayətimdir.

**Vər. 32a**

## VAQİFİN QƏZƏLİ*

Sübhdəm seyran içində çaldı bülbül ərğənun,
Əyyühəl-üşşaq qumu innəküm latəsməun.

Ərğənun tutdu piyalə, nəstərən doldurdu cam,
Mütriba, çal nəğmeyi – ya eyyühəl müstəğfirun.

Hüsni-ruyin hər görənlər afərin təhsin edər,
Şükr edən inamə yox illa qəlilən təşkərun.

Gözlərin sərxoşluğundan badə həm laxof oxur,
Ziri-ləb saqi deyər hər dəm: vəlahüm yəhzənun.

Vaqifin fikri budur yolunda can qurban edə,
Hər ötəndə deyəsən, inna ileyhi raciun.

## VAQİF BU QƏZƏLİ VİDADİNİN XAHİŞİ İLƏ YAZIB

Salmaq nəzərindən məni cananə düşərmi?
Tərk eyləmək öz qulunu sultanə düşərmi?

Kakil nə rəvadır ki, könüldən edə qeybət,
Şanə gileyi-zülfi-pərişanə düşərmi?

Qəmzən, ləbini dişləməmiş, qanımı tökdü,
Qan eyləməyən kimsənə heç qanə düşərmi?

Dil çahi-zənəxdanə düşüb zülfün ucundan,
Əlbəttə, xətasız kişi zindanə düşərmi?

Ol sərvi-xuramanə ki, gəzmək olub adət,
Bir yol yolu gör kim, bizim eyvanə düşərmi?

Olmasa əgər Vaqifə bir sədri-səmənbar.
Top eyləyibən başını meydanə düşərmi?

## VAQİFİN QƏZƏLİ

Hər gedən gəlmiş, mənim ol qəmküsarım gəlməmiş,
Ey gözüm, qan ağla kim, çeşmi-xumarım gəlməmiş.

---

* Qəzəl Şah İsmayıl Xətainindir.

Getmiş idi ixtiyarım biləsincə yarımın,
Çünki yarım gəlməmiş, həm ixtiyarım gəlməmiş.

Mən bu dərd ilə əgər ölsəm, məzarə qoymayın,
Üstümə ol tuti dilli şux nigarım gəlməmiş.

Deməsin Vaqif, əcəl gər gəlsə, məndən can alır,
Kimdir ona can verən fərmani-yarım gəlməmiş!?

## QƏZƏL

Mehribanlıq görməyib, bir məhliqadən küsmüşəm,
Gündə yüz al eyləyən qəlbi qəradən küsmüşəm.

Şəninə dedim şirin söz, bir şey ondan dadmadım,
Bu səbəbdən ağzı şəkkər dilrübadən küsmüşəm.

Bir qədəh mey istədim, sındırdı qəlbim şişəsin,
Daş bağırlı saqiyi-sahibcəfadən küsmüşəm.

Çün uman yerdən küsərlər, bu məsəldir xəlqara,
Küsdüyüm bica deyildir, aşinadən küsmüşəm.

Gördüm əvvəl kim, deyil böylə binayi-yarlıq,
Vaqifa, əsli budur, mən bu binadən küsmüşəm.

## VAQİFİN TİFLİSİN TƏRİFİNDƏ DEDİYİ MÜXƏMMƏS

Bəh, bu bağın nə əcəb sərvi-dilaraləri var,
Hər tərəf tazə açılmış gülü rənaləri var,
Açılıb tazəvü tər laleyi-əhmərləri var,
Yəni Tiflisin əcəb dilbəri-zibaləri var,
Ey könül, seyr elə, gör, türfə təmaşaləri var.

O qədərdir büti-nazikbədənü incəmiyan,
Eyləmək olmaz onun vəsfini mə'lumü əyan,
Hər biri nazü nəzakət ilə min afəti-can,
Cümlə bir cilvədə, bir şivədə, xoş sərvi-rəvan,
Məst tavus kimi gərdəni-minaləri var.

Mərhəba, Tiflis imiş cənnəti dünya yerinin,
Yığılıbdır ona cəmiyyəti hurü pərinin,
Mən bu şəhrin, nə deyim, vəsfini dilbərlərinin,
Filməsəl, şəklü şəmaildə vəli hər birinin,
Mahi-tabanə bərabər sərü simaləri var.

Üzləri pərtövi-mehri-cəhanara kimidir,
Səfheyi-sinələri simi-müsəffa kimidir,
Ləzzəti-ləhcələri nitqi-Məsiha kimidir,
Əlləri möcüzeyi-həzrəti-Musa kimidir,
Dilrübalıqda əcayib yədi-beyzaləri var.

Ala gözlər süzülüb, nərgisi-sirabə dönüb,
Ağ qabağında xəm əbruləri mehrabə dönüb,
Lə'l tək ləblərinin rəngi meyi-nabə dönüb,
Tökülüb gərdənə saçlar, ucu qüllabə dönüb,
Sona cıqqası kimi zülfi-mütərraləri var.

Nə qədər var isə buxaqü zənəxdanü yanaq,
Tazə gül yarpağı tək qırmızıdır, nazikü ağ,
Bir-birindən götürüb şöləsini misli-çırağ,
Az görüb kimsə belə qaşü gözü dişü dodaq,
Özgə babət sifətü surətü əzaləri var.

Kəsrəti-hüsn ki, xoş mərtəbədir insan üçün,
Bəxş edibdir həq ani dilbəri-Gürcüstan üçün,
Yox sual etmək əgər məsləhəti-Yəzdan üçün,
Nola, yarəb, səbəbi, baisi bu xuban üçün,
Belə surətlərin, əlbəttə ki, mənaləri var.

Yeddi həmmam, nə həmmam ki, sərmənzili-hur,
Həşt cənnət kimi hər guşəsi bir mətləi-nur,
Bir əcəb abi-rəvan gərm qılıb andə zühur,
Şükr təqdirinə, ey qadirü qəyyumi-ğəfur,
Lütfünün bəndələrə neməti-üzmaləri var.

Mənbəi-cudü kərəmdən açılıb dürri-xoşab,
Basəfa hövzə dəmadəm tökülür misli-gülab,
Görsə bir kərrə onu mən kimi bir xanəxərab,
Getməz andan dəxi bir canibə manəndi-hübab,
Getsə də badə başı, mənzilü mə'vaları var.

Gərçi, ey Xızr, bulubsan şərəfi-feyzi-əzəl,
Verməyibdir sənə amma könül asayişi əl,

İstəsən ömri-dübarə, görəsən türfə gözəl,
Bircə təşrif buyur Tiflisin həmmamına gəl,
Gör necə rahətü canbəxşü tənasaləri var.

Bu ocaq böylə ocaqdır, işığı ayə salır,
Gün kimi şöləsini cümleyi-dünyayə salır,
Tez tutar, xainü bədxahləri vayə salır,
Hər kimin başinə kim, mərhəməti sayə salır,
Elə bilsin oların din ilə dünyaləri var.

Vaqifa, səndə ki, yoxdur, bilirəm, zöhdü riya,
Şərti-ixlas gərək eyləyəsən şimdi əda.
Elə bu valiyə, oğlanlarına xeyrü-dua,
Saxlasın onları öz hifzi-əmanında Xuda,
Hasil etsin nə qədər dildə təmənnaləri var.

## VAQİFİN MÜXƏMMƏSİ

Ey mahi-şərq, mehri-vəfalər gətiribsən,
Çox lütfü kərəm, lütfü ətalər gətiribsən,
Xurşid kimi nurü ziyalər gətiribsən,
Bu şəhrə ki, təşrifı-bəqalər gətiribsən,
Sən xoş gəlibsən və səfalər gətiribsən.

Ey zati-şərifində olan cilveyi-təhsin,
Hicran bizi etmişdi belə xəstəvü qəmgin,
Nə dərdinə həd var idi, nə cövrünə təxmin,
Biz müntəziri-rahin idik,*
Xaki-qədəmində tutiyalər gətiribsən.

Ey sahibi-tə'zim, sərü can sənə peşkəş,
Dürdaneyi-çeşmi-gühərəfşan sənə peşkəş,
Bu təxtgəhi-sineyi-suzan sənə peşkəş,
Məcmueyi-mülki-dili-nalan sənə peşkəş,
Xoş mə'dələtü üqdəgüşalər gətiribsən.

Ey nüsxeyi-fərruxrəqəmi-münşiyi-qüdrət,
Əbruyi-lətifin xəti-mənşuri-səadət,
Sərlövhi-rüxin məsdəri-dibaçeyi-fitrət,
Məzmuni-vücudin, bəli, imdadi inayət,
Müxlislərə ehsanü səxalər gətiribsən.

* Misra orijinalda naqisdir

Ey cani-müəlla məhəlü sərvəri-Vaqif,
Fəğfurü Fəridunü Cəmü Qeysəri-Vaqif,
Əflaki-səadətdə səid əxtəri-Vaqif,
Didarına müştaq idi çeşmi-təri-Vaqif,
Əlminnətə lilləh ki, cilalər gətiribsən.

## VAQİFİN SAQQAL RƏDİFLİ MÜXƏMMƏSİ*

Ey məni eyləyən aləmdə pərişan, saqqal,
Səni yox eyləsin ol qadiri-sübhan, saqqal,
Görəyim kim, olasan xak ilə yeksan, saqqal,
Ki, məni eylədin axir evi viran, saqqal,
Dəydi səndən mənə yüz illətü nöqsan, saqqal.

Var idi bundan əzəl məndə ki, ta vəchi-həsən,
Tər bənaguşü zənəxdani-səmin, sadə zəğən,
Həmdəm idi mənə hər lə'lləbü qönçədəhən,
Tuf sənin üzünə kim, xublar içində məni sən,
Bir kəs idim, elədin nakəsü nadan, saqqal.

Bəs ki, bədşəklsənü başdan əyağə murdar,
Dəmbədəm səndən olur buyi-kəsafət izhar,
Necə etsin sənə rəğbət sənəmi-gülrüxsar,
Abrudən məni sən saldın elə, ey idbar,
Ta ki, oldun nagəhan üzdə nümayan, saqqal.

Sən döyülsən, bəli, bir şey ki, çıxmasan üzə sən.
İstəsən hər tükünə dürrü cəvahir düzəsən.
Yardan meylini bimərrə gərəkdir üzəsən.
Dəxi gəlməzmisən bir çəngə samanca gözə sən,
Filməsəl, gər olasan sünbülü reyhan, saqqal.

Qaradır böylədi, Vaqif, gələ gör kim, ağara,
Adəmi döndərəcək ağzi ağarmış zağara,
Bu hal ilə gələ gör kim, gedə toya, mağara,
Növcəvanlar edə söhbət, çala kusü nağara,
Edə aləmdə səni didəsi giryan, saqqal.

* Müxəmməs Nəvvabın təzkirəsinin avtoqraf nüsxəsində yoxdur.Təzkirənin çap nüsxəsindən alındı (1913-cü il müxtəsər çap nüsxəsi, səh.15-16).

* * *

Neylərəm böylə bunun mən gömüm iqbal içinə,
Handa üz tutdum isə düşdüm elə qal içinə,
Gündə yüz kər düşə aşüftəlik əhval içinə,
Qorxum oldur ki, sabah ağ düşə saqqal içinə,
Hər sənəm görsə deyə kim... çal içinə.

Etməyə bir sənəmin könlü səni hiç qəbul,
Sən ona istər isən eyləyəsən canını qul,
Canına rəhm eləməz yanasan odda yüz yol,
Saqqalı ağ olanın qiymətidir bır qara pul,
Gərçi girsən bəzənib gündə yaşıl, al içinə.

Kim ki, birçəklərini sünbülə timsal salır,
Xubların başına qovğa gətirib, qal salır,
Dami-təsxirə pəriruləri filhal salır,
Abrudən kişini dəhrdə saqqal salır,
Salma saqqalını əndamə, onun sal içinə.

Sahibi-saqqal əgər yüz ola sahir sözlü,
Yəni başdan-ayağa ləhcəsi şirin, duzlu,
Ram olub, baxmaz ona hiç bir ahu gözlü,
Nola saqqala yavuq gəlsə də bir gül üzlü,
Kim qıyar ki, düşə gül yarpağı qanqal içinə?

Demə, Vaqif, ki, filan kimsənə çox zirəkdir,
Ya filan şeir deyər, yazısı həm göyçəkdir,
Ya filan kəndxudanın simü zəri lək-ləkdır,
Xubların sevdiciyi sadəvü topbirçəkdır,
... onlar xətü şeir, kəmalü mal içinə.

**Vər. 25a**

## MİRZƏ VƏLİ VİDADİ

**Cəmadiyül-əvvəl, 1309-cu il (dekabr, 1891-ci il)**

**Mirzə Vəli ibn Bayram xan Baharlıdır. Baharlı Qarabağ Şuşasına tabe olan kəndin adıdır. Və o (Vidadi), Baharlıda anadan olub. Molla Pənah Vaqiflə müasirdir. Tərəkəmədirlər. Məlum olduğu kimi, Molla Vəli Qarabağın keçmiş valisi mərhum İbrahim xan Cavanşirin hüzuruna yaxın idi. İş elə gətirir ki, İbrahim Xəlil xan onu bir işi icra etmək üçün İran şahənşahı Fətəli şahın hüzuruna İrana göndərir. Molla Vəli Fətəli şahın hüzurunda kəskin sözlər danışır. Şah onun sözlərindən qəzəblənir və fərman verir ki. Molla Vəlini topun ağzına bağlayıb atəş açaraq, onu məhv etsinlər.**

**Necə ki, deyirlər və öz sözlərindən də məlum olur ki, o, sünni olmuşdur. Ancaq indi onun bütün nəvə-nəticələri və nəsli Qarabağda şiə məzhəbdirlər.**

**O, Molla Pənaha rəqib olmuş və həmişə bir-birilə şeirləşib, həcv demişlər.Vəfat edən vaxt təqribən həştad yaşı var idi. Aşağıda qeyd olunan şeirlər onun təbinin nəticəsidir. Şeirlərindən bəzisi əvvəldə qeyd olunub.[*]**

**Vər. 29b**

### VİDADİNİN VAQİFLƏ ZARAFATI

Vaqif, sənəmlərdən nə tez usandın,
Birin bir inəyə qiymət eylərsən.
Hələ sonra keçiyə də edərsən,
Alsa müştəriyə minnət eylərsən.

İpin dolaşıbdır ara yatıya,
Oğul olsa dəxi baxmaz atıya,
Birin də mən alım ölkən[**] çatıya.
Əgər qayırmağa möhlət eylərsən.

Sifariş etmişdin qələbəyiyə,
Ki, sən göz-qulaq ol bizim dügiyə
Müştəri doludur budur bəgiyə,
Necə ki, kefindir ləzzət eylərsən.

Biz də təşrif buyurmuşduq bağadan,
Eşittik kirabnı Nəsib ağadan,
Mən ha bilməz idim ta bu çağadan,
İndi bildim hünər, cürət eylərsən.

---

[*] Vaqiflə deyişməsi nəzərdə tutulur.
[**] Örkən

**Vər. 25b**

## VİDADİNİN MÜSƏDDƏSİ

Gəl çəkmə cəhan qeydini, dövran belə qalmaz,
Qan ağlama cox, dideyi-giryan belə qalmaz,
Gül vəxti keçər seyri-gülüstan belə qalmaz,
Hər ləhzə könül xürrəmü xəndan belə qalmaz,
Bir cam yetir, saqi, ki, dövran belə qalmaz,
Tən bir gün olur xakilə yeksan, belə qalmaz.

Soltani-cəhan olsa gedər, canə inanma,
Bir gün pozulur şövkəti-divanə inanma,
Gər aqilisən, gərdişi-dövranə inanma,
Çün baqi deyil, mülki-Süleymana inanma,
Bir cam yetir, saqi, ki, dövran belə qalmaz,
Tən bir gün olur xakilə yeksan, belə qalmaz.

Yüz mövsümi-xoş, xürrəmü bülbüllər açılsa,
Yüz baği-cəhan tazələnib, güllər açılsa,
Yüz lalə bitib, süsəni sünbüllər açılsa,
Könlün ki, açılmaz neçə müşküllər açılsa,
Bir cam yetir, saqi, ki, dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Əzbəs bu cəhan olsa ki, canan ola fani,
Bu işvə ilə qəddi-xuraman ola fani,
Bu gərdəni-xoş zülfi-pərişan ola fani,
Bu əhsəni-surətdə ki,insan ola fani,
Bir cam yetir, saqi, ki, dövran belə qalmaz,
Tən bir gün olur xakilə yeksan, belə qalmaz.

Ah, aldı məni dərdi-fəraqü qəmi-həsrət,
Sərməstü xərab etdi məni mayeyi-heyrət,
Bir mehrliqa yox ki, ona dil edə rəğbət,
Fövt eyləmə gəl, var ikən əldə dəmi-fürsət,
Bir cam yetir, saqi, ki, dövran belə qalmaz,
Tən bir gün olur xakilə yeksan, belə qalmaz.

Fikr etsən əgər, hər işi bir cami-bəladır,
Hər dürri-girənmayəsi min canə bəhadır,
Hər nəqşi bir ayineyi-isbati-fənadır,
Məqsudi-dü aləm yenə təhsili-rizadır,
Bir cam yetir, saqi, ki, dövran belə qalmaz.
Tən bir gün olur xakilə yeksan, belə qalmaz.

Ey xəstə Vidadi, bu cəhan bir quru səsdir.
Bir dəmdə keçər eylə ki, fəryadi-cərəsdir,
Gəl durma ki, ömrün keçib, əncami-nəfəsdir,
Bu bəzmi-fənadə bu nə həngami-həvəsdir?
Bir cam yetir, saqi ki, dövran belə qalmaz.
Tən bir gün olur xakilə yeksan, belə qalmaz.

## VİDADİNİN QOŞMASI

Ey ağalar, bir nigarın oduna,
Dəli könül yana-yana düşübdür.
Mən ki, düşüb bu hal ilə yanaram,
Nə səməndər, nə pərvanə düşübdür.

Açılıb cənnət tək cəmalın gülü,
Oxur çövrəsində şeyda bülbülü,
Bu gülşənin yasəməni, sünbülü,
Nə bir bağa, nə bostanə düşübdür.

Lə’li-ləbi bənzər gövhər kanına,
Düzülüb gövhər tək dür dəhanına,
Siyah tellər ağ buxağın yanına,
Xırda xallar zənəxdanə düşübdür.

Könül dost kuyinə etdikcə güzər,
Qanlı qəmzəsindən etməzmi həzər?
Gözüm çıxdı, etdi ona çün nəzər,
Gör necə kəsilməz qanə düşübdür.

## VİDADİNİN QİT’ƏSİ

Ey həmdəmim, səni qana qərq eylər,
Gəl tərpətmə yaralanmış könlümü,

Ayrı düşmüş vətənindən, elindən,
Həmdərdindən aralanmış könlümü.

Fələk saldı dürlü-dürlü odlara,
Şan-şan olmuş, paralanmış könlümü.

Yenə qəm səməndin mindi, yollandı,
Heç bilmənəm barəlanmış könlümü.

Rövşən etməz üzün, günəş bərq eylər,
Bu möhnətdə qaralanmış könlümü.

Çox təbibə şərh elədim dərdimi,
Heç görmədim çaralanmış könlümü.

Vidadiyəm, xəstə gözüm mərdümi,
İtirmişəm yaralanmış könlümü.

## YENƏ VİDADİNİN QOŞMASI

Seyri-gülşən etsən, ey gülüzarım,
Bülbül oxur, bağlar sədayə düşər.
Xəttinə baş əyər sünbül, bənövşə,
Gül xaki-fərşinə fədayə düşər.

Həyatımdır həyatımın həyatı,
Dəhani şəkkəri, dili nəbati,
Cəmalın sədqəsi, hüsnün zəkatı.
Mən təki binəva gədayə düşər.

Xurşidim, xavərim, hilalım sənsən,
Şəkkərim, şərbətim, zülalım sənsən,
Fikrim, zikrim, sözüm, xəyalım sənsən,
Könlüm haçan səndən cidayə düşər?!

Həsrətin çəkməkdən olmuşam xəstə,
Halı pərişanam, dili şikəstə,
İstər vüsalını Vidadi xəstə,
Yüz xaki-payına duayə düşər.

**Vər. 34b**

## KƏRBƏLAYİ SƏFİ VALEH

**Kərbəlayi Səfi Qarabağ kəndlərindən olan Gülablı əhalisindəndir. Təxəllüsü Valehdir. 1250-ci ildə (1834-35) sağ idi və kəsbkarlıq edirdi. Kərbəlayi Abdulla Canı oğlu ilə müasir olub. Yuxarıda göstərilən tarixdə təqribən 70 yaşı var idi. Kənd şairləri kimi şeirlər də deyərdi. Məsələn, müxəmməs, mustəzad, tərcibənd, qoşma və sairə. Qənbər adlı bir şair də onunla müasir olub. Valeh həmin Qənbər və Kərbəlayi Abdulla Canızadə ilə bəzi vaxtlar şeirləşib bir-birlərinə həcv deyərdilər. Hər üç şairin həyatı bir-biri ilə əlaqədar olduğundan biz də qarışıq yazdıq. Ancaq Kərbəlayi Abdullanın da əhvalatını eşitmək lazımdır.**

**Vər. 35a**

## KƏRBƏLAYİ ABDULLA CANI OĞLU

**Kərbəlayi Abdulla Canı oğlu Qarabağın Şuşa qalasında sakin idi. Kəsb-karlıq da edirdi. Ağıllı bir adam idi və dövrünün ariflərindən hesab olunurdu. 1255-ci ildə (1839) sağ idi və təxminən 50 yaşı var idi. 1259-cu ildə (miladi 1843) vəfat edib. Bəzi qəribə elmlərlə maraqlanırdı. Eşitdiyimizə görə, kimyanı məşq edirdi. O vaxtlar artıq səriştəsi də var idi. İstəyirdi ki, Mürtəzəvinin "Cefri-came" ("Sehirli fal") kitabını yazsın. Bu falnamənin cüzvlərindən on üç cüzv yazmışdı ki, fani dünyadan köçdü. Allah ona rəhmət eləsin. Mən o on üç cüzvü nəzərdən keçirəndə öz gözümlə gördüm ki, doğrudan da, zəhmət çəkmişdir. (Amma səhifələrin çoxunda səhvlər gördüm).**

**Mürtəzəvinin həmin "Cefri-came"sini bu sətirlərin müəllifı – mən Nəvvab Mir Möhsün bütünlüklə yazdım və Allahın köməyi ilə 28 iqlim, hər iqlimin 28 şəhəri, hər şəhərin 28 məhəlləsi, hər məhəllənin 28 evi, hər evin dörd hərfi (kimi) 14 ayda tamamladım.**

**Təzkirədə o kitab haqqında xüsusi danışmaq münasib deyil.**

**Xülasə, mərhum Kərbəlayi Abdulla rəvan şeirlər demişdır.Amma dağınıqdır, divanı, yoxdur. İbrahim xan Cavanşirin qızı, mərhumə Gövhər ağanın *Aşağı məscidi* üçün bir maddeyi-tarıx yazmışdır kı hal-hazırda məscid qapısının üstündəki mərmər daşın üzərində həkk olunmuşdur. O beytləri yazmağı lazım bildim.**

## KƏRBƏLAYİ ABDULLA CANIZADƏNİN MƏRHUMƏ GÖVHƏR AĞANIN MƏSCİDİ ÜÇÜN YAZDIĞI MADDEYİ-TARİX

**Şuşa məmləkətinin banisinin taxt-tacının qübbəsi,**
**Öz həşəmətilə aya tə'nə edərək onun qarşısına çıxdı.**
**Qapısı bütün dünya xalqları üçün pənahgah olan qüdrətli İbrahim xanın,**
**Elə parlaq bir gövhəri var idi ki,**
**Onun ay tək parlaq cəmalı günəşin qarşısını tuturdu.**
**O pak gövhər məscid və mehrabın banisi oldu.**
**Firdövs behişt əhli buna şahid oldu.**
**Əhli-qələm bu tarixi belə qeyd etdi:**
**"Bad peyvəsteqohər dər sədəfe-lotfe-Əllah."** *

**Aşağıda yazılan müxəmməs Kərbəlayi Səfi Valehin təbinin nəticəsidir.**

* Allahın lütf sədəfində bir gövhər – mirvari olsun.

## MÜXƏMMƏS

Şəfabəxşi dəmin ol həzrəti-İsadən öyrənmiş,
Həyati-cavidani ləblərin Xizradən öyrənmiş,
Gəhi xoş xəndə eylər bəzmara, minadən öyrənmiş,
Səvadi-kakilin tərhin şəbi-yeldadən öyrənmiş,
Cəbinin pərtövəfkənlik yədi-beyzadən öyrənmiş.

Qalıb əyyami- sabiq qəmzeyi-xunrizdən qanun,
Müdam məcruh edər, eşq əhlinin bağrın qılar pürxun,
Dili-sədparəni əşkilə çeşmimdən edər Ceyhun,
İçibdir cami-məxmuri, edər aşiqlərə əfsun,
Bu də’vi çeşmi-məstin nərgisi-şəhladən öyrənmiş.

Qaşın tağın görüb mehrabü minbərlər çəkər xiclət,
Buyindən nafeyi-Çin, müşkü ənbərlər çəkər xiclət,
Siyəh zülfün qəmindən sünbüli-tərlər çəkər xiclət.
Görəndə qəddini sərvü sənubərlər çəkər xiclət,
Bu rəftarı nihali-qamətin tubadən öyrənmiş.

Xəyali-cami-vəslin çoxları bəst eyləyib bibak,
Əzubi-hüsnünə şəblər siyəhpuş əyləşib qəmnak.
Görəndə vəslini hər sübhi-sadiq sinə eylər çak,
Rüxündən infəal eylər məhi-tabanə nöh əflak,
Yüzün rəxşəndəlik şəmsi-cəhanaradən öyrənmiş.

Gəl, ey zahid, sən etmə Valehi-divanəni mülzəm,
Deyil təğyirə qail kim, təriqi-eşqədir möhkəm.
Haçan olmuş cahanda eşq dərdi qabili-mərhəm?
Sevəndə Leylini Məcnun,olanda dərdinə məhrəm,
Cünunluq rəsmini bu qafılü şeydadən öyrənmiş.

## VALEH

Ləbinə nazlı yarın badeyi-gülfam dedim,
Tündü təlx oldu ki, “Hay, məstü cünun olma” - dedi.
“Ləzzəti şəhdü şəkər tək, ləbi xəndandır bu,
Qiyməti gəncü göhər, lə’li-Bədəxşandır bu.”

Üzünə nazlı yarın şəm’i-şəbistan dedim,
“Gədə, pərvanə kimi özün oda salma" - dedi.
“Necə qıydın bu belə mahtaban rüxsarə,
Aləmə şölə salan mehri-cahan rüxsarə?”

Qəddinə nazlı yarın ər-ərü şümşad dedim,
Yenə tünd oldu mənə, “dəxi bizə gəlmə”- dedi.
“Gözlərin var, bu belə, şivəvü rəftarıma bax,
Geymişəm alü yaşıl, libasi-zərtarıma bax.”

Ağzına nazlı yarın höqqə dedim, təng oldu,
Valehə təng tutub “dəxi belə dinmə” - dedi.
“Bu ki bir nöqtədürür qeybi, sənə yox səməri,
Həq bilir qeybi ki, heç kimsənin olmaz xəbəri.”

“Höqqə bir şişədi dünyadə, düşər əldən-ələ,
Belə pünhan sözü sən aşikara salma”-dedi.

**Mərhum Valehin sir-sifəti elə hala düşmüşdü ki, kim onu görsəydi, onunla nəsr və ya nəzmlə zarafat edib, əylənmək istərdi. O cümlədən, Qənbər və Baba bəy adlı şairlərlə bir-birinə həcv deyib sual-cavab etmişdilər ki, biz onları bu kitaba yazmağı layiq bilmədik. Ancaq mərhum Valeh imamların ziyarətinə nəsib olub geri qayıdandan sonra Kərbəlayi Abdulla Canızadə kinayə yolu ilə ona bir neçə beyt göndərərək bir-birinə həcv demişlər ki, bu da zarafatla olduğundan onlardan bəzisini yazıram.**

### KƏRBƏLAYİ ABDULLA VALEHƏ YAZIB

Ey Səfi, şahi-Nəcəf evi sənə məskən ikən.
Niyə ol rövzəni tərk etdin, əgər adəm idin?

Gün kimi olmadı yarın səri-kuyində yerin,
Sən məgər əhli-vəfa əzminə naməhrəm idin?

Süst rayin səni məhrumi-vüsal etməz idi,
Rəhi-eşq içrə əgər sabitü müstəhkəm idin.

Qürbi-övladi-Əlidir səbəbi-rəhməti-həq,
Sən bu mənada məgər cahilü layələm idin?

Kəhfin əshabını tərk etmədi səg bir saət,
Sən ki, insan idin, əhməq, məgər ondan kəm idin?

Müstəqim olsa idi eşq ilə təb’in daim,
Həlqə tək dərgəhi-mövladə bəsi möhkəm idin.

Adəm olsaydın əgər, zövqlə ta şamü səhər,
Yar kuyində gəzən itlər ilə həmdəm idin.

Dəsti-ixlas ilə canan ətəyin tutsa idin,
Şərəfi-rütbədə soltani-qəmi-aləm idin.

Qənbəra, Valehi mən’ etmə ki, bəs biqəmdir,
Sən dəxi cahil əgər olsa idin, biqəm idin.

## VALEHİN KƏRBƏLAYİ ABDULLA CANIZADƏYƏ CAVABI

Səfi naməhrəmi-dərgahü dəri-Heydərdir,
Kim bilir ki, filan şey ya xüşk və tərdir.

Mən əgər feyzü hünər cahiliyəm lə’n sənə,
Yoxsa lə’nət sənə gəlsin, bu nə növ’i şərdir.

Səfinin ziddi əzazil əzəl Abdullahdır,
Ona başımı əgəm, lə’nət ona, müztərdir!

Ol Əbucəhl Rəsulun nəyini əksiltdi?
Daima zəmmi-nəbi dildə onun əzbərdir.

Neçə kafər genə peyğəmbərə əbtər dedilər,
Elmi-təhqiqdə onların özü əbtərdir.

Ərşinə əlli kərən and içəni gör ki, mənə,
Elə söylər ki. görən der, özü peyğəmbərdir.

Özü Dəccaldürür, könlü vəli Kə’bə dilər,
Mömin indi Qalada sən, burada Qəmbərdir.

**Vər. 37b**

## VALEHİN QALADA UN SATMASI ƏHVALATI

**Kərbəlayi Səfi Valeh bir gün öz ulağına bir tay buğda unu yükləyib, Gülablıdan Qalaya gəlir ki, unu satsın. Bu vaxt qalalı Hacı Allahverdinin oğlu bazara gəlib, o bir yük buğdanı mərhum Valehdən alır. Valeh Hacının qonağı olur. Hacının oğlu buğdanın haqqını qiymətindən az verir. Valeh olduqca inciyir, çox danışdıqdan sonra Valeh Gülablıya gedir və bu fərdləri yazıb, Hacı Allahverdiyə göndərir.**

## VALEHİN HACI ALLAHVERDİYƏ MƏKTUBU

Gəldi mehman ki, sənə, ey Hacı, zəvvari-Hüseyn,
Necə saldın yola, ey mənsəbi-hacəl-hərəmeyn?

Sənin oğlanının o canına lə'nət gəlsin,
Belə dəllallar imanına lə'nət gəlsin.

Lənət olsun belə Hacıdan olan övladə,
Cəbr edə mən kimi sərrafi-süxənustadə.

Mənim ardım sarıdan getdi imanın badə,
Sənin ağzına baxardı tamam el sövdadə.

Görmədinmi məni həcv eyləyən Abdullanı,
Elə zərb etdim ona, çıxdı…canı.

Şəhrdən çöldə, əgər gəlsə əlimə o əlin,
Sürürəm hər tərəfə, yerdə qalır cümlə dərin.

## BU ƏHVALATI EŞİDƏNDƏN SONRA KƏRBƏLAYİ ABDULLA VALEHƏ YAZIB

Valeh, nə əcəb zümzümeyi-sövti-xərin var,
Fəxr eylə ki, qanuni-hünərdən xəbərin var.

İncitdi məni acı sözün, tünd nigahın,
Ey nəxli-qəbahət, nə bəla təlx bərin var.

Aldatdı, sənin belini basdı Hacızadə,
Soncuqlama, bundan belə zəxmi-kəmərin var.

Qərbalə qoyub ardını bazardə satdın,
Sövdagər isən, yaxşıca sövdadə sərin var.

## VALEHİN KƏRBƏLAYİ ABDULLAYA CAVABI

Ey bic, sənin Canıdan özgə pədərin var?
Öndan sədəfi-sinədə pünhan gühərin var?

İncimədi heç acı sözündən dili-şirin,
Çün nəxli-xuram tuşəsən, acı samərin var.

Atam deyibən, Canıya qəmxar olursan,
Ondan, a xətadidə, sənin nə xəbərin var?

Bir mən kimi şair kişinin nütfəsi sənsən,
Bu şerü fəsahətdə ki, muncan hünərin var.

Ağzına yaraşmaz Canının sən kimi oğlan,
Bir sən kimi oğlan, kükü oğlu, Qəzərin var.

## KƏRBƏLAYİ ABDULLA CANIZADƏNİN MÜXƏMMƏSİ

Ey ki, zülmətgəhi-zülf içrə nurun misli-çiraq,
Məstü sərxoş gözünə qarşı yaman gözlər iraq,
Olmasın xaki-dərin guşeyi-çeşmindən uzaq,
Ləblərindən dəhənim dərdə dəva etdi soraq,
Söylədi ağzıma innabi-şəkər, sibbuxaq.

Baxdı mərdüm üzünə, saldı nəzərdən ayi,
Qıldı xəm şöhrəti-əbruyi-lətifin yayi,
Qədrü qiymətü lə'li-ləbin həmtayi,
Həvəsi-zülfi-siyahınla olub sövdayi,
Ki, çəkib məsəleyi-kakili-tərrarə daraq.

Görünür çöhrələrin lalə kimi gülgünü al,
Qoymadı al ilə ruyin görünə, oldu məhal,
Sürməni şux gözün fitnəyə saldı filhal,
Qıldı izhari-şərəf Kə'beyi-rüxsardə hal,
Üzünü sərdi qədəmgahinə gülgünyənaq.

Kakilin şaxələnir zinəti-duş etmək üçün,
Xoş gəlir həlqeyi-ləb hərfi niyuş etmək üçün,
Dil dilər şərbəti-güftarını nuş etmək üçün,
Həlqədən vəsfi-binaguşunu guş etmək üçün,
Bəhr açdırdı sədəfdən düri-qəltanə qulaq.

Gül xitab etsə sənə qönçə ona eylər itab,
Qönçə kimdir ki, o qarşı üzünə verə cəvab?

Baxsa mərdüm üzünə şərmdən olmazmı kəlab?
Nədir ayinə ki, kuyində səni eyliyə yab?
Əksi-rüxsarın ona olmuya mənada dayaq?

Düşsə ayinə müqabil, üzünə qılsa nəzər,
Ona üz vermə, nəzərdən sal onu şamü səhər,
Qazədən qoyma qala dövri-yanağında əsər,
Sürməvü vəsmə gözü qaşına meyl etsə əgər,
Sürməni sehrə salıb, vəsməyə et qaşüqəbaq.

Hüsnünə aşiqi-sadiq demə hər gümrahi,
Aşiq oldur, yaxa çərxi dili-atəşgahi,
İmtəhan eylə şəbi-hicrdə Abdullahi,
Şöleyi-ahinə gər yanmasa çərxin mahi,
Tiğ çək, başını kəs, şəm' kimi atəşə yax.

**Abdulla məktəbdə cavan çağlarında Mirzə Əziz adlı dostlarından birinə qələm yonan zaman belə demişdir:**

Cavan Mirzənin qəmi ürəyimi qələm kimi yonur,
Onun eşq aləmi məni hər dəm bir sövdaya salır.
Minlərlə misirli Yusif dostumun qarşısında dayansa,
Ona deyərlər, ey Əziz, sən bizim mövlamızsan.

## YENƏ DƏ

Bu zəmanədə ikiüzlü aşiq xoşdur,
Bir sifətli sadiq aşiq həmişə qəm çəkər.

## YENƏ DƏ KƏRBƏLAYİ ABDULLADAN RÜBAİ

Gülüstanda əgər sərv ağacı əkilərsə,
Bağbanlar sulamalıdır.
Yarımın ayağında curabı olsa, nə eybi,
Ermənilərin suya "cur" dedikləri məşhurdur.

## ABDULLANIN BEYTLƏRİ

Sorma, ey dil, ləblərindən kim, şəkərdir ya nəbat,
Qorxum ondandır ki, sorsan, bəlkə bu, qəndab ola.

Könül, müjgan oxundan qıl həzər, meyli-üzar etmə,
Gərək bir şəklilə mərdüm dolansın, qan olan yerdə.

## ABDULLA CANIZADƏNİN MİRZƏ HƏSƏN BƏY VƏZİRZADƏYƏ CAVAB MƏKTUBU

Ey Həsən, ey gözəl üzlü, gözəl bədənli,
Ey vəfa gülüstanının təzə gülü, təzə yasəməni,

Ey kamal məktəbində şahlıq kitabın yazan,
Ey dürr mənalı şeirlər yazan,

Ələ qələm alıb, yazmağa başlayan zaman,
Qələmindən Çin müşkünün ətri səpilər.

Ey günəş, ey ay, ey təzə-tər gül dəstəsi,
Ey qəlbin təsəllisi, ruhun munisi,

Ey şirindilli tutiyə bənzər,
Məktubun çatdı bizə, şad etdi bizi!

Beytül-həzəndə Yəqub kimi nə qədər qalım?
Nə rəvadır ki, Yusifimiz məndən uzaq düşsün?

Nə rəvadır ki, ürəyim qəm içrə kabab olsun?
Mən bu Şuşada nə vaxtadək ağlar olmalıyam?!

Ey qədəmlərinə dürr kimi göz yaşı axıtdığım,
Sənə qurban olum, ömrün uzun olsun.

Sənin zülfün kimi qəm sövdan başımızda ikən,
Halımız şamü səhər pərişandır.

Ya öldür, ya da üstümüzə kölgə sal,
Ya de ki, eşqin avarəsivəm.

Sənin müştaqınam, sənə şöhrət arzularam,
İstərəm çatasan sən mənə, ya çatam mən sənə.

**Vər. 42a**

## QƏNBƏR GÜLABLI

**12 cəmadiyəl-əvvəl, 1309-cu ildə yazılıb
(15 dekabr 1891 -ci il)**

**Qənbər Əhməd oğlu Gülablıdandır və Gülablıda doğulub. Orada da sakin olub. Gülablı Qarabağın Şuşa şəhərinə tabe olan kənddir. Valehin, Kərbəlayi Abdulla Canızadənin və Baba bəy Cavanşirin müasiri olub. Fars dilində də bir az savadı var idi. Öyrəndiyimə görə, yaşı həştada yaxın olanda vəfat etmişdir. Bir dəfə qış fəslində Valehin gözləri qara düşüb ağrıyırmış. Qənbər aşağıdakı şeirləri zarafatla Valehə yazmış.**

### QƏNBƏRİN VALEHƏ YAZDIĞI MƏZHƏKƏSİ

Göy daş ilə duz qoy ona, zəy bağla, qurum qat,
ey Valehi-məşhur,
Zərnixi göyərdi, götür tez ab ilə islat,
civə ilə məqdur.
Şura ilə şurabu piyaz, qədri də bat-bat,
bir qədr də nil ur,
Nişatırı tənbakiyə qat, anduzu qaynat,
həm sirkeyi-ənqur,
Bağla gözünün nuruna, çəkmə dəxi heyhat,
qoyma ki, ola kur.

Tiryak, iki misqal yarım suddü kən ilə,
ayranü qəra ot.
Mərguməşi əz, narın elə, həm kətən ilə,
əzvay ilə issot,
Malın ödünü rövğəni-qaratikən ilə,
mülhəq elə mərbut.
Məcmuunu yığ, cəm elə bir kasada qaynat,
qoyma daşa, savur.*

Qəvamə gəlib qaynasın on yeddi müdava,
düşür yerə dər dəm,
Çəkmə dəxi göz qəmini, xof eyləmə əsla,
dürüst elə mərhəm.
Xam bezə yaxıb qədri də pambıq elə peyda,
bağla onu möhkəm,

* Bu bənd təzkirənin həm avtoqraf, həm də çap nüsxəsində dörd beytdir.

Görməz gözün azar, qiyamət ola bərpa,
heç gəlməz ona nəm,
Görsə gözünün görməyin aləm qalı həm mat,
olmaz belə pürnur.

Qəyzanı deyim, sübhə nəhar eylə çox ayran,
arpa çörəyinən.
Narın şərabın içgilən üstən iki fincan,
yaz nüsxəsin öyrən.
Çaştə yegilən çadu qatıq, turp ilə soğan,
səhhət tapa bədən.
Şamə yegilən balıq qaxacunü dərağan,
ey arifi-pürfən.
Ömrün nə qədər var isə böylə keçir övqat,
olma dəxi rəncur.

Dünyada yemə sən dəxi ət, bal ilə vağı,
pəhriz elə pəhriz.
Ənari-şirin əmrud ilə meyvəyi-bağı,
nə yazü nə payız.
Qovun yemə, gər yandıra gözündə çırağı,
gecən ola gündüz,
Məcmu şirin şey ola gər ömrünü baqi,
ölsən, yemə hərgiz,
Göndərdi könül mürşidinə bir belə sovqat,
bir nüsxeyi-məzbur.

Sən tək təbibin gözləri azarə düşərmi,
yazdan bir ay ötmüş?
Bir göz ki, qırov olmaya gör, qarə düşərmi?
azardı bu batmış!
Korluq sənə bu vəqtdə, biçarə, düşərmi?
sinnin ola yetmiş.
Qənbər kimi gözün, aya, bir karə düşərmi?
söz yerini tutmuş.
Öz nüsxən olub indi sənin özgəyü isbat,
tut sən məni mə'zur.

## VALEHİN QƏNBƏRƏ CAVABI

Bu təb'ü təbabətliyi bir kəs bilə, haşa,
ey Qənbəri-məcnun,
Dərmanlarını görsə, qalır məhzü müqəvva,
Loğmanü Fəlatun.

Gözdən və nəzərdən səni hifz eyliyə mövla,
danayi-pürəfzun.
Bir sən kimi kəhhal dəxi xəlq etməyib əsla,
ol qadiri-biçun.
Qırx yeddi qələm göz dəvasın eyləyə peyda,
gözdən özü məğbun.

Allaha şükür, gözlərimin yoxdur azarı,
axmaz pıçalağı.
Bir güzgü alıb bax gözünə sən, səni tari,
gör korca bulağı.
Həcvinə görə gözləri kor olmaya bari,
kardır də qulağı.
Adətdi ki, sağlar kora gülməkdi mədari,
verməkdi qınağı.
Sağ gözlünü kor həcv edibən eylədi rüsva,
düşdü təzə qanun.

Bir gün gözümüz qara düşəndə nə gülərsən,
könlün nə olur şad?
İllər uzunu burnunu bəs niyə silərsən,
olmuş sənə mötad?
Göz ağrısına pəhrizi qeyzanı bilərsən,
çün öyrədib ustad.
Bəs niyə qara mal kimi quyya yıxılırsan,
gər olmasa irşad?
Öz eybinə kor ol, dəxi çox söyləmə bica,
danışma bu məzmun.

Bircə dəva var, saxlamışam onu nıhan mən,
indi deyirəm, qan.*
Şagirdsən əgər məndən eşit onu da öyrən,
olsun sənə dərman.
Çox gözləri də sağ elə korluq ələmindən,
qıl özünə ehsan.
Gizlincə deyim, çırtta quşun suyunu əz sən,
doldur iki fincan.
Tök gözlərinə, gözlərin olsun belə bina,
gəzmə belə məhzun.

Valeh o zamandan ki, olubdur sənə yoldaş,
ol xoş qədəmindən.

---

* Bu bənd təzkirənin çap nüsxəsində yoxdur.

Yaxmadan olub gözləri manəndeyi-xəffaş,
gərək qaça gündən.
Bizdə yenə sağ gözdü, görər, qədri gedər yaş,
həqqin kərəmindən.
Sənin başına, ey biçarə, eylə düşüb daş,
dövran sitəmindən,
Görmək sənə olmaz dəxi ölüncə mühəyya,
səd dövr edə gərdun.

**Vər. 45a**

## YUSİF KOSA QARABAĞİ

**Yusif Kosanın əsil-nəsəbi mənə aydın olmadı və ancaq məlumdur ki, o, Qarabağ əhlindən, köhnə şairlərdəndir. Vaqifdən və birinci hissədə adları çəkilmiş şairlərdən əvvəl yaşamışdır. Şeirlərini tapa bilmədim. İndi də onun şeirlərindən bir beyti tapıb yazıram:**

Ürəyim qan oldu, yaxşı oldu, çün belə də olmalı idi,
O yaxşıdır ki, sənin zülmündən oldu, belə də olmalı idi.

**Vər. 45b**

## MİRZƏ MƏRİZ

### Hicri 1309 (miladi 1891-92)

**Mirzə Məhərrəm Hacı oğlu, əsli Güvəndükdən olmasına baxmayaraq, Qarabağın Şuşa şəhərində anadan olub. Əvvəllər yoxsul və miskin idilər. O vaxta qədər ki, bir növ ilə rus və fars elmində mahır oldu, get-pedə rütbə və mənsəb sahibi oldu.**

**Belə ki, rus dövlətinin sayəsində şərəf sahibi oldu, rus sərdarının yanında Tiflisdə ona böyük bir mənsəb verdilər. Qırx beş yaşında bu dünyadan köçənə qədər o, mənsəb başında idi. Bəzən şeir də demişdir. Deyirlər ki. pərakəndə şeirləri var və təxəllüsü Mərizdır. Ancaq şeirlərindən aşağıda verilənlərdən başqa mənim nəzərimə çatmayıb. Əlimə düşən şeirlərini aşağıda yazmışam:**

## MİRZƏ MƏRİZ

Boğazıma bir neçə xəncər çək ki,
Sənin önündə aləmi tərk edim.

Deyirlər dünyada qiyamət olmaz,
Mən isə sənin hicrində neçə məhşər gördüm.

Dilbərlivin qanununu bilməyən dilbərlərin,
Dilbərliyindən dad çəkirəm.

Gər əlindən bir neçə badə içsəm,
Məstlikdən heç qiyamətədək ayılmaram.

Rəhmsizliklə belə aşiqləri incitmə,
Rəhm et, sən, belə qəmçəkənlərə.

Ey könül, şux gözlərə can verirsən,
Yoxsa kafirlərdən vəfa umursan?

Bədxasiyyət, o uşağın hiyləsinə bax ki,
Öz qəmi ilə neçə ölkələr viran edibdir.

* * *

Nə görüləsi əhvalım var,
Nə eşidiləsi dərdim var.

Gecələr qəmindən yata bilmirəm,
Sənin eşqinlə qərar tutmaq olmur.

Mən yazığın dərdini soruşmayın,
Çünki bu dərd çəkiləsi dərd deyildir.

Qanadıma yüz daş belə vursalar,
Onun gülşənindən uçmayacağam.

Qəmdən canım boğaza yığışıb,
Mənim dərdimə əlac yoxdur.

Min cür həsrətdən ölüb qurtardım,
Sənin qəm zəhərin dadılası deyildir.

**Vər. 48a**

## MİRZƏ ƏLİ

**Mərhum Mirzə Əli Mirzə Haqverdi oğlu Qarabağ vilayətinin əhalisindəndir. Qarabağın Şuşa şəhərində birinci qazı olmuşdur.**

**Cənab xanlar xanı Mehdiqulu xan İbrahim Xəlil xan Cavanşir oğlunun xanlığı zamanı sağ idi. 1255-ci ildə (miladi 1839-1840) vəfat etmişdir.**

**Tanınmış alim olub, tibb elmində də məharəti var ıdı. Deyilənə görə, hərdən şeir də demişdir.**

**Belə ki, bir gün hazırcavab və məzəli bir şəxslə öz evində oturub söhbət edirdi. Onun Zöhrə adlı bir kiçik qızı var idi, görkəmsiz. Söhbət vaxtı qız qapıdan içəri daxil olur. Bu vaxt onun çirkin sifətini görən Mirzə Əli bədahətən bu fərdi (beyti) söyləmişdir:**

Əgər o, axıra qədər bu surətdə qalsa,
Bizim Zöhrəyə Müştəri tapılmayacaq.

**Vər. 50a**

## QASIM BƏY ZAKİR XINDIRISTANİ

**Qasım bəy Qarabağın bəyzadələrindəndir. O mərhumun doğulduğu yer Xızrıstan (Xındırıstan) kəndidir, olduğu yer isə Şuşa qalası. 1259-cu ildə (1843) sağ idi və mən onu görəndə təqribən 55 yaşı var idi. 1271-ci ildə (1854-55) vəfat etmişdir. Xoş sifət, ağ. ucaboy, incə qamətli və göygöz bir adam idi. Həmişə mənim Qurandan dərs dediyim məktəbin qarşısında oturacaq yerində əyləşərdi. Hər dəfə də əlində qələm və kağız olardı və şeir yazardı. Çox vaxt incə həcvlər deyərdi, türk (Azərbaycan) və fars dillərində qəsidə, qəzəl, müxəmməs, dördlüklər yazıb hamıya verərdi. Mərhumun təxəllüsü Zakir idi. Hal-hazırda onun şeirləri pərakəndə halında qeyd olunub və məlumdur. Ancaq divanı yoxdur. Aşağıda yazılan şeirlər o cənabın təbinin məhsuludur.**

### ZAKİRİN QƏZƏLİ

Sənə hər mətləbi məxfi dedim, ey gül, əyan tutdun,
Rəqibi-ziştkarın aşikar eybin nihan tutdun.

Oğurlar dövri-ruyində səfi-zülfün ərəq nəqdin,
Nə pakizə əmin tapdın, nə yaşxı pasiban tutdun.

Keçirdin bitəkəllüm şanədən geysuyi-pürpiçi,
Sənə ənam lazımdır ki, əfsunsuz ilan tutdun.

Kilidi-məxzəni-hüsnü sipahi-cənnə tapşırdın,
Hər iş ki, tutdun aləmdə, elə biimtahan tutdun.

Danışdın qaşü-göz ilə hər yetən naəhlilə, zalım,
Şikəstə Zakiri gördükdə ox çəkdin, kəman tutdun.

### ZAKİRİN QOŞMASI

Sifariş etmişəm badi-səbadən,
Görən dərdim o canana deyərmi?
Dolanıb başına misli-pərvanə,
Od tutuban yanə-yanə deyərmi?

Bu mükəddər dili-zarə keçdiyin,
Əl çəkməyib, varə-varə keçdiyin.
Uzun illər günü qarə keçdiyin,
Siyəh zülfi pərişana deyərmi?

Səg rəqibdən məclis olanda xali,
Çəkib bir kənarə çeşmğəzali,
Üzün təmənnası, ləbin xəyali,
Binəvanı salıb qanə deyərmi?

Səbadən olmasa əgər bir çarə,
Cürət edib ərz etməyə o yarə,
Bu əhvali o türreyi-tərrarə,
Mərhəm olan, görən, şanə deyərmi?

Zakirəm, kuyindən avarəyəm mən,
Karü şüğlüm olub naləvü şivən,
Yad eləyib bir yol, yarəb, görəsən,
"Harda qaldı o divanə" - deyərmi?

## ZAKİRİN QƏZƏLİ

Dün hökm qıldı qətlimə ol məh şitab ilə,
Şad eylədi gədasını bu xoş cəvab ilə.

Olsun qəra yüzü, görəlim, qanlı qəmzənin,
Öldürmədi məni, yenə qoydu əzab ilə.

Zülfisiyahlər qəmini şam ta səhər,
Ömr dirazdır, çəkirəm piçü-tab ilə.

Gündüz üzün qəmi, gecə zülfün kəşakəşi,
Asayişim nə xürdlə hasil, nə xab ilə.

Öl gül'üzardə ərəqin xoş səfası var,
Turfə budur ki, saziş edər ataş ab ilə.

Öldürməsin nə sud mənə bərqi-tiğdən,
Mümkün deyil ki, sirab ola təşnə sərab ilə.

Zakir o şux nərgisi-məstin xərabidir,
Böylə sərxoş olmaq olurmu şərab ilə?!

## QƏZƏL

Yox məndə bəs ki, tabü təvan hicr dağına,
Çarə odur, yıxam özümü xüm əyağına.

Sərməst, kafirəm, çıxa meyxanədən əgər,
Zöhd əhlinin dəyə meyi-gülgün dodağına.

Yüz fərqi var badə ilən abi-kövsərin,
Su içsin, ol kəsin dəyə bu söz damağına.

Hər kim dilərsə rahəti-dünyavü axirət,
Yıxsın özünü piri-muğanın bucağına.

Pürpiç zülfü qaməti-sərv üzrə, guyiya,
Mari-siyahlərdi çıxıb gül budağına.

Kəs şəm' başını, uzadır dil üzarına,
Zahirdə baxsa hiylə ilə ağlamağına.

Xari-müjəmdən etməsə əndişə, Zakira,
Ol sərvqəd basanda qədəm göz bulağına.

## YENƏ ZAKİRİN KƏLAMI

Heç üşşaqə məgər rəhm nigar etməz imiş,
Mütləqa sərzənişi-xəlqdən ar etməz imiş.

Desə hər kim qəmi-hicrində: filan biçarə,
Səxt rəncurdir, ol suyə güzar etməz imiş.

Əhdü peyman edərmiş, vəli ol səngindil,
Ani vahid sözünün üstə qərar etməz imiş.

Kaş bədhalü bədəhval olaydın, Zakir,
Çünki hal əhli ilə çərx mədar etməz imiş.

## YENƏ MƏRHUM ZAKİRİN QƏZƏLİ

Üzünü görsə əgər gəbrlər, imanə gəlir,
Küfrdən əl götürüb, rahi-müsəlmanə gəlir.

Baxa gər ruyinə ayinə ilə abi-rəvan,
Feyzi-ruhə yetişib, hər ikisi canə gəlir.

Gün sərasimə səri-kuyinə ilqar eylər,
Necə bir qul ki, durub dərgəhi-sultanə gəlir.

Xət bu məzmunladır dövri-ləbində, guya,
Ləşkəri-hind tutub Rumi Bədəxşana gəlir.

Qorxaram Zakiri hicrin qəmi bir halə sala,
Görən adəm deyə: "Vay-vay, budu, divanə gəlir".

## ZAKİRİN FARSCA TƏXMİSİ

Qılmanlar və hurü mələklər qapının torpağını arzu edərlər,
Can-başla gecə-gündüz səni axtararlar,
Ola bilsin, xoşbəxt olub dövrəsinə dolansınlar,
Kənanilər əgər gül üzünün ətrini duysalar,
Heç Misr gülşəninin havasını arzulamazlar.

Sənin gözəlliyindən göylər də dəyişib,
Buludlar bir an belə qərar tutmazlar,
Xəcalətdən ay üzünə niqab çəkər,
Günəşin üzü ayaqların altda paymal oldu,
Münkirlərə de ki, səninlə üz-üzə dursunlar.

Qafil deyilsən, zavallı ürəyimdən agahsan,
Ancaq rəhmsiz, vəfasız dilbərsən,
Yarın qəlbin almağa heç bir ümid qalmayıb indi,
Könül istər ki, ləb-ləb üstə qoyaydın,
Min ildən sonra ki, torpağı sürahi olanda.

Üzünün Kəbəsinin ətrafında gədalar dolanırlar ki,
Sənin qəmzə xəncərindən bəlkə qətrə dadalar,
Bu ləzzət qismət olsa əgər, şah başının tacı olarlar,
Mələklər dəstəsi ona baxmaq üçün səf çəkərlər,
Hər yerdə sənin eşq qurbanlarını yuyarlar.

Qiyamətdə də gözəlliyinin həvəskarı az olmaz,
Çünki onlar zahidlər kimi məqsədsiz (üsulsuz) deyillər,
Aşiq olmayan kəs heç vaxt ağıllı adlanmaz,
Eşqi dananların pərəstişi qəbul deyil,
Hətta yüz dəfə Zəm-Zəm bulağında dəstəmaz alsalar belə.

Hicran gecələrində həsrət məni yandırdı,
Artıq qüslü kəfənə mənim ehtiyacım yoxdur.

Ey mərhəmətsiz ayım, atının dırnağı ziynətdir mənə.
Eşqin məni elə yandırıb ki, qarışqalar gorda belə,
Bir üzv tapmadılar ayaq bassınlar.

Hicran dərdi səbrin kökünü kəsdi,
Bizim varlığımızı tamam sarsıtdı.
Zakir, əgər qəlb qapısını özün açmasan,
Yar qəmlərinin özləri könlünə daxil olarlar.
Gizlincə de ki, qəlbini pak etsinlər.

## ZAKİRİN QOCALIQDAN ŞİKAYƏT HAQQINDA MÜXƏMMƏSİ

Ah kim, aldı mənim əqlü kəmalım qocalıq,
Eylədi misli-xəzan çöhreyi-alım qocalıq,
Bidi-məcnun tək əyib sərvi-nihalım qocalıq,
Günbəgün etdi füzun dərdü məlalım qocalıq,
Doladı dəstinə əfsus ki, yalım, qocalıq.

Əlliyə yetəndək bilməz idim quru, yaşı,
Həll edərdi əngim mum kimi qarə daşı,
Gördüm altmışda qatı loğmalara yoxdu xoşi,
İndi it yalı kimi gündə gərək qaşıq aşı,
Zindəganlıqdımı bu, ağrını alım, qocalıq?

Azularımda qalıb bir neçə övraq dəndan,
Kargər düşməz o da səxt təamə çəndan,
Dolaşa dəməyinə oxşar edəndə xəndan,
Abgüşt ilə gərək müttəsil acıtmalı nan,
Kimə məqdurdu bu, orduna salım, qocalıq.

Dolanırdı necə ki, var idi təndə qüvvət,
Gündə pərvanə kimi başıma yüz gəz övrət,
Hər evə düşsə yolum, əhli çəkərdi minnət,
İndi öz sahibi-xanəm mənə etməz rəğbət,
Nə ümid ilə gedib özgədə qalım, qocalıq!

Duş gördüm neçə məhparə edir seyri-çəmən,
Ayağın öpmək üçün səmtlərinə düşdüm mən,
Gəldi güftarə biri söylədi: “Key piri-kühən,
Nə gəzirsən burada, yoxsa azıbsan köçdən?”.
Rişxənd mənzili etdi məni zalım qocalıq.

Hər sənəm görsə deyərdi əcəb oğlandır bu,
Ya Fəramərz, ya da Rüstəmi - dəstandır bu,
Xoş onun halına kim, bir gecə mehmandır bu,
Gülüşüb indi deyərlər hansı Vartandır bu,
Çünki etdin belə, tiz ilə zəvalım, qocalıq.

Hanı ol sərv ki, görərdin gecələr ayə baxar,
Sübhlər tövsini-sərxoş kimi səhrayə baxar,
Gəh zəni-dəllakə, gəh duxtəri-mollayə baxar,
İndi san xəstə qoyub baş mütəkkayə baxar,
Kəsdi eşqü həvəsi-zövqi-vüsalım qocalıq.

Tuf sənə kim, məni zövq ilə səfadən saldın,
Nəzəri-mərhəməti-mahliqadən saldın,
Hər iki çeşmi-cəhanbini ziyadən saldın,
Şahbazi-həvəsim övci-həvadən saldın,
Sındıdın səngi-sitəmlə pərü balım, qocalıq.

Gər mənə ruyi-zəmin simü zərü dövlət ola,
Asitanəm, eşigim rəşki-dəri-cənnət ola,
Puşişim xosrovü xaqan verən xəl’ət ola,
Neylərəm oni ki, kələz dalı kimi qət-qət ola,
Sifəti gərdəni-ayinə misalım qocalıq.

Qorxuram çərx mənə zülmi-mükərrər eləyə,
Ağqız oğlu Piri tək dillərə əzbər eləyə,
Qaralar Şəmmiyə hörmətdə bərabər eləyə,
Axırı Hatəm ağadan dəxi bədtər eləyə,
Çörü çöp dərməyə də qoymuya halım qocalıq.

Gərək indən belə qapıda bürünüb gəbəni,
Qoymuyam qarğa-quşu sərgidən apara dəni,
Ki, məbada ura övrət üzümə ta siləni,
İltimasım budu kim, öldü, xilas eylə məni,
Oğul-uşaq əlinə vermə saqalım, qocalıq.

Zakirəm, türfə xiyaban ilə bağım vardır,
Yatmağa, durmağa zəngin otağım vardır,
Nə qədər aşü plov yesə qonağım, vardır,
Yaxşı nəvvadələrim, oğul-uşağım vardır,
Yoxdu bir özgə qəmim, fıkrü xəyalım, qocalıq.

## MƏRHUM ZAKİRİN QƏZƏLİ

Geyib gülgün qəba sərvim, durub gülzar arasında,
Sanasan şaxsari-gül durub gülnar arasında.

Gözümdən, ey kəmanəbru, sərasər keçdi peykanın,
Bir əndək saxladım bu dideyi-xunbar arasında.

Siyahbəxtü pərişan olduğumdan qəsdim oldur kim,
Gəzəm bu rənglə ol türreyi-tərrar arasında.

Səgi-kuyinlə tutsam cəng, tut mə'zur, soltanım,
Qapıda qilüqal olmazmı xidmətkar arasında?

Səhər pərvaz edəndə zülfi-müşkin dövri-ruyində,
Görən der zağlərdir gülşənin oynar arasında.

Qaçıbdır tə'ndən Fərhad kuhə, Qeys səhrayə,
Mənim tək daşlanan kimdir dərü divar arasında?

Arasında nə nisbət qeyrlər cananilə canın,
Dil olsun olsa da, Zakir, yenə naçar arasında.

Hərimi-məhrəmi-bəzmi-səri-kuyi olan Zakir,
Rəvadırmı gəzə biganəvar əğyar arasında?

## QƏZƏL

Bayram günüdür, zövqü səfa xanələr içrə,
Cananım oturmuş neçə cananələr içrə.

Bir hiylə ilə gizlənərəm zülf arasında,
Pünhan gedə bilsəydim əgər şanələr içrə.

Könlüm quşu pərvaz edər kuyi-nigarə,
Zahir ki, onun qisməti var danələr içrə.

Dil mülkünə göndər həşəmi-dərdü fəraqi,
Şənlik düşə ta bəlkə bu viranələr içrə.

Hicran qəminin badeyi-gülgündür əlacı,
Vazeh danışırlar bunu meyxanələr içrə.

Əzbəs ki, mənə şəfqəti var piri-müğanın,
Camım doludur gör neçə peymanələr içrə.

Ha böylə məni əql xərab eylədi, yoxsa,
Bir adəm idim əvvəli divanələr içrə.

Haşa, çəkib əl həmdəmi-dirinələrimdən,
Bir də dolanam aqilü fərzanələr içrə.

Kəm tutma rəhi-eşqdə bu Zakiri kim, var,
Yanmaqda onun şöhrəti pərvanələr içrə.

## YENƏ ZAKİRİN QƏZƏLİ

Rəqibi görməyə mümkün olaydı yarım ilə,
Gedərdim ol səri-kudən öz ixtiyarım ilə.

Gəzərdim itləri içrə o dərdə bipərva,
Ziyadə tapmış idim rütbə etibarım ilə.

Hər ay başında bir ox navəki-qəmzədən ücrət,
Gərək mənə yetişə, şərt budur nigarım ilə.

Qoyanda qəbrə məni örtməyin, gəlib dilbər,
Nə güftgu edəcək, ta görüm, məzarım ilə.

Töküb sirişk gözündən deyərmi: "Ah, əfsus,
Ki, həsrət öldü bu biçarə intizarım ilə".

Təğafül eyləsə bir dəm o səngdil deyərəm,
Fəğan ilən tutuban damənin qübarım ilə.

Bağışla cürmümü, ey şux, kim, həyatımda,
Çox etmişəm səni azürdə  ahü zarım ilə.

Rəqibi mərhəmi-bəzmi-vüsal eyləmə kim,
Cahana od salaram ahi-pürşərarım ilə.

Xudaya şükr ki, basdın məzarım üstə qədəm,
Şikəstə Zakirəm, əhdim bu idi Tarım ilə.

## YENƏ ZAKİRİN QƏZƏLİ

Məni bir zülfi-mişkinin qəmi aşüftəhal eylər,
Gətirsə nıkhətin badi-səba, dəf'i-məlal eylər.

Qalıbdır bəstəri-möhnətdə dil, vəslin dilər yarın,
Görün bu zə'f talelə necə fikri-məhal eylər.

Sərasər xəlqi-aləm cümlə müştaqi-cəmalındır,
Göz açmaz kimsə, gün hərçənd izhari-cəmal eylər.

Mən öldüm həsrətindən bir büti-çeşmi-çəhəndazın,
Qətili-tiri-müjgandır, deyin, hər kim sual eylər.

Qılır əğyarlə seyri-çəmən sərvi-sərəfrazım,
Şikəstə Zakiri hər yerdə görsə, payimal eylər.

## YENƏ

Cahanda varmı bilən dərdi-eşqə bir çarə?
Bu eşq o eşqdi Məcnuni qoyubdu avarə.

Bu eşq o eşqdi Fərhadə dağı çapdırdı,
Axırda tişəni başına urdu biçarə.

Bu eşq o eşqdi Sən'an dinini atdı,
Buraxdı məzhəbini, səcdə qıldı zünnarə.

Bu eşq o eşqdi, bir erməni qızına Kərəm,
Axırda vəsl oduna yandı zarü biçarə.

Bu eşq o eşqdi Mənsuri darə çəkdirdi,
Töküldü qanı onun çarsuyi-bazarə.

Bu eşqə heç kəsi, ey xuda, düçar etmə,
Bu eşqə mən düşəli olmuşam günü qarə.*

## ZAKİRİN BÖYÜK BƏYDƏN TƏZƏ TƏXT İSTƏMƏSİ

Ey Böyük bəy, sən bizə verdiyin təxt,
Mənim dişlərim tək övraq olubdur.
Çürüyübdür payələri sərasər,
Bir dutumdan hələ alçaq olubdur.

Pozulubdur, dağılıbdır hər yanı,
Əgər göndərəsən usta Sehranı,
Yəqin bil ki, yoxdur qurmaq imkanı,
Bir növ ilə gərdənbucaq olubdur.

* Təzkirədə son beyti olmayan bu qəzəlin Qasım bəy Zakirə aid olması şübhəlidir.

Bir payəsin mıx çalmışam danaya,
Birisi gəlmədi heç ovsanaya,
Birin  övrət paz yondurub hanaya,
O birindən əcəb toxmaq olubdur.

Dağılıb, iqlimi-İranə dönüb,
Yıxılıb, sərayi-viranə dönüb,
Əyilib qaməti, piranə dönüb,
Tamam parçaları çuynaq olubdur.

Neyləsin, işlənir müddətdən bəri,
Qalmayıbdır hərgiz şənlik əsəri,
Sındıqca vonulub döşəmələri,
Eni, boyu iki barmaq olubdur.

Lazımdır qocadan eyləmək həzər,
Ölməli olubdur, bivəch gəzər,
Hər zaman uzansam, böyrümü əzər,
Sanasan ki, quru qaltaq olubdur.

İp ilən baş-başa çatmalı deyil,
Götürüb ocağa atmalı deyil,
O qədər gödəlib, yatmalı deyil,
Uşaq beşiyindən qıvraq olubdur.

Natəvanam, birə mənə güc eylər,
Heç bilmənəm yerdə yatan nec eylər,
Ta sübhədək qaşınmaqdan gecələr,
Varəndamım dırnaq-dırnaq olubdur.

Rəncü-təəb əsər etməz qalına,
Axşamadan yük götürə dalına,
Mən zərdü-zəifəm, xoşa halına,
Hər kim ki, sənin tək topcaq olubdur.

Ey mə’dəni-səxa, ey kani-kərəm,
Gərəkdir gözləyə adəmi adəm,
Bəxş eylə Zakirə bir təxti-möhkəm,
Qoyma, xabgahım çardaq olubdur.

**Vər. 58a**

## MİRZƏ MEHDİ BƏY ƏLİ BƏY OĞLU SARICALLI*

**25 ramazan əl-mübarək, 1309-cıı il (21 aprel, 1892 )**

**Mirzə Mehdi bəy Əli bəy oğlu Sarıcallı Qarabağ əhlindəndir, yuxarıda göstərdivimiz tarixdən təqribən iyirmi beş il əvvəl Allah rəhmətinə gedib. Uca boylu, xoşsifət, vüqarlı, zarafatcıl və ağıllı bir kişi idi. Şeiri sevirdi, özü də bəzən şeir deyirdi. Mənə dedilər ki, müxtəlif şeirləri var, ancaq mən görməmişəm.Gördüyüm aşağıdakı şeirlərdir ki, yazıram:**

### MEHDİ BƏY TİFLİSDƏN MİRZƏ İBRAHİM SƏBANIN ƏHVALINI RƏHİM BƏYƏ YAZIR

İbrahimin halın, mətai-əkrəm,
Mərhəmət yolilə alsanız xəbər,
Dolanır bazarda səfil, sərgərdan,
Şimdi sizin üçün çəkdirir çəpər.

Adəm idi fəqir zəmani-mazi,
İki yüz manata olmazdı razi,
Bu yerdə sataşıb cənabi-qazi,
Edibdir uçquldan** onu dərbədər.

Sifətinə görə yoxdur xoş halı,
Xiffətindən lap çallanıb saqqalı,
Əgər keçsə onun belə əhvalı,
Yəqin bil ki, başın alıban gedər.

Mübtəlayi-həlva, mədəyə əsir,
Söhbətləri tə'vil, qaməti qəsir,
Soruşsan ki, ona nə idi təqsir,
Yazdım necəliyin sənə müxtəsər.

Yaxşı deyil sözü qırmızı demək,
Qaziyə məlumdur, etmənəm hənək,

---

* Əlyazmada Sarıca Əlili kimi yazılsa da toponim kimi Sarıcallı qəbul olunmuşdur.
** Şkoladan – yəni, məktəbdən

Fəqirin başını kəsdi şəm’ tək,
Çirağ söhbətindən var idi kədər.

Çəməni-damaği olubdur örən,
Yüz hərifin daim cavabın verən,
Hanı o İbrahim, hanı sən görən,
Qan ağlarsız onu görəsiz əgər.

Gedibdir bilmərrə gözünün nuru,
Quruyub çöp kimi, olub qupquru,
Dəyişilib rəngi, düşübdür suru,
Saqqalının ardı ağarıb yeksər.

Halva yeyər olsa iyirmi bükün,
Çefaidə, onun tökdülər tükün,
Bundan sonra gərək bağlayıb yükün,
Axirət səmtinə eyləsin səfər.

Sizin yolunuzda çox çəkib əmək,
Mənə lazım deyil şərh edib demək,
Çalışın, işində eyləyin kömək,
Aşinalıq tərzi belə olur məgər?

**Vər. 60a**

## CƏFƏRQULU XAN ARİF

**1309-cu il (1892-ci il)**

**Qarabağın sabiq hakimi mərhum Cəfərqulu xan Məhəmməd Həsən ağanın oğlu, o da rəhmətlik İbrahim Xəlil xanın oğludur. Mən onu təqribən həştad beş yaşında görmüşəm. 1283-cü ildə (1866-186) Allah rəhmətinə gedib. Ucaboy, iri cüssəli, enlibədən bir adam idi və deyilənə görə, cavanlıqda çox güclü və qüvvətli olub. Şücaətli olması üz- gözündən məlum olurdu. Mən onu at minən vaxt görmüşəm, az qalırdı ki, ayaqları atın yəhərindən yerə çatsın. Musiqisevər bir şəxs idi. Onun məclisində həmişə sazü nəvaz, tar və tənbur, çəng və çəğanə, xanəndə və müğənnilər olurdu. Özünün də musiqi elminə — rastgah və muğamata, onun şöbə və guşələrinə bələdçiliyi çox idi. Bərbütdə hər cür musiqini çalırdı. Oyunbazları, fokusçuları sevirdi və onun məclisində həmişə belə adamlar tapılardı. Çox vaxt başqa vilayətlərdən gəlmiş pəhləvanlar onun huzurunda güləşərdilər. Erkək dəvələri, öküz və qoçları bir- birinin üzərinə salar, xoruz və kəklik döyüşdürər, it boğuşdurardılar. Mərhum zarafatı çox sevirdi. Çox vaxt mollalarla zarafatyana şeirləşərdi və bədahətən rəğbətli şeirlər deyərdi. Hər gün onun süfrəsinin başında 30-40 adam oturardı.**

**Özü nə yesəydi, qonaqlara da ondan yedizdirərdi. Vəfat edən vaxt maddeyi-tarix yazıb onun böyük oğlu mərhum Hidayət ağaya göndərdim. O maddeyi-tarixdən bir neçə fərdi bu dəftərə yazıram.**

### CƏFƏRQULU XANIN VƏFATI MÜNASİBƏTİLƏ TƏZİYƏNAMƏ

Əfsus, cəfakar zəmanənin gərdişinə ki,
Gül kimi ürəklər onun əlində xar oldu.
İbrahimxəlil xanın bağı xəzan oldu,
Səmum küləyindən gülzarının sərvləri soldu.
Əziz adlı Cəfərqulu xan,
O şəhryar, təmizrəftar hanı?
O, cəlalda zamanının Keyxosrovı idi,
Həşmətdə Cəmşid kimi idi.
Ərəstun onun idrakı qarşısında şagird idi,
Əflatun onun müvəffəqiyyəti qarşısında divar nəqşi idi.
Döyüş zamanı iti qılınc idi,
Həmlə zamanı nərildəyən şir idi.
Bu şirin sözlər ondan yadigar qaldı,
Biz onun şagirdi, o, şairlər ustadı idi.

Onun elm və mərifət süfrəsində daim,
Bərmək övladları həsrətdən ciyər qanı içərdilər.
Ehsan edəndə Hatəmi-Tai xəcalətdən,
Dodağın dişləyib, divar küncünə qısılardı.
Heyf ki, ehsan süfrəsi puç oldu,
Heyf ki, səyyar ulduz məhv oldu (söndü).
O nurlu günəş batdı,
O parlaq ay tutuldu.
O məhbub əcəl saqisindən məst oldu,
Peymanə alıb, ayıldı.
Elə ki saqidən əbədilik şərabını içdi,
Piri-xummardan "nuş olsun" səsini eşitdi.
Heyf ki, ədalətli xan dünyadan getdi,
Heyf ki, pərgarın qütbü viran oldu.
Təmiz ruhu quş kimi qanad açdıqda,
İldırım kimi behişt qəsrinin damına qondu.
Çəmənzarda cənnət quşu əyan olan kimi,
*Quş və dam*dan (1283) – (1866-67) onun vəfat ili yarandı.
Möhsün, dünya gülşənilə nə nazlanırsan,
Ki, qış vaxtı gəldi, huşyar ol!

## CƏFƏRQULU XANIN MİRZƏ ƏBÜLQASIM QAZİNİ HƏCV ETMƏSİ

Əla, ey munisi-dirinə qazi,
Yetirdin sinnini sittinə, qazi.

Sanırsan çinə yoxdur kim, bu yerdə,
Gedər quş qanda olsa Çinə, qazi.

Oxuduram, bilirsənmi, görəndə,
Sənə "vəl fəcr"ini[*] tərsinə, qazi.

Nə yaxşı minbər üstə çıxmayıbsan,
Giribsən hücrənin küncünə, qazi...

## CƏFƏRQULU XANIN MİRZƏ ƏBÜLQASIM QAZİNİ HƏCV ETMƏSİ

Matəmi böylə tutarmış məgər adəm, qazi?
Edə lə'nət ona bəs sahibi-matəm, qazi?

Sən necə zamin olurdun, kişi, dava olmaz?
Bu sözü rus yanında dediniz həm, qazi.

---

[*] Qur'an, əl-Fəcr surəsi, 1-ci ayə.

Sən məgər halını, öz əhlinizi bilməzdin?
Zərrəcə bəd əməlindən eləməz qəm qazi.

Özgə davada olan kəslər alır simü zəri,
Qırdırır şişəlini müftü müsəlləm qazi.

Zahirən qəl'əlinin qətlə gedirdi nisfi,
Olmasaydı aralıqda yenə Rüstəm, qazi.

Daima və'z verir xəlqə ki, ehsan eləyin,
Özü heç dişqarı verməz ola gər nəm qazi.

Daş-daş üstə belə Şişədə durmaz hərgiz,
Bəzi işlərdən əgər olmuya ə'ləm qazi.

Əhli-İslamə gərəkdir ki, gedə rast yolu,
Bunlann əyriliyi qəddim edib xəm, qazi.[*]

Adını molla qoyan xəlqə deməz rast yolu?
Bunların dərdi edibdir qədimi xəm, qazi.

Unudurlar hamısı Tanrı, peyəmbər əmrin,
Gər aralıqda ola söhbəti-dirhəm, qazi.

Bir para vəqt danışmaq bizə lazımdır, leyk,
Bir para vəqtdə yeydir olaq əbsəm, qazi.

Demişəm mən sənə: heç vaxt inanma xəlqə,
Bəzi ovqat eşit pəndimi kəm-kəm, qazi.

Bundan artıq nə yazım dərdi-dili, mövlana,
Deyərəm baqi sözümü səni görsəm, qazi.

## ZAKİR BƏYLƏRBƏYİ MİRZƏ CƏFƏRQULU XANA ONUN EVİNDƏ AYAQQABILARI OĞURLANDIĞI ÜÇÜN YAZMIŞDIR

Bəylər, nə layiqdi xan qulluğuna,
Bir kəs atlı gedə, piyadə gələ?
İldə bir yol düşər mənim güzarım,
Vay onun halına, ziyadə gələ![**]

---

[*] Bu beyt təzkirənin avtoqraf nüsxəsində yoxdur. Çap nüsxəsindən alınıb.

[**] Bu misra doğru olaraq Zakirin nəşr olunmuş əsərlərində "Gələ gör bir adam muradə gələ" kimi getmişdir.

Böyügün dərində lazımdır dərban,
Axşamdan ola bəndeyi-fərman,
Təmənnasız gələn olur peşiman,
Vay onun halına, ziyadə gələ.

Oğurluğa əcəb olubsuz mötad,
Həmrahi-birahın dad əlindən, dad.
Gedəndə şad gedir, gələndə naşad,
Hər kimsə ki, sizin bərbadə gələ.

Gəlməyən adama deyirsiz gəlin,
Müşküldür qayıtmaq ayağı yalın,
Mən genə qıvrağam, Adıgözəlin,
Gərək dalısınca ərradə gələ.

Məsəli-məşhurdur: "Quş dənə gedər",
Sizdə bir nəf' yox, savayi-zərər,
Gəlməz o qapıya heç kimsə məgər,
Horadiz, Quyucaq fəryadə gələ.

Mundan sonra girən xanın evinə,
Gərək başmaqların soxa cibinə,
Ya keçirə saf otağın dibinə,
Nə isə, muhəyya, amadə gələ.

Lazımdır tərəddüd xeyirdə, şərdə,
Ədalət üzünə çəkibsiz pərdə,
Bir tə'ziyə olsa xudanəkərdə.
Gümanım yoxdur ki, molla da gələ.

Bir adam təyin et astaniəyə.
Yaxşını yamanı görcək tanıya,
Nə eşiyə, nə də qəhvəxanəyə,
Qoymaya hər yetən səgzadə gələ.

## CƏFƏRQULU XANIN ZAKİRƏ CAVABI

Qasım bəy, adətdir, xan qulluğuna,
Bir kəs atlı gələ, piyadə gedər.
Mən deyiləm, aləmdə var, eldə var,
Belə cüzvi işlər aradə gedər.

Burada bir başmaq olub zərərin,
Qələm alıb yazdın zəmmin bu dərin,
Zalım, məgər yoxdur sənin xəbərin,
O dərdən ki, aləm fəsadə gedər?

İndi belə görmə Adıgözəli,
Səndən qıvraq idi onun əzəli,
Hər zaman ki, durub yola düzəli,
Yenə bədöv atdan ziyadə gedər.

Gədə, saf azıbdır əməlin sənin,
Mədənisən təqəllübün, fitnənin,
Sən neçün bilməzsən, bağlı gələnin,
Ayağı açılıb güşadə gedər.

Oğlan, sən çıxıbsan lap əndazədən,
Neylər hələ geyəcəksən yazədən.
Köhnə oğurlandı, tikər tazədən,
Bir adam yollaram ustadə gedər.

**Vər. 64a**

**Böyük şahənşah Məhəmməd şah Qacarın qardaşı nayibüs-səltənənin oğlu cənab şahzadə Bəhmən Mirzə 1278-ci ildə (1861-1862) Şuşa qalasında yaşayırdı. O vaxlar mən əmlak sahibi idim və karvansaram var idi. Şahzadə məndən bir qədər borc pul götürmüşdü. Sonra onu verməkdə kahıllıq edirdi. Hər nə etdimsə, israrı o oldu ki, qaytarmasın. Axırda onun üçün bir tərif-namə yazdım. İltifatı bu oldu ki, dedi: "Bərəkallah, bərəkallah, afərin, afərin!" Sonra qanım qaraldı. Aşağıdakı beytləri yazıb, mərhum cənab Cəfər-qulu xana göndərdim. Budur:**

Ey əsil-nəsəbli olan xan, sən Allah,
Bir an bu söhbətlərə qulaq as.

Bir gün başım çox həyəcanlı idi,
Bədənim ibadət paltarından üryan idi.

Rindlərin al qırmızı şərablarından,
Meypərəst tək düşdüm xumun alaqlarına.

O həyəcandan çoxlu sözlər dedim,
Xoşa gələn canfəza şeirlər dedim.

Şahzadəyə layiq o sözləri,
Şaha layiq gövhər kimi o sözləri,

Onun dərgahına göndərdim,
Mən daim onun yaxşılığını istərdim.

Elə ki o, qiymətli beytləri oxudu,
Bəyəndi, çünki bəyənilməli idi.

Bu cür mənə iltifat göstərdi,
Mənə belə bir bərat yazdırdı.

“Əhsən” sözündən başqa ondan bir bəhrə görmədim,
Əhsənlərilə mənim qanımı qaraltdı.

Mənə bir “afərin” kəlməsi göndərdi,
Bu “afərin”ə yüz min afərin olsun.

Bir incə mətləb əvəzinə o şahzadə,
Mənə iki “əhsən”, bir “bərəkallah” verdi.

Öz-özümə demişdim ki, ola bilsin,
O ədalətli şah mənə bir at göndərər.

Ya o pak etiqadlı şah özünün xüsusi cübbəsindən,
Birini mənə göndərər.

Ancaq bütün arzularım xam oldu,
Fələk mənim arzumla dolanmadı.

Bu zaman ağıllı adamların dediyi,
Bir dastan  yadıma düşdü.

Ki, bir gün birisi tələsik gedərkən,
Birdən kabab iyi hiss etdi.

İy gələn tərəfə gedib gördü ki,
Bir eşşək yerə sərilib.

İki əl-ayağı bağlanıb bərk-bərk,
Yer-yurd bulanıb onun qanına.

Bir  baytar onun baş-ayağına,
Dağ basır, neştər vurur.

Öz -özünə dedi, heyf bu yüyür-yüyürə,
Tuf olsun belə murdar iyə.

Ürəyimdə yüz ümid var idi,
Öz-özümə hər zaman yüz şadlıq ümidi verirdim.

Ki, o şəhriyardan feyz görərəm,
Bəhmən buludundan gülzar bəhrə gördüyü kimi.

Onun dərgahından ruhlanmaq istərkən,
Təbimin atının ayaqları qırıldı.

Əgər o beytlərdən bir neçəsini,
Aşpaz Musaya göndərsəydim,

Mənə bir qab aş göndərərdi,
Alt-üstündə də cüt-cüt lavaş qoyardı.

Əgər qiymətli beytlərdən,
Üç beyt o qovurmaçıya göndərsəydim,

Mənə min dil ilə dərhal,
Qovurma, səbzi, lüləkabab,

Hələ üstəlik, gülablı şərbət də göndərərdi.
Ancaq o, kəramət şərtini eşitmədiyindən,

Mənə belə səxavət göstərdi,
Ağıllı Firdovsi (Allah onun ruhunu şad etsin)
nə xoş deyibdir:

Əgər ənbər satanın yanından keçsən,
Üst-başın tamam ətirli olar.

Əgər kömürçü tərəfə getsən,
Qaralıqdan başqa fayda görməzsən.

Şair inciyərsə, həcv deyər,
Həcv isə qiyamətədək qalar.

Ancaq Allahdan başqa,
Mənim heç kəsdən qorxum yoxdur.

İstəyirdim elə fəqan edim ki,
Ondan dünyada bir dastan qalsın.

Ancaq mənim təmiz təbiətim buna yol vermədi,
Belə bir şəxsin də evi qoy abad olsun!

Nəvvab! Qızıl sahibləri belədir,
Allaha sığın və bunlardan vaz keç!

Əttövbə, Allah, bunların hamısına,
Dediyim bu sözlərə, tövbə!

## CƏFƏRQULU XANIN NƏVVAB MİR MÖHSÜNƏ MİRZƏ MƏMMƏDQULU ÇAKƏR VASİTƏSİLƏ CAVABI

Ey seyvid və növcavan sərvər,
Bu dünyada sənin cəddin məşhurdur.

Siz pak Rəsulun övladısınız,
Siz pak Fatimənin bətnindənsiniz.

Ürəyini geniş tut,
Belə əhvalatdan mükəddər olma!

Çox sərraf şəxslər var ki,
Qumu gövhərdən ayırd edə bilmirlər.

Səxavət cah-cəlal və malda deyil,
Nə xəzinə ilədir və nə dərvişlik (yoxsulluq) ilədir.

O, insanın zatında olan elə bir cövhərdir ki,
O sifətlərlə bir şəxs tərifə layiq olarsa,

O şəxsin vücudu başdan-başa gövhərdir,
Elə gövhər ki, bütün gövhərlərdən artıq.

Dünyanın bütün yaxşı-pisini görmüşəm,
Onları idrak mizanında ölçmüşəm.

Çox avam adamları görmüşəm ki,
Hesaba gəlməz.

O kəslərin üstündən qələm çək,
Onların adını dəftərdən poz!

## CƏNAB CƏFƏRQULU XAN AŞIQ PƏRİ MARALYANİYƏ, PƏRİ İSƏ CƏFƏRQULU XANA YAZMIŞDIR

***Cəfərqulu xan:***

Sən, ey Pəri, mələk pərvərdəsisən,
Həmişə deyərdin: "Biz çakərik ona."
Nədən ötrü bizdən kənar gəzərsən?
Nə tabe olubsan sərasər ona?

***Aşıq Pəri:***

Nə şayəstə bu sözləri danışmaq,
Besyardır mərdi-xidmətkar ona.
Saymanıq soltanı, xanı, paşanı,
Nə şah bir söz deyər, nə sərdar ona.

***Xan:***

Nə xoş güftarı var, nə xoş sadədir,
Bu dərdim hamıdan çox ziyadədir,
Doğrudur, dibaçə məlikzadədir,
Bəs niyə deyirlər sitəmkar ona?

***Pəri:***

Xanzadəsən, söz tapıram sözündən,
Əyri demə, doğru söylə düzündən,
Zülm etməklə yox xəbərin özündən,
Hər yerdə deyirlər rahbər ona.

***Xan:***

Əzəl başdan Mirzəcandır ustadın,
Cəmiyi-Dizaqda söylənir adın,
Nə səbəbdən sizin bala Fərhadın,
Gah xoxən deyərlər, gəh pəsər ona?

***Pəri:***

Mirzə Qədir sənin ustadi-pirin,
Zişt danışmaqlıqda yox bərabərin,
Xoxən Abdulladan yoxdur xəbərin,
Demə bundan sonra sən pəsər ona.

***Xan:***

Arifəm, bir yerdə yarı görəndə,
Mən nə deyim bu düxtəri görəndə?
Əql itirdim mən əğyarı görəndə,
Neçün göstəribsən etibar ona?

***Pəri:***

Dağam, gül yanında xarı görəndə,
Tərlan ovlağında sarı görəndə,
Sən ki, eşq əhlini, karı görəndə,
Pəriyəm duaçı aşikar ona.

## CƏFƏRQULU XAN
## AŞIQ PƏRİYƏ YAZIB

Aşıq Pəri, kağız sənə yetişcək,
Durmuyubsan gərək bura gələsən.
Tavus quşu kimi, ya mürği-tuti,
Gəzəcəksən yəqin əldən-ələ sən.

Lənət gəlsin Fərhadın imanına,
Salıb Şirin kimi səni yanına,
Salacaqsan pamoşnikin canına.
Görəcəksən bişübhə vəlvələ sən.

Pəşminə almazsan soltanı, xanı,
Eyləyirsən şahlar kimi divanı,
Sən Qədirdə olan neyi, surnanı
Görməyibsən, görsən məgər, gələsən.

## AŞIQ PƏRİNİN
## CƏFƏRQULU XANA CAVABI

Eşitmişdik, qulluğuna yetişdik,
Gördük ki,düşübsən dildən-dilə sən.
Unutmayıb müsəlmanlıq şərtini,
Matəm tutub, bir insafa gələsən.

Bu işdə Qədirin varıdır tayi,
Yetən kəslər ona deyir sövdayi,
Aralığa düşüb məhərrəm ayi,
Layiq deyil onda deyib-güləsən.

Yaxşı yetər imamı fəryadına,
Belə işin ləzzəti nə, dadı nə?
Adam bildik, biz də gəldik adına,
Adamlığı qanmayıbsan hələ sən.

Ey Pəri, tə’cil et sualında sən,
Nöqsan yetiribsən kamalında sən,
İndi surna çalmaq xəyalındasan,
Onu məgər axirətdə çalasan.

**Vər. 68a**

## MƏHƏMMƏD BƏY ZƏNGİLANİ

**Rəbiül-sani, 1309 (noyabr, 1891-ci il)**

**Məhəmməd bəy Behbüd bəy oğlu Qarabağ əhlindən olub. Zəngilan kəndindəndir. Bəzən Şuşa qalasına da təşrif gətirər, bizim evə də gələrdi. Heybətli və xoşsifət bir kişi idi. Əsli-nəcabəti var. Mən qırx ildən artıq onu tanıyıram. Təqribən yetmiş yaşı olar. Şeir deməyə çox həvəsi var idi. Aşağıdakı şeirlər o mərhumun xəyalındandır. Təxəllüsü Aşiqdir.**

### MƏHƏMMƏD BƏYİN MİRZƏ HƏSƏNƏ YAZDIĞI KƏLAM

Yenə asudə ikən uğradım bir şux zibayə,*
Üzü gül, arizi mül, zülfü sünbül, çeşmi-şəhlayə.

Xəti sərkəş, xalı dilkəş, rüxi məhvəş, ləbi canbəxş,
Beli incə, teli afət, qədi sərvi-dilarayə.

Dişi gövhər, dili şəkkər, turunc ğənəbi pürbər,
Pəritəl’ət, mələk siyrət, müjə ox, qaşları ayə.

Üzü sahir, özü zahir, gözü can almağa mahir.
Görən bir baxışın verməz onu dünyavü üqbayə.

Dəhanın var-yox sirrini bilmək xeyli müşküldür,
Əcəb mahirdir ol əyyar hər elmi-müəmmayə.

Baxanlar qamətindən rəmz anlarlar qiyamətdən,
Görənlər şəkli-əbrusin dəxi baxmaz yeni ayə.

Yer üzündə durmadı, getdi, səmavatı məqam etdi,
Ləbi ecaz rəsmin göstərən dəmdə Məsihayə.

Belə məhbubi-bihəmtayə can nəqdin nisar etsəm,
Qəribə  pürbəhayə sərfdir ömri-girənmayə.

Ləbi kövsər, dili şəkkər, üzü gülbərg tərdən tər,
Xəti hindu, gözü cadu, salıb yüz şur dünyayə.

* Təzkirənin çap nüsxəsində bu şeir səkkiz beytdir.

Götürsə gün camalından bulut kimi qəra zülfün,
Sərasimə Züleyxa tək çıxar Yusif tamaşayə.

Dodağilə yanağın küfrdür, vallahi bənzətmək
Ləbin ecazi-İsayə, yədin bəyzai-Musayə.

Qiyam eylər qiyamət qaməti-mövzuni baş çəksə,
Niqab açsa, verir xiclət üzü cənnətdə hurayə.

Dodağından sorardım ağzının mən var-yox sirrin,
Bu nazik nüktəni sorma, düşər qan-dedi-ortayə.

Eşitməz naləmi, ol səngdil şuxə gücüm çatmaz,
Qənaət eylərəm mən də sənin tək ah ilə vayə.

Mənim vardır yenə vasil vüsalə olmaq ümmidim,
Yetərsənmi səni də, bilməm, axir bu təmənnayə?

Məni-kəmtər gədayə qıl nəzər, ey padşahi-hüsn,
Həmişə iltifat etmək gəlir axir bu ədnayə.

Alır feyzi-nəzər bəhrini aşiq tutsa damanın,
Tapar sərriştəsin, yetsə əli zülfı-çəlipayə.

## MİRZƏ HƏSƏNİN MƏHƏMMƏD BƏYƏ CAVABI

Yetişdi, Aşiqa, əş’ari-mövzunun bu rüsvayə,
Hümayi-bəxt saldı başıma guya mənim sayə.

Bu nə əyyami-piridir, yenə nə küştigiridir,
Burax bu şüğli, ey piran, mənim tək bari bürnayə.

Dolaşma şanə tək sən çox o geysuyi-pərişanə,
İlişsə payinə bir tük, gedər başın bu sövdayə.

Bükülmüş qəddilə ol sərv baş qoymaz kənarinə,
Xədəngi-cansitan müşkül girər bövlə pozuq yayə.

Gərək dərd əhli dərdin əhli-dərdə eyləsin hali,
Giriharəm sənin tək mən də bir sərvi-dilaravə.

Məgər məşuqun aşiq qaşını oxşadı, ey Aşiq,
Yeni ayə və ya yayə, əgər göydən yensə ayə?

Bir ay üzlü, qəra gözlü, şəkər sözlü, sözü duzlu,
Beli incə, ağız qönçə, ləbi şəhdi-müsəffayə?!

**Vər. 69a**

## MİRZƏ HƏSƏN

**Mərhum Mirzə Həsən Mirzə Cəfər oğlu Qarabağın Şuşa əhlindəndir. Deyilənlərə görə, yaxşı görkəmli, xoş qamətli və şirindilli bir cavan idi. Cavan vaxtlarında da bu dünyanı tərk etmişdir. 1256- cı il rəbiül-əvvəl ayında (1840-cı ilin may ayı), əlli il bundan qabaq qürbətdə rəhmətə getmişdir. Cəsədini gətirib, sonradan onun adına adlanan qəbristanlıqda dəfn etmişlər. Hal-hazırda oraya Mirzə Həsən qəbristanlığı deyirlər. Belə eşitmişəm ki, mərhumun bir nəfərlə nəhayət dərəcədə sevişməsi olub. Vəsiyyət edib ki, məni məşuqənin gedib-gəldiyi yolun üstündə dəfn edin. Ona görə də onu həmin yerdə dəfn etmişlər. Biçarə hərdən şeir yazardı, həm də şeirləşərdi. Məhəmməd bəy və Aşıq Pəri Maralyani ilə müşairəsi o cümlədəndir. Şeirlərini Mirzə və Mirzə Həsən adı ilə demişdir.**

## MİRZƏNİN QƏZƏLİ

Eşqindən divanə oldum, ey zülf, öz zəncirin vur,
Miskin aşiq üçün bundan başqa bir tədbir yoxdur.

Miskin aşiqin qətli üçün nə lazım xəncər çəkəsən,
Qaşlarına əmr et, onu qəmzə şəmşirilə vursun.

Nə məndə söz açmaq qabiliyyəti var, nə onda iltifat,
Məclisdə mən və məşuqə bir-birimizə şəkil kimi baxırıq.

Könül elə viran olub ki, bir də abad olmayacaq,
Bəlkə, ey canan, vüsalın bu viranəni bərpa edəcək?

Yarım bu gecə öz vüsalı ilə başıma kölgə salıbdır,
Mənim xatirimə, ey sübh, axirətədək açılma, səbr eylə.

Qantökən gözlərinə qurban, əcəb oxatan gözlərdir,
Mirzəyə hər dəm kirpiklərindən qara oxlar vurar.

## QƏZƏL

Əla, ey şuxi-şirinkar, bimürüvvət, xudahafiz,
Qəmi-eşqində bəsdir çəkdiyim zillət, xudahafiz.

Nigara, dövri-hüsnündə rəqibim şadnam oldu,
Mənəm ancaq olan avareyi-möhnət, xudahafiz.

Könüllər izdihamı, şanə cövrü qoymadı könlüm,
Edə zülfündə bir asayişi-rahət, xudahafiz.

Dərində pasiban tək şad bulsun xatiri, yetməz,
Bu gündən böylə naləmdən ona zəhmət, xudahafiz.

Həsən, bu mahrulərdən vəfavü mehri az istə,
Ki, cövr etmək olur məhvəşlərə adət, xudahafiz.

## MƏHƏMMƏD BƏY ZƏNGİLANİNİN KƏLAMI

Əla, ev həmdəıni-kəmlütfü kəmülfət, xudahafiz,
Ğəmin həmrahi-candır, canə yüz minnət, xudahafiz.

Deyildim layiqi-bəzmi-vüsal, ey məh, hüzurunda,
Bu gündən böylə əğyar evləsin söhbət, xudahafiz.

Səri-kuyində naləmdən rəqibim canə yetmişdi,
Gəzər rahət, vəli çəkməz dəxi zəhmət, xudahafiz.

Qiyamət olmasa çəkməzdim əl canan vüsalından,
Məni məhrum edən əğyarə yüz lənət, xudahafiz.

Qaçan zar ağlasam, ya eyləsəm yadi-vətən sənsiz,
Nə məndə səbr var, nə səndə mürüvvət, xudahafiz.

Gərək tərki-diyar etmək bu dəm, ey rəhmsiz, guya,
Nə məndə səbr var, səndə nə mürvət var, xudahafiz.*

## MİRZƏ HƏSƏNİN AŞIQ PƏRİ MARALYANİYƏ YAZDIĞI QOŞMA

Lalə yanağında badi-səbadən,
Ucu tər cıqqalı tellər oynaşır.
Süzgün baxışından xumar gözlərin,
Hiylələr, fitnələr, fe'llər oynaşır.

Cəm olubdur hüsnün, bu vəcahətin,**
Yetməsin zavala çeşmi-afətin,
Yayına bir zaman sərv qamətin,
Gözüm içrə qanlar, sellər oynaşır.

* Son beytlərin ikinci misraları orijinalda da təkrar olunur.
** Bu bənd təzkirənin çap nüsxəsində yoxdur.

Boyun yaraşıqda qiyamət eylər,
Ağ məmə köynəyə zərafət eylər,
İşvəni, qəmzəni bu babət eylər,
Kəmər ilə nazik bellər oynaşır.

Mum tək incəlmişəm incə belindən,
Sövdaya düşmüşəm siyah telindən,
Titrədikcə zülfün əsər yelindən,
Sanasan gülşəndə güllər oynaşır.

Etdikcə zülfünü Mirzə mükərrər,
Tazələnir ruhu, olur müəttər,
Gülüstanda zülfün kimi müənbər,
Nə süsənlər, nə sünbüllər oynaşır.

## AŞIQ PƏRİ MARALYANİNİN MİRZƏ HƏSƏNƏ CAVABI

Katiblərin şahı, dəftər içində,
Qələm ilə nazik əllər oynaşır.
Fitnəli fe'llisən, nazü qəmzəli,
Dəhanında şirin dillər oynaşır.

Eşqinin əlindən gedərəm dadə,
Dərdim olur günü-gündən ziyadə,
Şivəvü rəftarın düşəndə yadə,
Bağrımın başında millər oynaşır.

Dad eylərəm, haray naşı əlindən,
Yandı ciyər eşq atəşi əlindən,
Mən nə deyim, gözüm yaşı əlindən,
Ürküşür sonalar, güllər oynaşır.

Adam var dolanır məkrin içində,
Adam var dolanır zikrin içində,
Sənin kamalında, fikrin içində,
Əcayib-qərayib hallar oynaşır.

## MİRZƏ HƏSƏN NAXOŞ OLAN VAXT AŞIQ PƏRİNİN ONA YAZDIĞI ŞEİR

Nə yatıbsan lihaf-bəstər içində,
Bimarmısan, nədir bəs halın sənin?
Eşqin mərizinə mən də təbibəm,
Bəyan eylə mənə əhvalın sənin.

İsmi-şərifiniz dadə yetişsin,
Mətləb alıb, hər muradə yetişsin,
Şahlar mahı özü dadə yetişsin,
Hifzində saxlasın zəvalın sənin.

Barilahim gülzarına qıymasın,
Xəstə düşüb bimarına qıymasın,
Şirin-şirin güftarına qıymasın,
Bağışlasın qaşı-hilalın sənin.

Bir məsəldir, bağban olan bar çəkər,
Əndəlibin həm meyli gülzar çəkər,
Allahına bəndə ahü-zar çəkər,
Qəm çəkmə, kamildir kamalın sənin.

Mən Pəriyəm, eşqə zarəm, neyləyim?
Dərdi-dildən xəbərdarəm, neyləyim?
Burdan orayə ki, varəm, nevləvim?
Şəfalansın nuri-vüsalın sənin.

## MİRZƏ HƏSƏNİN AŞIQ PƏRİYƏ CAVABI

Bu qəm bəstərində, möhnət içində,
Daima fikrimdir xəyalın sənin.
Dərmansız dərdimə bulunmaz çarə,
Müyəssər olmasa vüsalın sənin.

Qönçə lətafətli, lalə üzlüsən,
Məstanə baxışlı, xumar gözlüsən,
Şirin hərəkətli, şəkər sözlüsən,
Yer üzündə yoxdur misalın sənin.

Könül adət ahü-zarə elənir,
Eşq sirri aşikarə elənir,
Ruzigarım, qoyma, qarə elənir,
O zülfün, o xətin, o xalın sənin.

İltifat eyləyib, alıb canımı,
Odlara  salıbsan din, imanımı,
Yəqin bil, ölürəm, şəbistanımı,
Münəvvər etməsə cəmalın sənin.

Sən Mirzənin qədrini bil, naz eylə,
Səg rəqiblərdən də ehtiraz eylə,
Nəcəf bəyə iltifatı az eylə,
Həlak eylər məni bu halın sənin.

## QARABAĞIN ŞUŞA TABELİYİNDƏ OLAN ÇANAQÇI KƏND SAKİNİ MİRZƏCAN MƏDƏDOVLA AŞIQ PƏRİNİN MÜŞAİRƏSİ

***Aşıq Pəri:***

Şaira, sənsən zəmanə mərdi, meydandan danış,
Əzbər eylə dildə dəftər, cövhəri-candan danış,
Yeddi yerdir, yeddi göydür, eylə əzbərdir sual,
Yeddi məna, yeddi qüsl, yeddi gövhər, həm kəmal,
Yeddi göydə, yeddi ulduz, həşt cənnət bimisal,
Yeddi rükət, on iki imamü-ərkandan danış.

***Mirzəcan:***

Neylirəm bunları mən, gəl, ey Pəri, yardan danış,
Neylərəm üqba işin, sən kimi dildardan danış,
Yeddi yerdən, yeddi göydən neylərəm etmək sual?
Tapmışam bir mürşüdü, kəsb etmişəm ondan kamal,
Çəkmənəm rizvan qəmin, bu dünyada versən məcal,
Aşiqə cövr eyləyən yari-sitəmkardan danış.

***Pəri:***

Yek güni Qüdsi-Xəlildə Məqdəs ilə Mehrasa,
Əqlini təğayür etdi,aldı sərdən kəlisa,
Əzbər eylə hər saətdə zikri-Məryəm, həm İsa,
Gah İncil, gah cim-cim, gah ərkandan danış.

***Mirzəcan:***

Tapmışam qüdsi-Xəlili, Məhrasanı neylərəm?
Əldə təsbih ilə zünnarü əsanı neylərəm?
Bir Pəri şeyda qalıb, İsa, Musanı neylərəm?
Sevmənəm Tövrat, Zəburi, çalan tardan danış.

***Pəri:***

Motaves, Marqos, Ohanes, Loqani yad etgilən,
Petros, həm İstepanı yad edib, şad etgilən,
Doğulan uşağı "Allah" deyibən, dad etgilən,
Yandırıb xaxordi Davud, Süleymandan danış.

***Mirzəcan:***

Mən bu sözlərdən iraqəm, ey Pəri, dad etmə sən,
Yad edib bu sözləri, hər ləhzə fəryad etmə sən,
Bir belə sözlər deyib əğyarı həm şad etmə sən,
Zülfi-mişk, xali-ənbər, xətti-reyhandan danış.

***Pəri:***

Tapdığın tərsa yoludur, eyləmə zövqü həvəs,
Badeyi-gülgunə təhsin etmisən, nitqü nəfəs,
Qaidə, qanun budur:qalü bəladan xaçpərəst,
Çağırır Isa, kəlisa, güftgu candan danış.

***Mirzəcan:***

Məndə can yox, eyləmə səyi-əbəs, bica həvəs,
Mürği-can pərvaz edib, cismim qalıb xali qəfəs,
Gəl mənə zülm eyləmə, naləm salır dünyaya səs.
Aləmi qərqə verən bu çeşmi-xunbardan danış.

***Pəri:***

Ey Pəri, oldu dili-şeyda rədifi əlbəəl,
Sən təriqətdən ötüb ürfanlara qoyma məhəl,
Yəmdə* mahi, göydə Şəmsü Mahü Mərrixü Zühəl,
Abi-heyvan, şaxi-tuba, bağı-rizvandan danış.

***Mirzəcan:***

Tapalı eşqin yolun biz böylə işi neyləriz?
Əqlimiz heyran olubdur, dinü kişi neyləriz?
Gəl edək zövqü səfa, molla, keşişi neyləriz?
Mirzəcanı öldürən bu ah ilə zardan danış.

---

* Dəryada

## MİRZƏCANİN QOŞMASI

Girdabi-möhnətdə qərq olan canım,
Ya Rəb, ola bir kənarə yetərmi?
Bu seyli-bəladən, tufani-qəmdən,
Xilas olub, o dildarə yetərmi?

Qəm ləşgəri mənə olub həvalə,
İstəyir qürbətdə canımı alə,
Çəkdiyim əfqanlar, etdiyim nalə,
Bu diyardan o diyarə yetərmi?

Çünki belə hicran düşmüş arayə,
Kim var ki, yetişsin bunda hərayə?
Ümid yox qasidə, badi-səbayə,
Bir ah çəksəm, andə yarə yetərmi?

Necə dözsün canım bu sitəmlərə,
Munca möhnətlərə, munca qəmlərə?
Yarımın kuyində siz həmdəmlərə,
Bir də görüm bu biçarə yetərmi?

Fələk məni belə salmış avarə,
Könül müştaq, göz müntəzir didarə,
Mirzəcanı, məgər o gül üzarə
Sənin kimi bəxti qarə yetərmi?

## MİRZƏCAN MƏDƏDOV QARABAĞİNİN BƏNÖVŞƏ İLƏ HƏSBİ-HALI

Boynu buruq varıb yarın yanına,
Söylə dərdi-dilim yarə, bənövşə.
Üzümə bax, rəngi-ruyum hər nə var,
Ərz etgilən o xunxarə, bənövşə.

Aparsalar səni yar otağına,
Qafil olma,bax sən solu sağına,
Üz sürtüb zülfünə, de qulağına,
Salmasın aşiqi narə, bənövşə.

Seyr elə üzündə, baxgilən hər su,
Məskən sal telində, seylə mubəmu,

Görsən ki, cananım olmayıb bədxu,
Bir xələl qat o əğyarə, bənövşə.

Neyləsin mən kimi fəqir əndəlib,
Sən bənövşə olub şol gülə həbib,
Əgər sən də mənə olasan rəqib,
Görüm günün keçsin qarə, bənövşə.

Bundan artıq yoxdur sənə bir cavab,
Laviq deyil etmək aşiqə əzab,
Istərsən edəsən dünyada səvab,
Eylə Mirzəcana çarə, bənövşə.

### MİRZƏCAN MƏDƏDOV HƏBSXANADA DEYİB

Bir belə əyyamda, belə zamanda,
Qəmgin könlüm necə munda şad olsun?
Munca zülmü sitəm, munca siyasət,
Bəs deyilmi, yar da məndən yad olsun?!

Nə bir qəmkar, nə bir dusti-yeganə,
Təmamən aşina oldu biganə,
Saldın axır, fələk, məni zindanə,
Qoymadın qüssədən can azad olsun.

Olmasın o qəmgin, mən çəkim cəfa.
Unutmaq aşiqin görməsin rəva,
Gəlməsə, deyərlər ona bivəfa,
İstərəm özünə yaxşı ad olsun.

Külli-aləm düşmən olub canıma,
Tapıb fürsət, düşmən batıb qanıma,
Deyin,dostlar, yarım gəlsin yanıma,
Bəlkə görmək ilə bir imdad olsun.

Fələyin ədli yox, dünyada divan,
Dəxi gəlməz həyatıma bir güman,
Nahəq bəndə düşüb fəqir Mirzəcan,
Səbəbkarın qoy evi abad olsun.

**Vər. 75a**

## RƏHİM BƏY UĞURLU BƏY OĞLU

**Kapitan Rəhim bəy Uğurlu bəy oğlu Qarabağ vilayətinin əhalisindəndir. Şuşa qalasında yaşayırdı. 50 yaşlı, heybətli, möhkəm bədənli, uca boylu, çox yoğun və yekəqarın bir kişi idi. Bir gün hamama gəlmişdi, mən də orada idim. Molla və ölü işlərinə baxanlardan biri ki, adına Mirzə Qasım Katib deyirdilər, hamamdan bayıra çıxıb paltarlarını geymişdi və əmmaməsini düzəldirdi. Bu vaxt Rəhim bəy onu görüb bu fərdi bədahətən ona dedi:**

**Sənin qat-qat olmuş əmmamənə and olsun,**
**Heç olmayan fəzlü kamalına and olsun.**

**Mərhum hərdən cürbəcür şeirlər deyərdi. Varisi olmadığından onun şeirlərindən öz hamamının tarixi haqqında söylədiyi rübaidən başqa bir şey mənim əlimə düşmədi.**

### RƏHİM BƏY

Qorxmaz Rəhim Uğurlu bəy oğlu,
Bu gəlirli və misilsiz hamamı düzəldəndə.
Tarixi Uğurlu bəy sözlərindən əyan oldu,
Bu qəşəng bina küləkdən qorunsun.

**1281-ci ildə (1864-65) vəfat edib. Arvadının xahişi ilə onun ölüm tarixinə aşağıdakı beytləri deyib, məzarının üstündəki daşa da yazmışam.**

### RƏHİM BƏY UĞURLU BƏY OĞLUNUN VƏFAT TARİXİ

Elə ki, pakcan cavan Rəhim ibn Uğurlu bəy,
Qəm və kədərlə əbədilik tərəfə getdi.

Onun məskəni cənnət bağı, həmdəmi mələklər oldu.
O rövşən rəvan üçün Tuba ağacının altı mənzil oldu.

Elə ki, qürurlu dünyanın qəmlərindən azad oldu,
*"Əz fəraq aməd"*dən[*] (1281) ölüm ili əyan oldu.

Ey Möhsün, nə vaxtadək qəflət şərabından xumar olacaqsan?
Hər şey məhv olacaq şərabdan, sənin ömür kasan al şərabdan dolubdur.

---

[*] "Ayrılıqdan gəldi."

## MƏHƏMMƏD BƏY AŞİQIN QƏZƏLİ

Verdimsə gər o şuxi-sitəmkarə könlümü,
Bir gün də görmədim mən o biçarə könlümü.

Bir rusiyalıq ilə dolanırdı zülfara,
Yandırmasaydı çöhrə açıb narə könlümü.

Peykani-eşqü tiri-qəzadən səvayi yox,
Gər yüz tərəfdən əhli-cəfa yarə könlümü.

Yüz dad edər fəraqda, min nalə vəsldə,
Bu zalım eşqi gör yetirib harə könlümü?!

Biri nəharü həm biri şam olduğu üçün,
Tapşırmışam o zülfilə rüxsarə könlümü.

Zülfi-siyahi arizi-al üzrə salmağın,
Vəchi budur ki, ta sala ehzarə könlümü.

Əbruvü zülfü qəmzən olub yaği Aşiqə,
Mənəm həm dübarə, vermənəm onlarə könlümü.

## MƏHƏMMƏD BƏY AŞİQDƏN AŞIQ PƏRİYƏ

Təxəllüs nə lazım, ey Aşiq Pəri,
Bir kəs ki, mehrdən xəbərdar ola.

Könüldən könülə yollar görünür,
Əlavə nə hacət ki, aşkar ola?

Dizaq mahalında sənin tək gözəl,
Həqdən istəmişəm, bərqərar ola.

Sənin tək dərdmənd olmayan mahal,
Görüm ki, dağılıb tar-mar ola.

Çəkəsən ağuşa bala Fərhadı,
Şirin didarına intizar ola.

Fəhmü fərasətə ursan, ey Pəri,
Məhəmmədə gərək xidmətkar ola.

## AŞIQ PƏRİNİN MƏHƏMMƏD BƏY AŞİQƏ CAVABI

Şayəstədir, ey mürşidi-kamilim,
Dostlar arasında etibar ola.

Şair odur, ustadından dərs ala,
Cəddü cinsi rədifü pərgar ola.

Şənilə şövkətin olsun bizəval,
Gərək xidmətində xidmətkar ola.

Səni sallam müəşşərin çənginə,
Arif bu yerlərdən xəbərdar ola.

Pəriyəm mən, eşq içində aşikar,
Arasında yaxşı səbəbkar ola.

Bu cəng mevdanında eylərəm şikar,
Məhəmməd təki əgər səd həzar ola.

## YENƏ MƏHƏMMƏD BƏY AŞİQ AŞIQ PƏRİYƏ YAZMIŞDIR

Ustadi-əzəldən dərsim almışam,
Mayiləm hər yerdə qovğayə, Pəri.

Ziddü cinsü rədif sözün danışma,
Mən desəm düşərsən vay-vayə, Pəri.

Böyük yerdən danışmağın az olsun,
Düşərsən bir dərin dəryayə, Pəri.

Müəşşərdə yəqindir ki, qaçarsan,
Axırında bəlkə Mirzəyə, Pəri.

Eyləyimmi, bilməm, sənə rişxənd,
Yoxsa onu yazan mollayə, Pəri?

Dəhanının müəmması Aşiqi,
Salıbdır bir uzun sövdəyə, Pəri.

## Q.ZAKİRİN MƏHƏMMƏD BƏY AŞİQ ZƏNGİLANİYƏ MƏZƏMMƏT MƏKTUBU

Eşitdim nameyi-mehrü məhəbbət,
Yetişir hər zaman Pəridən sənə.
Aşiqin məşuqu gərək çağ ola,
Nə hasil o quru dəridən sənə?

Əvvəl sevdin Fatma ilən Məryəmi,
Onların dalınca Şahisənəmi.
Belə sövda xarab eylər adəmi,
Özün bil, deyirəm bəridən sənə...

## ƏSƏD BƏY AŞIQ PƏRİYƏ YAZIB

O gündən ki, didarını görmüşəm,
Həsrətindən yanar cismücan, Pəri.
Dolanır başına səri-zülfündə,
Könül mürgü tutub aşiyan, Pəri.

İştiyaqın çəkər neçə kimsənə,
Amma heç birisi bənzəməz mənə,
Canü dildən mübtəlayəm mən sənə,
İnanmırsan, eylə imtahan, Pəri.

Arizindir günəş, camalındır ay,
Heç nazənin ola bilməz sənə tay,
Qəmzən qatil, kirpiyin ox, qaşın yay,
Qamətindir sərvi xuraman, Pəri.

Nə qədər var idi canda ixtiyar,
Bir xatirə səndən dolandım kənar,
Axır gizlin dərdim saldın aşikar,
Qoy bilsə də bilsin Mirzəcan, Pəri.

Bir mülaqat ilə, ey mələkzadə,
Kar etdi könlümə eşqin ziyadə,
Axar günəş ruyin düşəndə yadə,
Yaş yerinə gözlərimdən qan, Pəri.

Gəl gör fəraqında mən natəvanəm,
Əfsürdəxatirəm, şikəstəcanəm,
Əsəd deyər, sənə bəndəfərmanəm,
Sənsən mənə soltan, Pəri, xan Pəri.

**Bəhram bəy Fədai dedi ki, bu şeir mənim atamındır. Atası isə həmin Əsəd bəydir.**

**Vər. 78a**

## AXUND MOLLA ABBAS CAVANŞİR

**Axund Molla Abbas Qarabağ əhlindəndir. Sarıcallı kəndindən, Cavanşir əhalisindən. Şeirlərini gah Abbas, gah da Cavanşiri adı ilə demişdir. Xoşxasiyyət, xoşsifət və xoşsima bir adam idi. Ərəb, fars və türk elmini mükəmməl bilirdi. Kürdüstan şəhərində təhsil alıb. Riyaziyyat elmində əvəzsiz ustaddır. 1284-cü ildə (1867) Şuşa şəhərinə gəlib, dərs deməyə başladı. Mən astronomiya, rəml, üstürlab və nücum elmini o cənabdan dərs almışam. Asronomiya elminə dair o özü bir kitab yazmışdı. Bəzi riyaziyyat kitablarına Cavanşiri adı ilə haşiyə də yazırdı. O vaxt İran əhalisindən bir şəxs müctəhidlər silkində təmtəraqla şəhərə daxil olub, özünü müctəhid elan etdi. Ləqəbi Şəmsül-üləma idi. Məclis və yığıncaqlarda bir sıra müddəalar irəli sürürdü. Bir dəfə həmin Molla Abbasla mübahisə etmişdi. Molla Abbas bir gün axşamdan səhərə qədər oturub Şəmsül-üləmadan iyirmi beş elmdən iyirmi beş sual soruşdu ki, mən onların hamısını görüb, oxumuşam. Axırda şəhərin bəzi möhtərəm adamları razı olmadılar ki, Şəmsül-üləmaya belə həmlə etsin. Şəmsül-üləma ondan sonra iki gün də şəhərdə qalmayıb, başqa şəhərlərə getdi. Sonra həqiqət aydınlaşıb məlum oldu ki, "alihəzrət" Luti təriqətinə mənsub, dəhriməzhəb bir şəxs olub və bəzilərinin dediyi kimi, vəhdəti-vücudi və ya vəhdəti-mövcudi imiş. Ancaq mən öz qulaqlarımla eşitmişəm Came məscidində moizə oxuyan vaxt o elə sözlər dedi ki, məscid əhli vəlvələyə düşüb, səs-küy qaldırdılar. Xalqın səsi ucalan vaxt o hey deyirdi: "ənəl- həqq, ənəl-həqq". Bu sözləri dəfələrlə təkrar edirdi.**

**Xülasə, Axund Molla Abbas sağlam nəfsli Allah adamı idi. Mənim mənzilimdə çox olardı. Şiəməzhəb idi. Bəziləri onu səhvən avam hesab edirdilər. Ancaq mənə tam aydın idi.**

**Xülasə, o, bəzən şeir də deyirdi. Şeirlərinin bəzisi aşağıda yazılıb. Yuxarıdakı tarixdən üç il sonra yenə də Kürdüstana getdi. Biçarə o qürbətdə Allah rəhmətinə getdi. Allah onun ruhunu işıqlandırsın. O vaxt yaşı əlli olardı.**

**Cəmadiyül-əvvəl 1309-cu il (dekabr, 1891-ci il).**

## MOLLA ABBAS CAVANŞİRİN QƏZƏLİ

Tərfi-rüxsarə nə xoş zülfi-xəmin pirayə,
Guyiya, əbri-siyəh halə urubdur ayə.

Çıxma gün qarşısına, ruyinə düşdükdə günəş,
Üzünə zəxm urar zülf salanda sayə.

Səndə bu qədər həlavət ki, sərapa görünür,
Səni, guya, əmizib şirü şəkərdən dayə.

Gər biləydim bu qədər hicr cəfasın çəkirəm,
Mən ədəm içrə bəsi sabiq idim ənqayə.

Gər vəfa görsə idi əhli-zamandan Məcnun,
Mürğü vəhşilər ilə düşməz idi səhrayə.

Görməmiş qeyri-cəfavü sitəmi-qürbətü qəm,
Bilməzəm kim, neçün Abbas gəlib dünyayə.

## MOLLA ABBAS CAVANŞİR

Rüxün səthində xətti-hüsn kim, lövhü qələm yazmış,
Cəbinim lövhi üzrə ol zaman eşqi rəqəm yazmış.

Qədindir bir əlif kim, rast çəkmiş xameyi-qüdrət,
Ayırmış ol əlifdən lami-zülfün, necə xəm yazmış.

Qələm sirri-dəhanə məndən ələmdir ki, mən deyərdim,
Onu bir nükteyi-mövhum yaz, gördüm ki, kəm yazmış.

Sürurü ğəm ki, yazdı katibi-qüdrət bu məxluqə,
Süruri aləmə, tənha mənə tumari-qəm yazmış.

Nə qəm, gər ixtiyar ilə məni zikr eyləsə zahid,
Ki, arif dəftəri-üşşaqə bəxtim möhtərəm yazmış.

Əgər, Abbas, şeirində rəkakət bulsa şairlər,
De kim, məbhut idim mən,bunları sərxod qələm yazmış.

## MOLLA ABBAS CAVANŞİR

Gül deyil mətlubimiz gülşəndə çün tutduq vətən,
Bəlkə gül rüxsarımız yadilə yad etdik çəmən.

Sərv çün öz qamətin bənzətdi qəddi-yarıma,
Sərzənişlə başını pakub edir zağü zəğən.

Şöleyi-nari-tənim kim, yandırır hər kisvəti,
Istərəm cildi-səməndərdən tikəm bir pirəhən.

Kermi-pilə halını sordum qəmu əhvaldin,
Kim təni üzrə toxur öldükdən əqdəm bir kəfən.

Mən kimi bir guşədə qəm çəkməyə tab etməyib,
Qaçdı Məcnun kuhü səhrayə cəfayi-yardən.

Gər ümidi-vəsl ola mən bir səri-müjgan ilə,
Dəlləm ol dağı ki, fuladla dəlmiş kuhkən.

Şöleyi-ahım mənə rövşən qılır hər külbəni,
Hacətim yox şəm ilə rövşən qılam kaşanə mən.

Çün mənə qürbət vətəndir, izzətimdir bu vətən,
Hər zaman Abbasə olmuş əhli-qürbət həmsüxən.*

## MOLLA ABBAS CAVANŞİR

Necə dildadəyəm mən, bu dilim dildardən doymaz,
Əcayib didədir bu didə kim, didardən doymaz.

Səba məndən füzun ol cə'di-zülfə mübtəladır kim,
Həmişə oynadır, ol türreyi-tərrardən doymaz.

Dəmadəm qut edər öz lə'linin şəhdini şirinim,
Zəhi tutizəbandır, şəhdi-şəkkərbardən doymaz.

Nə tabi-qürbətəm, nə izzətim vardır məqamımda,
Mənim haqqımda gərdun bunca kəcrəftardən doymaz.

Edibdir mürği-nəfsin danəsin təsbihdən zahid,
Bu mürğə danə yüz danə nə, yüz xərvardən doymaz.

Kələm tək başını pürpiç edib əmmamədən daim,
Bu nazik boynu gör kim, bu bari-ardən doymaz.

Edib üşşaq inkarın şüar ol cahili-nakəs,
Doyub Abbas ondan, ol məgər inkardən doymaz?

## MOLLA ABBAS CAVANŞİR

Dəvami-ləzzəti-candır ki, canandan cəfa görsün,
Nə vəslilə bulub arami-eşqə intəha görsün.

Çəkibdir nəqşi-Çin mişki-Xəta ilə rüxə zülfü,
Gözüm baxsın nigarə gər dilər Çinü Xəta görsün.

* Təzkirənin çap nüsxəsində "həmvətən" kimi yazılmışdır.

Könül çox çə’di-zülfündə baxır hər həlqədən ruyə.
Bəli, məhbus olan istər deşiklərdən ziya görsün.

Deyil qadir gözə bir gəncnəzər xurşid rüxsarın,
Nə yara, dideyi-xəffaşə kim, şəmsi-züha görsün.

Özün möhkəm qılır dil hər səhərgəh piçi-zülfündə,
Məbada kim, pərişanlıq səba zülfə rəva görsün.

Gözüm mərdümləri dəryayi-əşkim içrə qərq olmaz,
Nə qəm, insani-bəhrilər ki, yüz mövcü bəla görsün.

Şüruti eşqdəndir cövrə, ey Abbas, səbr etmək,
Kim, etmiş eşq şərtin yardən aşiq vəfa görsün.

## MOLLA ABBAS CAVANŞİR

Nuşdarudur dövran, cami-möhnətdir məgər?
Saqiya, qəm badəsi üşşaqə qismətdir məgər?

Xabi-rahət eşqdə bidarlıqdır sübhədək,
Rahəti-əhli-cəfa, bu xabi-qəflətdir məgər?

Qəm gələndə könlümün viranına nifrət qılır,
Bu anisim mənzili çox təngü zülmətdir məgər?

Mürği-vəhşidən mənim başımda var cəmiyyətim,
Hakimi-mülki-cünun biizzü həşmətdir məgər?

Nəbzimi tutduqda dərmanımda acizdir təbib.
Bu mərəz kim məndə vardır, ziddi-hikmətdir məgər?

Dil şəfasiyçün dilər daim ləbin cüllabını,
Müzmin olmuş dərdinin dərmanı şərbətdir məgər?

Ol səfayi-gərdəni-minayə düşdü gözlərim,
Sə’y edib, can qılmışam, qurban mürüvvətdir məgər?

Özgə Abbasdan səva ruyinə sanma ağlayır,
Gün görən gözdən axan yaş əşki-həsrətdir məgər?

**Mərhum cənab Axund Molla Abbasın qəzəlləri tamam oldu. Hicri 1309-cu ilin cəmadiyəl-əvvəl ayının 3-də (5 dekabr, 1891).**

**Vər. 81a**

## ABDULLA BƏY ASİ QARABAĞİ

**Cənab Abdulla bəy Əli bəy oğlunun təxəllüsü Asidir. O, Qarabağ əhalisindəndir. 1256-ci ildə (1841) Qarabağın Şuşa şəhərində anadan olub. 1291 - ci ildə (1874) vəfat etmişdir. Şux və incə zövqlü bir cavan idi. Farsca da savadı var idi. Qasım bəy Zakir Xındırıstaninin nəvələrindəndir. Bu hissəni yazan vaxt onun şeir dəftəri ımənim qarşımda idi. Təxmin etdiyimə görə, şeirlərinin sayı 1400 fərd olardı və hamısı da şəhid seyid cənablarına (İmam-Hüseynə) olan növhələrdən, müxəmməs, müstəzad, tərcibbənd, təcnis, qəzəl və şairədən ibarət idi. Biçarənin ömrü vəfa etmədi, yoxsa ki, şairliyə lazım olan hər şey onda var idi. Din yolçusu sayılırdı.**

**Belə ki, sağ olan vaxt çox zaman mənim yanıma gəlirdi, əhvalından xəbər tuturdum. O mərhumun bacısı oğlu maarifpərvər cənab Məşədi Səməd bəy onun maddeyi-tarixi üçün bu beytləri yazmışdır:**

### ABDULLA BƏY ASİ QARABAĞİ HAQQINDA MADDEYİ-TARİX

Fəqan, yenə üzü qara çərxin gərdişindən,
Qəm sultanı aləm şəhərinə ordu çəkdi.

Şeir deməkdə və nəzm qoşmaqda ad-san,
Ay və günəşə çatan Asi həqqin dəvətinə,

“Ləbbeyk” devib, bu vəfasız dünyadan,
Allahın rəhmətinə tərəf yollandı.

Əfsus, elm və söz xəzinəsi olan o sinəyə,
Ki, qara torpağın altı ona yataq oldu.

Qeybdən vəfat tarixi üçün nida gəldi.
Ruhu behişt (1291) qəsrlərini cayqah etdi.

### ASİNİN QƏZƏLİ

İstərsən ayın üzünü bulud altında gizlədəsən,
Üzündən o iki zülfünü bir yana çək.

Sənin qıvrım zülfünün yadı ilə ayrılıq gecəsi,
Könlümün ahının tüstüsünü aya çatdırıram.

Üzündə hər kim sənin xəttini görsə,
Deyər Hind şahı Rum elinə qoşun çəkibdir.

Şahənşahın eşqinin vəsfində bunu demək,
Kifayətdir ki, o, padşahı bəndələrə qul edər.

Ey piri-muğanın lütfü feyzi bizi düz yola gətir.
Meyxanədən Kə'bəyə gedən yolu itirmişəm.

Ey zahid, xudavənd o cəhhənəmi ki, yaradıb,
Biz bilirik ki, o, xanəgahdan ibarətdir...

Asi  nə üçün sabahın qəmin çəksin ki,
Qiyamət günü şəfəqqət saqisi günahı bağışlar.

## YENƏ ASİNİNDİR

Bayram günüdür,mən bu xirqə və dəftəri neynirəm?
Əgər badə yolunda girov qoymasan, daha onu neynirəm?

Əgər meysatan o gəncin yolunda can qurban etməsəm,
Çiynimin yükü ağır olan mən bu başı neynirəm?

Mənim ki, əlimdə mey, dodağım saqinin dodağındadır,
Ey zahid, hurini istəmərəm, kövsəri neynirəm?

Ey müfti, kabab bişirmək üçün odun yoxdur,
Yol göstər, minbəri yandırmayım,bəs nə edim?

Əziz şey ona görə varımdı ki, verəm şərab alam.
Yoxsa gümüş nəyimə lazım, qızılı neynəyirəm?

Ağ bədənli gözəlim ətirsaçlı saqidir,
Belə qiblə olan yerdə, sənəmxaneyi-Azəri
(oda sitavəş edənlərin bütlərini) neynirəm?

Dəfələrlə bədxasiyyət zahidi yanımdan qovmuşam,
Ey Asi, belə eşşəyə əl qaldırmayım, bəs nə edim?

## YENƏ ASİNİNDİR

Əgər behişt tuba ağacı ilə fəxr edirsə,
Onun acığına rəna qəddinlə naz ilə gəl!

Sənin peykərinə asimanın ayı hardan oxşasın?
Saf gümüşün, üzünə qızıl suyu çəkilmiş misə nə oxşayışı var?

Sina dağında Allah əgər işıq yandırsa,
O işıq üzünün nurunun yanında kölgədə qalar.

Sənin üzünün xəyalını sinədə məhbus etmişəm,
Ki, eşq yolunda Züleyxanın ardınca gedim.

Xacə (Hafiz) kimi təkcə Səmərqənd və Buxaranı yox,
Mən din və dünyanı sənin eşqinə fəda edərəm.

Vüsal qapısını üzünə bu ümidlə açıram ki,
Sənin kuyində "fətahna" * surəsini əzbər edəm.

Yazıq Asi sənin qara gözlərinin yadı ilə,
Səhra ahularını özünə munis etdi.

## YENƏ ASİ

Nəsibim gərçi eşqində bəladır,
Bəla üşşaqə eyni-müddəadır.

Xoşam, hər cövr ilə qılsa nəvaziş,
Cəfasın çəkməmək, billah, cəfadır.

Cəfa gəlməz pərivəş mahlərdən,
Sanır qafil cəfa, leykən vəfadır.

Ləbi-şirinin ər düşnamə açsa,
Cəvabi-aşiqi-sadiq duadır.

Neçün lafi-ələst urmazsan, ey məh,
Bilirsən kim, cavabında bəladır.

Şərabi-lə'li-nabın firqətində,
Könül rəncü xumarə mübtəladır.

Neçün hicrandan Asi şikvə qılsın,
Riyazi-dost isə ol səfadır.

## ASİNİN QƏZƏLİ

Zahida, guşeyi-məsciddə nəyim var mənim?
Bərbətü çəngü dəfü nayü neyim var mənim.

Kövsəri vədə edərsən mənə gərçi nisyə,
Nəqd dəstimdə bu gün cami-meyim var mənim.

* Qur'an, 49-cu surə, 29-cu ayə

Hurü qılmanını çox vəsf eləmə minbərdə,
Gör necə saqiyi-fərxəndəpeyim var mənim.

Nə üçün Kə'bə üçün kuhü biyabanı gəzim,
Meykədə mənzili-leyladı, heyim var mənim.

Yığılıb müğbeçələr piri-muğan dövrünə,
Duxtəri-nə'ş arasında cüdeyim var mənim.

Asiya, meykədə küncün özünə məskən edib,
Nüsrəti-mülki-Kəyavusü Keyim var mənim...

* * *

Ey zülf, sənin qıvrımlarının misli yoxdur,
Qıvrım olsan da, qiyamət tək uzunsan.

Əgər qamətinə əyilməsə, ey zülf, deyərdim ki,
Sənin qamətin aləmdə yüksəklik əlamətidir.

Bağışla, əgər sənə Xəta müşki dedimsə,
Xəta dedim, vallah, ayələrin ayəsisən.

Badi-səba ilə şanənin əlindən ürəyim,
Özünü sənin kömək kölgənə atdı.

Nə qədər cövr-cəfandan ürəyim yanacaqdır?
Axı səninlə miskin Asinin ədavəti yoxdur.

## ASİNİN QƏZƏLİ

Əla, ey şuxi-şirinkari-bihəmta, xudahafiz,
Qəmi-eşqində bəsdir olduğum rüsva, xudahafiz.

Nə qədri nəqdi-səbrim var idi, sərf oldu eşqində,
Tükəndi mayə, bir sud etmədi sevda, xudahafiz.

Nə məndə tab var kim, səbr edim bu daği-hicranə,
Nə cövri-zülmdən var səndə bir pərva, xudahafiz.

Rəqibi-divsurət qoymadı firdovsi-kuyində,
Dərəm bir ləhzə vəslindən güli-həmra, xudahafiz.

Hərimi-kuyinə məhrəm olub əğyar, mən məhrum,
Qəbul eylər bu zülmü qeyrətim, haşa, xudahafiz.

Səri-kuyində məskən tutmağa Asi deyil layiq,
Bu gündən belə əğyar eyləsin mə’va, xudahafiz.

## ASİNİN QƏZƏLİ

Edər sehr ilə daim bu xəta kani qəra gözlər,
Könül şəhrini yəğma türki-türkani qəra gözlər.

Yenə sultani-hindu tək sipahi-xətt hökm etmiş,
Ki, tutsun dövri-lə’lində Bədəxşani qəra gözlər.

Qəzali-Çinə bənzətdim bu cadunu, xəta etdim,
Ki, onda kəc nigahın şivəsi hanı, qəra gözlər?

Könül məcmu ikən zülfi-pərişanda edər dərhəm,
Nə təqsir eyləyib, bilməm, bu zindani qəra gözlər.

Verib baş-başə Asi qətlinə daim müsəmməmdir,
Bu yektalıqda yoxdur onlara sani, qəra gözlər...

* * *

Əgər sənin adını çəkib, mədh edirəmsə,
Hamı bilir ki, mən sənə pərəstiş edirəm.

Bu gözəllik işığı Adəmin zatında olduğu üçün,
Göylərdə olan bütün mələklər ona səcdə etdilər.

Ey dost, nə istəsən et, çünki sənin gözəlliyinə,
Qiyamətdə də layiqli mükafat alarsan.

Güzgü tək üzünə diqqətlə baxsaq,
Allahın nurundan özgə heç nə görünməz.

Əgər Asi deyirsə, Allahdan başqa heç nə yoxdur,
Hamını inkar edirlər, təkcə səni yox.

* * *

Ürəyim dalğavari saçlarının toruna düşdü,
Bundan sonra işlərim lap müşkülə düşdü.

Deyərdim ki, heç kəsə mən könül verməræm,
Nə edim ki, sə'ylərim faydasız oldu.

Elə ki, sərv istədi xuraman olsun,
Bağda ayağı gilə batdı.

Zülfünün ətrini badi-səba bağlara saldı,
Bundan sünbülün halı pərişan oldu.

Qırmızı ləblərindən bir qətrə mey dadmamış,
Mevxanə aşiqi tək bihal oldum.

Məcnunun təkcə Asi deyildir,
Aşiqlərinin hamısı Məcnun olubdur.

Yenə gözəlim səfər fikrinə düşdü,
Könlüm o karvanın dəvəsindən asılmış zəngə döndü.

İstədim kəcavəsinə baş qoyam,
Ayaqlarım göz yaşımla palçığa batdı.

Yarın vəslinin hücrəsindən ayrı düşdükdə,
Ürəyim məclislərin şamı kimi alovlanır.

Qaşlarının mehrabı qarşımda olmasa,
Bilirəm, qıldığım namaz qəbul olunmaz.

Nə Sumnat, nə Kə'bə, nə kilsə, nə xanəgah,
Meyxanələr kimi dərdimə əlac etməz.

O ətirli zülfünlə dərdimə çarə etməsən,
Ölənədək ətəyindən əl üzməræm.

Asi, necə ağlamayım bulbul tək bu qəm ilə,
Ki, gülüm mənim acığıma tikana yar olub.

## ASİNİN CIĞATAYCA QƏZƏLİ

Səbağə itsəm əhvalimi şərh, imdad qılğaymu?
Pəvami giltürüb biçarə dilni şad qılğaymu?

Sifariş ilasam şahimğə virlən mülki-dil şərhin,
Sipahi-dərdi-qəmni göndərüb abad qılğaymu?

Mey içqan dəm rəqibi-rusiyəh birlə o şol bimehr,
Fəraqidən bənüm qan yutmaqımni yad qılğaymu?

Sirişkim sudrasə kuyiğə uşbu mürdə cismimi,
Rəvanbəşx irəni birlə tərkizüb bir ad qılğaymu?

Fəraqiğə belə xugər etübdür xəstə könlümni,
Vüsaliğə ginə bilməm onu mötad qılğaymu?

İki çeşmin neçün seyd eyləğay avarə könlümni,
Zəif olğan keyk qəsdin iki səyyad qılğaymu?

O şol kafərğə köp yalbarma, ey dil, mürğini səyyad,
Tuzaqdin nalə qılmaqlıq belə azad qılğaymu?

Bəna yetkəc cəfavü zülmğə mötad olur zülfün,
Və ya əğyarlərğə həm belə bidad qılğaymu?

Quyaş ruxsarlardin zərrəcə mehr ummağay, Asi,
Ədalət görməğan kəs şahlarğə dad qılğaymu?..

* * *

Elə ki, zülfünü üzündə pərişan yaratdılar,
Bunlardan küfr və iman yaratdılar.

Sənin məst qara gözlərin yaranandan bəri,
Dünya fitnədən bir an azad deyildir.

Misir arvadları o dəm əllərini kəsdilər,
Ki, Kən'anda Yusifi yaratdılar.

Bağda bülbül naləsi üçün,
Qönçənin ağzını xəndan yaratdılar.

Sənin kuyinin Kə'bə hicrində,
Bizim qəlbimizdə tikan (xari-müğilan) yaratdılar.

Mənim bəxtimin əriş arğacından,
Hicranın qara gecələrini yaratdılar.

Sənin üzünün eşqinin atəşində,
Xəlil kimi gülüstan yaratdılar.

Sənin ki, qəddini xuraman yaratdılar,
Şümşad və sərvin ayağı palçığa batdı.

Asi eşq sultanının bəndəsi olduğu üçün,
Onun yüz sultan kimi bəndəsi vardır.

## YENƏ ASİNİNDİR

Əgər nigarım bu surətdə görünsə,
Qiyamətin həyəcanı yüz dəfə artar.

Çətin ki, bundan sonra dünya anası,
Sənin kimi cavan bir gözəl doğsun.

Çətin ki, Şuşada sağlam bir adam qalsın,
Bu pəri belə ki, ürəkləri aparır.

Tatar müşkünün bazarı kasad olar,
Əgər nigarım ətirli saçlarını açsa.

O şirin ləbindən bir cavab buyur,
İstər acı, istər şirin ola, yaraşır.

Hərgah Asi onun lə'lindən söhbət açsa,
Sözlərindən şəkər tökülər.

**Vər. 86b**

## ŞƏHİD QARABAĞİ

**Mərhumun adı Mirzə Əbülhəsən Kərbəlayi Kazım oğludur. Qarabağın Şuşa vilayətindəndir. Təxəllüsü Şəhiddir. Ömrünün ilk çağlarında sənət əhli idi. Sonra qazandığı elmin sayəsində mollalar silkinə daxil oldu. Get-gedə Cavanşir mahalının qazısı, sonra da Gəncənin şəriət məclisinin üzvlərindən biri oldu. Şeir deməkdə də məharəti var idi. Hündürboy, qarasifət bir kişi idi. 1293-cü ildə (miladi 1875) təxminən 60 yaşında sağ idi. Aşağıdakı şeirlər onun kəlamındandır:**

Va həsrəta ki, tərki-vəfa qıldı yarlər,
Əfğan ki, keçdi həsrət ilə ruzigarlər.

Dərda ki, yarsız qəmi-hicr aldı canımı,
Qaldı könüldə məhşərə çox intizarlər.

Sövdayi-zülfü xəttini başdan çıxarmazam,
Gər başım içrə məskən edə murü marlər.

Ərbabi-eşqdən sora aləmdə kaş kim,
Meyli-rəqib qılmaya gər gül'üzarlər.

Künci-qəfəsdə bülbüli-miskin edər fəğan,
Tutmuş məqam səhni-gülüstanda xarlər.

Əfsus, gül eşitmədi bülbül nəvalərin,
Yetdi xəzan gülşənə, keçdi baharlər.

Ömr əziz saxla, Şəhid, olsa gər nəsib,
Əyyami-vəsl lazım olur çox nisarlər.

## ŞƏHİDİN KƏLAMI

Gülşənimdə güllər xara məhəbbət bağlayıblar,
Məskənim qəfəs küncü oldu.

Canan, düşmən tərəfə gizli baxma,
Onun kin atəşi xirmənimə od salıbdır.

Gözucu gizlincə baxıb gördüm ki,
Məclisdə rəqib dodaq dodağına qoyubdur.

Məni uçurmaq üçün məni daşa basma,
Bu yuvada qanadlarımın tükünü tökmüşəm.

Şəhid, Allah xatirinə, bir dəm,
Qanlı göz yaşını sil ki, canımı bağışladığım zaman onu görüm.

**QƏZƏL**

Çox təşnəyəm ol qaməti-rə’nayə, yavaş get,
Min həsrətəm ol hüsni-dilarayə,yavaş get.

Qıldın məni-biçarəni aşüfteyi-zülfün,
Saldın bir uzun şur ilə qovğayə, yavaş get.

Ey badi-səba, türreyi-yarə güzər etsən,
Bir tul sözüm var dili-şeydayə, yavaş get.

Ahulara mə’nus qılıb nərgisi-məstin,
Salmış məni Məcnun kimi səhrayə, yavaş get.

Dur, bir baxım ol qəmzeyi-cəlladə, verim can,
Axir yetişəm bircə təmənnayə, yavaş get.

Əbruyi-xəmin tiğ çəkib qətli-Şəhidə,
Saldın dili-aşüftəni qövqayə, yavaş get.

* * *

Ürəyim qılınca oxşar qaşlarını görəndə elə titrəyir,
Elə bil ki, yaralanmış ov tələnin bəndini görüb titrəyir.

Mərhəmət zamanı qəmzələr gözündə elə titrəyir,
Sanki qəzəb vaxtı qatil əlində nizə titrəyir.

Saçının düyümünü açanda əyri tellər titrəyir,
Bəli, yoxlama vaxtı xain xəzinədar titrəyir.

Onun üzü kirpiklərin kölgəsində titrəsə, olar,
Çünki Peyğəmbərin barmağından göydəki ay titrəyir.

Gözəl üzünü ört, gəl, yenidən bir inqilab yaratma,
Çünki dünya Tur dağı tək bu səhnədən titrəyir.

Sənin zülfündən bir damcı qan olan ürək necə titrəməsin?
Musa öz yədi-beyzası ilə qızmış əjdahadan titrəyir.

Göz yaşlarının dalğaları arasında qamətinin təsviri titrəyir,
Elə bil sərv ağacının kölgəsi axan suda titrəyir.

Ürəyimin fəryadından ürəklər aram tutmur,
Axı təhlükəli gecədə zəng səsindən karvan da titrəyir.

Sənin əmrin olanda, eşqin Şəhidi odda da oturar,
Nəmrudilərin odundan titrəyən adamın halı necə olar?

* * *

Sənin məst gözlərin badə içənlərdir,
Onlar xəstədirlər, üzürlüdürlər.

Füsunkarlıqda qaşların mahirdir,
Hər ikisi daim əyilmiş (qıvrılmış) ilandırlar.

Sənin o iki gözün iki xətakar məstdirlər,
Hərəsi bir qılınca söykənən qaniçəndir.

Gözlərinin əlindən nalə çəkmərəm, onlar ürək sancandır,
Bu üsul artıq hamıya bəllidir.

Sənin qaşların qaniçən ox atandırlar,
İki cevran ovlamaqçün ox atandırlar.

İlan tək o bir cüt hörüyün sənin,
Firdövs gülşəninin bağbanıdırlar.

Zəncir tək bağlanan bir cüt hörüyün sənin,
Gecə tək uzundur, hamı onun əsiri.

Ey zülf, Şəhid tək aşiqin çoxdur sənin,
Onlar ömrü boyu sənə bağlı (aşiq) qalacaqlar.

* * *

Ey baş-başa vermiş qövsi qaşlar,
Daima iki dünya mülkünü xərab etməkdəsiniz.

O parlaq saçların həvaləsindəsən,
İlandan qorxan (qanad açmış) tovuz tək qanadlanmısan.

Sanki bu dəli könlün sorağında sən,
Bu qıvrım tellərə baş əyibsən.

Dostlar xəstə dost yanında olduğu kimi,
Bir cüt məst göz qarşısında əyilib qamətin sənin.

Sərv budağı şehdən gülə doğru əyildiyi tək,
Vəsmənin rəngindən belim gül camala doğru əyilib.

Qövsi qaşlar qarşısında yay tək əyilmiş bu bəxt,
Bu əyilmiş bəxt sənin özünü də özünə əyir.

Ox atmaq elmində sanki Bijənsən,
Qılınc vurmaq sirrində Rüstəm həsəd çəkər sənə.

Qara vəsmə paltar geymişsən,
Sanki, cəfakeş Şəhidin matəmindəsən.

* * *

Ey yar, səndən başqa heç bir hekayətim yoxdur,
Hər kəsdən hekayə etsəm, son məqsəd sənsən.

Dostlar hər tərəfimdə yüz cür söhbət edirlər,
Mən isə həvəslə səndən danışıram.

Dövranım tamam oldu, ömür axıra çatdı,
Sənəsə eşqimin hələ sonu görünmür.

Canıma saldığın bu od-alov kaş ki,
Bir gün sənin də canına sirayət edərdi!

Cismimə od vurma, axı bu mülk sənindir,
Köməklik ümidilə onu sənə təslim etmişəm.

Eşqin qəlb evinin taracına hökm verdi,
Sultan acıqdan vilayəti qarət edər.

Hüsnünün padşahı bayraq qaldıranda,
Hamının qoşunu canımın şəhərini tərk etdi.

Sənin gözəl surətindən mərifət aşkar olur,
Bu hüsnün Allahın qüdrətindən yaranmışdır.

Mənə nəsihət verəndən nə tayda ki, o özü eşqində
qərq olmuşdur.
O özünü itirmiş olduğu halda, necə yol göstərə bilər?!

Əgər məni öldürsən, hər şey olar-aydın olar,
Heç bir üzlə səndən şikayətim olmaz.

Çək iti qılıncını, bizim şəriətdə rəvadır,
Şəhid qətl olsa, cinayət sayılmaz.

* * *

Ey yar, qəlbim bənd oldu kəməndində sənin,
İki dünya mülkünə sənin bəndindən qopmaram.

Getmir bir dəm belə qəlbimdən xəyalın sənin,
Hər iki dünyanın möhtacları sənin arzundadır.

Hər an sənin sərv qamətin mənim gözlərimin önündədir,
Sənin gözəl camalın hər an mənim könlümdədir.

Sənin sərv qamətinə adət edəndən bəri,
Qəlb quşum öz yuvasına meyl etmir.

Sənin gözəl cəmalın hər an mənim könlümdədir,
Beşikdən qəbrədək dərmanımsan mənim.

Camalın gözəllikdə misilsizdir,
Şirin ləblərin İsa kimi ölüləri dirildər.

Ey dost bəndində olan Şəhidə öyüd verən,
Mən ancaq öz dostumdan öyüd götürərəm.

**Vər. 91a**

## MİRZƏ İBRAHİM SƏBA

**Şə'ban, 1309-cu il (mart, 1892-ci il)**

**Mirzə İbrahim Həsənağa oğlu Qarabağın Şuşa əhalisinin molla və şairlərindəndir. Onun əsli Bayəzid məmləkətindəndir. Heybətli bir kişi idi. Sənəti müəllimlik idi və yaxşı xətti var idi. On beş il bundan əvvəl yetmiş yaşında rəhmətə gedib. Təxəllüsü Səba olub. Bəzən şeir də deyirdi. Divanı yoxdur və şeirləri pərakəndədir.**

**Bir gün mərhum arvadı Aynanın üzünü kədərli görür, vəcdə gəlib dərhal bu fərd ilə ona müraciət edir:**

**Ayineyi-ruyində çün oldu kədər peyda,**
**Vəhm eyləgilən, oldu ahımda əsər peyda.**

**Və bu təxmis yenə o mərhumun xəyalatındandır.**

## SƏBA MİRZƏ İBRAHİM

Dila, etmə dünyayə zövqü həvəs,
Cahandan təməh, candan ümmid kəs.
Gəlir guşimə dəmbədəm belə səs:
Cəhan, ey bəradər, nəmanəd be kəs,
Del əndər cəhanafərin bənd bəs.*

Nərə getdi Cəmşidi-fərruxsirişt,
Olub bəstəri xak, balini xişt.
Vəfa etmədi onlara gərduni-zişt,
Məkon təkye bər molke-donyavo poşt,
Ke, besyar kəs çon to pərvərdevo koşt.**

## SƏBANIN TƏXMİSİ

Gözün üstəki o qara teldən ayrılmaram mən,
Allah yaradıb o qoşunu bəxtimə mənim.
Padşahın üzünün mehrini görəndən bəri,

---

* Bu dünya, ey qardaş, bir kəsə qalmayacaq,
Ürəyini dünyanı yaradana bağla.

** Bu dünyaya bel bağlama,
O sənin kimi çoxlarını bəsləyib öldürdü.

Xanəgahı meyxanədən ayıra bilmədim.
Eşqin həyəcanından mən yolu itirdim.

Meydən ancaq müddəinin artığı nəsib oldu bizə,
Müddəi yar ilə əhd bağlayıb mey içdi.
Müddəi  bu yolla sənin hicranına tapşırdı məni.
Müddəi gülüstanda gülün ətəyini ələ alan zaman,
Mən gülə baxmaq üçün bağbandan icazə aldım.

Onun daş qəlbinə heç "ah" təsir etmir,
Aşiqlərin fəryadı Sürəyyaya çatıbdır,
Kirpiklərin qanı gözlərdən səhraya axıbdır,
Məni qana salan, başına kəc papaq qoyan,
O türkü mən sənə nişan verəcəyəm.

Ey vay, yarım yaxşılıq etməyə meyl etmir,
Camalının nuru çatıb son həddə.
Nə vaxtadək miskin könlümü kabab edəcək?
Bu bağın gülləri sudan sirab olmur,
Görən, nə vaxt bu otlara bir damcı su verəcəklər?

Hicrdə kim mənim zümzüməmi görsə,
Mənim xəyala qapıldığımı zənn edər.
Onun vüsalı zamanı danışa bilmirəm, nitqim quruyur,
Bəxtim görəndə ki, şikayət dilim yoxdur,
Padşahın ürəyini ədalətə meyl etdirdi.

Mənim qanım ana südü tək halaldır sənə,
İndi ki, vüsalın nəsib olub mən biçarəyə.
Əgər istərsən ki, yol tapmasın ürəyimə qəm-kədər,
Saqi, gəl mey tök bu hilala oxşar badəyə,
Orucluq bayramıdır, şah üzündə ayı görmüşəm.

Bir baxışla yüz cəfanın əvəzi çıxar,
Aşiqlərin sinəsinə yüz dağ çəksən belə.
Piri-müğan bu yolu mənə öyrədib,
Əgər saqi sənsən, badəni sən paylayırsan,
Qiyamət günündə günahlarımdan üzr istəmərəm.

Hicrində qocalar və cavanlar avarə oldular,
Bu hicrdə aşiqlərinə ürək qanı nəsib oldu.
O nə dost tanıyır, nə düşmən, nə rəqib,

O füsunkar gözdən aləm zinhara gəlib.
Qəmzələrin yenə də qoşun yığmaq fikrindədir.

Hicrində sənin Ceyhun mənim gözümə çatmaz,
Bu pis taledən Səbaya nə çatar?
Gör ki, mənim naləmdən indi sənə nə çatar?
Bu gecə zamanın xırmanına nə ziyan çatar?
Aşiqin sinəsində nə qədər ah olar?

**Vər. 93a**

## MİRZƏ HAQVERDİ QARABAĞİ

**Cəmadiyül-əvvəl 1309-cu il (dekabr, 1891-ci il)**

**Mərhum Mirzə Əlinin oğlu mərhum Mirzə Haqverdi Qarabağın Şuşa şəhərinin keçmiş qazısı olub. Şuşa şəhərində doğulub və mərhum qazı Mirzə Əbülqasımın qardaşıdır. Cavanlığından bu şəhərdə elmlə məşğul olmağa başlayıb və bir qədər keçəndən sonra təhsilini davam etdirmək üçün dini mərkəzlərə getmişdir. Bir qədər təhsil aldıqdan və ilahi-ruhani mətləblərin dərinliyinə varid olduqdan sonra mərhəmət günəşi mərifət üfüqlərindən onun taleyinə düşdü. Bu həvəsi onu gətirib tərki-dünyalığa və səadətin yerləşən nöqtəsinə çatdırıb, xoşbəxt etdi. Ömrünü Allaha ibadət və itaətlə keçirdi. Belə ki, 1299-cu ildə (1881) bu dünyadan köçüb getdi. Təxəllüsü Səfa idi. Divanı yoxdur. Onun bəzi şeirlərini bu təzkirəyə yazıram.**

**Gizli qalmasın ki, mərhumun 32 qəzəli əlimə düşmüşdü, ancaq işin çoxluğu onların hamısını yazmağa mane oldu. Ona görə də onlardan on altısı ilə bu təzkirə bəzəndi. Cəmadiyül-əvvəl 1309-cu il (dekabr, 1891).**

### QƏZƏL

Ahü fəğanımız çəmənə od-alov saldı,
Bundan bağban, çəməndə yurd-yuvamız yandı.

Qara qarğa bostanımızı dağıtdı,
Payız küləyindən gülüstanımız soldu.

Qara qarğa gül budağında yuva saldıqda,
Xoşavaz bülbülümüzün səsi batdı.

Qapında rəqibdən özgə tələbkar yoxdursa,
Bizim gizli sirrimiz qulağına çatarmı?

Səndən mənə min cəfa gəlsə, dözərəm,
Zəif canımız bəladan özgə bir şey görməyib.

### QƏZƏL

Ey yar, üzünlə xanəmizi nura boyandır,
Axır dəli könlümüzü ələ al.

Halımızı bilmək üçün yubanmadan bizə tərəf bir addım at,
Axı evimizin yolunu sən bilirsən.

Mehriban əlinlə könlümüzün xanəsini abad et,
Dəli könlümüzün viran olmasına yol vermə.

Onun xalının danəsi,
Yüzdanə təsbihimi əlimdən aldı.

Ey kaş, bizim dəli üzümüzü görən kəs,
Mən adsız və nişansızı bir yad edəydi!

## YENƏ

Allah xatirinə, bizim yorğun canımızı incitmə ki,
Bizim sınmış qol-qanadımız özümüzə tələ olub.

Ey dad, bütün yoldaşlar səfər etdilər,
Heyhat! Bağlı ayaqlar bizə yol verməyir.

Naz ilə gəl ki, ürək camalını görmək istəyər,
İntizarda biz qapında oturanları öldürmə,

Gəl ki, vida vaxtı çatmışdır,
Yorğun canımız qədəmlərinə qurban olsun.

Ürək sınıqlığımız ürək düzlüyümüzdəndir,
Bizim qəlbimizi bir də sındırmağına ehtiyac var?

## YENƏ

Bizim əfsanəmizə qulaq asan hardadır ki,
Zəmanəmizin bizə nə etdiyini ona söyləyim?

Ayrılığa dedim ki, eşqin gizli sirlərini demərəm,
Göz yaşımdan gizli qəmlərim aşkar oldu.

Əgər nigarım bir dəm bizə gəlsə,
Rəqib cövrü cəfasından arxayın olaram.

Ey könül, məhəbbət yolunda şadlıqdan nişanə axtarma,
Eşqdən könül dağı indi nişanımız oldu.

Elə ki qəfəsdə şövqlü bir nəğmə oxudum,
Təranəmiz çəmənə şurü fəqan saldı.

## YENƏ

Könül naləsindən bu gecə əzab çəkirəm,
Dərdliyəm, həm də kədərliyəm bu gecə.

Ağlamaqdan göz yaşıma qərq olmuşam,
Nə biləsən ki, nə haldayam bu gecə?

Nigarım bu gecə gəlsə qapıma,
Qədəmlərinə canımı qurban edərəm.

Ey səxavət mayası, əlimdən tut,
Rəqib əlində xar oldum bu gecə.

Həmsöhbətim qəm və müsibətdir,
Söhbətim bu gecə yarla deyildir.

Ey pərivəş, sənin ay üzün olmadığı üçün,
Gözlərimdən yaş axır bu gecə.

Səfa necə fəqan etməsin?
Sənin dərdin qəlbimdədir bu gecə.

## YENƏ

O məh bu gecə mənə baxmır,
Pənahım, dostlar, bu gecə kim olacaq?

Sənin eşqində ürəyim heç şad olmadı,
Şahidim qəm-qüssəndir sənin bu gecə.

Yadlar yanında oturdun, ey yar,
Axı günahım nədir mənim bu gecə?

Canansız ahımın tüstüsündən,
Dünya gözümdə qaraldı bu gecə.

Ələm dəstəsi mənə sarı gəldi,
Qəm ləşkəri qoşunum oldu bu gecə.

## HAQVERDİ SƏFANIN KƏDƏR VƏ BƏLADA YAŞAMASI

**(Məsnəvi)**

Hindistandan uzaq düşən,
Ey doslar, mən qəmdidəyəm.

Ey qüds bağının quşları,
Ünsiyyət bostanından uzaq düşən mənəm.

Könül can aləmini seyr etdi yenə,
Könül canan əhdini yad etdi yenə.

Çəmənlik məclisinin havası ilə,
Ruh quşum qol-qanad açdı.

Başımda bülbül havası vardır,
Bülbülün nəvası gül üçündür.

Hicranda olan yar vüsal eşqinə düşdü,
Məcnun söyüd öz əslinə (kökünə) sarı əyildi.

Yenə könül naləsi başımdan çıxardı huşumu,
Yenə yada düşdü yar və diyar həvəsi.

Qəfəsi titrədən quş məgər,
Gülşən tərəfə uçmaq istəyir?

Könlümə əsl vətən sevdası düşdü,
Könlüm bir daha müşkülə düşdü.

Əfsus! Bahar qurtardı, gül vaxtı keçdi,
Çəmən soldu, bülbül uçub getdi.

Sızlaram, qəlbimdə fəğan tüğyan edir,
Nə edim, karvan gedib, qalmışam tək.

Xoş o məclisə ki, orada kef var idi,
Ruhani əhvallıların məclisi idi.

Müqəddəs məclis idi, yar kəlamı onun məşqi idi,
Məhəbbət məclisi idi, yar eşqi onun hekayəsi idi.

Xoş o dərsə ki, işraqi idi,
Xoş o şərhə ki, müştaqi idi.

Günəş getdi, nurlu ay hanı?
Dərya qurudu, bəs gövhər hanı?

Yarın üzü hicab altda olsa belə,
Surəti yadigar kimi məndədir.

O dilrübanın üzündən uzaq olsam da,
Könlümdə ondan bir kəhrəba var.

Can məni mə'na tərəfə çəkir,
Mənə cananın yolunu nişan verir.

Ey dəryadan yadigar qalan gövhər,
Ey ətirli gülüstanın gülabı.

O gövhərdən çıraq kimi işıq saç,
Bu gülabınla damağıma ətir saç.

Hərdən bu hicrində olanı yad et,
Könül Turunu nur ilə işıqlandır.

Hərdən çaparla ətirli müşklər,
Hərdən ətirli məktublar,

Göndər bu hicrində olanına,
Lütf et, göndər, cananım mənim.

Yarın diyarından olan o məktub,
Xəstə könlümün fərəhini artırar.

Yarın diyarından əsən o nəsim,
Aşiqin canını çox rahatlandırar.

Aşiqlər üçün yar hədisi xoş olar,
Bülbül üçün yar söhbəti xoş olar.

Mən yardan, vətəndən uzaq düşmüşəm,
Siz xoş olun, mənim dostlarım!

Ney kimi hər bəndim fəğana gəlir.
Haray, hicran əlindən, haray!

## QƏZƏL

Sənsiz alsam əlimə cam bu gecə,
Sənsiz mey içsəm, olsun haram bu gecə.

Ey naqis ay, sən gəl kənara dur ki,
Bədrlənmiş ay özü gəlibdir bu gecə.

Nə fayda ki, bir dəm belə rəqib yardan ayrılmır,
Vüsal şərabımı zəhrmar etdi bu gecə.

Ey dil, qumru kimi qu-qu etmə ki,
O xoş qəmzəli sərv evimə gəldi bu gecə.

Onun şam üzü məclisimi çırağban etdi,
Min şükür, bəxtimi kama yetişdir bu gecə.

Müddəinin. rəqibin, əğyarın zəhmətini istəmərəm,
Hamısı büsbütün uzaq oldu məclisimizdən bu gecə.

Zülf yuvasından özgə qaçılası bir yer yox,
Səfa zülfün qıvrımında tora düşdü.

Vəfa gözəlliyi mülkündə sən tək bir şah görmədim,
O bir Allah bilir ki, sənə nökər oldum bu gecə.

## YENƏ

Mənim "ya Rəb" səsim bu gecə fələyə çatar,
Lakin vəfasız yarım bu "ya Rəb"dən qafil oldu.

Vəfasıza bax ki, atəşimə tökmədi su,
Eşqinin atəşindən ürək gücdən düşüb, bədən qızdırmadadır.

Ürək yandıran naləmdən xalq hər gun əzabdadır,
Gecədən sübhədək tökərəm göz yaşı onun qəmindən.

Hər kəs əbədi yaşayar əmsə dodağın şəhdindən,
Məgər o dodaqda dirilik suyunun xasiyyəti var?

Səfa, mehrü vəfadan başqa söz deməərəm,
Müəllim məktəbdə eşq aləmindən dərs deyib mənə.

## YENƏ

Gül mövsümü xoşdur, saqi, badə ver,
Çatdı həmin vaxt ki, camdan məstü xərab olam.

Səhranın seyri gülşəni gəzməkdən xoş olar, əgər,
Orda olsa saqi qədəhlə, müğənni dəflə, rübabla.

Eşqin adətidir ki, harda yarın adını çəksələr,
Ürək iztiraba düşər, üz saralmaz.

Yar hərdən vəfa etsə, qəm olmaz,
Hərçənd ki, onun əli aşiqlərin qanına batıbdır.

Çox çətinliklər bu yolda səbrlə asan olar,
Eşq yolunda tələsmək haçan xoş olar?

Qocanın cavanla eşqbazlığı nə vaxtadək çəkər,
Ey Səfa, artıq ötüb səndən cavanlıq çağı.

## YENƏ

Yenə yasəmən səfası arzusundayam,
Yenə bağü gülşən arzusundayam.

Könlüm həvəsi məni çəmənə tərəf çəkir,
Bevtül-həzəndən uzaqlıq arzusundayam.

Səfər fikrindən qəlbim sıxılır,
Vətən yarını görmək arzusundayam.

Ömür acılıqda, həyəcanda keçdi,
Şirindil dilbər arzusundayam.

Namus paltarını cırmışam,
Gül köynəkli saqi arzusundayam.

Özgələrdən pis sözlər çox eşitmişəm,
Xoş sözlü ağız arzusundayam.

Ayrılıq bəlasından rəngim qızıl rəngi aldı,
Gümüş bədənli gözəl arzusundayam...

## YENƏ

Gəl, ey yar, novbahar fəslidir,
Hər tərəfdən xoş səsli bülbüllər səslənir.

Bütün dostlar gülşəndə mey içirlər,
Bilmirəm saqi nə işlə məşğuldur?!

Çəmən gəlinləri naz pərdəsində,
Çəmən onların hüsnü ilə gözəlləşibdir.

Hər kəs bir nigarın əlindən tutub,
Bağ və laləzarın seyrinə dalıbdır.

Nigarın vəslindən uzaq olan hər kəsin,
Gülüstan gözündə bir tikanlıqdır.

Gəl, ey xəstə könüllərin dərmanı,
Ki, can ayrılıq dərdindən qəmdədir.

Ayrılıq dərdindən ela ağlaram,
Sanki gözlərim bahar buludu(dur).

## YENƏ

Gözəllik mülkündə sən tək şah az tapılar,
Hərçənd ki, bu zəmanədə çox gözəllər var.

Əgərçi qapında çox aşiqlərin var,
Mən tək nökər qapında az tapılar.

Bağda çoxlu sərvü çinar olsa da,
Ucalıqda qəddinə çatan olmaz.

Qəm yemə ki, dodaqların ətrafına xətt düşüb,
Çeşmə ətrafında tər çəmən xoş görünər.

Sənin üzünün əksi badəyə düşsə,
Saqinin şərabı bizə başqa nə’şə verər.

Saqi, gəl ki, bağü bahar mövsümü oldu,
Gül fəslində şərab daha xoşdur.

Ey göz yaşım, rüsvalığıma bais sənsən,
İndi Səfanın sirri hər ölkəyə düşdu.

## YENƏ

Sənin fərağına daima adət edənlər,
Bir dəm üzünü görməyi arzu edərlər.

Qəm günlərində məhəbbət əhlinin adətidir,
Gözdən axan ürək qanı ilə üzlərini yuyarlar.

Məhəbbətin müqəddəs mülkünə qədəm basanlar,
Gərək əvvəl öz qanları ilə dəstəmaz alalar.

Səhəng aparmaq qismətim olmasa da, ümidvaram ki,
Meysatanlar küçəsində palçığımızdan səhəng yaparlar.

İndi vəfalıqda aləmin başçısıyam,
Gərək dəfn olduğum torpağı iyləsinlər.

O niqabın sirri öz camalının mehrü məhindəndir,
Ki, bu mehrü məh niqabı üzünə salır.

Şükr Allaha ki, Səfa eşq yolunda öldürüldü,
Hamı onu axtarar, eşq yolu belə yoldu.

## QƏZƏL

### Səfa, İbrahim Xəlil xan Cavanşirin qızı mərhumə Gövhər Ağanın vəsfində deyib

Əgər könlündə gülüstan həvəsi olsa,
O dilbərin küçəsinə həvəs olar.

Bir kəsin astanasında ki, onda,
Bilqeyis tək yüz pasiban olar.

Bilik gövhəri olan Gövhər ağanın,
İnsanlığı və qəlbi vəsfdən uzaqdır.

Onun gülüstan kimi kuyi – küçəsi,
Cənnət bağından daha gözəldir.

Onun qamətinin rəftarı,
Zəmanənin fitnəsidir.

O, düşmənin canını alandır,
O, dostla çox mehribandır.

Mümkün deyil yenidən onun misli,
İki yüz əsr dünyada mövcud olsun.

Allah taleyini Şişədə yaradıbdır,
Onun cənnət dünyasından payı vardır.

Şükr Allaha ki, onun vücudu ilə,
Dövr edən asiman aram olur.

Heç kəs taleyindən (fələkdən) gileyli deyil,
Heç kəs zəmanədən qayğılı deyil.

Gör onun ədaləti necə də,
Bütün ziddlərin ziddinə durubdur.

Gur ilə (maral) şir birgə yatırlar,
Sərçələr qartalla birgə uçurlar.

Əgər dost tərəfə bir nəzər salsa,
Qoca olsa, dərhal cavanlaşar.

Ey qurbanı olduğum, səndən başqa kim,
Canımın, qəlbimin ümidi olar?

Bu bir həqiqətdir, hamı bilir ki,
Bülbülün yeri gülüstan olar.

Gəl saf ürəkli Səfaya bir bax,
Səfadan başqa daha nəyi var?!

## QƏZƏL

Bizdən canan məclisinə kim xəbər aparar?!
Gədanın sözünü sultana kim aparar?!

Cahan gülşənindən könül quşu diltəng olub,
Bu quşu cənnət bağına kim aparar?!

Xızır tək əbədi həyat sövdasındayam,
Bu təşnəni dirilik çeşməsinə kim aparar?!

Əğyarların sözü ilə yar bizdən bədgüman olub,
Vəfa sözünü söz qanan yara kim aparar?!

Ey badi-səba, bülbülün qissəsini gülə de,
Səndən özgə gülüstana bu xəbəri kim aparar?!

Yəqubun qəlbi ətrindən cana gələr,
Köynəyi Misirdən Kənana kim aparar?!

Qarabağ dilbərlərinin dilbəndi olduq,
Bizdən İsfahana xəbər kim aparar?!

Möhnət səxavətlidir, Səfanın sevgisi bəsdir,
Eşq kitabının şərhini kim başa vurar?!

**Vər. 100b**

## MOLLA ZEYNALABDİN SAĞƏRİ

**Şə'ban ayının 2-ci gecəsi, 1309-cu il (2 mart, 1892)**

**Molla Zeynalabdin ibn Molla Sadıq ibn Mirzə Məhəmməd Qarabaği Şuşada yaşayırdı. Uca boylu, xoş görkəmli, xoşsifət, göygöz bir şəxs idi. Sənəti mollalıq və rövzəxanlıq idi. Yaxşı səsi və avazı var idi. Musiqi elmində də məharəti və səriştəsi var idi. Eşq-işrət adamlarından idi. Şeirlə iki cild kitab nəzmə çəkmişdir. İki divanı var, biri farsca, biri türkcə (azərbaycanca). Mükəmməl şeir və qəzəlləri var. O iki kitabda olan qəzəl, rübai, müxəmməs və s. sayı mindən çoxdur. Qəzəllərin əksəriyyəti yeddi beytdir. Ləqəbi Sağəri olub. Bu dünya ancaq hadisələr səhnəsi olduğundan 1271-ci ildə (miladi 1854) günün batmasına üç saat qalmış güclü yağış yağmağa başladı. Mərhum öz qonaq və həmsöhbətləri üçün çay hazırlamaqla məşğul idi ki, birdən ildırımın odu o biçarəyə dəydi və dərhal canını cahanı Yaradana tapşırdı. Yusifi onun tarixi üçün bu beyti yazdı. Oğlundan eşitdiyimə görə, o hadisə vaxtı Sağərinin 65 yaşı var idi.**

**Xarrat Qulu Yusifi Qarabağinin Molla Zeynalabdin Sağəri üçün dediyi maddeyi-tarixi:**

Heyf olsun axund Zeynalabdin rövzəxana,
Vücudunun ömür xirmənini ildırım yandırdı.

Bu dünyada çaya, qəndə, narınc-limona,
İstəkan-simavara, bir də şirin söhbətə vurğun idi.

Tarixini axtarırdım, qeybdən nida gəldi,
Bir Hatif dedi ki, "Ey Yusif, *Sağəri*dən istə" (1271/1854).

Fələyin dövranı heç zaman kamımızca olmadı,
Saqi, al şərabı camımıza süz!

Bağbanın cəfasından gülüstandan çıxdım,
Bir kəs yoxdur, gülüstana xəbərimi çatdırsın.

Surət və zülfünün o qədər fikrində oldum ki,
Bizimçün axşamla səhərin fərqi olmadı.

Yarın zülfünün sevdasından xəbərdar olan hər kəs,
Sözümüzün rəmzinin yanğısından agah olar.

Hicran baltasını Fərhad kimi başıma vurdum,
Bu acı taleyimiz vüsalından şirin olmadı.

Öz Sağərini, gəl, bir dəm yada sal,
Ey sərv qamətli, ay üzlü, xoş yerişlim mənim.

**YENƏ**

Əgər ənbər saçan zülfünü küləyə tutsan,
Səhra ahularını öz toruna salarsan.

Sərvqamətlinin seyri mənimçün yaramaz,
Sinəmin ahından uca qamətliyə tə’nə vuraram.

Əgər məclisdə danışmaq fikrində olsan,
Yüz Məsihanın möcüzəsini xərab edərsən.

Sənə aşiq olmaqdan özgə nə etmişəm mən?
Niyə bəs bövlə qəlbimizi qana döndərəsən?

Misirli Yusif-Züleyxa əfsanəsindən özgə,
Gəl, Sağəriyə başqa əfsanə söyləmə.

**YENƏ**

Qıvrım saçlar elə ki, bir-birinə dolaşdı,
Əyri qəddim bundan daha da əyildi.

Kim halımdan agah olsa bir dəm,
Mən tək dərd və  qəm toruna düşər.

O saçdırmı, ya aşiq qəlbinin qaranlığı,
Ki, mehrü mahın dövrəsinə zəncir tək düşüb?

Xatirimə tərdən üzündə olan qızartı yadıma düşdü,
Gözüm üstünə şəbnəm düşən gülə düşdü.

Yarın torunda mənim kimi yüz əsir olsa da,
Tora Sağəri tək əsir az düşər.

**YENƏ**

Könlüm quşu zarü fəryad edər,
Zülfün tək dincliyi yoxdur.

Əgər zahirdə məndən uzaq olsan da,
Batində gecə-gündüz yanımdasan.

İki günlük gülüstanın qədrini bil,
Ömrün bahara ümidi hardadır?

Qurbanın olum, Allah xatirinə, məni incitmə,
Ki, can fəda etməkdən başqa əlimdən bir şey gəlməz.

Ey nurlu ay, sənin hicran gecəndə,
İşim ancaq ulduz saymaq oldu.

Ey şah, öz gədanı yanından qovdun,
Bu ki, şahlıq qaydası deyil.

Sağəri, axır mətləbimə çatdım,
Bir müddət meyxanədə oturdum.

## QƏZƏL

Gül budağında oturmaq mənə nəsib olmadı,
Baharın əvvəlində gülşənim xəzan oldu.

Bu il bahardan heç bir ləzzət almadım,
Naləm və qəm yeməyim özümə qaldı.

Gül budağında yuva qura bilmədim,
Hərçənd ki, bir ömür qanad çalıram.

Könül quşu tor və danə həvəsinə düşüb.
Könül əlindən ahü şivənim göylərə yetib.

Əhd etmişdim, Sağəri, heç vaxt tövbəmi sındırmayım,
Yüz dəfə tövbə edib, axırda (tövbəni) sındırmışam.

## YENƏ

O gün ki, gülşənindən uzaq oldum,
Bülbül tək qəmindən gözü yaşlı oldum.

Lə'li-ləbin qönçəsindən mənə bir şey çatmadı,
Ağzının qönçəsindən qanlıciyər oldum.

Könül quşu sinəmdən bağa tərəf uçdu,
Ey bağban, sənin zülmündən qol-qanadsız oldum.

Öldürdün məni, həyadan sənə nəzər salmadım,
Hərçənd ki, qılıncından sənin zirü zəbər oldum.

Sağəri, dünən gecə məni o yar səslədi,
Sevincdən ayaqlarım sustaldı, başı üstə getdim.

## RÜBAİLƏR

Eşq yatağında yenə xəstə oldum,
Bülbül tək fəryadü zar oldum.
Cana vüslət günü əziz olduq,
Ayrılıq gecəsi yaman xar oldum.

## YENƏ DƏ

Əlim dünyada vaxşı-pisdən xalidir,
Mən kafirəm, bütpərəstəm, məstəm.
Xumaram, halsızam, özümdən xəbərsizəm,
İlk sevgilim mənə əzəldən sitəm etdi.

## YENƏ DƏ

Bahar çağı oldu, güllər açıldı,
Bülbül gül və qönçədən şurə gəldi.
Saqi, sən o al şərabı gətir,
Çünki eyş-işrət məclisi bərpa oldu.

## YENƏ DƏ

Fələyin gərdişindən nə qədər fəryad edim?
Nə qədər öz bəxtimdən şikayət edim?!
Əgər ayrılıq gecəsi ah çəksəm, canan,
Şübhəsiz, bütün dünyanı bərbad edərəm.

## YENƏ DƏ

Gülüstanda payız əlamətləri görürəm,
Açılmış gülləri xəzanda görürəm.
Fələyin gərdişindən fəryad edirlər,`
Bülbüllər arasında həyəcan görürəm.

## MOLLA ZEYNALABDİN İBN MOLLA SADIQ QARABAĞİ SAĞƏRİ TƏXƏLLÜSÜN AZƏRBAYCANCA QƏZƏLLƏRİ

Rəsmdir, xublar rüxündə zülfi-ənbərbar olur,
Gənc olan yerdə bu adətdir, həmişə mar olur.

Qəddini təşbih edənlər sərvə olmazmı xəcil,
Sərvdə bir qəddi-mövzun var, nə bu rəftar olur.

Yoxdu aram aşiqə bir yerdə ta tutsun məqam,
Aşiqə aram olur hər məhfil içrə, yar olur.

Ey könül, gəl qılma nalə atəşi-hicranara,
Dilbərim yatmış, məbada xabdan bidar olur.

Badeyi-lə'li-ləbindən Sağəri məxmur olub,
Bəh, nə meydir şərbəti-lə'lin, içən huşyar olur.

### YENƏ

Gəlmədi bilməm neçün ol sərvi-xoşrəftarımız,
Ərşə çıxdı fırqətində ahi-atəşbarımız.

İntizarım aşdı həddən, təndə taqət qalmadı,
Harda qaldı, gəlmədi məhbubi-məhruxsarımız?

Vədə vermişdi ki, gəlləm bir gecə mehman sənə,
Ömrümüz başa yetişdi, gəlmədi dildarımız.

Gör xəzani-bimürüvvət vermədi hərgiz aman,
Gülsitan oldu xəzan, pamal olub gülzarımız.

Qüdrətim yox, gülsitan seyrinə uçmaq istərəm,
Quş kimi məhbus edib, künci-qəfəsdə yarımız.

Sağəri, az qıl şikayət dilbəri-birəhmdən,
Cövrü xoşdur rəhmdən, gər qılsa xoş güftarımız.

### YENƏ

Nə gördün sən vəfadə, aşiqə tərki-vəfa etdin?
Vəfanı tərk qıldın, bivəfa, yüz min cəfa etdin.

Vüsalın xanəsin viran edib, hicran evin tikdin,
Dağıtdın xaneyi-vəsli, məni biaşina etdin.

Təğafül qılma aşiqdən sən, ey mə’şuqi-səngdil,
Məni dərdə salıb əğyar dərdinə dəva etdin.

Rəqibi rəğmimə qıldın nəvaziş, canımı aldın,
Könül mülkünü eşqində əcəb sən bisəfa etdin.

Özümdən oldu hər nə oldu, yoxdu yarın təqsiri,
Zəbanın lal olaydı, Sağəri, sən bihəya etdin.

## QƏZƏL

Nə xoş zaman idi ol dəm ki, yarə həmdəm idim,
Təfaxür eylər idim öz-özümə, xürrəm idim.

Nə dərdi-hicr bilirdim, nə ahü əfğanı,
Öz aləmimdə şəhənşahi-külli-aləm idim.

Gözü gözümdə, əli əldə, yar yanımda,
Vüsali-yari-vəfadara yarü məhrəm idim.

Təğafül etməz idi məndən ol vəfapərvər,
Vüsali-məmləkətində əzizü əkrəm idim.

Fələk ayırdı məni gülşəni-vüsalından,
Behişt içində gəzərdim besani-Adəm idim.

Rəqib ayırdı məni vəsldən, qılıb məhrum,
Vüsal evində sərəfraz, bəs müəzzəm idim.

Nə xoş zaman idi əyyami-vəsl, getdi, nedim,
O gülsitanda mən Sağəri mükərrəm idim.

## ŞUŞA ƏHLİNDƏN VƏ ONUN MOLLALARINDAN SAĞƏRİNİN ŞİKAYƏTİ

Şişənin əhlində hərgiz mən dəyanət görmədim,
Aşina oldum tamam ilə, sədaqət görmədim.

Alimü zahidlərində yoxdu bir həq canibi,
Dami-təzvir, hiylədən qeyri halət görmədim.

Çox namaz etdim cəmaətlə xüzun-qəlb ilə,
Leyk axırda imamında imamət görmədim.

Kinü büğzü hiyləni gördüm imamında tamam,
Hiylədən qeyri o şeytanda ibadət görmədim.

Cümlə mə'mumi edər iblisə guya iqtida,
Cümlə mə'qulində mən qeyr əz səfahət görmədim.

Əhli-din nayab olub, məzhəb itib bu şəhrdə,
Vaizi-bədtinətində qeyri-bid'ət görmədim.

Tazə məzhəb xəlqə iqva eyləyib, təşrih edər,
Xaliqi-yekta üçün qeyr əz şərakət görmədim.

Qalmayıb islamdan hərgiz əsər, bir adı var,
Bu vilayət içrə mən qeyr əz şərarət görmədim.

Pak müslüm qətlinə fərman verib təkfır edər,
Hiç millət içrə mən bir böylə adət görmədim.

Pak Əmirəlmömin həqqində min böhtan deyir,
Ömrüm axır oldu, böhtana nəhayət görmədim.

Bu xərab olmuş Qarabağ içrə hörmət qalmayıb,
Mən bu əhlin cümləsindən hiç hörmət görmədim.

Şişə əhli cinndir, təsxir ediblər şişədə,
Bu şəyatinlər arasında mən ülfət görmədim.

İnziva qıldım xəlayiqdən o gün kim, Sağəri,
Hər nə gördüm onda gördüm, böylə nemət görmədim.

## QƏZƏL

Ur şanəni ol zülfi-pərişanə, dağılsın,
Tellər tökülüb, ətri biyabanə dağılsın.

Çak eyləmə qətlimdə giribanü üzarın,
Qorxum budu kim, xəlqə bu əfsanə dağılsın.

Cəm eyləmə zülfi üzünə, eylə pərişan,
Qoy əbr kimi mehri-dirəxşanə dağılsın.

Beytül-həzəni-hicrdə yandı dili-zarım,
Ey vəsl, mədəd qıl ki, bu kaşanə dağılsın.

Min dil yığılıb zülfi-pərişanına mənsiz,
Qoy ah çəkim, hər biri bir yanə dağılsın.

Hicran ələmi qıldı fəramuş vüsalı,
Ey Sağəri, ah eylə, bu viranə dağılsın.

## QƏZƏL

Rəqibi mən kimi, ey çərxi-gərdun, kamran etmə,
Gülə xari-cəfakarı rəfiqü pasiban etmə.

Məni gözdən salıb, ağyarə yarım həmnişin olmuş,
Xudavənda, o birəhmi rəqibə mehriban etmə.

Mənə ol qədr möhlət ver ki, yari-mehriban gəlsin,
Amandır, ey əcəl, bir dəm mənə sən qəsdi-can etmə.

Pərişan zülfara tutdun vətən, ey dil, xoş aləmdir,
Tikibsən aşiyanə, andə, tərki-aşiyan etmə.

Əlimdən tutgilən, ey vəsl, hicran taqətim almış,
Məni çeşmi-mərizin tək mərizü natəvan etmə.

Həzər qıl, şanə, dəymə zülfi-pürçininə cananın,
Dağıtma dilləri ol zülfdən, ey şanə, can etmə.

Çıxarma xatirindən "innə bə'd-əl-üsri yəsrani",*
Olur şiddət fərəc, ey Sağəri, bəsdir, fəğan etmə!

## YENƏ

Sən kimi bir kafəri-birəhm canan olmasın,
Mən kimi bir kimsənə pabəndi-hicran olmasın.

Sən kimi bir bivəfa yoxdur cahanda hiç kəs,
Mən kimi bir kəs o zülfün tək pərişan olmasın.

---

* "Həqiqətən hər çətinliyin ardınca asanlıq gələr" – Quran, İnşirah surəsi, 6-cı ayə.

Sən kimi hərgiz cahanda qatilü xunxar yox,
Mən kimi məcruhü zarü didəgiryan olmasın.

Sən kimi mə'şuq yoxdur şivey-rəftardə,
Mən kimi aşiq sənə bir kimsə heyran olmasın.

Sən kimi dildarü dilazarü biinsaf yox,
Mən kimi məcruhi-tiri-çeşmi-fəttan olmasın.

Sən kimi namehriban məşuq olmaz aşiqə,
Mən kimi aşiq sənə, ey afəti-can, olmasın.

Sən kimi xunxar görmüb Sağəri, ey bivəfa,
Mən kimi aşiqlərə bu ahü əfğan olmasın.

## YENƏ

Yüzündən al niqabın, sal yerə, gül şərmsar olsun,
Gülüstan içrə güllər həsrətindən xar-zar olsun.

Könül mürğü pərişan zülfara hiç olmadı iymən,
Mənim könlüm kimi, ya Rəb, o zülfü biqərar olsun.

Rəqibi-rusiyəh qıldı məni məhrum vəslindən,
Rəqibin xanəsi zülfün teli tək tarü mar olsun.

Qənimət bil bahar əyyamını, ey dil, fəğan eylə,
Vəfa yoxdur bu ömrə, il dolansın, növbahar olsun.

Soruşdum əhli-dildən aşiq-məşuq əhvalın,
Dedilər olmayıb aləmdə aşiq bəxtiyar olsun.

Əcəl peyki giribanım tutub canım alan vəqtə,
Rəqəm qıldım bu şeiri mən cahanda yadigar olsun.

Dəxi nəzm eyləmə, ey Sağəri, şe'rü qəzəl bəsdir,
Cahan əhlinə sirrin, qorxuram ki, aşikar olsun.

## RÜBAİLƏR

Hicran aləmi al ruxum eylədi zərd,
Ahım yeli eşqim odunu qılmadı sərd,
Cananıma yetmədim deyim dərdi-dilim,
Can çıxdı bədəndən, məni öldürdü bu dərd.

Ey lə’li-ləbin ləzizü güftar ləziz,
Didari-rüxün qəndü şəkərvar ləziz,
Ləfzin kimi şəhdü qəndü şəkkər olmaz,
Kim dedi ləbin kimi şəkər var ləziz?!

Ey dil, dəxi gəl, zülfi-pərişanı unut,
Ey göz, dəxi ol çöhreyi-cananı unut,
Ey Sağəri, tövbə qılgilən üsyandan,
Bəsdir dəxi, keçdi ömr, şeytanı unut.

**Molla Zeynalabdin Sağərinin şeirləri tamam oldu. 1309-cu il, şə’ban ayı (mart, 1892-ci il)**

**Vər. 106a**

## MİRZƏ BƏYBABA FƏNA

**(28 şəvval 1309-cu il – 26 may 1892-ci il)**

**Mirzə Bəybaba Mirzə Əliyar bəy oğlu. Əsli Qaracadağdan olub, Qarabağ sakini idi. Ucaboylu, tanınmış bir şəxs idi, yaxşı xətti var idi. Əvvəllər Qarabağ zadəganlarının yanında katib idi. Sonra dövlətləndi, mülklər tikdirdi. Bəzən şeir də deyərdi. Müxtəlif şeirləri var idi. Onlardan bəzilərini bu təzkirəyə yazdım. Mərhum Zakir, Səba, Səfa və Sağəri ilə müasir olub. Mən onu görmüşdüm. Yaxşı xasiyyəti var idi. Təxəllüsü Fəna olub. Həştad yaşında dünyanı tərk edib. Aşağıdakı şeirlər onun xəyalatındandır. Fatma xanım Kəminənin atasıdır.**

### MİRZƏ BƏYBABA FƏNANIN QƏZƏLİ

Eşq yolunda iztirab dolu ürəklə çalış,
Həmişə haqq qorxusundan yaşlı gözlə çalış.

Heç vaxt öz haqqından üz döndərmə,
Hər gün iki-üç qədəh şərab nuş elə!

Əgər başında cənnət havası varsa,
Ayıq ol, cənnət yuxusundan oyanmağa sə'y et !

Eşqi tərk etmək qəlbi abad edər,
Məbada qəlb evini xarab edəsən.

Nədamətdən özgə boş yalandan nə çıxar?
Heyfdir! Ömr keçir, yaxşılıq et.

Aşiqlərə eşqdən möhnət və bəla yetər,
Bax qazancına, çalış haqdan üz döndərmə.

Əgər vaiz yavaş-yavaş haqqa pərdə çəkirsə,
Sən də tənə ilə onu anmağa çalış!

Haqq əhli hər nə tələb etsə, yerinə yetir,
Günahlar yuyulmasa, dualar hədər gedər.

Fəna, əziz ömr nə vaxtadək böylə keçəcək?
Qəflət etmə bu qədər, səvaba çalış!

## QƏZƏL

Könül evini sənin eşqindən başqa eşqlərdən pak etdim,
Daha, şükr Allaha, düşməndən heç qorxum yoxdur.

Ya Rəb, məni cənnətdə onun vüsalından uzaq etmə,
Onun hicri, yəqin ki, cəhənnəm odundan qorxuludur.

Əgər səhər küləyi onun küçəsindən behişt ətri gətirsə,
Sevincdən paltarımı qönçə kimi cıraram.

Vaxtı qənimət bil, haqq yolunda çalış,
Çünki bir anda bir aləm torpağa dönür.

Bu sayaq çəmənə düz qamətli sərv gəlsə,
Xəcalətdən parlaq günəş çıxmaz heç zaman.

Yadların cəfasından yorulub bihal oldum,
Soyuq ahım yerdən göylərə çatar.

Əgər, Fəna, günahın çox olsa, Allah bağışlar,
Xətanı bağışlayan Allahın lütfünə ümidvar ol!

Əzəl gündən namus şüşəsin daşa çaldım,
Müğənni, qəm yemə, çəngdə bir şən hava çal.

## YENƏ

Elə ki, məni cünunluq bazarında məst tutdular,
Bundan sonra nəyə lazımdır ad, namus, həya?!

Əgər canan üzünün vəslinə meylin varsa,
Heç vaxt mey camını, badəni və bəngi əldən vermə.

Nə vaxtadək canan üzünün vəslindən uzaq olacaqsan?
Xalis şərabdan iç, vüsala yetiş!

Yardan yaxınlıq istəyən, gərək yaxşılıq etsin,
Zor-güclə həqqə yaxınlaşmaq mümkün deyil.

Məhəbbət camının meyilə hər iş asan olar,
Zahid, insaf et, bu hiylə-yalan nə vaxtadək olacaq?

Əgər saf bir badə içsən, hər məqama yetərsən,
Firəng şahı sənə qulağı halqalı qul olar.

Fənanın gözlərinə yüzlərlə ox atsalar da,
Səni görmək üçün heç vaxt gözlərimi qırpmaram.

## QƏZƏL

O şux tələsik qapıdan girsə,
Şadlıqdan başım düz göylərə yüksələr.

Burnuma zülfünün ətri dəysə,
Əynimdə köynəyimi qönçə təki cıraram.

Onun eşqindən əl götürmərəm heç vaxt,
Hətta onun eşqi çox xətərnak olsa da.

Vüsal üçün hicran zəhrindən dadmışam,
Axırda zəhər içmışə tiryək də verirlər.

O gözəl mələyin eşqini tərk etmərəm,
Başımı kəssələr də, heç vaxt qorxmaram.

Məst nərgisdən elə məst oluram ki,
Ondan başqa başımda özgə idrak yoxdur.

Məhəbbətindən başqa qəlbimdə heç nə yoxdur,
Səndən başqa dünyada heç nə istəmirəm.

Sənin mehrini qəlbindən çıxarmaz,
Əgər Fənanın toqqaya başını bağlasan da.

## QƏZƏL

Ey ağ gərdəni fil sümüyü tək saf olan,
Qara xalın hind şahından xərac alar.

Əzəl gündən qaşların aşiqlər səcdəgahı olub,
Gözəl gözlərin Çinü Maçinə bacü xəracı tərgidib.

Sənin hüsnünü Allah elə misilsiz yaradıb ki,
Gözəllərin bazarı sənin gözəlliyindən həmişə rəvac olar.

Evə sarı gəlsən, günəş gözə görünməz,
Günəşin qarşısında çıraq nəyə bənzər?

Qəddin Kə’bədir, qara xalın - qara daş,
Həcc və könül aşiqləri başına fırlananlar.

Hicran küləyi iman evini xarab etdi.
Əgər üzünü görsəm, yenə şad ollam.

Ta can var canda, sevgin ürəkdən çıxmaz,
Çünkü can və ürək əzəldən birləşiblər.

Hicrindən Fəna çox möhnət görüb, heç sorma.
Ya Rəb, rəhm et, vəslinə çatdır, əlac et!

**Mirzə Bəybaba Fənanın şeirləri sona yetdi, şəvval, 1309 (may, 1892).**

**Vər. 108a**

## KƏRBƏLAYİ QULU XARRAT YUSİFİ

**28 rəbiül-sani 1309-cu il – 25 dekabr, 1891-ci il**

**Kərbəlayi Qulu Məhəmməd oğlu Pərinazzadə Qarabağın Şuşa vilayətinin əhalisindəndir. Deyilənə görə, atası Məhəmməd, İbrahim xan Cavanşir dövlətinin nağara çalanı olub. Mən onu görmüşəm. Eyş məclislərində nağara çalardı, oyunbaz idi, bazarda car çəkərdi. Ancaq oğlu Kərbəlayi Qulu Yusifi təxəllüs xoş görünüşlü bir kişi idi. Farsca savadı var idi. Bacarıqlı əlləri var idi. Məşğuliyyəti dülgərlik idi. Axır vaxtlar şəbihgərdanlıq edirdi. Yaxşı da məharəti var idi. Mən onu görəndə 55 yaşı var idi. Yuxarıdakı tarixdən 15 il əvvəl rəhmətə gedib. Seyyid əş-şühəda əleyh əs-səlam cənablarına çoxlu mükalimə və mərsiyə inşa edib. Həcv və çoxlu cəfəngiyyat da demişdir. Şeir və qəzəl də yazırdı. Aşağıdakı beytlər o mərhumun xəyalındandır:**

## YUSİFİ XARRAT QULU QARABAĞİ

Yenə çəmən Misrində gül Yusif peyda oldu,
Bülbüllər Züleyxa tək qovqaya düşdü.

Bülbül Fərhad kimi fəqana gəldi,
Qönçə badi-səbadan Şirin dodağı tək açıldı.

Məcnun kimi lalənin ürəyi dağlı oldu,
Nərgiz nazlanmaqdan çəməndə Leyla oldu.

Bülbül gülüstanda Vamiq tək aşiq oldu,
Gülşəndə qızıl gül Əzra üzü tək oldu.

Gülşən səhnəsi bülbülün şadlıq avazı ilə doldu,
Rast humayun avazilə yenə cuşa gəldi.

Ölülər çəməndə səhər İsasının nəfəsindən,
Torpaqdan baş qaldırıb dirildilər.

Yusifi Ayaz kimi olan o dilbərin qəmində,
Mahmud kimi aləmdə rüsvay oldu.

## QƏZƏL

Hər nakəsə veribdi xuda pul ağını,
Ancaq rəva görübdü mənə qəm qalağını.

Atlar təvilə içrə qalıb ac, arpasız,
Bu sirri bilməzəm, nə çox istər ulağını?

Hər kəs dəvabdır – dördayaqlı heyvandır, ələfiyyatı çox görüb,
Çəksin təməh dişini və yumsun dodağını.

Qismət mənə olubdu qəmim, həm də göz yaşım,
Fərman verib bu növ ilə vermək səyaqını.

Hər kəs cahanda mal yığıban xərc qılmasa,
Layiqdi mənzil eyləyə neyran bucağını.

Çünki görüb səlah xudavəndi-zülcəlal,
Heyvani-bizəbanə bu dünya yatağını.

Yorğun edibdi Yusifini kəsbkarlıq,
Hər dəm çəkər bu çərx ona min növ dağını.

## YUSİFİ VƏ QARABAĞ ŞAİRLƏRİNİN ŞİRVAN ŞAİRLƏRİLƏ ETDİKLƏRİ MÜŞAİRƏSİ BELƏDİR

Gözəllik günəşi camalına pərdə salıbdır,
Aşiqləri zərrə kimi vəcdə salıbdır.

Leylanın hüsnü nur tək ətrafı bəzədi,
Qeys Məcnuna dönüb özünü fikrə salıbdır.

Eşq fərdin cövhəridir, amma xasiyyətlər müxtəlif !
Biri qaşa, biri xala meyl salıbdır.

Mə’na sirrindən xəbərsiz olan o cahil zahid,
Yar üzünü bir şəkil hesab edibdir.

Taleyinin qələmi gözəllərin rüxsar və qaşından,
Ayın dairəsinə hilal şəkli salıbdır.

Allahı görmək istəyən tək sən məni görməyəcəksən,
Arifləri bu söz yaman qorxuya salıbdır.

Yar ağuşumda, mən özümdən bixəbərəm,
O, ortalığa vüsal və hicran söhbəti salıbdır.

Gah Kə'bədə, gah kilsədə görünür,
Abidlə rahib arasına cidal salıbdır.

Yusifi Yəqub tək vüsal həsrətindədir.
Ağcaqanada bax ki, zümrüd ovlamaq fikrinə düşüb.

**Vər. 111a**

## İBRAHİM BƏY AZƏR

**(Cəmadiyəl-əvvəl, 1309-cu il – yanvar, 1892)**

**İbrahim bəy Həllac Əli bəyin oğludur. Qarabağın Şuşa əhalisindəndir. Abdulla bəy Asinin böyük qardaşı, Qasım bəy Zakirin nəvəsidir. Yuxarıdakı tarixdən altı il əvvəl vəlat edib. Əlli beş yaşı var idi. Xoşəhval bir kişi idi. Rus dilini yaxşı bilirdi və rus məhkəmələrində vəkillik edərdi. Uşaqlığının ilk çağlarında Mehdiqulu xan Cavanşir tərəfindən tərbiyə olunub. Təxəllüsü Azərdir. Aşağıdakı şeirlər o mərhumun xəyalındandın**

Bilmirəm, ey gözəllərin zülfü, siz necə bəla torusunuz,
Mümkündürmü sizdən xilas olmaq təsəvvürü?

And olsun canına, ey qənaət mülkünün padşahı!
Şahlar qapında həsrətlə gədalıq etmək istərlər.

Ey eşq xəstəliyi, bilmirəm, bu dünyada sən necə dərdsən,
Ki, dünyada ölümdən başqa sənə dərman yoxdur.

Sənin zülfündə könlüm itsə, nə təəccüb?
Qaranlıq gecədə qəriblər yolunu azar.

Ey daşürəkli, canına and olsun ki, sənin cövrü cəfan,
Qeyrilərin mehrü məhəbbətindən daha əzizdir.

Hicran gecəsinin yanında cəhənnəmin nə əzabı?
Sənin bağçanın yanında cənnətin nə səfası?!

Zahid, sən Kə'bədə, mən onun kuyində qalım,
Bizim hər birimiz bir yerə ümid bağlamışıq.

And olsun Allaha, özünə Allah adı verəndən bəri,
O, sən kimi bir gözəl yaratmayıb.

### QƏZƏL

Ahu kimi baxanda o məstanə gözlərin,
Baxdıqca eyləyir məni divanə gözlərin.

Fərhad kimi mən kimiyə dağı dəldirir.
Şirin baxışlı xosrovü xubanə gözlərin.

Hər dəm ki, istəsə baxa bir kəc nigahilə,
Yüz min könül yıxar yenə cananə gözlərin.

Zənciri-eşqini salıbsan boynuma mənim.
Bak etməyib çəkər məni hər yanə gözlərin.

Eşqin edibdi Azəri-dilxəstəni cünun,
Məcnunsifət salıbdı biyabanə gözlərin.

**Vər. 113a**

## MİRZƏ HÜSEYN SALAR

## (4 Cəmadiyəl-əvvəl, 1309-cu il – 6 dekabr, 1891)

**Mərhum Mirzə Hüseyn bəy Məhəmməd ağa oğlu Hacı Yusif övladındandır. Qarabağ əhlidir, Şuşa şəhərinin Hacı Yusifli məhəlləsindəndir. Təxəllüsü Salardır. Yuxarıdakı tarixdən təxminən 15 il əvvəl vəfat etmişdir. Düz qamətli, enli bədənli, yekəqarın, dombagöz bir kişi idi. Ərəb və fars dillərində də bir qədər savadı var idi. Çox vaxt rus divanında xidmət edirdi. Vodyanka (qarnına su yığılma) xəstəliyi ilə dünyadan köçdü. Şeir də deyərdi, şəhidlər seyidi cənablarına növhələr, qəsidə və qəzəlləri ilə bərabər, həcv və satirik parçaları da vardı. Aşağıda yazılmış şeirlər o mərhumun xəyalatındandır:**

### QƏZƏL

Mari-siyah zülfün edib xanə könlümü,
Qıldı məhəlli-gənc bu viranə könlümü.

Tiri-bəlayə etdi hədəf aqibət məni,
Ya Rəb ki, seydvəş görüm oxlanə könlümü.

Qəmzən çəkib xədəng, qaşın tirlə kəman,
Qanlı kimi çəkər hərə bir yanə könlümü.

Qoyma ki, şanə dil uzada o tari-zülfünə,
Allaha bax, batırmagilən qanə könlümü.

Xalın havası ilə könül qondu zülfünə,
Axır əsiri-dam elədi danə könlümü.

Hər sübhdəm əsiri-dilxəstə eyləyir,
Gahi nəsimi-sübh, gəhi şanə könlümü.

Salarını qoyub qəmi-hicranda mübtəla,
Rəhm eyləməz, edər yenə viranə könlümü.

### YENƏ DƏ SALARIN QƏZƏLİ

Yar mehribansızlıq edib, yara bir bax,
Bizimlə cəng meyli var, dostluğa bir bax!

Qəm ləşgərinə əmr edib, canı tarac etsin,
Şahın cövrünü gör, zülmünə bir bax!

Dilbər könlümüzü aparıb, bizdən ürək götürdü,
Qəlbi qəmə həmdəm o edib, qəmküsara bir bax!

Səbəbsiz xatirimdən mehr sözünü sildi,
Bədbəxtliyi gör, bədrüzgarə bir bax!

Təskinlik üçün vüsal əhdi verdin mənə,
Yadından çıxıbdır, etibarsızlığa bir bax!

Bir an gəl mənə sarı, ey sərvi-çəmən,
Göz yaşlarından üzümə axan çaylara bir bax!

Hər an qəmindən könlümə atəş vururam,
Ona ah küləyi vurur, göz yaşı çiləyirəm, bədbəxtliyə bir bax!

Vüsal havasından gül kimi gülərəm dedimsə,
İndi hicrdən şam tək ağlaram, zavallılığa bir bax.

Bir Salara tərəf gəl, ey daşqəlbli təbib,
Qəlbində hicran oxu var, ölümcül yarasına bax.

### MİRZƏ HÜSEYN SALARIN ÖZ PÜRTƏŞVİŞ SAQQALI ÜÇÜN DEDİYİ MADDEYİ-TARİX

Əkbəra, gürgi-fələk gör mənə nə al elədi,
Ağ toyuq ağzıma verdi, məni çaqqal elədi.

Çənəmə bağladı bir çəngə tükü, hər tükünü,
Birin ağ, biri sarı, həm birini çal elədi.

Zülfü xali-siyəh, çahi-zənəxdanı mənə,
Keçi quyruğu, qoyun qığı, siyəhçal elədi.

Birə, bit yığnağı, sirkə yuvası, pox şələsin,
Boynuma bağladı, axır məni hammal elədi.

Nuri-imanə bədəl hikməti-küfrüm oldu,
Ağarıb, sanma ki, rüsva məni saqqal elədi.

Ağ üzərlik külünə döndü bu murdar, yetən,
Paçasın qaldırıb hər səg ona inzal elədi.

Bir-iki həftə buraxsam, tökülür altıma,
Bunu day kimi qəza quyruq ilə yal elədi.

Ay, gün sanma şəfəq göydə ki, ahım şərəri,
Xirməni-nöh fələyi odladı, tonqal elədi.

Ah kim, qəflət ilə getdi cavanlıq əldən,
Qocalıq əydi əlif qamətimi, dal elədi.

Dişimi tökdü, ağardı başım, ordum batırıb.
Büzdü dodaqlarımı, ağzımı mazqal elədi.

Rə’şə saldı canıma, boynumu incəltdi mənim,
Aləti-məzhəkeyi-firqeyi-ətfal elədi.

Döyül əncüm ki, mənim başıma yağdırmaq üçün
Dolu daşla ətəyin çərxi-bədəf’al elədi.

Eyləsəm hər gözələ dərdi-dil izhardir,
Əbləhin ağlına bax, qeysavəni yal elədi.

... ala-buladır... çal içinə (1263-1846-47)
Saqqalın tarixini xamə bu minval elədi.

**Vər. 115b**

## KƏRİM BƏY TALIB BƏY OĞLU

**(Cəmadiyəl-əvvəl, 1309-cu il – oktyabr, 1891-ci il)**

**Mərhum Kərim bəy ibn Talıb bəy ibn Zeynalabdin bəy Vəzirzadədir. Qarabağın Şuşa əhalisindəndir. Otuz yaşlı nakam bir cavan idi. Həmin tarixdə rəhmətə getdi. Yenicə şeir deməyə başlayırdı. Aşağıdakı şeir o mərhumun xəyalındandır:**

### QƏZƏL

Müsəllət eylədi tanrı mənə bu tərsanı,
Qılıb günümü siyəh zülfi-ənbərəfşanı.

Qədi olubdu qiyamət təmam üşşaqə,
Gətirdi cilvəyə nagəh o qəddi-rə’nanı.

Xəyali, qaşü gözü taq edibdi taqətlər,
Budur xəyalı, yıxa məscidü kəlisanı.

Məni müqəyyəd edibdir o küfri-zülfünə,
Bu kafər oğlu, görün, öldürür müsəlmanı.

Ümid kəsməzəm axir xəyali-vəslindən,
Məgər budur ki, çıxa Talib oğlunun canı.

**Vər. 116a**

## MOLLA SƏ'Dİ

**(Cəmadiyəl-əvvəl, 1309 – dekabr, 1891)**

**Molla Sə'di Qarabağ əhli olub, Cinli kəndindəndir. Eşitdiyimə görə, adi camaatdandır. Sonra səs yayıldı ki, etiqadını dəyişib, şiəməzhəb olub. İyirmi beş yaşlı cavan bir şəxs idi. Yuxarıdakı tarixdən on iki il əvvəl rəhmətə gedib. Təxəllüsü Sə'didir. Deyilənə görə, cənab imam Hüseyn həzrətlərinə, Həzrət Abbasa növhə və qəsidə demişdir. Başqa şeirləri də var, ancaq mən görməmişəm. Bu müşairəsi (şeirləşmə) əlimə düşdü, onu da yazdım:**

### MOLLA SƏ'DİNİN HƏSƏNƏLİ AĞA XAN QARADAĞİ İLƏ MÜŞAİRƏSİ

***Sə'di:***

Yenə üftadeyi-bir çahi-zənəxdan oldum,
Neylədim mən, görəsən, layiqi-zindan oldum.

***Qaradaği:***

Cəm' idi yengi xəyalım bu pərişanlıqdan,
Bir pəri zülfü xəyalilə pərişan oldum.

***Sə'di:***

Görəli xalını ruyində gözüm mərdüməki,
Maili-məşqi-xəti-nüqteyi-Quran oldum.

***Qaradaği:***

Ləbi-şəhdin düşəli yadıma zənbur evi tək,
Nişeyi-şövq dəlib bağrımı, şan-şan oldum.

***Sə'di:***

Lalə tək ruyin ilə qan ciyərim dağlandı,
Qönçə tək lə'lin ilə çaki-giriban oldum.

***Qaradaği:***

Ləbinə badə dedim, saldı rəqiblər bəhsi,
Düşdü qan, çıxdım aradan, səbəbi-qan oldum.

***Sə'di:***

Urdum əl, çaki-giribanın açıldı üzümə,
Bu cahan içrə əcəb cənnətə rizvan oldum.

***Qaradaği:***

Gərçi saldı məni bir atəşə Nəmrudi-fəraq,
Vəslini yad edib, atəşlə gülüstan oldum.

***Sə'di:***

Hanı hüd-hüd, apara şəhri-Səbaya xəbərim?
İntizarəm, gələ Bilqeys, Süleyman oldum.

***Qaradaği:***

Surətin nəqşini oydum ki, çəkəm lövhi-dilə,
Bir xəyal ilə görüb valehü heyran oldum.

***Sə'di:***

Düşəli zülfünə meylim üzün ətrafinda,
Çıxdı imandan əlim, tabei-şeytan oldum.

***Qaradaği:***

Üz büküb, yaxşı mənim dərdimə dərd artırdın,
Səndən, ey şux, neçün talibi-dərman oldum?

***Sə'di:***

Müshəfi atdım oda görcək o tərsa üzünü,
Boynuma keçdi bu zünnar ucu, Sən'an oldum.

***Qaradaği:***

İstədim uyduram ol sərv qədinə sərvi,
Gördüm uymaz qədinə sərv, peşiman oldum.

***Sə'di:***

Gedəcəksə, nə edim, cənnətə zahid getsin,
Bu gecə mən düşüb ol huriyə mehman oldum.

***Qaradaği:***

Göstərib sə'b üzün gör nə əcəb hicr mənə,
Nuh tək ağlayıban qərqeyi-tufan oldum.

*Sə'di:*

Leylivəş mail olub bir sənəmə hər ləhzə,
Bağlayıb zəncir ilə Məcnuni-dövran oldum.

*Qaradaği:*

Kim bilirdi məni divanəvü ya fərzanə,
Düşəli eşqə, əcəb dillərə dastan oldum.

*Sə'di:*

Hələ Məcnuni, deyək, Leyli biyabanə salıb,
Bəs nə gəldi mənə, Məcnuni-biyaban oldum?

*Qaradaği:*

Gər məni öz xoşuma həşrdə mövla qoysa,
Deyərəm: Yarımı ver, qanei-neyran oldum.

*Sə'di:*

Nə xəta eylədim,ey şux Züleyxa, sölə mən,
Çahi-zindanə düşüb, Yusifi-Kənan oldum?

*Qaradaği:*

Hurvəş bir sənəmin dərdini çəkməkdən əcəb,
İncəlib, yayə dönüb, hər oxa qurban oldum.

*Sə'di:*

Bundan əvvəl yenə, filcümlə, süxən söylərdim,
Axırı mən saf ilə hərzəvü hədyan oldum.

*Qaradaği:*

Nuş qıldım demə mey lə'li-lə'bin camından,
Saqiya, məst gözündən yenə məstan oldum.

*Sə'di:*

Neyliyim, Xan, sənə xan təxtinə xan oldunsa,
Mən də bu təxti-qəmə Sə'di kimi xan oldum.

*Qaradaği:*

Can nisar eyliyəli hicr ilə məsnəd yüzdüm,
Xanlığım badə verib münşiyi-divan oldum.

## RÜBAİLƏR[*]

Dostluqla yox olar qəm də, kədər də,
Dostluq dərman olar hər ağır dərdə,
Hərbin qartalları uçmasın, ey kaş!
Sülhün göyərçini uçan yerlərdə.

Kəsilsin bombalar yaradan əllər,
Məhv olsun bəşəri hədələyənlər.
İnsana bir dəfə ömür bəxş olur,
Olmasın həyatı pozan əməllər.

Əsrlər keçdikcə qoca zəmanə,
Yadigar qoymuşdur min cür kaşanə.
Yaramaz bir cəllad istəyir indi,
Qoymasın onlardan qala nişanə.

Aman, dağılmasın tikilən evlər,
Ana təbiətə dəyməsin zərər.
Füsunkar gözəllik, dəniz, dərə, dağ,
Gözləri oxşasın hər axşam səhər.

## MOLLA SƏ'Dİ CİNLİ[**] QARABAĞİNİN TƏRCİLƏRİ

### (dördləmə)

Padşah əgər bu qədər böyüklük qazansa,
Dostu, düşməni özünə vəzir və nədim edər.
Sülh, dava, asayiş və qorxu qazanar,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

Sədr-ə'zəm ki, bütün cahanın böyüyüdür,
Cəlal ilə əzəmətdə tamamilə kəramətlidir.
Hər zaman şah yanında yeri vardır,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

Əsgərlər ordusunun sərəsgəri (başçısı) olan,
Əsgərləri zikr edər, onları səslər.
İslama baş əyər, istəsən lap kafir də olar,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

---

[*] Rübailərin bədii tərcüməsi M.Soltanındır.

[**] Təzkirədə Cinləvi yazılsa da Sə'di Çinli kimi məşhurdur.

Kəndxuda ki, kənddə kəndliləri sıxır,
Bütün ömür boyu canı rahatlıq görməz.
Rəiyyətə ədalətsizliklə zülm edər,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

Dehqanın qapısından ayaq çəkməyən çavuş,
Hər səhər hər qapıda qarğa tək qarıldayar.
Aləm onun qarıltısından cana gələr,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

Hər kəsə fitva verən o mufti,
Hər iki dünyanın qəmini yeməz.
Şaha da yersiz bir dua etməz,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

Hamıdan şəriət qanunlarını soruşan qazi,
Əvvəl rüşvətin az-çoxluğunu sorub, sonra götürər.
Müttəhim və şikayətçidən ancaq ədavət görər,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

O zahid ki, nə mal, nə dövlət istəyir,
Tamahına bax ki, cənnət tamaşası arzular.
Əhli-kərəm əlinə göz dikər,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

O münəccim ki, adamı nücumla tanıyır,
Adamın qəmin yeyir, aləmi də şad edir,
Bütün nəğd vaxtını əğyarlara sərf edər,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

Bir xoş sədalı ki, ney kimi zümzümə edir,
Qaməti əyri, ağzı çəp, dodağı azar çəkir.
Boğazın damarı səsin gücündən ip tək dartılır,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

Xəstə Sə'di ki, həmişə xəstə olur,
İşi həmişə özgələri vəsf etməkdir,
Şahlar qarşısına gül dəstəsi tək namə aparar,
Mətləbi isə məhz budur ki, gümüş qazansın.

## SƏ'DİNİN AZƏRBAYCANCA QƏZƏLİ

Səba, gəl bir xəbər ver ol güli-tənnazdən nazik,
Çəməndə bülbüli-zar etdiyi avazdən nazik.

Gəl, ey qasid, gədadən bir niyaz et ol şəhi-nazə,
Sədayi-dilnəvazi nəğmeyi-şəhnazdən nazik.

Hicazi nəğməsindən bir tərənnüm saz qıl, mütrib,
Sızıldaşsın vücudum riştəsi ol sazdən nazik.

Nə qəsd etmiş yenə can seydinə səyyad tək çeşmin,
Nə düzmüş tiri-müjganın pəri-şahbazdən nazik.

Kitabi-hüsnünə şirazə çəkmiş rişteyi-candan,
Sölər Sə'diyi-Sani  Sədiyi-Şirazdən nazik.

**Vər. 119a**

## HACI ƏBDÜLMƏCİD ƏFƏNDİ*

### MİNACAT

Bir əbdi-siyəhruyü günəhkari-xəciləm,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla.
Aludeyi-üsyan, əliləmü zəliləm,
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Ol vəqtdə kim, məhşəri-divan olacaqdı,
Başlarda beyin cuşə gəlib, qan olacaqdı,
Qismət kimə cənnət, kimə nevran olacaqdı,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla,
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Bir müznibi-asi qulunam, çoxdu günahım,
Məhşərdə güvahımdı mənim ruyi-siyahım,
Sənsən ki, mənim padşəhim, püştpənahım,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla,
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Bir vəqt ki, mən olmuş idim tabeyi-şeytan,
Həm fisqü fücur əhlivü həm sahibi-tüğyan,
İndi olubəm etdiyim əf'alə peşiman,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla,
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Gərçi ki, bu əyyam idi əyyami-cəhalət,
Yox mən kimi bir kimsə ola əhli-dəlalət,
Məhşərdə məni eyləmə bədnamü xəcalət,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla,
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Hərçənd ki, bir müznibi-məzlumü cühuləm,
Yoxdur əməlim layiqi-dərgah, məluləm.

---

* Nəvvab təzkirədə Hacı Əbdülməcid Əfəndi haqqında heç nə yazmayıb, vərəqin yarısını ağ buraxıb. Əsərlərindən isə bu şeiri vermişdir. Təzkirənin çap nüsxəsində minacatın əvvəlində onu Bağadı kənd sakini kimi qeyd edir.

İxlaskəşi-Ali-Əli, nəsli-Rəsuləm,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla,
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Sərgəştəvü heyranəmü avarə Məcidəm,
Həm müznibü  həm mücrimü biçarə Məcidəm.
Üftadeyi-dərgah, yüzü qarə Məcidəm,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla.
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

**Vər. 121a**

## MİRZƏ MƏHƏMMƏD
## KATİB QARABAĞİ

**Mərhum Mirzə Məhəmməd Məşədi Bayram oğlu Qarabağın Şuşa əhalisindəndir, təxəllüsü Katibdir. 1305-ci ildə (1887) sağ idi. Qübar xətti ilə yaxşı yaza bilirdi. Sənəti şeir demək idi. Şeirlərinin çoxu həcv idi. Sadəlövh bir kişi idi, hər nə desəydilər, inanardı. Çox vaxt gülmək üçün bəzi zaralatcıl şəxslər başqa adamların dilindən ona yalan xəbərlər çatdırardılar ki, filankəs sizə belə demədi, elə dedi. Həmin gün və ya o günün axşamı o biçarə günahsıza həcv yazardı. Yuxarıdakı tarixdə əlli beş yaşı var idi. Əksər vaxtlar mənim vanımda olardı. Qəsidə, qəzəl, müxəmməs, mürrəbbe, müstəzad, qafiyə, müzəxrəfat (cəfəngiyyat) və həcvlərinin sayı təxminən iki min beyt olar. Çuxur məhəlləsindəndir. Aşağıdakı şeirlər o mərhumun dedikləridir:**

### QƏZƏL

Vücudun olmasa, heç olmasın bahar, ey dust,
Üzündən ayrı nədir seyri-laləzər,ey dust?

Məqami-eşqdə tut bir əyaq ilə əlimi,
Məni əyağə salıbdır bu ruzigar, ey dust.

Bu şuri-eşqdə dövri-müxalifi-gərdun,
Nə edəcək mənə, lütfün ola həsar, ey dust?

O tari-zülfə, aman, urma şanə, tarıya bax,
Ki, könlüm aşiyanəsidir, etmə tarmar, ey dust.

Əgər o qaşlarını əyri tiğə oxşatsam,
Görüm, məni kəsə hər ləhzə zülfiqar, ey dust.

Öləm, mənimlə gedər qəbrə atəşi-eşqin,
Rəqiblə gəzəsən, od tutar məzar, ey dust.

Bu qəddü qamət ilə bağa gər xuram edəsən,
Ki, payi-bəndin olu sərvi-cuybar, ey dust.

Məni çevir başına, öldürüb xilas eylə,
Bu həsrət ilə qoyma intizar, ey dust.

Şəbani-hicrdə Katib nə qədər intizar çəkib,
Nə vəqtədək olacaq çeşmi əşkbar, ey dust?

## YENƏ

Gün səni görmək ilə çərxdə avarə düşüb,
Sərbirəhnə o səbəbdən dərü divarə düşüb.

Yerdə ol şuxi görüb, çərxdə baxdım qəmərə,
Deyəsən parələnib məh, yerə bir parə düşüb.

Vaiza, mən’ eləmə zülfünə meyl etsəm əgər,
Bu belə əsrdi, İslam işi küffarə düşüb.

Lalə bağrına çəkib dağ görüb gül üzünü,
Xiclətindən qaralıb, daməni-kühsarə düşüb.

Nisbəti yox sənə ayın ki, onun vəchi budur,
Əksi-ayinə üzündən göyə bir parə düşüb.

Eşq bimarı olan aşiqə çün baxdı təbib,
Qəmzeyi-nərgisi-bimarın ona çarə düşüb,

Buyi-zülfün eşidib badi-səbadən nagəh,
Ondan ötrü bu çölə Katibin avarə düşüb.

## YENƏ KATİBİN QƏZƏLİ

Sənə mümkün deyil gülşəndə, bülbül, xarə yalvarmaq,
Mənə olmaz rəva əsla gedib əğyarə yalvarmaq.

Nə müşküldür şəbi-firqətdə qalmaq, eyləmək əfğan,
Töküb qan-yaş dəmadəm, sabitü səyyarə yalvarmaq.

Görər pərvanə şəm’in, yanmaq istər aşiqi-sabit,
Nə hacət eşqdə sən arizi-gülnarə yalvarmaq?

Əgər huşyarsən, məxmur çeşmə baxma, ey bidil,
Neçün bimar olmaq, nərgisi-bimarə yalvarmaq?

Əbəs hər nakəsə can vermə, demə iltifat eylər,
Nə mürvətdir sərasər mimürüvvət yarə yalvarmaq?

Könül, eşq içrə düşmə, çıxma yoldan Şeyx Sən’an tək,
Nə lazım meyli-tərsa eyləyib zünnarə yalvarmaq!

Yetişmək mətləbə istərsən, aya, Katibi-miskin,
Gərək ixlas ilə ol Heydəri-Kərrarə yalvarmaq.

## YENƏ

Mürği-dil aşiq olub qaməti-rənayə baxar,
Qumriyi-sərv kimi sərvi-dilarayə baxar.

Dəyişib halını ol zülfi-müənbər, nə deyim,
Nə bu əhvalə, nə başımdakı sövdayə baxar.

Məni zünnarpərəst etdi xətakar gözüm,
Bəli, Sənan olu hər kim ki, o tərsayə baxar.

Yar otağında barı surəti-divar olasan,
Xoş onun halına kim, surəti-zibayə baxar.

Eyd olur aşiqə əbruyi-hilalını görə,
Rəsmdir, çünki cəmaət yığılıb ayə baxar.

Aşiqin görsə səni, taqəti-didar olmaz,
Necə tab eyləyə bir göz ki, təcəllayə baxar?

Nə yazım şeir, yenə, Katibi-bimar oldum,
Kim, xəyalilə gözüm nərgisi-şəhlayə baxar.

## YENƏ

Sərimdə şövqi-zülfi-ruvi-gəncə şahmarım var,
Gecə-gündüz ilan çalmış kimi çox ahü zarım var.

Piyadə rahi-eşq içrə dolandım, gərçi mat oldum,
Dəxi bir kimsəyə rüx tutmanam, bir şəhsuvarım var.

Nəsihət vermə, vaiz, taqi-əbru qibləgahimdir,
Mənim bu taqi-mehrab ilə aləmdə nə karım var?

Mühəqqəqdir ki, səndə Leylidən artıq vəcahət var,
Cünunluqda mənim Məcnundan artıq iştiharım var.

Çalışma, ey əcəl, nahəq yerə, can verməném, billah,
Gərək yarım gələ, ta tapşıram can, intizarım var.

Yuxuda bulsa etmək ayrılıq tə’biridir, guya,
Kənar oldum, yuxuda görmüşəm, busü kənarım var.

Kənar etmə məni, ölsəm də mən səndən kənar olmam,
Qübari-məqdəminçün yol kənarında məzarım var.

Məzarım aç, sərimdən çıxmayan şövqi-xətü zülfin,
Görəsən, kaseyi-sərdə mücəssəm murü marım var.

Məzarım üstünə gəl, qoyma tə'miri-həsar olsun,
Təriqi-eşqdə səngi-məlamətdən həsarım var.

Nəzərdə gərçi xarəm, bir gədayəm, Katibi-zarəm,
Əzizi-Misri-izzət, padşahi-tacdarım var.

## QOŞMA

Səhər-səhər durub qıya baxanda,
Düşgünüyəm mən o ala gözlərin.
Badə nə lazımdı, sevdiyim, mənə,
Məst eyləyib o piyalə gözlərin.

Qəmzeyi-cəlladın nə xunxar imiş,
Canım alan, bəlli, sitəmkar imiş,
Bu zalımda nə fitnələr var imiş!
Salar məni haldan-hala gözlərin.

Sən gözəlsən bədrlənmiş ay kimi,
Mən aşiqəm, göz yaşım var çay kimi,
Əyilmişəm qaşın kimi, yay kimi,
Qəddimi döndərib dala gözlərin.

Zülfün aldı bu şikəstə könlümü,
Eylədi tarına bəstə könlümü,
Mən istəməm dəxi xəstə könlümü,
İndi nə var məndə ala gözlərin?

Hər zaman çəkərəm yüz min ahü zar,
Nə rəhmin var cana, nə mürvətin var,
Katib olub hicrində zarü əfkar,
Nə rəvadır gözdən sala gözlərin.

## MƏRHUM KATİB 1301-Cİ İLDƏ (1883) NƏVVABA YAZIB, ARXALIQ İSTƏMİŞDİR

Həbbəza, qəl'eyi-Şuşa ki, tutub onda məkan,
Bir cəlalətli müəlla nəsəbü pakrəvan,
Adı Mir Fəssih, özü hadivü daiyyi-zəman,
Seyyidü sərvərü mövlayi-həmə əhli-cəhan.

Üz qoyub dərgəhi-pakinə onun xürdü kübar,
Qəbrini öpməyi şut etmək üçün leylü nəhar,
Şöhrəti misli-günəş, aləm içində əşhar,
Pak peyğəmbərin övladıdır ol pakrəvan.

Şəhr içində o cənabın ulu nəvvadəsi var,
Cəddi-ətharı kimi xasiyyəti-əqdəsi var,
Elmdə, helmdə Qafqazda ə'la səsi var,
Xaki-payinə nisarım ola bu cümlə cəhan.

Adı Mir Möhsün ağa, həm ləqəbidir Nəvvab,
Elmi-təncimdə, həm cəfrdə yoxdur ona bab,
İrtifai tuta, gər al ələ üstürlab,
Aşkarə olacaqdır ola hər növ nihan.

İldə bir dəfə olur xəlqi-cahana bayram,
Mənə hər dəfə olur gər ola əncami məram,
Yetişəm xidmətinə, eyləyə lütfünü tamam,
Zülfıqarı gər edə bu gecə şadü xəndan.

Sahibi-cudsən, ey seyyidi-alidərəcat,
Cəddinin cudü səxasına olub müddəi mat,
Nə olur ki, verəsən Katibə bir tazə bərat,
Yırtılıb arxalığı, pak qalıbdır üryan.

## QƏZƏL

Hiç aşiq maili-zülfü zənədxan olmasın,
Dəhrdə divaneyi-zənciri-zindan olmasın.

Mən çəkən möhnətləri aləmdə kafər çəkməsin,
Küfri-zülfün görməsin, halı pərişan olmasın.

Gün qabağında amandı, əzmi-cövlan eyləmə,
Sayə tək zülfün yenə xak ilə yeksan olmasın.

Bada vermə zülfünü, hər ləhzə lərzan eyləmə,
Mənzili-şami-qəriban onda viran olmasın.

Şanə urma zülfünə, dünyanı zülmat eyləmə,
Katibin sövdasın artırma, pərişan olmasın.

## ŞİRVAN ŞAİRLƏRİNƏ KATİBİN NƏZİRƏSİ

Atəşi-hicrin mənə gərçi hərarət verir,
Eşq salır yadıma vəslini, taqət verir.

Arizin, ey dilrüba, laləni dilgir edər,
Daireyi-çərxdə şəmsə xəcalət verir.

Zalım, əyilmiş qaşın çeşmini təhrik edər,
Aşiqi-biçarənin qətlinə rüsxət verir.

Xəndeyi-pünhani-yar könlüm açar aşkar.
Gülruxuma ərzi-hal etməyə cür’ət verir.

Bu necə mehrabdır, yoxsa qaşın tağıdır,
Vaiz özü baş əyər, xəlqə nəsihət verir.

Xali-siyahə nə üz vermisən, ol bəxtəvər,
Yoxsa Həbəş əhlidir, gülşənə zinət verir?

Nəzmi-Nişat, Məsih, şeiri-Zülali məgər,
Katib oxur dəmbədəm, ruhuma ləzzət verir.

## QƏZƏL

Mahdır bu, ya mələk, ya huri-zibadır, nədir?
Pərtövi-hüsni günəş tək aləmaradır, nədir?

Zülfdür, ya aşiqi-divanəyə zəncirdir?
Şövqdür bu, ya mənim başımda sövdadır, nədir?

Nöqteyi-mövhumdur, ya çeşmeyi-abi-həyat?
Ya dəhəndir mimvəş, ya sirri-ixfadır, nədir?

Qəmzədir, ya fitnədir, ya qan edən cəlladdır?
Ya üşşaq əhlinin qətlinə imadır, nədir?

Bu necə göz yaşıdır, qərq eyləyibdir aləmi?
Gül üzündən ayrı cuş etmiş, bu dəryadır, nədir?

Dindiribdir lütf ilə eşq əhlini əhya eyləmiş,
Bu nə xoş məhbubdur, sani Məsihadır, nədir?

Şövqi-ruyin, ey pəri, aləmdə rüsva eylədi,
Katibi hər kim görür, der kim, bu şeydadır, nədir?

## MƏRHUM KATİBİN ERMƏNİLƏRLƏ ŞƏRİKLİ ŞƏRAB DÜZƏLDƏN BAĞAT ƏHLİNİ HƏVC ETMƏSİ

Bərhəm ola bu çərxi-dunpərvəri,
Müdam əhli-həqqə cəfa göstəri,
Kamrəva eyləyə hər kafəri,
Şəhid edə künəndeyi-Xeybəri,
Nə mürvətdir, incidə peyğəmbəri.

Bağatlarda olan müsəlmanə bax,
Tamam oğru, tabeyi-şeytanə bax.
Münafiqə, münkiri-Qur'anə bax,
Fasiqü məl'uni-biimanə bax,
Şəriətin hökmünə yox bavəri.

Oğrular ki, hərамə mötad olur,
Yüz ev tikə,axırı bərbad olur,
Şəbi-cümə ruhlər azad olur,
Halal bişən evdə gəli şad olur,
Haram bişən evdən üzün döndəri.

Əhmədavar Fərəc,Vəli dünyadə,
Çaxır basdı bu iki haramzadə,
Badə üçün dini verdilər badə,
Baxın belə vilayəti-bərbadə,
Unudublar Bağat əhli məhşəri.

Dedilər ki, gəlin bir yoldaş kimi,
Tapaq çaxır, basaq qızılbaş kimi,
Ermənidən tutaq bir hamaş kimi,
Şərik olaq çaxıra qardaş kimi,
Mundan qeyri işin yoxdu səməri.

Anton adlı ermənini gördülər,
Bağlarını yarılığa verdilər,
Bir gün gəlib çərəvişə girdilər,
Tuluqlarda çaxırı az gördülər,
Qəbul etmədilər belə zərəri.

Yava oğlu Fərəc götürdü yava,
Zərər qəbul etmədi, saldı dava.

Ermənini istədi döyüb qova,
Yalqız özü çaxırı satıb sova,
Sövda sulu gərək olsa müştəri.

Ay erməni, məgər candan keçmisən?
Yoxsa müsəlmanı axmaq seçmisən?
Payın yoxdu, sən payını içmisən,
Nəf'in qaçırdıb içinə...
Qalan çaxır mənimdi, ey sərsəri.

Ey səfih erməni, incitmə məni,
Boğazına sallam bu siyirtməni,
And olsun pərpətə, öldürrəm səni,
Dərələrdə cəngəl yiyən erməni,
Müftə çaxır görüb, verib içəri.

Erməni dedi ki, canım, ay Vəli,
Bu yoldaşın içməmiş oldu dəli,
Vermə muna, içər olu cəzvəli,
Al çaxır payını, salma əngəli,
Bir neçə istəkan tulla içəri.

Ey mosəlman, qəsəm be rəbbe-ğəfur,
Nədideəm mesle-to laən-şour,
Hər zəman ke, şəvəd qeyamət zohur,
Nə mirəsəd bər to şərabe-təhur,
Benuş əz in meye-taze sağəri.*

"Ax tı, durak, ya ne budu vinovat,
Ya tebe pokaju yebto yamat,
Mirovoy sud tebe budet nakazat,
Ya ne poydu, xoçu zdes noçevat,
Naprostnıy talkovıy vina beri"

"Bidqa kinem sudin qışdin ərz unim,
Hinç asma a şan dığa yer qunim,
Şad xosimes nihur bet quret kunim,

* "Ey müsəlman ,and olsun mərhəmətli Allaha,
Sənin kimi şüursuz adam görməmişəm.
Ta qiyamət olan vaxtadək,
Təmiz şərab sənə çatmayacaq.
Bu təzə şərabdan bir az iç!"

Atorq du gudumçe yes andunim,
İs saat qan çumim kema derderi”.

Keşiş gəli, özün sənə yetiri,
Məndən vəkil olub, işi bitiri,
Dilavərdi, axırını itiri,
Çaxır basdım mən ki, sizdən ötəri,
Nə verdiniz mənə bu dərdi-səri?!

Çaxır davasına tutun meyxana,
Katib deyə, yaza mərdü mərdana,
İbrət ola şəriətdən çıxana,
Bu fisqlər məşhur ola hər yana,
Bu həcviyyat ola dillər əzbəri.

**Vər. 127a**

## ABBAS BƏY

**Cəmadiyəl-əvvəl, 1309 (dekabr, 1891)**

**Abbas bəy Həsən bəy oğlu Qarabağ Şuşasının tabeliyində olan Pəri oğlulardandır. Onu Pərioğlu deyə çağırırdılar. Ona görə ki, anasının adı Pəri idi. Özü Qarabağ bəylərindən idi. Yetmiş yaşı var idi. Yuxarıdakı tarixdən beş il əvvəl öz kəndlərində qəflətən tüfəng gülləsi ilə vurublar. Qatili məlum olmadı. Aşağıdakı şeirlər onundur.**

Saqi, oturma, ver içək badəni,
Etmə fəramuş məni-üftadəni.

Qaşına bənzətməyə mahi-fələk,
Ayda otuz yol pozur amadəni.

Vermə nəsihət bu qədər, zahida,
Neyləyirəm məscüdü səccadəni?

Kə'bədən əl çəkməyə hazır, gözüm,
Görsə qabağında büti-sadəni.

Bari – xudaya, sən özün hifz qıl,
Tərsa arasında Poqoszadəni.

Sən pərisən, yar, hərəmxanənə,
Məhrəm edərsənmi Pərizadəni?

**Vər. 127b**

## MƏŞƏDİ ƏLİ MƏDƏD
## QAZİ OĞLU QURTLAR

**Əli Mədəd Qarabağın Şuşa əhalisindəndir. Şuşada anadan olub. Bu tarixdən on beş il əvvəl, təxminən 60 yaşında vəfat edib. Qarasifət bir kişi idi. Cavanlığının əvvəllərində yasavulluq edərdi, tənbur çalardı. Şadlıq məclislərində bədahətən şeirlər deyər, qafiyə tutardı. Onunla- bununla eşqbazlıq edərdi. Ömrünün axırlarında dərviş olub, bazarlarda öz şeirlərini oxuyurdu. Aşağıdakı şeirlər onundur.**

**Mədəd imzası ilə demişdir. Müxtəlif cəfəng şeirləri var ki, yazılmasını layiq bilmədim. (1310-cu il – 1892-93)**

Nə xoşdur bir güləndamın başın almaq qucaq üstə,
Müsəlsəl zülfünə etmək tamaşa gül yanaq üstə,
Etmək şirin təkəllüm hər dəm, bir xoş səyaq üstə,
Səmənsa telləri misli-bənövşə tər buxaq üstə,
Öpüb məstanə çeşmindən, qoymaq dodaq dodaq üstə,
Verər çox nəşə dimağə qoşa gəzmək ayaq üstə.

Götürüb tellərin hər dəm ruyindən kənar etmək,
Heyrət gözüylə baxıb, camalına güzar etmək,
Içirdib badeyi-gülgün, qılıb məstü xumar etmək,
Açılsa sinədən bəndi necə olur namusü ar etmək,
Görünsə iki şamamə yetişmiş tazə tağ üstə.

Edib yüz naz ilə əfşan, açıb geysulərin hörmək,
Gəhi işvə, gəhi qəmzə, gəhi vəqt oynayıb gülmək,
Gəhi öpmək, gəhi qucmaq, gəhi dəm oynayıb gülmək,
Durub min şövq ilə baği-vüsalından gülün dərmək,
Üz üz üstə, qolu boynunda ola yatmaq damağ üstə.

Girib səhni-gülüstanə dolanmaq naz ilən bağı,
Tutub nazik əlin gəzmək gəhi solu, gəhi sağı,
Görəndə ağlaya yüz qan ləbində qönçə yaprağı,
Urubdur bəndi-zəncirə siyəh xal əhli-üşşaqı,
Qurib dəstə, çəkib ləşkər getmək şəhri-Əraq üstə.

Çəkib bir künci-pünhanə, edəsən eyş ilə işrət,
Yanınca mütribi-xoşhal edə şamü səhər söhbət,

Sevəsən bir gülüzarı, görəsən dünyada ləzzət,
Mədədi öldürür, yaran, belə dərdü belə möhnət,
Görübdür bivəfa gülün bu gün bu xari-zağ üstə.

* * *

Mail oldum yenə bir mahcəbin tərsayə,
Bədəni bərgi-səmən, simvəşü rənayə.
Ləbləri rəxnə salıb tazə güli-həmrayə,
Uğradım Qeys kimi bir betərin sövdayə,
Etdi məcnunsifət, saldı məni səhrayə.

Gəlməyib ruyi-zəminə belə bir şux ziba,
Üzünün şəşəəsindən gətirib nur ziya,
Yazılıb səfheyi-rüxsarına "La hövlə vəla",[*]
Görsə gər bu şəkili alimü şeyxü üləma,
Əl çəkib ali-əbadən, yapışar İsayə.

Gəlməyib ruyi-zəminə belə ziba, mütləq,
Baxıban qəmzələrinə çəkib ustadi-sədəq.
Görməmiş lə'li-ləbin, açmadı gül al vərəq.
Gör nə təsvir çəkib kilki-qəza, qüdrəti-həq,
Göstərib mehri-rüxün, saldı şəfəq dünyayə.

Görməyib çeşmi-zəmanə belə şirin hərəkat,
Lalərəng, fitnəfirəng, dilbəri-pakizəsifat,
Mədədəm, xızrsifət yoxdu mənə rahi-nicat,
Saldı ümmana məni, qərq elədi dəryayə.[**]

* * *

Yenə ziyafətdir xublar evində,
Mahvəşlər bir yığnağa düşübdür.
Eyham edər, bir-birinə naz edər,
Qaş-gözləri oynamağa düşübdür.

Şirindir söhbəti, hekayətləri,
Var işvəsi, nazü nəzakətləri,
Vacibdi Kə'bə tək ziyarətləri,
Əlim yetmir, min iraqə düşübdür.

Əlvan olub gül hənadən əlləri,
Qucmalıdır gərdənləri, belləri,

---

[*] "Qüdrət Allaha məxsusdur" məşhur ifadənin qısaldılmış formasıdır.
[**] Müxəmməsin son bəndi orijinalda da dörd misradır.

Sona cığası tək sərdən telləri,
Əfşan olub, gül yanağə düşübdür.

Gözəllərin padşahı, sərvəri,
Fələyin istəkli mahi-ənvəri,
Mədəd sevib bir leyliveş dilbəri,
Məcnunsifət dağdan dağə düşübdür.*

Vəsfin edim boyun, yanaqlarının,
Ağ gül kimi bədən, buxaqlarının,
Həsrətindən şəkər dodaqlarının,
Lalə dağə, qönçə bağə düşübdür.

* * *

Sənin kimi gözəl yoxdu dünyada,**
Misri, İstanbulu, Şamı görmüşəm.
Hər yerdə ki, adı bəlli gözəl var,
Gəzmişəm tapmanam, hamı görmüşəm.

Qoynun içi – qızıl gülün çəməni,
Dişin dürdür, dodaqların yəməni,
Cənnət cəmalından ayırma məni,
Səndən ayrılalı damı görmüşəm.

Ayna tutub, yar camalın görsənə,
Şanə alıb siyəh zülfün hörsənə,
Gözəllikdə heç kəs gəlməz tay sənə,
Mən Bəhramı, Güləndamı görmüşəm.

Abbas bir qubardır, qürsi-afitab,
Camalın görənə dəxl olur səvab,
Abid, sənin olsun məscidü mehrab,
Mən öz-özüm müsəllamı görmüşəm.

* * *

Sevgili sultanım, istəkli xanım,
Yadlarinən aşinalıq eyləmə.

---

* Qoşmanın bu bəndi orijinalda da dördüncü yerdədir.

** Nəvvab təzkirədə Əli Mədədin tərcümeyi-halını yazdıqdan sonra onun başqa xətlə “Üstə” rədifli və “Mail oldun yenə bir mahcəbin tərsayə” misrası ilə başlanan müxəmməsləri yazılmış vərəqi əlyazmasına tikmişdir. Abbasın(?) “Görmüşəm” və müəllifi göstərilməmiş “Eyləmə” qoşmaları da həmin vərəqdədir.

Dön başına könül sevən aşiqin,
Hər nakəsə ilticalıq eyləmə.

Qoynun içi qızıl gülün çəməni,
Dodaqların lə'l, mərcan-yəməni,
Aşiqinəm, hər dəm yada sal məni,
Vəfalı yar, bivəfalıq eyləmə.

Nə müddətdir həsrətini çəkərəm,
Gözlərimdən qanlı yaşlar tökərəm,
Vəfalı qulunam, sənə nökərəm,
Padşahım, gəl gədalıq eyləmə.

Hüsnün düşüb Dağıstanə, Dərbəndə,
Dodaqların bənzər nabata,qəndə,
Bir busə lütf eylə mən dərdməndə,
Ağrın alım, nakəsalıq eyləmə.

**Vər. 129a**

## MƏHƏMMƏDƏLİ BƏY MƏXFİ

**Mərhum cənab Məhəmmədəli bəy Məxfi Əsədulla bəy oğlu Qarabağ əhlidir. İndi 1309-cu (1891-92) ildir. O da iki aydır ki, rəhmətə gedib. Təqribən yetmiş yaşı var idi. Zəmanəsinin ariflərindən sayılırdı. Ömrünü Rəvan və Qarabağda hakimliklə (dövlət qulluğunda) keçirib. Rus dilini çox yaxşı bilirdi. Rus dilindən Azərbaycan dilinə əsərlər çevirmişdir. Şeir və qəzəl deməkdə də əvəzi yox idi. Divanı var. Axund molla Vəli Vidadinin nəvələrindəndir. Baharlı Bayram xanın oğlu həmin Vidadi, cənab Vaqiflə həməsr idi və mərhum İbrahim Xəlil xanın hüzurunda olardılar. O cənabın təxəllüsü Məxfi idi və aşağıdakı şeirlər onundur.**

## MƏHƏMMƏDƏLİ BƏY MƏXFİ

Nə vaxtadək hiylə və riya ilə məşğul olacam,
Açıq deyəcəm bundan sonra, ki, eşqbazam.

Nə qədər gizlində olmaq olar, indi deyirəm:
Sevirəm, gözəllər eşqində nazlanıram.

Daşürəklilik və peymanşikənlik səndən oldu,
Nəhayət, sirrim bütün xalqa əyan oldu.

Rəhmdarlıq etmirsən, ya da ki, heç rəhmin yoxdur,
Ya da könlümün qəmli avazı qulağına çatmayır.

Əgər bu hüsnü camalla cahandan yüksəkdəsənsə,
Allaha and olsun, mən də sənin eşqində hamıdan yüksəkdəyəm.

Başımda olan bu eşqdən xilas ola bilmərəm,
Ta ki, onu canan ayağı altına salmayınca.

Canan tərifində mən tək şeir deyən olmaz,
Bəlkə Sə’di Şirazdan gəlib çıxa.

Bir baxışla ki, Məxfi, özümdən könlümü aparır,
Həm bir nəzər salmaqla yenə məni özümə qaytarır.

## YENƏ

Bir gün könlüm dərdindən can təslim etsə,
Sənin kuyini qoyub cənnətə getməyəcək.

Cənnət nədir? Müdriklərin söhbətinin bir anıdır,
Cəhənnəm nədir? Qədim dastanların ayrılığıdır.

Ölü qəbir torpağından oynaya-oynaya çıxar,
Əgər qəbrinə kuyindən nəsim çatarsa.

Biz göz qapısını bütün aləmin üzünə bağlamışıq,
Çünki gözəl üzünün xəyalı orada sakin olub.

Sənin təmənnanda ikən cənnət istəmək günahdır,
Səninlə dostluq edərkən cəhənnəmdən qorxmaq nadanlıqdır.

Hər kim ağzın yanında xalın görsə, deyər ki,
Mim üstünə səhv olaraq nöqtə düşübdür.

Hər şeydə eşqin təsiri vardır,
Aşiqlərin nəğməsi quşlara təlim olub.

Nadanın boş sözünə qulaq asma, badə nuş et,
Müdrik söz budur, əgər qulaq assan.

Eşq əqlin əlindən, Məxfi rəqib əlindən ağlar.
Nacinslərin söhbəti ruhu əzaba salar.

* * *

Əgər yanımda qaşqabaqlı otursan belə,
Narahat olmaram, çünki çox şirinsən.

Çox tündlük eyləmə, ey vəfasız cəfakar,
Zəiflərə özünü göstərmə, ey qolu qüvvəli.

Qəlbimi düyünə salmaq üçün qaşını düyünləmə,
Qıvrım saçların buna kifayət edər.

Zülm günah olsa da, sənin zülmün gözəldir,
Bütün cövr-cəfan ilə yüz təhsinə layiqsən.

Zəiflərə qarşı güc göstərmə,
Sən şahinsən, zəif sərçə ilə nə işin var?!

Hamı ilə sülh edirsən, Məxfi ilə cəng,
Qəribədir ki, vəfa əhli ilə kinlisən.

* * *

Hər kəsin təmkinli nigarı varsa,
Deyə bilməz ki, qəmli könlü var.

Şirin dilbərin dodağından şirin kam alan,
Dünyada eyş ölkəsinin Xosrovu olar.

Dünyanın eşqi ikidir: gözəlin vüsalı və rəqibin ölümü,
Xoşbəxt odur ki, həm o varıdır, həm də bu.

Yastığı yanında İsa nəfəsli yar olan xəstə,
Heç zaman ölüm fikrini yada gətirməz.

Axır, ey dost, bilmirsən ki, kinli qəminin,
Mən miskinə nə qədər cövrü cəfası vardır?

Ömür o qədər deyil ki, oturam, Məxfi,
Sənin nə qədər cövrün olduğun hesablayam.

* * *

Görgəc ol meyxanədə həmbəzmdir şahü gəda,
Eylədim təşxis kim, yox orda bir zöhdü riya.

Bir nigahi-kəc ilə aldın əlimdən könlümü,
Görməyib kimsə sənin tək nazəninü dilrüba.

Eşidib sərvim gülüstanə xuraman olduğun,
Səcdəyə enmiş bənövşə, qamətin qılmış düta.

Telbətel gəzdim xəmi-geysulərin hər tarını,
Yoxdu, yox ol həlqeyi-zülfündə mən tək mübtəla.

Vaiza, çox eyləmə ol həşt cənnət vəsfini,
Yar kuyidir bizə həşt behiştdən dilgüşa.

Gər güzarın düşsə qəbrim üstə, ey ruhi-rəvan,
Bas məzarım üstə payin, payinə canım fəda.

Çox dolanıb, Məxfi, mən seyr eylədim bu aləmi,
Yoxdu gördüm mərdümi-aləmdə asari-vəfa.

* * *

Urma ol həlqeyi-geysuyə, pəri, şanə bu gün,
Ki, salır könlümü ol şanə pərişanə bu gün.

Bağladım könlümü ol zülfi-pərişanə bu gün,
Düşdü zəncirə əcəb yerdə bu divanə bu gün.

Qorxuram, dəstinə almış o pəri şanə bu gün,
Salacaqdır dili-biçarəni bir qanə bu gün.

Arizindən götür ol zülfüni bir yanə bu gün,
Görə ta zahidi-kafər, gələ imanə bu gün.

Müjəvü qəmzəvü göz qəsd eləyib canə bu gün,
Cana minnətdir əgər oxlana mərdanə bu gün.

Eylədi ləşkəri-qəm könlümü viranə bu gün.
Deyin imdad eləsin ol şəhi-xubanə bu gün.

Mən kimi cür’əti varmı yana pərvanə bu gün,
Yanıram atəşi-hicranına, Pərvanə, bu gün.

Tökmə rüxsarına zülfü, çək onu yanə bu gün,
Qorxuram ki, olar odlarə düşə, yanə bu gün.

Sölədi, Məxfi, mənə mürşidi-meyxanə bu gün,
Fürsəti fövt eləmə, iç neçə peymanə bu gün.

* * *

Rəhm qılmaz məni-dilxəstəyə, cananıma bax,
Belə birəhm yolunda bu çıxan canıma bax.

Ey məni xəstə qılıb, canıma rəhm eyləməyən,
Səri-kuyindəki bu naleyi-əfğanıma bax.

Ey deyən duzəx odun hicrlə yeksan, bir gəl,
Çak edib köksümü, bu sineyi-suzanıma bax.

Könül əhvalını sordum, o pərişan söylədi,
Bu qara telləri gör, zülfi-pərişanıma bax.

Ey düşən eşqinə gülçöhrələrin, bir göz açıb,
Ləxtə-ləxtə bu ciyərdən tökülən qanıma bax.

Sorma, ey şux, könül halını hicran gecəsi,
Qanlı göz yaşımı gör, dideyi-giryanıma bax.

Qılmadın şükrünü ol ne'məti-vəslin bir dəm,
İndi, ey Məxfi, gəlib bu şəbi-hicranıma bax.

## YENƏ

Bağlamaq könlü xətadır xəmi-keysulərinə,
Saçır aşüftəlik ol şanə səri-mulərinə.

Sinəmə urdu bir ox qəmzə, kifayətmi edər,
Bir də ur, qurban olum qəmzeyi-cadulərinə.

Həbəşü Hindü Xətani satalar xalın üçün,
Qiymət olmaz o sənin daneyi-hindulərinə.

Tutdu mehrabə üzün, döydü yerə ol zahid,
Başını əymədi kafər xəmi-əbrulərinə.

Bu qədər naləvü zar eyləmə, Məxfi, bir utan,
Xəlq, aləm yığılıb gəldi bu hahulərinə.

## YENƏ

Əzəl nəqqaşı qaşın tağını mehrab yazmışlar,
Üzün ol halə altında əcəb mahtab yazmışlar.

Xilas olmaz könül bir ömrdür ol qeydi-zülfündən ,
Müsəlsəl tari-zülfün aşiqə qüllab yazmışlar.

Könül ol ləblərindən müttəsil gər sorsa, eyb etmə,
Bu bimarın əlacın şərbəti-innab yazmışlar.

Xəyali-zülfü ruyin gözdən almış xabımı yeksər,
Ki, aşiq çeşmini şəb ta səhər bixab yazmışlar.

Yazan dəm hər kəsə qismət, məgər ol katibi-qüdrət,
Könüllər qismətin zülfündə piçü tab yazmışlar?

Gözüm yaşinə qərq olmuş tənim girdabi-çeşmimdə,
Ləbin şövqündə cismim qərqeyi-xunab yazmışlar.

Cahan məhvəşlərində görmədim hərgiz vəfa, Məxfi,
Vəfa bu mahvəşlərdə, məgər, nayab yazmışlar?!

## MƏXFİNİN TƏNHALIQ QƏMİNDƏN ŞİKAYƏTİ

Hali-zarım qəti pərişandır,
Üstümə ceyşi-qəm şitabandır.

Bikəsəm, acizəm, pərişanəm,
Hədəfi-tiri-cövri-dövranəm.

Necə hər ləhzə etməyim fəryad,
Necə gərdunu etməyim bərbad?

Dari-qürbətdə qəmküsarım yox,
Müşfiqim yox, ənisü yarım yox.

Nə dilim, nə dilnəvazım var,
Nə rəfiqim, nə çarəsazım var.

Ruzigarım siyahü bəxtim dun,
Taleyim tirə, xatirim məhzun.

Əşkdən qeyri mehribanım yox,
Ahdan qeyri həmzəbanım yox.

**Vər. 132a**

## XUDADAD BƏY ƏLİ BƏY OĞLU

**Xudadad bəy Əli bəy oğlu Asinin qardaşıdır. 28 yaşında rəhmətə gedib. Söyləyirdilər ki, şeir deyir, amma bu iki beytdən başqa mənim nəzərimə bir şey çatmadı:**

### XUDADAD BƏY

Xoş o könülə ki, səndən ötrü rüsvay ola,
Xoş o başa ki, söhbətindən məst ola.

Əgər mənə Müştəri desələr Misirdə,
Çox Yusiflər sənin Züleyxan olar.

**Vər. 134b**

## İ K İ N C İ  H İ S S Ə

**1309-cu illədək (1891) sağ olan Qarabağ şairlərinin həyatı və şeirləridir. Allah o incə zövqlü şəxslərin aqibətini xoşbəxt eləsin.**

**Bismillahir-rəhmanir-rəhim…**

**Sonra Allaha ümid bəsləyən günahkar qul Nəvvab Mir Möhsün Qarabaği (şükr olsun bu dünyanı saxlayan o Allaha) bu dünyanı tərk etmiş şairlərin həyat və qiymətli şeirlərini – o şeirləri ki, künclərdə, onun-bunun yanında gizli qalmışdı, bütünlüklə toplayıb, zəmanə ariflərinin və dövran şairlərinin hüzuruna təqdim edib qurtardım.**

**İndi də Allahın köməyi ilə başlayaq həyatda olan şairlərin əhvalını ərz edib, qiymətli şeirlərindən elm və ədəb sahiblərinə söyləməyə. Ümid edirik ki, fəzilət və kamal sahiblərinin xoşuna gələcək, onun eyiblərini bağışlayacaq, lazım gəldikdə islah edib, bizi xeyir-dua ilə yada salacaqlar.**

## MÜASİR QARABAĞ ŞAİRLƏRİ

**Əlavə olaraq aşağıdakı maddələri də aydınlaşdırmaq lazımdır. Çünki gələcək (nəsillərə) lazım ola bilər. Birinci hissədə adlarını və əhvallarını verdiyimiz şairlər dövründə əlahəzrət Ağa Məhəmməd şah Qacarla, ondan sonra əlahəzrət Fətəli şahla və sonra da əlahəzrət Məhəmməd şahla müasir olmuşlar ki, hər üçü qüdrətli Qacarlar sülaləsindən olub, İran məmləkətində şahlıq edirdilər.**

**Rusiya məmləkətində isə əlahəzrət Nikolay Nikolayeviç, əlahəzrət Aleksandr Nikolayeviç, əlahəzrət Aleksandr Aleksandroviç bir-birinin ardınca müstəqil padşah idilər.**

**Bu zaman Rum-Osmanlı məmləkətlərində sultanlar sultanı əlahəzrət Sultan Mahmud xan, ondan sonra əlahəzrət Sultan Məcid xan və ondan da sonra əlahəzrət Sultan Əziz xan müstəqil padşah idilər.**

**Əvvəllər Qarabağ Pənah xanın və ondan sonra şanlı İbrahim Xəlil xanın hökmranlığı altında idi. O vaxta qədər ki, böyük rus padşahı əlahəzrət imperator Qarabağı ələ aldı, neçə il Qarabağın xanlığı və hökmranlığını şanlı Mehdiqulu xan bin İbrahim Xəlil xan Cavanşirin (öhdəsinə) qoydu.**

**Ad və əhvallarını bu təzkirənin ikinci hissəsində çəkdiyimiz şairlər ki, indi İslam tarixi 1309, Rum-rus tarixi 1892-ci ildir, İran padşahı, şanlı-şövkətli əlahəzrət Nəsirəddin şah bin Məhəmməd şah Qacarla müasirdirlər.**

**Rus məmləkətinin ehtişamlı padşahı, hörmətli imperator əlahəzrət III Aleksandr Aleksandroviçdir.**

**Osmanlı məmləkətində isə quru və dəniz sultanı əlahəzrət Sultan Əbdül-Həmid xan bin Sultan Məcid xandır.**

**Bu ikinci hissədəki şairlərin müasirlərindən olan üləmaların ən məşhuru, hal-hazırda islam dini və şəriətini təbliğ edən, həzrət Hacı Mirzə Məhəmməd Həsən Şirazidir ki, nicat bayrağını qaldırmış və özünü düz yola çağıran, rəhbər və insanları şeytan zəlalətindən qoruyan qüvvə hesab edir.**

**Vər. 138a**

## MÖHTƏRƏMƏ VƏ MÖHTƏŞƏMƏ NATƏVAN

**Xurşid Banu bəyim rəhmətlik Mehdiqulu xan ibn İbrahim Xəlil xan ibn Pənah xan Cavanşirin qızıdır. Qarabağın Şuşa şəhərində anadan olubdur. Mənə o əzizənin köməyi olub, ləqəbi Natəvandır.Beyt:**

**Qoy onun günəş camalı**
**Xoşbəxtlik bürcündə aydan-aya, ildən-ilə parlasın.**

**O, həmişə səxavət və xeyriyyə mənbəyi olan hörmətli nəsli və əcdadı kimi ehsanlar vermişdir. Xüsusilə 1291-ci ildə (miladi 1874-75) Şuşa şəhəri əhalisi üçün verdiyi ehsan ondan ibarətdir ki, şəhərin qərb hissəsindən uzaq məsafədən çox böyük çətinliklərlə və çox ağır xərclə sərin və şirin su çəkdirib, şəhərin şimal hissəsindən (Şuşaya) daxil edib. Suyu saxlamaq üçün böyük və möhkəm bir anbar tikdirib.**

**Şəhər əhalisinin istirahət və gəzintisi üçün cənnət kimi bir bağ saldırdı. Cənnətdə olduğu kimi, ağacların və güllərin dibindən gecə- gündüz su axır.**

### NECƏ Kİ, NƏVVAB DEMİŞDİR

Gülab kimi arxlar hər tərəfdən rəvandır,
Nərgisin gözləri məstlikdən yuxudadır.

Hər tərəfdən ətirli meh əsməkdədir,
Alma budaqları ilə hər tərəf bəzənməkdədir.

Bülbül gül budağında cəh-cəh vurur,
Qönçə açıla-açıla naz-qəmzə satmaqdadır.

Bütün hovuzlar saf su ilə doludur,
Baxanların dərdi-qəmi azalar.

Güllərin, bülbüllərin, çəmənlərin, çayların,
Peşələri ancaq Allahın zikridir.

### ALİCƏNAB XAN QIZININ SU ÇƏKDİRMƏ TARİXİNDƏ

İbrahim Xəlil xanın pak nəslindən,
Həyalı, ləyaqətli, parlaq bir ulduz parladı.

Onun əziz adı Xurşidbanudur,
Dünya onun səxavət dənizində bir köpükdür.

O elə bir bulaq yaratdı ki,
Dadı kövsər suyundan pay almışdır.

Hüseynin — o məzlum şahın ehsanına
Göylərdən gülab axıtmışdır.

İçki şərab içənlər üçün ləzzətlidir,
İç, ancaq ürəyi kabab olanların xatirinə.

Haqdan, susuzların ruhuna salam,
*Səvab yolu* — onun tarixi oldu — 1291 (1874-75).

## YENƏ DƏ O ƏZİZ XANIMIN SU ÇƏKDİRMƏ TARİXİ

Ehsan banisi, cahanın banusu (xanımı),
İbrahim xanın gülzarının gül budağı.

Təşnə Hüseynin ehsanı üçün,
Bu yaraşıqlı tikintinin bünövrəsini qoydu.

Müqəddəs bir işin tarixi belə aşkar oldu:
*Şahların və təşnələrin yanğısına ah çək* – 1291 (1874-75).

**Xülasə, mətləbdən uzaqlaşmayaq, əhvalı və məzacı adi, xarici görünüşü eybsiz, zərif qadındır. Qadınlara xas olan əməllərdə çox mahirdir. Rəssamlıq sənətində çox qabil və kamildir. Bəzən şeir də yazır. Aşağıda qeyd edilmiş şeirlər onun təbinin nəticəsidir.**

## QƏZƏL

Fəraq ilə işimi ahü zar edən sən idin,
Yıxan bu könlüm evin, tarmar edən sən idin.

Sənin yolunda bəlalər qəbul edən mən idim,
Mənim xilafıma hicr ixtiyar edən sən idin.

Sirişki-çeşmimi hər kəs görə, bilər dərdim,
Bu sirri aləmara aşikar edən sən idin.

Məni bu qəm yükünü çəkməyə rəva bildin,
Salıb məlamətə, həm şərmsar edən sən idin.

Xəzani-hicrdən asudə, vəsldən xoşdil,
Fəzayi-könlümü rəşki-bahar edən sən idin.

Qübari-xatiri-qeyr olduğum küdurətmiş,
Salıb əyağə, vücudim qübar edən sən idin.

Səbəb nə oldu ki, peymanü əhdi sındırdın?
Vəfavü əhdə əzəl etibar edən sən idin.

Bu qəmli könlümü gəh şad edən vüsalından,
Qəmi-fəraq ilə gahi fikar edən sən idin.

Gələndə mürği-dilim qəm çölündə pərvazə,
Xədəngi-cövrü sitəmlə şikar edən sən idin.

Dəmadəm ah çəkib, yanmışam fərağında,
Məni bu rəncü bəlayə düçar edən sən idin.

Qoyan bu səfheyi-dəhr içrə zarü sərgərdan,
Məni bu nimeyi-rəh biqərar edən sən idin.

Tükəndi ömr, driğa, qəmi-fərağında,
Ümidi-vəslə məni intizar edən sən idin.

Əzizi-aləm idi Natəvan vüsalınla,
Çəkib məzəlləti-hicrana, xar edən sən idin.

* * *

Müşküldü mən kənarə düşəm kuyi-yardən,
Düşvardır ki, əl üzəm ol gülüzardən.

Ya rəb, nolur ki, bari, gələ mərg aşiqə,
Can qüssədən rəha ola, dil intizardən,

Şaxi-gül üzrə əyləşib, ol şahmarı gör,
Əmr eyləyir ki, çək əlini zülfi-yardən.

Hicr atəşin araya dəxi salmasa rəqib,
Mümkün olurmu ayrıla pərvanə nardən?

Hüsnün xəyalıdır səbəbi-şövqi-xatirim,
Qəmzəndi qoymayan qurtaram ahü zardən.

Qəmdən səvay qəm günü qəmsar yox, könül,
Şad ola qəzayə, hər nə yetsə qəmküsardən.

Rahi-vəfada canü cahan verdi Natəvan,
Ta həşr olunca çəkməz əlin etibardən.

## YENƏ

Olmuşam dəhri-bəla içrə bu gün divanə mən,
Varmadım meyxanəyə, sındırmadım peymanə mən.

Əhdlərdən keçmədim, peymanələr sındırmadım,
Lacərəm bimehrlər tək olmuşam əfsanə mən.

Tərki-gülzar etmişəm bülbül kimi mən, ey rəqib,
Aqibət bir guşə içrə gəlmişəm əfğanə mən.

Eşqi-ruxsarında bir dəm vəsldə şad olmadım,
Hər tərəf seyr eylədim, düşdüm əcəb hicranə mən.

Qəm yükün çəkməkdən, ey dil, bir dəm azad olmadım,
Hərçi cəhd etdim, nə hasil, yetmədim cananə mən.

Duş gördüm kim, gəlibsən külbeyi-əhzanıma,
Ol zaman nəzr eylədim canü dilim qurbanə mən.

Görməyim düşvardır, billah, səni, ey rəqib,
Zülfə bağlı qoy gedim, axır düşüm zindanə mən.

Dövrü dönmüş dövr dövran etmədi kamımca, ah,
Düşmənimdir, bilməzəm ki, netmişəm dövranə mən.

Yoxü varımdan mənim ancaq qalan bir can idi,
Natəvan, daxi nedim, sərf eyləyim mehmanə mən.

## ƏLİYYƏ-NATƏVAN NURİ-DİDƏSİ MİR ABBAS AĞANIN VƏFATI ZAMANI DEMİŞDİR

Varımdı sinədə dərdü ğəmi-nihan, ölürəm,
Fəda olum sənə, gəl, eylə imtəhan, ölürəm.

Fəraqdan gecələr yatmazam sabaha kimi,
Xəyali-zülfünə bağlı gedibdi can, ölürəm.

Bahari-hüsnünara gör necə xəzanəm mən,
Bahar qönçəsi tək bağrım oldu qan, ölürəm.

Vərəq-vərəq dilü can hicrin içrə odlaşdı,
Misali-gəncəfə səd parə oldu can, ölürəm.

O xaki-payını mən aşiyan etmiş idim,
Vətəndan ayrı düşüb, indi laməkan, ölürəm.

Dedin ki, çək əlini damənimdən, əl çəkdim,
Tərəhhüm eyləmədin axır, ey cavan, ölürəm.

Çəkərdim həsrətini, görmədim, xudahafiz,
Nəzarə eyləmədin, ahü əl'aman, ölürəm.

Fəda o qamətinə kim, qəza nə xoş çəkmiş,
Kədər büküb belimi, eyləyib kaman, ölürəm.

Fəraqdən tükənib tabü taqətim,billah,
Vüsalə yetməz əlim, zarü Natəvan, ölürəm.

**YENƏ**

Nə mən olaydım, ilahi, nə də bu aləm olaydı,
Nə də bu aləmara dil müqəyyədi-qəm olaydı.

Nə hicr atəşinə odlaşıb yanaydım mən,
Nə eşqin içrə könül bölə şadü xürrəm olaydı.

Nə sərv qəddin olaydı, nə heyrət ilə gözüm,
Nə ruzigari-fəraqında qamətim xəm olaydı.

Nə bəhr olaydı, nə ümman, nə böylə göz yaşı,
Nə gül üzündə, ilahi, bu növ şəbnəm olaydı.

Nə gül olaydı, nə gülzarü gülşənin seyri,
Nə xari-möhnəti-bülbül səninlə möhkəm olaydı.

Nə Misr olaydı, nə Kən'an, nə həzrəti-Yə'qub,
Nə kor olub qəmi-hicranda qərqi-matəm olaydı.

Nə çah olaydı, nə zindan, nə karvan güzəri,
Nə Yusifi bu bəladə görən bir adəm olaydı.

Nə bəzm olaydı, nə bazarü Yusif əhvalı,
Nə rəhgüzərdə Züleyxa onunla həmdəm olaydı.

Nə ah olaydı, nə əfsusü parə-parə könül,
Nə Natəvan həvası bu növ bərhəm olaydı.

## YENƏ

Firiştətəl'ətü məhruyü xoşliqa, getmə,
Cəmali zu'i edən qəlbimi ziya, getmə.

Məsih tək nəfəsi mürdəni edən əhya,
Dəhani içrə olan çeşmeyi-bəqa, getmə.

Əsiri-danə olub dami-zülfə düşdü könül,
Onu bu silsilədən kim edər rəha, getmə.

Mərizi-eşq olana neyləsin ətibbalər,
Səvayi-ləli-ləbin yoxdu bir dəva,getmə.

Kəmali-şövqilə qoy eyləyim Xəlilasa,
O xaki-məqdəminə canımı fəda, getmə.

Əgər fəraqını görsə, görən gözüm çıxsın,
Gözümdə xaki-rəhi əsil tutiya, getmə.

Təvafi-kuydə təyin necə olur hasil?
Ona ki, zikri-qəmin verməsə səfa,getmə.

Xəzinə gövhəri tək olmusan nihan gözdən,
Vücudunu eyləyib məhz kimiya,getmə.

Rəqib tənəsi, hicran qəmi olur müşkül,
Bu Natəvanə görüb onları rəva, getmə.

## YENƏ

Yenə məxmur çeşmin hər mənə baxdıqca qan eylər,
Tutubdur fitnə dünyanı, xəlayiq əl-əman eylər.

Xətadır, gər desəm o nərgisi-məstin xəta etmiş,
Yəqinimdir, əgər qan etmiş isə, qanə qan eylər.

Əgər qaşü gözün xişm ilə ima eyləsə bir dəm,
Könüldə fitnələr peyda olub,hər dəm fəğan eylər.

Nihani baxmağından iztirabi-könlüm əfzundur,
Nə cadudur ki, hər dəm kəşfi-əsrari-nihan eylər?

Açıb mürği-dilim qonmuş səri-zülfı-pərişanə,
Bəla sərmənzilində, gör, nə qafil aşiyan eylər.

Üzün dövründə zülfün küfrə bənzər, tutmuş imani,
Hərami xeylini kim belə gəncə pasiban eylər?

Səba zülfün nəsimin gər aparsa vadiyi-Çinə,
Xütən səhrasını mişkin edib, ənbərfəşan eylər.

Rəqibi görməsin bir nişat, ya Rəb, cami-işrətdən,
Ki, məndən bisəbəb ol şux məsti sərgəran eylər.

Əgər qəhr aləminə gəlmiş olsa ol məhi-taban,
Nə etsə cana – minnət, çünki yari-mehriban eylər.

Derlər dərdi-eşqin adəm öldürməz, dürüstdür bu,
Və leykən ömrlər mən kimi zarü Natəvan eylər.

## YENƏ

O müjgani-siyəhnukin xədəngi-yarə bənzətdim,
Xətadır çeşmi-məsti ahuyi-tatarə bənzətdim.

Gözün mərdümləri sərməst olub, tökmək dilər qanım,
Düzübdür hər tərəf peykan, əcəb xunxarə bənzətdim.

Çəkilmiş guşəyə bülbül, fəğanü nalələr eylər,
Düşən gül üstə damə əndəlibi-zarə bənzətdim.

Tutub kəc gərdənin, hər ləhzə olmuş məhv nəzzarə,
Xəyali-yar ilə heyran baxan naçarə bənzətdim.

Görüb tərfi-bənaguşində çini-zülfi-mişkinin,
O gənci şayeqan üzrə yatan şahmarə bənzətdim.

Derdim ki, nədəndir Qeys olub divaneyi-aləm?
Cünun sərriştəsin ol türreyi-tərrarə bənzətdim.

Cəfayi-dəhrdən gördüm edirdi şikvə bir müztər,
Səsindən Natəvanü bidilü əfkarə bənzətdim.

## YENƏ

Zəmanə saldı əcəb möhnətü məlalə məni,
O mahrudən uzaq verdi qəm zəvalə məni.

Tükəndi tabü təvan, ey  xudayi-ləmyəzəli,
Ya tez bu canımı al, ya yetir vüsalə məni.

Sənə  nə qədər dedim: Rəhm qıl mənə, getmə,
Gəl, indi gör ki, fəraqın salıb nə halə məni!

Nə vəqtədək qəmi-hicrində ahü zar çəkim?
Tərəhhüm eylə, gətir sən də xəyalə məni.

Kəsildi səbrü qərarım, fəraqə tabım yox,
Rəvadı təngə gətirsin bu ahü nalə məni?!

Alıbdı əqlimi sərdən, qərarımı dildən,
Edib bəlayə fələk, gör, necə həvalə məni.

Təəccübəm ki, neçün rəhmə gəlmədin, zalım,
Fəraq oduna yaxıb, salmısan bu qalə məni.

Nə yaxşı günlər idi kim, səninlə munis idim,
Zəmanə indi edib sinədağ lalə məni.

Vüsalə yetməyibən zarü Natəvan qaldım,
Edib fələk niyə həsrət o məhcəmalə məni?

**Vər. 145a**

## KNYAZ MEHDİQULU XAN SANİ

**Cənab Knyaz Mehdiqulu xan ləkziyyə (ləzgi) əhalisinin nəciblərindən sayılan, alicah Knyaz Xasay xanin oğludur. Deyilənə görə, o, əlahəzrət qüdrətli Çingiz xanın nəslindəndir. Möhründə olan yazı da bunu təstiq edir. Fərd: *Dünyanı fəth edən Çingiz xan övladlarından Əmir cahandan Knyaz Xasay.***

**Mehdiqulu xanın anası möhtərəmə Xurşid Banu bəyim Natəvandır. Uca boylu, xoş xasiyyətli, xoşsurət və xoştəb bir cavandır. Rus tarixi ilə 1856-cı ildə 35 yaşları vardı. Rusiya dövlətində böyük mənsəbə malikdir və yüksək maaşı var. Rusca və farsca savadı var. Bir neçə il əvvəl Rus dövləti tərəfindən böyük bir vəzifəylə Tehrana gedib, şahənşah əlahəzrət Nəsirəddin şahın hüzuruna şərəfyab olmuşlar. Rus-Osmanlı müharibəsində də iştirak edib. 1301-ci ildə (miladi 1883-84) sizin duaçı bəndəniz Nəvvab Qarabaği musiqi elmində bir risalə tərtib etmişdi. Adı da "Yüzuh ül-ərqam" ("Rəqəmlərin izahı"). Bu əsəri o cənabın adıyla başlayıb qurtardım, onun da xoşuna gəldi. Lazımdır ki, risalənin əvvəlində yazılmış bir neçə beyti buraya da qeyd edim.**

## BÖYÜK XAN KNYAZ MEHDİQULU XAN SANİNİN MƏDHİ

Ey uca, şərəfli nəsildən olan cavan xan,
Vücudunun səxavətindən cahan cənnət kimidir.

Ey şahlar gülşəninin qızıl gül şaxəsi,
Qoca dünya səninlə təzələşdi.

Cəlalın cəlildir, cəmalın cəmil,
Əlin bəhmən buludu, qəlbin Nil çayı kimidir.

Ulu nəslin parlaq ulduzu,
Himmət göylərinin səxavət buludusan.

Qarabağ öz şadlığı ilə,
Ruma, İrana, Turana naz etməyə layiqdir.

Çünki sənin kimi ehtişamlı şahzadəsinin,
Öz məqamında yüz cür ehtiramı var.

Allah dünya və insanları yaradandan bəri,
Sənin tək növcavan görünməyibdir.

Ey qəlbi təmiz, səni mədh etmək nə gərək,
Min dəfələrlə desəm də, yenə azdır.

Sənin mədhin başa gələn deyildir,
Yaxşısı budur ki, dua ilə müxtəsər edim.

Dünyanı yaradandan bir istəyim var,
Dünyanı bəzəyən o bir Allahdan, ki,

Həmişə ürəyim şad olsun,
Pis gözlər dərgahından uzaq olsun.

Gərdişi-rüzgar belə qaldıqca,
Sənin ömr və dövlətin payidar olsun.

Dünyanın bütün işləri sənin arzunla olsun,
Bütün şahlar sənin qulamın olsun.

Elə ki, Nəvvabın məqsədi tamam oldu,
Sənin şərəfli adınla sözünü qurtardı.

**Xülasə, bu xanın mədhi o qədər deyil ki, bu kiçik parçada yerləşsin. Bizim məqsədimiz o xoşbəxtin əhvalını bəyan etmək idi ki, yazıldı. O cənab yazı və şeiri çox sevir, özü də bəzən şeirlər yazır. Onun şərafətli təxəllüsü Vəfadır. Aşağıda qeyd olunmuş şeirlər onun təbinin nəticəsidir. Şeir deməyi və şairləri sevir, onlardan xəbər tutur. Xüsusilə Mirzə Ələsgər Növrəsdən daha çox hal-əhval tutur. Mirzə Növrəsin özünün dediyinə görə, ona sonsuz və nəhayətsiz iltifat bəxş edir.**

## VƏFA

Ey naz yatağında səhər yuxusunda olan,
Yüz ah ki, yuxusuzluğumdan xəbərsizsən.

Canü cahan yandıran nalələrim var mənim,
Lakin daş qəlbinə bu nalələrin təsiri yoxdur.

Mənim ki, belə gündüzüm, belə gecəm var,
Kaş başqa gün, başqa bir axşam olaydı.

Xoş o günümə ki, bu tordan qurtarıb,
Sənin kuyinə yetmək ümidilə qol-qanad açam.

Bu gecə pərvanənin qanı boynunda olan şam da,
Sübhədək yanıb, yox olacaqdır.

Azadlıq yolundakı şəhidlərin hörməti vardır,
Türbətləri vanından ötərkən ədəbli ol.

Vəfa, hər iki dünyanın neməti əziz olsa belə,
Himmət ondadır ki, hər iki dünyadan əl çəkəsən.

* * *

Heç kəsin qəlbini özündən incik salma,
Səadətin yolu ancaq bundadır.

Ürəyi milçəyin halına yanmasa,
Bir gün hörümçəyin öz evi yanar.

Qəfəsdəki quşa rəhm etməzsə,
Qəza ovçunun əlin sındırar.

Çəmən səhnəsinə ahəstə qədəm bas,
Məbada, səndən çör-çöp inciyə.

Sən hər kəslə mehriban ol,
Ancaq özün isə heç kəsdən mehribanlıq təmənna etmə.

Ey dost, nə qədər ki, sağsan, yaxşılıq elə,
Çıxan nəfəs bir daha geri qayıtmaz.

Bir an nəfsin və həvəsin təhrikindən,
Azad olanın halına eşq olsun.

Vəfa, insaf yolunu əldə əsas tut,
Şərafət yolu ancaq budur və bəs.

## YENƏ

Ey sənsiz gün-güzəranım qara olanım,
Gecələr qəmin yarım, qəmküsarım olanım.

Bənövşə və sünbülün ətrindən nə fayda?
Aramsız qəlbim zülflərinə bağlıdır.

Sənin gülşənindən uçmuş avarə bülbüləm,
Viranə yuva məndən qalan yadigardır

Gülün vəfasızlığından, bağbanın cövründənsə,
Daha xoşdur ki, günlərim qəfəsdə keçə.

Ətrafa axan qanlı göz yaşlarından,
Dörd tərəfim güllə, lalə ilə dolub.

Qəbrimdən lalə göyərsə, təəccüb olmaz,
Çün dağdar ürəyimdə yüz belə qəmlər gizlənib.

Mən uzaqlıq qəmindən can verirəm,
Ancaq qəlbin mənə və mənim ruzigarıma yanmadı.

Ey dost, əgər yolun qəbrim üstündən düşsə,
Tozum belə sənin ətəyindən əl çəkməz.

Hər rəsm ki, ruzigar rəssamının işidir.
O mənim məzar daşıma Vəfa adı yazıb.

## BİÇARƏ KNYAZ MEHDİQULU XAN ƏSƏBİLİK CƏHƏTİNDƏN AŞAĞIDAKI FƏRDLƏRİ DEYİB

**Ancaq ömr ona vəfa etmədi, 26 cəmadiyəl-əvvəl 1318-ci ildə rəhmətə getdi. (5 sentyabr 1900, Nəvvab)**

Yaran, gəlin, bu gün fürsət məqamıdır,
Viran olub vətən, qeyrət məqamıdır.

Dini-Məhəmmədi xarü zəlil olub,
Qan ilə könlümüz peymanə tək dolub,

Avarə qalmışıq, sərdarımız hanı?
Keçmiş zəmanədən asarımız hanı?

İcma edin, bu gün dərdə dəva edək,
Dinü təriqətə canlar nisar edək.

Abad olan vətən axır xərab olub,
Bu dəşti-zülmdə min lalələr solub.

Dünyada məhv olub namü nişanımız,
Yoxdur bu möhnətə tabü təvanımız.

Axır nə vəqtədək bu hala səbr edək,
Bunca sitəm görək, belə cəfa çəkək?

İcma edin, bu gün dərdə dəva edək.
Dinü təriqətə canlar nisar edək.

Hər dindən bizim rövşəndi dinimiz,
Leykən zəlil olub, yoxdur müinimiz.

Ta key ala bizi qəflət, oyanmayaq,
Huşyar olub, gərək bir an dayanmayaq.

Fani olub gedir ömri-girənbəha,
Sidq ilə çağıraq, ya vahibül-əta.

İcma edin, bu gün dərdə dəva edək,
Dinü təriqətə canlar nisar edək.

**Vər. 151a**

## MİR HƏSƏN AĞA

**Hicri 1309-cu il ( miladi 1891-ci il)**

**Mir Həsən ağa mərhum Ağa Seyid Hüseyn ağanın oğludur. Qarabağın istəkli və nəcib əyanlarındandır. Anası Mehdiqulu xan Cavanşirin qızı möhtərəmə Xurşidbanu bəyim Natəvandır. Xoşsifət, xoşxasiyyət, xoş görünüşlü bir cavandır. İyirmi iki yaşı var. Fars və rus dilini yenicə öyrənməyə başlayıb. Yazını və şeiri sevir. Özü də hərdən şeir deyir.Təxəllüsii Mirdir. Aşağıda yazılmış şeirlər onundur:**
**(Şeir yazılmış vərəqin kənarında sonradan belə bir qeyd var: Biçarə Mir Həsən 1320-ci ildə vəfat etdi).**

## MİR HƏSƏN AĞANIN, ANASI XURŞİDBANU NATƏVANIN ŞEİRİNƏ NƏZİRƏSİ

Nə zülfı-yarə, ilahi, könül müsəxxər olaydı,
Nə elə zarü pərişan, nə belə müztər olaydı.

Nə mah tək doğuban aləmi münəvvər edəydi,
Nə zülməti-şəbi-zülfündə dil mükəddər olaydı.

Nə əhd olaydı, nə misaqü sidq olaydı, nə kizb,
Nə də zəmanədə peymanşikəst dilbər olaydı.

Nə sərvqədd olaydı, nə qaməti-şümşad,
Nə də xürama gələndə qiyami-məhşər olaydı.

Nə udü məcmər olaydı, nə zülfi-ğaliyəbu,
Nə də diyari-Xütən içrə mişkü-ənbər olaydı.

Nə qaşi-müqəvvəs olaydı, nə tir tək müjgan,
Nə çaki-sinə edən tiği-tizü xəncər olaydı.

Nə mey olaydı, nə işrət, nə cami-badeyi-nab,
Nə Miri məst eləyən saqiyi-sitəmgər olaydı.

**Vər. 155a**

## MİRZƏ FATMA KƏMİNƏ

**28 şəvvaləl-mükərrəm, 1309-cu il (26 may, 1892-ci il)**

**Mirzə Fatma mərhum Mirzə Bəybaba Əliyarbəyzadənin istəkli qızı olub. Qarabağın Şuşa əhalisindəndir. Şuşada anadan olub. Xoşsurət, xoş-əhval və xoş rəftar bir qadındır. Farsca savadı var. Müxtəlif şeirləri varsa da, divanı yoxdur. Mənim hesabladığıma görə, 300-400 ədəd şeiri var. Təxəllüsü Kəminədir. Şəhər ziyalılarındandır. Aşağıda yazılmış şeirlər onundur.**

## MİRZƏ FATMA KƏMİNƏ

Eşqin yolunda, ey dost, elə naşadam ki,
Sənin yolunun tozu kimi badə – küləyə verib fələk məni.

Qəza qəfəsində qol-qanadsız bir quş idim,
Tor qurub, hiylə ilə tora salıb ovçu məni.

Hürküb ümid dağına qaçan bir ahu idim,
Kəməndinə düşdüyümə heyrət edirəm.

Soyuq ahdan, qanlı könüldən qorxmayırsan,asandır,
Allah qəzəbinin atəşindən qorx, azad et məni.

Şirin kimi eşqin məni qəmgin edər,
Fərhad olsaydım, kipriyinlə səbr dağın dağıdardım.

Ömrüm boyu pərgar kimi qəm başına dolanmışam,
Bəh-bəh, çərxi-fələyin gərdişi üzündən əcəb ustadam!

Kəminə səndən özgə heç kəsdən xahiş eyləməz.
Ay Allah, əldən düşmüşəm, kömək elə!

## YENƏ

Nə vaxtadək, ey sərvi-rəvan, sənsiz dolanacağam,
Dodaqlarını nuş etməyi yad edib dilə gələcəm?!

Qəddin təki bağda sərv bitsə,
Səni görmək üçün başı üstə gəlləm.

Yusif təki səni bazarda satsalar,
Züleyxa kimi qəlbimi dinimi verib, səni almağa gələrəm.

Əgər misirli Hatifdən eşidsən “ey bəşər” sözünü,
Qaçaraq öz mətaimlə bazara gələrəm.

Dost üzünü görmək ümidilə “mənə görün” deyib,
“Məni görmək olmaz” sözün eşidib, qəmgin gələrəm.

Gözlərin peymanəsi məni elə xumar edibdir ki,
Təəccüblü olar hüzuruna huşyar gəlsəm.

Yuxuda üzünü görmək gümanım olsaydı əgər,
İtin ilə həmrah olub, ayıq gələrəm.

Eşitsəm ki, gül niqabını atıbdır,
Gül üzünə oxşar, mən gülüstana gələrəm.

Qəmli günündə “ah-vay” deyən olmasın,
Ey Kəminə, əhdin haqqı, sənə qəmxar gələrəm.

## YENƏ

Ya Rəb, məni cəfayə salan şad olmaya,
Səyyadi-zülmə seyd olub, azad olmaya.

Qəhri-xuda düçarı ola ta ki, ömrü var,
Ol qeyddən xilasə imdad olmaya.

Hurimisal salim ola əhli-ruzigar,
Bəlkə cahanda zülmilə bidad olmaya.

Hər kimsə gər xərab qıla bir könül evin,
Dünyavü axirət, evi abad olmaya.

Bülbül təəşşüqün gülə bilməzdi bağban,
Bağ içrə gər nəva ilə fəryad olmaya.

Bu çərxi-kəcmədardə dirinə rəsmdir,
Bir yar ki, yardır, onu bərbad olmaya.

Əhli-xuda, Kəminə, cəfa görsə, səbr edər,
Ya Rəb, görüm ki, gümrəhi irşad olmaya.

## YENƏ

Cövri-rəqib, sərzənişi-əhli-ruzigar,
Qoymaz qılam bu dərdi-dili yarə aşikar.

İşrətsərayi-könlümü, ey yari-tündxu,
Hər dəm cəfavü qəhr ilə, gəl, etmə tarmar.

Hicrində dürri-əşk, vüsalında nəqdi-can,
Bilməm hüzurü qeybətdə eylərəm nisar.

Gülşəndə gör nə şur ilə bülbül fəğan edər,
Guya ki, şax üzrə gülə həmdəm oldu xar.

Dil intizari-vəsldə pamali-fikr olub,
Tən atəşi-fəraqda çün muyi-biqərar.

Gər feyzi-cami-eşqi-həqiqətdə məstsən,
Əhsən, xoş məqamdasan, olma huşyar.

Dövran ki, saqiyi-qəmə olmuş həvalə, gör,
Ki, bu dövrdə Kəminə kimi kimdi kamkar?

## YENƏ

Əfsus, sərdə bisərü payın havası var,
Hər kimsə gümrəh ilə düşsə, çox bəlası var.

Ey peyki-ruzigar, yetir şahi-hüsnə kim,
Qəmxaneyi-zəmanədə bir binəvası var.

Tutmuş səriri-izzdə aramü ar edər,
Nisbət bu binəvaya deməк  aşinası var.

Əğyari-dunə mehrü məhəbbət edər müdam,
Öz yari-həqgüzarinə daim cəfası var.

Bəsdir mənə bu cövrü cəfa, şuxi-bivəfa,
Əcri-əməl o qadiri-biçün qisası var.

Gər çərxi-pir laf ura ki, qəmküsarınam,
Hərgiz inanmazam ki, onun da vəfası var!

Olmuş Kəminə cövri-fələkdən zəlilü xar,
Əfsürdə cism, ney kimi dəm-dəm nəvası var.

## YENƏ

Heç bir xəzinədə ləl dodağın tək dodaq olmayıb,
Onun rəngindən nişanə qəlbimin al qanıdır.

Sən gah qəlbimdə, gah xəyalımdasan,
Məhəbbət məclisindən kənarda olmazsan.

Dürdanə xalın qıvrım saçların arasından görünür,
Aşiqlərin könül quşları o danənin ardınca gəzər.

Dünya günəş üzünün vəsfini kimdən eşidib,
Ki, hər sübh yanağını sənin qapına qoyur?

Qəminin əlindən heç bilirsən nə üçün ürəyim ağlayır?
Bəlkə qəlbinə gecə ahəngləri təsir edər.

Zahid, gəl, huriləri çox vəsf etmə,
Dostumun üzünün vəsfi mənim üçün bəsdir.

Hər an cünun olub, mən yaxamı yırtaram,
Zülflərinin zənciri buna bir bəhanədir.

Kəminə qəmindən qəmgin deyildir,
O hər an zəmanənin əlindən şikayət edər.

* * *

Düşər könlüm, əziza, qanə sənsiz,
Gəlir şamü səhər əfğanə sənsiz.

Səninlə duzəxin narinə yannam,
Behiştdə baxmazam qilmanə sənsiz.

Edən abad memari-vüsalın,
Olubdur hicrdə viranə sənsiz.

Müsəddər bəzmi-vəslində olan dil,
Neçün hicran çölündə yanə sənsiz?

Gülüstani-vüsalə həsrət oldum,
Dönüb aləm mənə zindanə sənsiz.

Ənis olmuşdu dil ol şəm’ qəddə,
Yanar, billah, necə pərvanə, sənsiz.

Nə sənsiz xüm əyağına əl urram,
Nə də nuş eylərəm peymanə sənsiz.

Olur bərhəm, pərişan, qanədönmüş,
Könül zülfə çəkəndə şanə sənsiz.

Dinimdə zikrsən, könlümdə fikrim,
İki aləm dəxi əfsanə sənsiz.

Kəminə, ey hərifi-bimürüvvət,
Ola qorxum budu, divanə sənsiz.

## YENƏ

Könül, aldanma, bu çərxi-fələkdə etibar olmaz,
Vəfa bir kimsədə gər olmasa, namusü ar olmaz.

Fərar et zülf damından, gəl uyma daneyi-xalə,
Hidayət övcünə seyr eylə kim, şahin-şikar olamaz.

Mükərrər cövrlər qıldın mənə, ey şuxi-bipərva,
Nədəndir bir usanmazsan, məgər ruz şümar olmaz?

Meyi-gülgun ilə saqi edər ləbriz peymanə,
Ləbin tək nəş’eyi-ruhani verməz, xoşgüvar olmaz.

Görüb peymaneyi-hüsnün, gözüm, könlüm dönüb qanə,
İçən kəs badeyi-eşqini, billah, huşyar olmaz.

Yədi-qüdrət çəkən bu surətin görsə əgər Mani,
Olur bərhəm nigaristani-Çin, nəqşi-nigar olmaz.

Dəmadəm könlümü qan eyləyir əğyar tən ilən,
Cəfayi-xardən bülbül, vəli güldən kənar olmaz.

Əgər mə’şuqdən aşiq cəfa gördükcə tab etsə,
Vəfasız mahrulərdən ölüncə şərmsar olmaz.

Əgər səbt olmasa lövhi-cəbinində əzəl gündən,
Kəminə, bir bəlayə sən kimi kimsə düçar olmaz.

* * *

Rəhi-eşq içrə mənzurim mənim ol tacdarımdır,
Könül mülkünə sultanım, xocəstə şəhriyarımdır.

Əgərçi guşeyi-qəmdə şikəstəxatirəm, leykən,
Səri-kuyində dövr eyliyən xəyali-biqərarımdır.

Kəməndi-eşqinə bağlı gedib könlüm,inanmırsan,
Yoluna göz dikən şahid dü çeşmi-əşkbarımdır.

Şikənci-zülfdə könlüm mütəvvəl arizu eylər,
Səri-zülfün kimi bərhəm pərişan ruzigarımdır.

Sənin əğyar ilə könlün əgərçi şadü xürrəmdir,
Həmişə naləvü əfğan mənim də şüğlü karımdır.

Sənin gər qaməti-mövzun varındır surəti-ziba,
Mənim də dövlətü cahım bu eşqi-paydarımdır.

Kəminə bivəfa görsə səni, vallahi, inciməz,
Səni məndən iraq eyləyən bu bəxti-kəcmədarımdır.

**Vər. 161a**

## BALACA AĞA XAN QARADAĞİ

**15 rəcəb 1311 (22 yanvar 1894-cü il)**

**Cənab Balaca ağa atası Həsənəli ağa ilə eyni adda olub təxəllüsü Xan Qarabağidir. Onların əsli İran vilayəti Qaradağ mahalının nəciblərindəndir. 1220-ci üdə (1804 miladi) Qaradağdan gəlib Qarabağı özünə vətən edibdir. Əcdadı Səfəvi padşahlarının hüzurunda xəlifələr xəlifəsi mənsəbində olub. İndi Həsənəli ağanın 45 yaşı var. Zəmanəsinin ən arif şəxslərindəndir. Bizim "Məclisi-fəramuşan"ın üzvlərindən biridir. Bəzən həm farsca, həm də azərbaycanca şeirlər deyir. Şeirləri pərakəndədir, divanı yoxdur. Rus millətinin şairlərindən biri olan Krılovun bəzi təmsillərini nəzmlə tərcümə edib. Bu cənab "Məclisi- fəramuşan"ın üzvlərindən biri olmasına baxmayaraq, həyatda olan bütün Qarabağ şairləri böyük bir həvəslə öz şeirlərini öz dəstxətləriylə yazıb, bu təzkirədə qeyd etmək üçün göndərdikləri halda (hamısını da qeyd etmişəm), o, vaxtı-vaxta satmış, öz şeirlərini verməkdə bu gün-sabaha salmış, iki il səhlənkarlıq etmişdir.**

**Buna baxmayaraq, mən aşağıdakı şeirləriylə kifayətləndim. Mənimlə sual-cavab ctdiyi bəzi şeirləri də məlumdur. 15 rəcəb 1311-ci il.**

Ah kim, hasil mənə aləmdə ahü zardır,
Guyiya mən bir neyəm, könlüm evi bimardır.

Göz yaşıyla bəslədim ol sərvqəddi, haliya,
Nuki-müjganı bu qəmli sinəm içrə xardır.

Həsrəti-zülfündən olmuş tar tək pürpiçütab,
Nərgisi-məstindən ötrü xəstə dil bimardır.

Yoxdu bir dil kim, giriftar etməsin ol zülfi-kəc,
Nüqteyi-mülki-cünunə guyiya pərgardır.

Küfri-zülmün məzhəbi, taqi-qaşındır qibləsi,
Gör Qaradaği nə türfə  mərdümi-dindardır.

### YENƏ

Əbrvəş məh üzünə zülf salanda sayə,
Sanki bir ay tutulub, şur düşüb dünyayə.

Düşsə bir tar telindən üzünə, tanrı bilir,
Ləkələr zahir olar, nəqs yetər ol ayə.

Gərçi İsa dəmi çox mürdələr əhya eləyib,
Özü əhya olu, gər yetsə dəmin İsayə.

Yığılıb dövrəsinə bir neçə dilbər,guya,
Duxtəri-nə'ş alıbdır Cüdeyi ortayə.

Üzməzəm, tanrı bilir, daməni-vəslindən əlim,
Gətirə ruhül-əmin göydən əgər min ayə.

Var idik bundan əzəl biz nə gözəl həmxabə,
İndi biganəsifət göz kimiyik həmsayə.

Baş çəkib, aşiqdən böylə xuraman gəzmə,
Salma, ey sərv, məni mə'rəkeyi-kübrayə.

Sən hara, sərv hara, qaməti-mövzun hara?
Bu xuraman gəzişin nisbəti yox tubayə.

Mən hara, eşq hara, dilbəri-məhruy hara?
Nə yaman yerdə yenə düşdü başım qovğayə?!

Necə təqrir qılım vəsldə hicran şərhin,
Dərdi-hicrü qəmin, ey dust, gəlirmi sayə?

Görməmişəm mehrü vəfa, cövrü cəfa çəkmək üçün,
Belə zahir ki, Qaradaği gəlib dünyayə.

## YENƏ

Ol kəs ki, məni öldürü, indi belə getdi,
Qan ilə xizab eylədi, şəmşir ilə getdi.

Başdan-ayağa qan ilə qanlım olub əlvan,
Qoyman, gözümə dəydi bu könlüm gilə, getdi.

Hicrində nigarın bu qədər zar idim, axir,
Əşkim götürüb verdi vücudum selə, getdi.

Can nəqdi ki, sərmayədi imkani-vücudə,
Əldən çıxarıb zülfünü verdim yelə, getdi.

İmanə dəxi qalmadı fəxrin, Qaradaği,
Küfr aldı əlindən bunu da, bir telə getdi.

**Vər. 163b**

## CƏNAB SƏLLÜLLAH ƏS-SADATULLAH NİZAM AĞAYİ-AĞAYAN MİR MÖHSÜN NƏVVAB

Birinci ehsan Rzanınkıdır:
Onun gözəl xasiyyəti var.

İkinci ehsan Məşhədinindir:
Bizim üçün o, bərəkət atasıdır.

Sonra Hacı Məhəmməd Mürşiddir:
O, mövqufat vəkilliyi rəisidir.

Dördüncü Qazidir - yetimlərin atası:
Onun hökmü Herati qədər nüfuzludur...

Beşinci qorxmaz Bakidir:
Onun sözü şəkər kimidir.

Altıncı Möhsün Nəvvabdır:
Xalqın kiçiyi, seyyidlərin fəqiri.

Yeddinci şəxs Xan Qaradaği:
Hər şey ondan bərat olur.

İki dövrəyə ümid vardır,
Üçüncü dövrə olmaz heyhat!

Bunu Qaradaği 1315-ci ilin 23 rəcəb ayında, dedi,
Pəncşənbə günündə yanvar ayında,

Qeysarat (?) ayının iyirmi birində,
Tarix min səkkiz yüz doğsan dörd idi.

Sonra da doxsan dörd gəlirdi,
Cədi bürcündə qış ayı idi.

Bu il və ay ehsan vaxtıdır,
İşdən azad “Fəramuşan” da.

Yeddi şəxs, yeddi ulduz kimi,
Toplaşdılar Böyük Ayı bürcü kimi.

Seyidlər seyidinin məsləhəti ilə,
Qonaqlıq başlandı növbə ilə.

Birinci növbə Rzanın oldu,
İkinci növbə Əbu əl-Bərəkatın.

Üçüncü növbə — Hacı Məhəmmədin,
Dördüncü oldu Qazi əl-Hacat.

Xoşxasiyyətli Qazi Molla Hüseyn,
Elm və səbr sahibi, xoştəbiətli.

Din xadimi, adil və fazil,
Xeyir banisi, faydalı bir şəxs.

Beşinci növbə Məşədi Əyyubun oldu,
Təxəllüsü isə onun Bakidir.

Altıncı oldu Seyid Nəvvab,
"Məcməyi-Üns"ün Möhsünüdür o.

Yeddinci növbə Qaradağinindir,
O bura toplaşanların qulu və dostudur.

**Vər. 164a**

**Cənab Xan Qaradaği aşağıdakı qəzəlləri öz əlilə yazmışdır.**

## QƏZƏL

Tərəhhümlü təkəllüm, ya qəzalə,
Ucaltma çərxə bunca ahü nalə.

Gəlib güftarə şəkkərriz olmaq,
Yaraşıb sən kimi tutiməqalə.

Elədir məh üzündə zülf, guya,
Urub məh dövrəsinə əbr halə.

Götürüb üzdən niqabın, aç camalın,
Ziya kəsb eylənir ondan hilalə.

Bənöfşəvardır başım dizimdə,
Düşüb eşqində yüz fıkrü xəyalə.

Vüsalın hasili şəhdi-müsəffa,
Fəraqın hasilidir ahü nalə.

Yetişmiş başa ömrüm, indi hicran,
Nəvaziş eyləyib, dönmüş vüsalə.

Əyaq tək düşmüşəm başdan əyağə,
Əlim tut, saqiya, doldur piyalə.

Mənə bir cam tut, saqi, o meydən,
Qılım hal əhlini heyran bu halə.

Pərişan eyləyən fıkrü xəyalım,
Pərişan zülfdür, mişkin külalə.

Sızıldar ney təki könlüm dəmadəm,
Düşüb yüz piçü tab zülfü camalə.

Könül verdim o zülfə, əl götürdüm,
Bu gündən kim, uyubdur xəttü xalə.

Sərasər dağlanıbdır misli-lalə,
Bu könlüm qan udub, gəlmiş zəvalə.

Hal əhli yada salmaz əhli-halı,
Nədən yeksər olubdur əhli-qalə?

Nədir bais, Qaradaği, cahanda,
Olubsan qəmlərə bunca həvalə?

## YENƏ

Könülə açan rahi-vüsalın gözdə hər sulərmidir?
Yoxsa bu qan-yaşdən cari üzə culərmidir?

Çeşmi-məxmurundumu cəlladvəş, ya qaşların?
Göz görə qan eyləyən,insafsız, bulərmidir?

Əbr tək halə uran ol məh üzün ətrafına,
Xaldır, xətdir və ya çiynində geysulərmidir?

Can alan, qanlar tökən ol çeşmi-mişkindir və ya,
Ox tutub, tiğ çəkən üşşaqə əbrulərmidir?

Xaldır, xətdir və ya zülfündü ol zəngibeçə?
Ağ üzündə qəlbi qarə yoxsa hindulərmidir?

Kəc dönüb, süzgün baxan kani-hiyəl canlar alar,
Sehr edən, məkr eyləyən bu çeşmi-cadulərmidir?

Ömrdür tutmuş Qaradaği Xütən səhraların,
Ram edib ondan qaçan bilməm, bu ahulərmidir?

**YENƏ**

Hanı o yarə uyub xəlvət etdiyim gecələr?
Ənisü munis olub, söhbət etdiyim gecələr?

Necoldu, bir mən idim, bir də ol nigarım idi,
Hərimi-qürbdə mən şöhrət etdiyim gecələr?

Hanı, fəraqdə axir belə deyildim xar,
Vüsali-şahidimi izzət etdiyim gecələr?

Necoldu, bari xudaya ki, yar ilə var idim,
Həmişə eyşdə mən işrət etdiyim gecələr?

Gözüm gözündə, əlim daməni-vüsalında,
Hanı o yarə durub minnət etdiyim gecələr ?

Fəraqi-cövrünü, bilməm, bu qədr mən çəkirəm,
Ki, bir də qismət olur vəslət etdiyim gecələr ?

Nəsib ola, Qaradaği, mənə görüm bir də,
O yar ilə qonuşub, ülfət etdiyim gecələr?

* * *

Salıbdı indi nəzərdən, gedib o yar məni,
Edibdi möhnətü dərdü qəmə düçar məni.

Fəğanü nalə yükün çəkmək ilə gün keçdi,
Bəla qatarına çərx etdi sərqatar məni.

Bəla xədənginə olmuş nişan dili-zarım,
Nedim ki, eylədi səyyadi-qəm şikar məni.

Fəğan ilə ətəyin tutdum ol turşruyun,
Cəfadə söylədi: Yan, get ki, od tutar məni.

Bu fıkr yordu məni, ahu səyyad edənlər tək,
O ahu gözlü görəndə nədən qaçar məni?

Hara gedim, nə qılım, eyləyim nə çarə?
Bu zalım indi belə öldürür fıkar məni.

Nə söz dedim, görəsən, dəydi qəlbinə, ya rəb?
Küsübdü, indi belə dindiməz nigar məni.

Qaşından özgə əgər qiblə tutsam aləmdə,
Görüm ki, eyləyə sədparə Zülfiqar məni.

Əsirü xəstədil oldum bu möhnətü qəmara,
Əcəl yetişəydi, gələydi, görəydi yar məni.

Nə etmişəm, Qaradaği, bu qədr yar belə,
Rəqiblər nəzərində tutubdu xar məni?!

## YENƏ

Bir ləhzə istəməm olasan dur, mən səni,
Gözdən, könüldən, ey gözümə nur, mən səni.

Sən bir süruri-dil, mənə nurül-üyunsən,
Dünyada həq, görüm, edə məsrur, mən səni.

Musa cahanda uymaq üçün həq civarına,
Bir dağ tapanda tapmış idim Tur, mən səni.

Hər mövcudun vücuduna mənzur bir səbəb,
Yox özgə, bilmişəm, elə mənzur, mən səni.

Məczubi bu dildə dəxi necə bəs olur,
Bir de görüm ki, cəzb edəcək hur, mən səni.

Göstər camalını o mahü mehrə, dövrə gəl,
Mövcudsan, görüm tazə bir dövr, mən səni.

Söylər o yar, ey Qaradaği, nə hasilin,
Dünyada etmişəm belə məhcur mən səni!?

## YENƏ

Bir qəmzəsilə könlümü verdi talanə göz,
Vay o zaman ki, kəc baxa, süzgün dolanə göz.

İmavü işarə, şivəvü naz elmini tamam,
Bir ğəmzəsilə bildirir arif olanə göz.

Ahu gözün xətadı sənə bənzədim,buna,
Həddi nədir o yan dura, qıyğaz dolanə göz.

Dil sındırandı, söz toxumaq adət eyləyib,
Hər ləhzə istəyir ki, bu könlüm bulanə göz.

Qorxum budur ki, ərz qılam cism yarəsin,
Dil matəmində əyləşə bir dəm, sulanə göz.

Dərdü qəmə, bu möhnətara yüz bəlalərə,
Düşdüm, nə söyləyim məni gözdən salanə, göz?

Eşqin hərarəti, bəsi hicran mərarəti,
Soldurdu gül kimi, dəxi baxmaz sulanə göz.

Başdan düşüb ayağına zülfündə yalvarır,
Könlüm gəh əqrəbə, gəhi pürpiç ilanə, göz.

Rəhm eylə, alma canımı, salma bəlalərə,
Gəlsin bəla ki, canına hər dəm alanə, göz.

Bir də gəlirmi cana cahanda könül, görən,
Bir bu qədr ki, zülm edər ixlas qılanə göz?

Batmış qaraya ol Qaradaği, qəra gunə,
Qoydum, deməzmi cəbr elədim, mən filanə, göz?!

* * *

Kəc-kəc dönüb baxanda o məstanə gözlərin,
Məst eyləyir, salır məni hər yanə gözlərin.

Məxmurü məstdir yenə, süzgün nigahdır,
Viran edib məgər neçə meyxanə gözlərin?!

Ahunigəh, xətaya düşüb, qoy Xütən gəzim,
Varmı, görüm cahanda bu şahanə gözlərin?

Viranə eyləyib bu könül mülkünü tamam,
İndi nə göz dikib yenə viranə gözlərin?

Nət' salıbdı, təxtə çıxıb, tiğ çəkdirib,
Fərman veribdi qətlimə şahanə gözlərin.

Şan-şan edibdi bağrımı, qan uddurub mənə,
Baisdi indi, gör neçə min qanə gözlərin!

Səbrü  qərarü tabü təvan, ixtiyar alıb,
Bilməm qoyubdu məndə, deyim, ta nə gözlərin?!

Oğrun bəlalıdır Qaradağı, nə eyləsin?
Məkrü fününə çün salacaq fəttanə gözlərin.

* * *

Ariz üzrə ol sənəm zülfi-siyahın dağıdır,
Mülki-islam içrə küffarın sipahın dağıdır.

Gərçi zülfündən düşər şamə, ey dil, çəkmə qəm,
Pərdeyi-rüxsarın, ah sübhgahın dağıdır.

Ol niqab altından ər xurşidrux göstərsə üz,
Şöleyi-rüxsarı çərxin mehrü mahın dağıdır.

Qönçəvəş qan oldu könlüm həsrətindən hər zaman,
Sinədə bu dağlər bir kəc nigahın dağıdır.

Səngdil canan cəfasından, gəl, ey can, incimə,
Ah çəksən, Şişə şəhrin  tiri-ahın dağıdır.

Eyləyən Məhmudu təxti-səltənətdə müztərib,
Ruzigar içrə Əyazi kəckülahın dağıdır.

Dedilər kim, dostlar pəndin eşit, verdim cavab:
Rəsmdir, divanə başdan nikxahın dağıdır.

Zahidi-xudbin müqəvvəs qaşların yadı ilə,
Səcdə qılmaz, bir zaman səcdəgahın dağıdır.

İstima' bulmaz Qaradaği nəsihət, zahida,
Ehtiraz eylə kim, ahı xanəgahın dağıdır.

* * *

Vədə vermişdir, nədən, ol yar gəlsin, gəlmədi?
Tuti dilli, bir şəkərgüftar gəlsin, gəlmədi.

Əldə mey camın tutub, göz intizarın çəkmişəm,
Gözlərəm, ol gözləri xummar gəlsin, gəlmədi.

Hər yetən kimsə könül mülkünü viran eylədi,
Mən dedim dil sahibi, sərdar gəlsin, gəlmədi.

Bu qədər təxir elər, ya rəb, nə olmuş, bilməzəm,
Gəlməmək fikri olub, ya var gəlsin, gəlmədi.

Ol vəfalı bivəfa olmaz, nədəndir, bilməzəm,
Əhd edib, bir bu qədər, zinhar gəlsin, gəlmədi.

Ya xətayə uğradı, ya kim, Xütəndən istədi,
Ahu gözlü, kəc baxışlı dildar gəlsin, gəlmədi.

Könlüm istər, əl yetişməz, ey Qaradaği, nedim,
Bu xəzan içrə dedim gülzar gəlsin, gəlmədi.

* * *

Mən bir cavan, türfə, gözəl yarə aşiqəm,
Oğrun baxışlı, gözləri xummarə aşiqəm.

Şəm'i-camala gərçi yanıb natəvan könül,
Pərvanəvar yandıra odlarə, aşiqəm.

Baxmaz üzümə bircə nədən döndərib yüzün,
Bilməzmidir ki, mən ona biçarə aşiqəm?!

Həsrət odiylə laləsifət dağdar olub,
Məcnunmisal düşməyə dağlarə, aşiqəm.

Müjgan oxuna etmiş hədəf dağlı sinəmi,
Hər ləhzə bağrımı dələ, gər yarə, aşiqəm.

Aya, alır bu canı düşüb xaki-payinə,
Mən etsəm ərz yalvarə-yalvarə, aşiqəm.

Bir mehri yox, vəfası bulunmaz, cəfası çox,
Aləmdə mən də bir belə dildarə aşiqəm.

Razı deyil cahanda Qaradaği ölməyə,
Hər kimsə öldürüb, məni qurtarə aşiqəm.*

* Nəvvab, Qaradagiyə aid olan hissədə 14 vərəq ağ qoyub ki, sonra onun şeirlərini yazsın, lakin yazmayıb.

**Vər. 182a**

## SƏMƏD BƏY VƏZİRZADƏ

**Rəbiül-əvvəl, 1309-cu il (oktyabr, 1891)**

**Səməd bəy mərhum Əsəd bəyin oğlu, Qasım bəy Zakirin nəvəsi, Abdulla bəy Asinin də bacısı oğludur. Vüqarlı və təmkinli bir cavandır. Yaşı təxminən qırx olar. Aşağıdakı şeirlər o cənabın xəyalındandır.**

**Cənab maarifpərvər Mirzə Rəhim Fəna bu qəzəli demiş və Səməd bəy ona cavab vermişdir:**

Hicrin edibdi könlüm evin qarət, ağlaram,
Çün ağlamaq olubdu mənə adət, ağlaram.

Qəddin fəraqı başıma gətdi qiyaməti,
Ta həşr olunca hər dəmü hər saət ağlaram.

Ta var idi fəraqına tabım, səbur idim,
İmdi yoxumdu səbr, nedim, taqət, ağlaram.

Zülfü rüxün fəraqına sərf oldu ruzü şəb,
Ömrümdə bir dəm olmamışam rahət, ağlaram.

Xəlqə nədir ziyanı mənim əşki-didəmin?
Bidərdlər edərlər mənə töhmət, ağlaram.

Bu giryədir açan dili-qəmgini-razımı,
Göz yaşım ilə xoşdu mənə halət, ağlaram.

Söhbət macalı olmadı bir dəm səninlə,heyf,
Hər dəm edib xəyalın ilə söhbət, ağlaram.

Ruyin fəraqıdır səbəbi-giryeyi-Fəna,
Didarına qoyubdu fələk həsrət, ağlaram.

## SƏMƏD BƏYİN FƏNAYA CAVABI

Ey piri-xəstədil, belə bitaqət ağlama,
Əğyar görsə giryən, edər  töhmət, ağlama.

Təşbihini qiyamətə qıldın çü qamətin,
Bir eyb olur vüsali-qədü qamət, ağlama.

Pərvanələr aşiq edər nəqdi-can nisar,
Üşşaq içində qoymagilən bid'ət, ağlama.

Zülf içrə gərçi könlün olub pasibani-hüsn,
Gül rudə busədir ona həm ücrət, ağlama.

Gər mövci-bəhrdən sənə yox bakü ictinab,
Tufani-əşk xəlqə verir zəhmət, ağlama.

Mə'şuq elər aşiqini nazla imtahan,
Bu nazı sən saqınmagilən fırqət, ağlama.

Şükr eylə kim. ənisi-dilindir xəyali-yar,
Çoxdur qalan bu söhbətə həm həsrət, ağlama.

Lazım tutur əgərçi Fəna ləfzi giryəni,
Baqi olub, vəfada qalıb himmət, ağlama.

**Rəbiül-əvvəl, 1309 – oktyabr, 1891**

**Vər. 183a**

**BƏHRAM BƏY FƏDAİ**

**Cənab Bəhram bəy Əsəd oğlu Vəzirzadə Qarabağın Şuşa şəhərinin əhalisindəndir. Xoşxasiyyət, orta boylu bir cavandır. Yaşı təqribən 35-ə çatar. Mərhum Qasım bəy Zakirin nəvəsi, Abdulla bəy Asinin bacısı oğludur. Fars və rus dillərində məharəti var. Etika elmində tayı-bərabəri yoxdur. Təxəllüsü Fədaidir. Şairlik təbi var. Aşağıdakı şeirlər onundur, öz xətti ilə yazılıb.**

**Rəbiül-əvvəl, 1309 – oktyabr, 1891**

Saqi, gəl ki, lalə və gül tələf olur,
Yarın ləl ləbini xatırla, mey ver, qorxma!

Sabah məlum olmur başına nə gələcəkdir,
Bu gün fürsətdir, mey camını əldən vermə!

Bu qarımış qoca çərxdən arxayın olma,
Minlərlə sən tək oğul öldürən anadır.

Əgər dəhrin qilü-qalından azad olmaq istərsən,
Gecə-gündüz çəng və dəf avazı ilə mey iç!

Ey canım, mal yemək-içmək üçündür,bil,
Səndən sonra lə'l, ya zibilin qalması nəyə lazım?

Nə vaxtadək məqsədə çatmaq üçün ah çəkəcəksən?
Sinəni bəla oxuna hədəf edəcəksən?!

Ey Fədai, hər kəs hikmət şərabı içsə,
Şahi-Nəcəf həmişə ona kömək olar.

**YENƏ**

Cəllad gözlərin tək dünyada qatil yoxdur,
Aşiqləri həlak etməkdə bir an səbr etməzsən.

Sənin iki zülftin tərəzisində dəfələrlə yoxlamışam,
Eşqimin qarşısında Məcnunun eşqi bir misqal da deyil.

Uzun saçlarının fikri ümidimi uzatdı,
Bundan başqa heç bir ümidə ehtiyac yoxdur.

Ey naseh, məni öz halıma qoy, get,
Mənim halımı müşkül görən əhli-hal deyil.

Ağzının sirrini filosof hardan bilər?
Müəmma sirlərinin şərhi hər cahilin işi deyil.

Dünya malından get dünya əhlinə danış,
Eşq dövlətlisiyəm, mal-dövlət arzusunda deyiləm.

Ey Fədai, bu alçaq dünyaya könül vermə,
Cünki uşaq evciyi tək möhkəmliyi yoxdur.

## YENƏ

Ey könül, nə vaxtadək füsunkar gözəllərdən əfsanə deyəcəksən?
Üzünü xatırlayıb, nə vaxtadək gecə-gündüz nalə edəcəksən?!

Ey könül, məgər Adəmin hekayətin eşitməmisən?
Üzünün behiştində yenə danəyə meyl edirsən?

Ey könül, əgər şanə kimi diliklənməsən,
Çətin ki, yarın telinə şanə vurasan.

Əgər sinəni bəla oxuna nişanə etməsən,
Cananın kaman qaşlarını çəkə bilməzsən.

Dünya bağının zövqü səfası iki günlükdür,
Ey ürək, məbada bu bağda yuva qurasan!

Cəhan mülkünün əbədiliyi su üstündəki köpük kimidir,
Bu sarayda, Fədai, məbadə ev tikəsən.

## RÜBAİ

Ey qəminin acısı hər şeydən şirin olanım,
Sözlərinin dürrü daim qulağımdadır.
Hərçənd sənin üzün hicab altındadır,
Daim sənin xəyalın mənim ağuşumdadır.

**Vər. 186a**

## SƏ’DİNİN QƏZƏLİNİ TƏXMİS

Ey dost, istəsən ki, iki dünyada məsud olasan,
Minnətdən keç ki, məqsədinə çatasan.
Ağıl sahibləriçün şöhrət təhsinə layiq olmaz,

“Nəfsin şərəfi səxavətdədir, səxavət səcdədir,
Bu iki şeyi olmayan kəsin yoxluğu varlığından yaxşıdır”.

Əqliıı uduzub, heç vaxt nəfs dalınca getmə,
Yeddi iqlimin şahlığı iki arpaya dəyməz.
Aç qulağını, məndən bu nəsihəti eşit:
"Dünyanın nazü-nemətinə qürrələnmə sən,
Ki, bu dünyada əbədi həyat çətindir, çətin”.

Kamal əhli olanlar bu murdar dünyaya mail olmazlar,
Mal-dövlət yoxluğundan qəm-qüssə yeməzlər.
Yoxsulluq fəxrdir, öz yoxsulluğuna ağlama,
“Ey yoxsulluq içrə pərişan olan kəs,
Səbr et ki, iki-üç gün hesablanıb başa gələr”.

Var-dövlət üçün bu dünyanı nə dolanırsan?
Əziz ömrün nə üçün qəflət və təlaşda keçir?
Dünvanın bütün zərrəsini bu sözlər aşkar edər:
“Bir dəm belə keçdiyin torpağın sakini ol,
Çünki gözün, bədənin, üzün və qəddin axırı odur .

Alçaq dünyanın məhəbbəti yandırıcı oddur,
Bu fani dünyanın qəm və şadlığı on günlükdür.
Taleyin üzünə gülsə belə, heç qürrələnmə,
“Bu dünyanı işiqlandıran həmin günəş çeşməsidir ki,
Ad və Səmud tayfalarının yurd-yuvasına da düşərdi”.

Dünyada çox böyüklər, çox şahlar olub,
Fəridun, Cəmşid, Kəyan şahlar kimi.
Hamısı yüz dərd-qəm ilə dünyadan getdi,
“Misir torpağında görməzsən şadlıq-sevinc,
Həman Misir torpağıdır, lakin fironların üstündə”.

Əgər ömrün nə cür keçəcəyini bilsə idin,
Bütün dünyanı bir qara pula almaz idin,
Ey dost, nə həsəd aparırsan özgə malına?
“Dünya ona dəyməz ki, həsəd aparasan ona,
Ey qardaş, nə paxıl qalacaq, nə paxıllıq edilən”.

Yaş və qurudan heç nə müyəssər olmasa əgər,
Öz quru dodağına, yaş gözlərinə qane ol.
Alçaqdan minnət götürmə,başına tac qoysa da,
“Ehtiyac əlin uzatsan, Allaha uzat,
Çünki o səxavətlidir, rəhmlidir, mehribandır".

Ey Fədai, əcəl günü hamının qisməti birdir,
Əgər cahan ilə ülfətin rübab ilə Də’d* kimi olsa,
Ondan mehrini çək ki, ildırım hərarətinə yaxınlığı var,
“Xoşbəxtlik xəzinəsinin açarı olan Sə’di nəsihətinə,
Qulaq versən, ola bilməz ki, xoşbəxt olmayasan”.

**Vər. 187a**

## HAFİZİN QƏZƏLİNİ TƏXMİS

Elə ki, bu insan dünyasına qədəm qoydum,
Gecə-gündüz dilimin əzbəri yar oldu.
Ey şeyx, əbəs yerə məni məscidə göndərmə,
“Açıq deyirəm və dediyimdən dilşadam:
Eşq quluyam, hər iki dünyadan azadam”.

Xoş o dəmlərə ki, mənlə onun arasında ittifaq var idi,
Onun üzü və zülfündən gecə-gündüzüm üfüqlərdə keçirdi.
Pis göz bizim ittifaqımızı nifaq etdi.
“Qüds gülşəninin quşuyam, fərağı necə mən şərh edim ki,
Bu hadisənin toruna mən necə düşmüşəm?”

Xoş o günə ki, sənin kuyin məskənim idi,
Himmət başım uca dərgəhin qapısında idi,
Doqquz qatlı göylər ayağım altında idi,
“Mən mələk idim, cənnət məkanım idi,
Adəm gətirdi abad dünyadan bu xarab dünyayə məni”.

Yaradan öz qələmini tale lövhəsinə qoyandan bəri,
Xəttimi lalə yanaqlı gözəlin qulluğuna vermişəm.
Mən vurğundan başqa heç kəsi ürəyinə gətirmə,
“Çünki ürəyimdə yarın əlif qamətindən qeyri
bir şey yoxdur,
Nə edim ki, ustadım özgə şey öyrətməyibdir”.

Zəmanənin qəmi eyşim üstünə hücum etdi,
Dilü canım tamamən qəm odunda əritdi.
Bu alçaq zəmanə mən dilxəstə ilə bir an da düz gəlmədi,
“Mənim bəxt ulduzumu heç münəccim tanımadı,
Ya Rəb, zəmanə anasından nə bəxtlə doğulmuşam?!”.

* Də’d – gözəlliyi ilə məşhur olan qadının adıdır.

Sənin əfsungər gözlərin eşq əfsanəsi oxuyanda,
Ağlımı itirdim, oldum valeh və eşq dəlisi.
Eşq peymanəsinin nəşəsindən məst və sərxoş oldum,
“Eşq meyxanəsində qulağı sırğalı qul olandan bəri,
Hər dəm təzə bir qəm məni təbrikə gəlir”.

Dünyada sənin hicran dərdinin dəvası yoxdur,
Sənin fərağından cana gəldim, ölüm hardadır?
Sənin eşqin mənə hər nə etsə, rəvadır,
“Göz bəbəyin ürək qanım içsə, rəvadır.
Axı mən nə üçün canana könül vermişəm?”

Ey sərv qamətinə Tuba həsəd aparan,
Fərağından gözlərim iki tuluq dolub,
Fədainin dərdinə heç həkim çarə edə bilməz.
“Saçlarının ucu ilə Hafizin çöhrəsindən göz yaşını sil,
Yoxsa bu kəsilməz seylab əsasımı dağıdar”.

**Vər. 188a**

## QƏZƏL

Mənim ayım günəş üzündə bulud tək olan zülfündür sənin,
Ya da gözəllik şahının hörülmüş çadırlarıdır.

Yarın qırmızı yanağın görəndə qətlimi yəqin etdim,
Çünki günəş üzündəki qırmızılıq qana dəlildir.

Üzünə baxanda gözümdən qanlar axar,
Od üstə, qaydadır, kababın qanı axar.

O gözəlin əlinin allığı hənadan deyil,
Ürəyimə əl atıb, əllərini qana boyayıb.

Fədai, illərlə özünə yaxşı bir ad qazandın,
Eşqin qoca-cavan yanında adını rüsvay etdi.

## YENƏ

Sən əhdini qırdın, mənsə öz əhdimdəyəm hələ,
Özünə tay tapdın, mənsə qəmində tənhayam hələ.

Gecələr məclislər şamı oldun, mən biçarə isə,
Pərvanə təki odlarda yanmaqdayam hələ.

Yarın qəmində hümayun ay və günə çatar,
Rast, şur və nəva ilə aşiqlər nalə edir hələ.

Hicranının zəhri canımı boğazıma yığdı,
Sən isə tiryək gətirmək fikrindəsən hələ.

Fədai kimi kəslər az tapılar ki,
Qəmində ömür dəftərini vərəq-vərəq edə hələ.

## YENƏ

Saçların qaşlarının yanında qıvrılıb,
Qaşların təzə aya tərəf halə çəkibdir.

Yanağın ətrafinda görünən o xətdir və ya,
Nəmrud atəşindən bitən göyərtidir?

Şuxluq və sitəmkarlıq bir qəbadır ki,
Tale dərzisi sənin sərv qəddinə biçibdir.

Ey sərvi-güləndam, sənin üzünün həsrətindən,
Yaralı könlümə yüz cəfa tikanı batıbdır.

Dodağından öpüş almaq istər ikən,
Gözlərin sivrilmiş qılınc tək başımın üstünü alır.

Eşq vadisində ardımca Vamiq və Məcnunlar,
Çox qaçıblarsa da, heç tozuma belə çatmayıblar.

Fədai bir ömürdür ki, sənin zülfünə bağlanıbdır,
Qəhrindən başqa bir şey eşutməyib, cövründən başqa
bir şey görməyib.

## YENƏ

Allah əzəl gündən qəlbimi yoğuranda,
Eşqinin dərdini xəmrimə qatıbdır.

Heyf ki, səninçün mən vəfa toxumu əkmişəm,
Dərdü ələmdən başqa heç nə əldə etməmişəm.

Fəraq dərdinin çarəsini hər kəsdən soruşdum,
Heç kəs çətinliyimi həll edə bilmədi.

Zəmanə qəmi axırda məni dərdə saldı,
Bütün ürək arzularım qəlbimdə qaldı, əfsus!

Qatilim qətlim zamanı təbəssüm etsə əgər,
Mən yazığın qanı halal olsun ona.

Canü dilimi sənin yolunda qurban edərəm,
Əgər, ey dost, mənzilimə qədəm bassan mənim.

Ey Fədai, onun iki saçının küfrünü əldən verməræm,
Əgər yüz min rəhmət ayəsi mənimçün nazil olsa belə.

**Vər. 189b**

## YENƏ

Onun xumar gözlərinin yadı ilə ürəyimdə
qəmim vardır,
Bu dərd ki, mənim vardır, ondan heç
sağalmaq istəmərəm.

Mən onun iti xəncərinin yarasından ölməyə
qorxmuram,
O dərdlə nalə edirəm ki, yaşamaq qorxum vardır.

Onun oxunun yarasından xoşam mən, çünki,
Dua etmək üçün, onun lə'l ağzını yad edərək,
yüz açılmış ağzım var mənim.

## YENƏ

Ürəyimi vurmaq üçün o gözəl müjgan oxun atar,
Onun oxun can arasında şaxlaram.

Təzə-tər xəttü xalının, al yanağının hicrindən,
Lalə kimi ürəyimdə yüz köhnə dağım var mənim.

Hicran gecəsi onun pərişan, qıvrım saçlarını yad edərək,
Dövrəmdə ilan və əqrəblərdən məclisim var mənim.

Ürəyimi, canan, heç çıxardarammı çahi-zənəxdanından?
Tellərini quyudan çıxarmağa mənimsə kəndirim var.

Uzun gecə, qəmzə və gülnar üzündən ayrı,
Yatağım tikandan, köynəyim oddandır mənim.

Fədai, məgər taparammı o gözəlin vüsal xəzinəsini,
Əgər gəzsəm viranə vətəndə divanə kimi?

## YENƏ

Sənin hilal qaşlarına, ay üzünə,
Ay və günəş tay ola bilməz, ay nigar.

Gözəllikdə cənnət hurilərindən üstünsən,
Sən təbiətli gözəl yaradan xaliqə eşq olsun!

Min aşiqi-bidil Musa kimi huşdan getdi,
Görcək gözəl üzünü, hüsnün Tur dağından.

Necə zar-zar ağlamayım, yaralı qəlbim yanır,
Duzlu gülüşlərinsə,ey dost, artırır bu ağrıları.

Bu lətif təbiətinlə naz ilə gəzsən əgər,
Yerdən göyədək sənə nəzər duası oxuyarlar.

Əgər sən saçlarını pərişan etsən,
İki yüz min aşiqin qəlbi sağ-solundan tökülər.

Nəyə lazımdır Fədainin ayağına bənd vurmağın?
Onsuz da tale onun boynunu möhkəm ipinlə bağlayıbdır.

**Vər. 191a**

## YENƏ

Çatılmış qaşlarına oxşadığı üçün, gecə-gündüz,
Mehrabı özümə səcdəgah eyləmişəm.

Yuxuda bəzən üzünü mənə göstərdiyin üçün,
Eşqin həsəddən gözlərimdən yuxumu qaçırdır.

Tale nərdbazı altı tərəfdən üzümə qapını bağlayıb,
Odur ki, mən marsdan çıxa bilmirəm.

Qapının iti mənə ram olmasa, təəccüblü deyil,
Çünki gəda ilə həmnişin olmaq şaha ar gələr.

Məclisinin meyxorları ilə tay-tuş olsam əgər,
Göz yaşımla suyu al qan edərəm mən.

Fədai, əgər aqillər müdrik olsalar,
O pəri yenə aşiqləri divanəliyə çəkər.

**Vər. 191b**

## RÜBAİ

Sənin ayrılıq şərabından həyat camı doludur,
Vüsalının şəhdi şirindirsə də, həyat kamı yoxdur.
Eşqin əqlimi, ürəyimi, səbr və huşumu alıbdır,
Məndə həyatın adından başqa bir şey qalmayıbdır.

* * *

Ey Allah, könül şəhrimi tarac etmə,
Bizi tə'nə oxuna hədəf etmə.
Ya Rəb, əşrəfi-xilqət həqqinə and verirəm,
Bu zəmanə adamlarına məni möhtac etmə.

## QƏZƏL

Məgər görmüş rüxi-adəm fəribin surəti-Mani,
Qılıbdır təkyə divarə, təhəyyürdən çıxıb cani?

Görən dəmdə camali-bimisalın pirəzali-çərx,
Xəcalətdən salıb çahə əlilə mahi-Kən'ani.

Nigara, kakilindən mişki-əzfər buy kəsb etmiş,
Qılıb məhbubi-aləm əksi-lə'lin, rah-reyhani.

Xədəngi-navəki-dilsuzinə dil necə tab etsin?
Dələr fulad cövşən geysə aşiq qəmzə peykani.

Camali-həmçumahindən, büta, bürqə kənar eylə,
Sala təhti-şüayə nuri-ruyin mehri-rəxşani.

Fəramuş olmaya ta etdiyin əhdə vəfa qılmaq,
Edim əngüştinə piçidə qoy bu rişteyi-cani.

Fədai nəzr qılmış xaki-payində verə canın,
Xudavəndi-zəbiüllah qəbul etsin bu qurbani.

**Vər. 192a**

## FƏDAİ KÖNLÜ İLƏ MÜKALİMƏ EDİR

Sübh məşşateyi-nəsimi-bahar,
Eylədi səhni-gülşən üzrə güzar.

Düşdü səthi-gülşənə xara,
Sərvə geydirdi xəl'əti-Xizra.

Türreyi-sünbüli edib mərğul,
Eylədi çeşmi-nərgisi məkhul.

Qoydular susənü güli-suri,
Lalə mərdüməkinə şəm, kafuri.

Gül qabağında xar edib xari,
Qıldı damad bülbüli-zari.

Bülbülə qönçəni ərus etdi,
Rüxi-ali-ərusi bus etdi.

Cəm edib toy büsatını kəmü biş,
Eylədi nazü ğənc ilə sağdiş.

Bülbülə tutiyi-şəkkərşikəni,
Qönçəyə yengə qoşdu yasəməni.

Gülbin Növrəs oldu toybaşı,
Qıldı təklif yarü yoldaşı.

Məclisi-işrəti görüb layiq,
Ələ tar aldı qumriyi-sadiq.

Qıldı qu-qu təranəsin saz,
Dili-üşşaqə saldı suzü qüdaz.

Tutdu xəlvət "Hüseyni" rahi-"Hicaz",
"Şur" ilə doldu "Zabul"ü "Şiraz",

"Rast" etdi "Simayi-şəms"ə "Nəva",
Oldu rəqqas "Zöhreyi-Zəhra".

"Mahur" istimainə "Bəhram",
Eylədi xanəyi-Əsəddə* məqam.

Oldu sabit fələkdə səyyarə,
Yanılıb seyrini, qaldı avarə.

Naleyi-əndəlib, bangi-həzar,
Eylədi xabdan məni bidar.

* Xanəyi-Əsəd (Əsədin evi) dedikdə Bəhram atası Əsəd bəyin evini nəzərdə tutmaqla, həm də Əsəd (Şir) bürcünə işarə edir.

Dil xəyali-vüsali-yar etdi,
Həvəsi-istimai tar etdi.

Olmamış rəf’ dərdü rənci-xumar,
Eylədi meyli-badə digər bar.

Dili-aşüftənin bu rəftarı,
Qıldı azürdədil məni-zarı.

Canıma saldı atəşi-qeyrət,
Dedim, ey bişüurü bihimmət,

Bəs deyilmi məgər bu rüsvalıq,
Zülfü rüx yadı ilə şeydalıq?

Keçdi ömrün tamam tar ilə,
Gah şərabü gəhi qumar ilə.

Xabi-qəflətdən, ey dəni, bir ayıl,
İşini tanı, ziştü qəbhini bil.

Əsldə sən mələkdən əşrəfsən,
Nə işə, söylə, şimdi məsrəfsən?

Elmdən yoxdu zərrəcə xəbərin,
Eybculuqdan özgə yox hünərin.

Var hər elmə səndə iste’dad,
Elm kəsb eylə, sən də qoy bir ad.

Bir bəsirətlə özgə millətə bax,
Gör təəccüblərin, dəyanətə bax.

Cümlə sərmənzili-murada yetib,
Hər biri gör necə bir ada yetib.

Nə qədr millətə verirlər nəf’,
Hər şərü şuri eyləyiblər dəf’.

Sən də, ey bihəyavü binamus,
Eyləyirsən tərəqqiyi-mə’kus.

Ləşkəri-hirs olub sənə qalib,
Mali-dünyaya olubsan talib.

Gecə ta sübh atırsan üstürlab,
Ki, səhərdən kimə qurum dolab.

Qalacaqsan nə vəxtədək nadan,
Vadiyi-qəflət içrə sərgərdan?

Vəqtdir, sən də bir tərənnümə gəl,
Aç dilini, sən də bir təkəllümə gəl.

Ta bekey bu kəsalətü qəflət,
Sən də bir qan təəssübi-millət.

Dili-möhnətkəşidə qıldı itab,
Mənə bu sözlər ilə verdi cavab:

Burda qanı o sahibi-hikmət,
Hikmətü danişə verə qiymət?

Bular icmaən əhli-zövrəqdilər,
Cümlə dəryayi-Azə qərqdilər.

Şahü şahzadə, tacirü bəyü xan,
Qazi, müfti, molla, mərsiyəxan.

Hökmü hakimü həkim təmam,
Müqtədidirlər, anlara pul imam.

Girəm oldun Qürabü Calinus,
Kimdi, göstər, verən bəhainə fülus?

Hər eşşəyin bir-iki atı ola,
Arpavü buğdadən bəratı ola.

Şəhrdə əvvəlinci adəmdir,
Qüssü Boqratdən müəzzəmdir.

Olsa hər kəsdə bir neçə qali,
Özünün olsa bir neçə şali.

Qəltəbandır və ya ki, məbundur,
Olsa hər fe'li-zişti, məzundur.

Gərdəni-hakimə rəsən salacaq,
Hər nə mənsəb tələb qıla, olacaq.

Tapacaq günbəgün tərəqqi işi,
Kimdi təhlil edən ki, boşdu başi?

Olsa əskik, xudanəkərdə, işin,
Edəcək ar qövmü qardaşin.

Səndən ər bilmək istəyib əhval,
Əmin oğlundan etsə biri sual.

Ki, filanın sənə nə nisbəti var?
Deyəcək, cüz'inə qərabəti var.

Gər xudaxastə, işin ola saz,
Ola dünya maaşı səndə bir az.

Yadü biganə cümlə xiş olacaq.
Sənə sidqilə xeyrkiş olacaq.

Qoyulub əmrinə səri-təslim,
Görsə hər kimsə edəcək təkrim.

Olsa səndə təəssübi-millət,
Edəcək hər görən sənə töhmət.

Deyəcək məclis içrə hər hasid,
Ki, olubdur əqidəsi fasid.

Ey Fədai, belə cəmaət ilə,
Belə məxluqi-bidəyanət ilə.

Olmasın mütləqa müvanisətin,
Gəlməz onlara xoş məcalisətin.

Dutub aram künci-üzlətdə,
Keçir ömrün tamam vəhdətdə.

**Vər. 196b**

## MİRZƏ ƏLƏSGƏR NÖVRƏS

**Rəbiül-əvvəl, 1309 (oktyabr, 1881)**

**Cənab Mirzə Ələsgər Növrəs mərhum Kərbəlayi Abdin bəy Zərgərin oğludur. Zərgər Qarabağda tayfa adıdır. Lakin o, Şuşada anadan olub. Yaxşı, xoşrəftar, hər kəsin yerini bilən, hər işə yarayan şəxsdir. Fars və rus dillərinə bələddir.Yaşı bu təzkirəni yazan vaxt, təxminən əlli beş olar. Yaxşı xasiyyəti var. Şeirləri min beytə yaxındır. Çox vaxt farsca və türkcə şeirlər deyir. Şeirləri mürəbbe, müstəzad, qafiyə, təcnis, qəzəldən ibarətdir. Cənab Seyyid əş-Şühəda əleyhissəlamın təziyəsində növhə, pişvaqiə, mərsiyə söyləmişdir. Təxəllüsü Növrəsdir. Aşağıdakı şeirlər onun xəyalatındandır ki, öz dəsti-xətti ilə yazılıb.**

### QƏZƏL

Ta qaldı könül zülfi-şikən pürşikən içrə,
Asudəlik olmuş o qəribə vətən içrə.

Ol xali-siyəh arizə guya ki, düşübdür,
Bir daneyi-ənqur şərabi-kühən içrə.

Naz ilə əzəl şir verən dəm sənə dayə,
Məmzuc qılıb mayeyi-nazi ləbən içrə.

Abi-dəhənin şərbəti-şirindimi, yoxsa,
Məxlut olub qəndi-mükərrər süxən içrə?

Xaki-səri-kuyindi mənə türbəti-xalis,
Qoynumda onu qəbrə aparram kəfən içrə.

Bilməm nə xəta eylədim, ey dilbəri-tənnaz,
Səhhar gözün saldı məni məkrü fən içrə.

Ta silsileyi-zülfdə qaldı dili-Növrəs,
Məşhur idi divanəliyi mərdü zən içrə.

* * *

Bahar fəsli yetib, mövsümi-səfa görünür,
Məzaq əhlinə bir özgə macəra görünür.

Həqiqət əhli üçün ən’əmüs-səba görünür,
Məcaz fırqəsinə əzləmü məsa görünür.

Bənövşə, qasidi-ordubehişt verdi pəyam,
Ki, ləşkəri-dey üçün rənci-ibtila görünür.

Bahar vəsli üçün əbri-bəhmən gözdən,
Sirişk cari edib, rihləti-şita görünür.

Həyat tapdı nəbatat ziri-qübradə,
Dəmi-nəsim dəmadəm Məsihasa görünür.

Kəmuni-qaldə qalmışdi şestər kimi,
Tapıbdı təsviyə, iksiri-kimiya görünür.

Bu xaki-ab ilə bad, bu neyyəri-ə’zəm,
Çahar ünsüri-əbdanə rəhnüma görünür.

Səhihdir ki, təvəllü fəssəm vəchillah,
Baxanda hər tərəfə, vəchi-kibriya görünür.

Hicaz qəntərəsi teyli-qətli-həqiqətlə,
Baxın ki, fər’i-ədəm əsl masəva görünür.

Təriqi-mərifət həqqi eyləsən təhqiq,
Rümuzi-kənzi-nihani sənə məla görünür.

Bəsirət əhli gər olsa bu sirrdən vaqif,
Məayinə ona bu eyni-müddəa görünür.

Keçib bu mərhələdən, qıl həzar istiğfar,
Nə ibtida ona, ey dil, nə intəha görünür.

Bu sirrə silsileyi-ənbiya deyil məhrəm,
Məqam onlara təslim, həm riza görünür.

Kıtabi-hikməti, ey dil, kənar qoygilsin,
Vərəq-vərəq gül açıb, rövzətüs-səfa görünür.

Olubdu sərv ələmdari-ləşkəri-gülşən,
Ki, sərvi-sərkeş üçün payeyi-ə’la görünür.

Çəməndə sübhü məsa əndəlibi-şuridə,
Gəlibdi şurü nəvayə o binəva, görünür.

Ələlxüsus bu mövsümdə, ey dili-qafil,
Baxanda hər yana bir şuxi-dilrüba görünür.

Pəri məqamı olubdur bu şəhri-Şişə məgər,
Ki, eşq əhlinə təsviri-bərməla görünür?!

Çəkibdi hər birisi zülfə telbətel şanə,
O vəchdəndi ki, Növrəs günü qara görünür.

## YENƏ

Tutub məskən könül ol türreyi-tərrar arasında,
Vətən aqil olan kimsə tutarmı mar arasında?!

Könül mürğini seyd etmiş iki çeşmi-siyəhməstin,
Budur vəhmim: Düşə qanlar iki xummar arasında.

Siyəh zülfün necə saziş edir, bilməm, üzarında,
Təəccübdür ki, əf'i mənzil etmiş nar arasında.

Könül cəmiyyəti zülfün içində tarmar olmuş,
Belə aşüftəlik ol şanədəndir tar arasında.

Ruxü zülfün xəyalilə gecə ta sübhədək Növrəs
Əsiri-bəndi-zindandır, qalıb küffar arasında.

## YENƏ

Dili-bimardən, ya rəb, nə istər, çəkməz əl gözlər?
Mənə əl eyləyir sərçeşmeyi-məkri hiyəl gözlər.

Dəxi təkrar qılma, saqiya, gəl badə övsafın,
Ki, sərməstü xumar etmiş məni ruzi-əzəl gözlər.

Salıbdır mərdüm afaqi hər dəm məkrü təzvirə,
Xətadən xoş olmaz qaraqəlb, bədəməl gözlər.

Mənim varım tək. ey mehri-fələk, gər var isə, gözlər,
Gözəl xalın, gözəl zülfün, gözəl qaşın, gözəl gözlər!

Yıxıbdır fitnəsi yüz min könül bünyadını axır,
Həzər qıl, verməsin dil mülkünə, Növrəs, xələl gözlər.

## YENƏ

Hədisi-zülf olur izhar gahi rast, gali kəc,
Yüz il şərhində var güftar, gahi rast, gahi kəc.

O məhrüxsarın üzrə, ey büti-ziba, nədir vəchi,
Dolanır zülf əqrəbvar, gahi rast, gahi kəc.

Dili-divanə bixud vəcdi-hal eylər, məgər zülfün
Nəsimi-sübhdən oynar, gahi rast, gahi kəc.

Binayi-tərhi-mehrabi qədi-əbrudən öyrənmiş,
Onu təmir edər memar, gahi rast, gahi kəc.

Mətai-pirəzal oldu, əzizan, Yusifi-Kənan,
Olurmuş rövnəqi-bazar gahi rast, gahi kəc.

Həzər qıl lalərüxlərdən dəmadəm, Növrəsi-miskin,
Dili-sədparəni dağlar, gahi rast, gahi kəc.

## YENƏ

Gəl, ey olan dili-bimarıma təbib, ölürəm,
Vüsali-bəzmi mənə olmayan nəsib, ölürəm.

Cəmal ayinəsin dutgilən nəfəs sarı,
Ki, gör nə halilə hicrində bişəkib, ölürəm.

Xiyali-zülfün ilə cismi-natəvan əyirib,
Məriz edibdi məni çeşmi-dilfərib, ölürəm.

Gözüm önündə bu halımda bir qiyam eylə,
Ki, ruzi-məhşər ola bəlkə ənqərib, ölürəm.

Mənə əgərçi vətən şəhri-Şişədir, cana,
Vəli nə faidə, bu şəhrdə qərib, ölürəm.

Nə qəmküsar, nə yar, nə bir vəfalı nigar,
Nə bir ənis, nə munis, nə bir həbib, ölürəm.

Bu Növrəsin rəhi-eşqində, bilmədin qədrin,
Get, indi zövqü səfa eyləsin rəqib, ölürəm.

## TƏCNİS

Açılmış çəməndə gülü yasəmən,
Açılmaz könül, batmışam yasə mən.

Tutub, saqi, qəm ləşkəri meymənə,
Xilas eylə qəmdən, yetir mey mənə.

Səfufi-ələm tutsa gər meysərə,
Nə qəm ursa bu nəş’eyi-mey sərə.

Verib könlü, zar etməyə bari-ğəm,
Əlif qamətim xəm qılıb bari-ğəm.

Özü şuxi-sərməst cananədir,
Həmişə fəda cismü can anədir.

Qara zülfü məmzuc olub müşk ilə,
Salıb könlümü gör neçə müşkilə.

Tutub yüzdə zülfi-ənbər tər kimi,
Sərasər qılıbdır mənim tərkimi.

Siyəh zülfdən müşki-tər iyləmək,
Könül zəxminin çarəsin eyləmək.

Ayaqdan salıbdır ilahım məni,
Qutarsın bu qəmdən ilahim məni.

Vəfalı ola dəhrdə yar odu,
Nə ki, yandıra Növrəsi, yar odu.

## QƏZƏL

Ta ki, mən yadi-səri-zülfi-pərişan etdim,
Bu təriq ilə könül mülkünü viran etdim.

Dili-məcruhda çün qəmzə xədəngin qaldı,
Yadigarındı deyib, sinədə pünhan etdim.

Verib imanımı tərsabeçələr eşqində,
Özümü axırı həmməzhəbi-Sən’an etdim.

Yetmədi zülf hədisi, nə qılım, payanə,
Lövhi-sinəmdə onun şərhini ünvan etdim.

Bəhri-vəslində gözüm yaşını dürr etmişdim,
İndi hicranda onu şəddeyi-mərcan etdim.

Qədri-gənci-dili-viranəmizi bilmədi, heyf,
Bir gədazadəni gənc üstə nigəhban etdim.

Bəs ki, əfzundu səri-zülfdə dil sövdası,
Aradan ari olub çaki-giriban etdim.

Rahi-eşqində sənin Növrəsi-biçarə kimi,
Hansı aşiqdi deyən: Tərki-sərü can etdim?

## YENƏ

Səfalər könlümə lə'lin kimi gülbərgü tər verməz,
Deyən kimdir, söylə, şəhdi-ləbin təm'i-şəkər verməz?!

Əbiri-mişk kəsbi-taciri-eşqə münafedir,
Anınçün könlümə sərmayeyi-zülfün zərər verməz.

Qəmi-hicran könüldə, dostlar, bir qayətə yetmiş,
Səri-kudə rəqibə əşki-çeşmim rəhgüzər verməz.

Səfa bəzmində sən tə'siri-meydən tündxu olma,
Gözüm, Fərhad üçün Şirin cavabi-təlxtər verməz.

Qəriqi-bəhri-eşq olsa, muradi-dil olur hasil,
Məgər qəvvasi-eşqə eşq dəryası gühər verməz?!

Vəfa əhlin unutma, talibi-cövrü cəfa olma,
Sənə bu bivəfalıq rəsmi axırda səmər verməz.

Dili-divanə hansı dilbərin zülfündə bənd olmuş,
Kim, ondan Növrəsə badi-səhər hərgiz xəbər verməz?

## YENƏ

Könül ta xu tutubdur eşqin ilə, qeyrə ram olmaz,
Yetib həddi-kəmalə, nəqs bulmaz, natəmam olmaz.

Qədəm qoyduqca eşq içrə muradi-dil olur hasil,
Təriqi-eşqdə kimdir deyən: Hər kamə kam olmaz?

Mənəm kim, sümmi-vəchüllah şövqilə fəna buldum,
Sənə, zahid, ki, xudbinsən, fənafillah məqam olmaz.

Olub könlüm mübərra aləmi-mə’nidə kəsrətdən,
Meyi-vəhdət gətir, saqi, o bir meydir, həram olmaz.

Qəriqi-bəhri-eşq ol, nəfs əlində qalma avarə,
Kim, ol bədgövhərin mizani-hökmündə nizam olmaz.

Təmənna qılmayan sə’yi-dil ilə Kə’bəyi-kuyin,
Səfayi-əmr görməz, xürrəmü xoşdil müdam olmaz.

Qılıbdır cəzbeyi-eşqi məni min küfr ilə rüsva,
Bəli, məczub olan adəmdə, Növrəs, nəngü nam olmaz.

## YENƏ

Çıxmaz, nə olubdur, yenə dildar içəridən,
Qılmaz günəşasa üzün izhar içəridən.

Labənd olalı zülfi-siyəhdə dili-zarım,
Ney kimi nəvayə gəlib, ağlar içəridən.

Şövqi-güli-rüxsarın, əya, dilbəri-sərməst,
Lalə kimi bu sinəmi dağlar içəridən.

Hicrin məni bir halə salıb, şöləvər oldu,
Rəhm eylə, bu sinəmdəki odlar içəridən.

Bəsdir mənə hicran ələmi, görmə rəva kim,
Ahi-dili-Növrəs ola təkrar içəridən.

## YENƏ

Pərişanlıq olub şə’ni-könlümə zülfi-pərişandən,
Görüm həşrə kimi tarı onu ayırmasın andən.

Dedim: Qafil könül tutdu vətən içrə, hörmət qıl,
Dedi: Nifrət edər hər kəs ola naxandə, mehmandən.

Gözün mərdümləri yüz qan edib, xof etmə məhşərdən,
Keçər bu hüsnilə görsə səni qan sahibi qandən.

Bu adətdir, məhəbbət eyləyir mehri giyahəfzun.
Qubaraludə olmaz xatirim ol xətti-reyhandən.

Mənə tən eylədin, zahid, ki, düşmə eşqi-Leylayə,
Çəkər Məcnun nəsihət birlə əl kuhü biyabandən?

Alar imanını əldən onu kafər qılan tərsa,
Çək, ey zahid, məlamət dəstini daməni-Sən’andən.

Ciyər qan oldu lə’li-şəkkərin arzusunda,
Besani-ney könül fariğ deyil hər ləhzə əfğandən.

Bilən zövqi-vüsalın axtarırmı hurü qılmani?
Görən mehri-camalın dəm urarmı mahi-tabandən?

Xəyali-atəşin ruyinlə, ey şəm’i-şəbistanım,
Ciyər dağ etməyi dil öyrənibdir şəm’i-suzandən.

Qədim xəm, ruzigarım tirəvü könlüm pərişandır,
Gəl, əl çək, ey könül, əbruyü zülfü xətti-xubandən.

Ləbi-lə’lindən ayrı, ey gözüm nuri, deyil hasil,
Dili-bimarıma hərgiz səfa yaqutü mərcandən.

Səbur ol, Növrəsa, gər yar olub həmbəzm əğyarə,
Olur məhrum əğyarım vəfayi-əhdi-canandən.

**Vər. 202a**

### YENƏ

Ya Rəb, bu mahtəl’ətə mehri-nigar ver,
Bir dilbəri-sitəmkeş, sərkəş şüar ver.

Olsun məqami könlümə zülmətsərayi-zülf,
Aşüftəhal elə, siyah ruzigar ver.

Fikrü xəyali-çeşmi-xumar ilə məst qıl,
Bimarü xəstədil elə, cismi-fikar ver.

Tari, həmişə seyd ola qeydi-fırqətə,
Kuyi-vüsalə dideyi-pürintizar ver.

Bidar ola kəşakəşi-eşq içrə hər gecə,
Ta sübh olunca çeşmi-kəvakibşümar ver.

Ta inki hicrdə görə Növrəs nələr çəkir,
Ya Rəb, dərdi-eşqi ona paydar ver.

**Vər. 203**

## NÖVRƏS

### (Qəzəl )

Zülfə bağlı olan könlün gecə olar,
Mənim sınıq könlüm zülf dəstəsinin arzusundadır.

Heç zaman Əqrəb bürcü Sünbülədə ola bilməz,
Cəmali-Günəşçün xoşbəxtlik dəmidir...

Hörümçək kimi dilbərin saçının toruna düşdüm,
Xoş o könlün halına ki, daimə zülfə bağlıdır.

Zülfün o xumar gözlər üstə düşən dəmdə,
Biçarə xəstənin qəlbi qızdırmadan necə xilas olar?

Zülfünün təsviri mənimçün sərməşq olub,
Növrəsin sinəsində zülfün xətti şikəstə olub.

## YENƏ

Min əsrdir ana dünya sən kimisin doğmayıb,
Sanki sənin palçığın nurdan yoğrulub.

Sən hüsnü lətafətdə nə qədər zənginsən!
Çünki üzün dünyada min Zöhrəyə nur verir.

Sən elə gözəlsən ki, Çin gözəli sənə qibtə aparır,
Sənin camalına “Çin surətinin qibtəsi” deyərlər.

Ey miskin ürək, onun zülfündən təvəssül – vəsilə axtarma,
əlini çəkmə!
Çünki onun qara saçı ən möhkəm kəndirdir.

Sənin dodağın şirinlikdə şəkərdən də üstündür,
O şəkərli dodaqlardan acı cavab yaramaz.

Ey ürək, baxmayaraq ki, qara saçın zülmətində əsirsən,
Lakin bundan yaxşı rahat yer yoxdur.

Mən cənnət bağını arzu edənlərdən deyiləm,
Ey Növrəs, dostun kuyi səninçün behiştdir.

**YENƏ**

Qaranlıq gecələr könül öz aşiqanə ahından,
Öz çırağını əcəb çıraqban etdi.

Könlüm quşu sənin eşqinin həvəsilə,
Saçlarını tor, xalını dən etdi özünə.

Mütrüblərin şadlıq eyşi nəyə yarayar?
Könül öz təranəsindən vəcdə, hala gələr.

Əzəl gündən eşq dəryasında qərq olmuşam,
Öz yeganə gövhərimdən bir əsər tapmadım.

Zahidlər qaşlarının mehrabına,
Gecə-gündüz beş dəfə səcdə edərlər.

Ey gözəllik ölkəsinin padşahı, sənin hicrində,
Göz öz xəzinəsindən dürr nisar edər.

Ey Növrəs, əgər uzun ömür sürmək istəyirsənsə,
Qara saçların tərifini özünə əfsanə et!

**YENƏ**

Elə ki, oğrun saçların aşiqi olduq,
Birdəfəlik qeyd – bağlılıq qəminə giriftar olduq.

Bir müddətdir ki, üzün şövqü – həvəsi qəlbimizdədir,
Zülfün zülmət gecəsinə giriftar olduq.

Çoxdandır eyş bizə üz göstərmir,
Çünki zülfünü yad etməklə çox yasda olmuşuq.

Bir cüt qaşlarının ibadəti yada düşəndə,
Gah ayağa dururam, gah otururam yerə.

Əhli-dilin qibləgahı, o Kə'bədə biz,
Pərgar xətti tək dairədə düz dayanmışıq.

Üzün işığı qarşımızda cilvələnəndən,
O işıqdan hamımız nurlara qərq olmuşuq.

Ağzın sirrindən bir söz demədik, amma,
Dodağın müəmmasından sirlər xəzinəsi olmuşuq.

Növrəs, bundan belə bu fəxrü qürur kifayətdir ki,
Bu dostlar məclisinə biz daxil olmuşuq.

**YENƏ**

Eşqinin şuru qəlbimi yandırır,
Doğrusu, bu nəvalardan ürəyim fəxr edir indi.

Zahidlər yar qaşının qibləsindən ayrı düşüblər,
Əcəb işdir, həqiqət yolunu məcazi bilirlər indi.

Xilas yolu hardadır? Ürəyim qəm-qüssə içində,
Hicaz nəvası ilə zar-zar ağlayır indi.

Bu qana dönmüş ürəyim nə üçün ney təki ağlamasın,
Həqiqi dosta bax ki, düşmənə nəvaziş edir indi.

Onun üzü ətrafında saçını görəndə dedim:
Sanki Əqrəb yaxınlaşıb, Günəşlə oynayır indi.

Sən bilmirsən ki, qaranlıq gecədə yar kuyinin ətrafında,
Ürəyim köksümdə sənin qəmin ilə razi-nivaz edir indi.

Nəsirəddin şah, Növrəs, çox yaxşı deyibdir:
Harada olursa-olsun, məhəbbət işə yarayar.

**YENƏ**

Ey sərv boylu cavan, bəh, nə gözəl yerişin var,
O qəddü qamətdə qiyamət qoparıb gedirsən.

Ey canü dilim fəda olduğu gözəl qamətlim,
Özünlə canlar aparırsan, sanma ki, tənha gedirsən.

Elə ki qara torpaq üstündə yeriyirsən,
Hamı deyir ki, ay Allah, torpaq olaydım.

Bilmirsən ki, məstedici, qara xumar gözlərinlə,
El arasında nə qovğalar salıb, gedirsən.

Küfr volu ilə müsəlman dininə rəxnə vurub,
Ey tərsa gözəli, daim kilsəyə sarı gedirsən.

Ey dilaram, könüldən aramımı aldın, ahəstə get,
Yoxsa qəlbində təmənna varındır, gedirsən?

Sərv boyunun kölgəsi Növrəsin qara bəxtidir,
Qiyamətədək arxanca gedəcək, hər hara getsən.

## QƏZƏL

Saqi, gətir sağərü peymanəni.
Zahidə baxma, deyir əfsanəni.

Tarı üçün, ey büti-siminbədən,
Urma o zülfi-siyəhə şanəni.

Sən kimi tərsabeçənin aşiqi,
Axtarırmı Kə'bədə butxanəni?

Yusif əgər görsə xiridar olur,
Sən kimi bir gövhəri-dürdanəni.

Yadına sal, ey büti-şirinzəban,
Dəhrdə bu Növrəsi-divanəni.

* * *

Şahidü şəm'i-şəbü yarü meyim var mənim,
Həşməti-qeysərü Cəmşidü Keyim var mənim.

Zahida, künci-xərabat mənə məskəndir,
Məscidü mədrəsədə, söylə, nəyim var mənim?

Qəmü möhnət tükənib, şadlıq əyyamı yetib,
Şükr kim, taleyi-fərxəndəpeyim var mənim.

Vəslinə yetdi könül, çəkmiş idi hicr ələmin,
Dərdi-dil, mən sənə, ey dost, deyim, var mənim.

Naz oxun atdı, dəyib cismimə, gör, xud ötdü,
Cismə can vermədi, ondan gileyim var mənim.

Tən sənin, ruh sənin, cism sənin, can sənin,
Dinü iman sənin, bəs nə şeyim var mənim?

Növrəs düşəli eşq oduna zahirdir,
Bənd-bəndimdə nəva, türfə neyim var mənim.

## MİRZƏ MÜŞTAQA CAVAB

Zahida, mayili-bir sibbuxağam, sənə nə?
Aşiqi-sərvqədü lə'ldodağam, sənə nə?

Məscidü minbərü mehrab sənin peyvəstə,
Yadi-əbru ilə mən taqəti-tağam, sənə nə?

Və'z birlə məni öz yanına təklif eləmə,
Olma azürdə, gözüm, səndən irağam, sənə nə?

Elmi-cəhl ilə məni xofə salıb allatma,
Dəhri, cəbriyi və ya özgə səyağam, sənə nə?

Buriya fərşini sal, böylə riyadən nə gəlir?
Baxmazam sözlərinə, sanki ulağam, sənə nə?

Dərdi-sər verməgilən, bəsdi mənə rənci-xumar,
Künci-meyxanədə bir ləhzə qonağam, sənə nə?

Şövqi-müştaqı yəqin tərk eləməz Növrəsi-zar,
Mən də Müştaq kimi məst uşağam, sənə nə

## YENƏ

Xəttindir gül camalın içrə nuki-xardən nazik,
Ləbindir zahirən bərgi-gülzardən nazik.

O gündən kim, könül verdim səri-zülfi-siyəhfamə,
Olubdur rişteyi-can tari-zülfi-yardən nazik.

Uzun tellər verib bərbadə ömrün, qılmayıb peyda,
Xəyal əhli xəyali-türreyi-tərrardən nazik.

Dəhani-hər var-yoxluq rəmzini hər xürdədan bilməz,
Ləbin əsrarıdır ləfzi-gühərbardən nazik.

Gözün bimarıyam, sındırma könlüm, ey gözüm nuru,
Zibəs ki, hiç dil olmaz dili-bimardən nazik.

Görübdür nazəninlər nazını çox Növrəsi-miskin,
Və leykən görməyibdir işveyi-dildardən nazik.

***1309 (1891-92)***

## MİRZƏ ƏLƏSGƏR NÖVRƏSİN VƏFATI

### 6 Ramazan, 1330 (19 avqust, 1912)*

Əfsus, dünyaya yeni gəlmiş Növrəsi-zar,
Bu alçaq dünyadan tez oldu bezar.

76 yaşında cahanı tərk etdi,
Aman qəddar dünyanın möhnətindən!

Ölüm tarixi 1330 oldu,
Əcəl saqisindən xumar oldu.

Ey Növrəs, nə vaxtadək gülün nazını çəkəcəksən,
Ki, “dey” (qış) ayı gəldi, ayıq ol?!

* Şeir təzkirəyə Növrəs vəfat etdikdən sonra əlavə edilib.

**Vər. 206b**

## MİRZƏ HƏSƏN ƏLİ YÜZBAŞI OĞLU

**Rəbiül-əvvəl, 1309 (oktyabr, 1891)**

**Cənab sərkar Mirzə Həsən mərhum Əli Yüzbaşı oğlu Qarabağın Şuşa şəhərindəndir. "Məclisi-üns"ün üzvlərindən biridir. Eybsiz bir şəxsdir. Yaşı əlli altıya yaxın olar. Mən onun üçün "Kaşifi" ləqəbini seçdim. Lakin ləqəbi Bərğidir. Şeirlərini (isə) Həsən adıyla yazır. Sənəti tacirlikdir. Çox vaxt "Məclisi-üns"də həm azərbaycanca, həm də farsca şeirlər oxuyur. Yaxşı məsnəvi deyir. Bir il bundan əvvəl mən "Məclisi-üns"ün üzvlərilə, onunla sual-cavab etmişəm. İnşallah, sağlıq olsun, bu kitabın axırında yazacağam və onun məsnəviləri orada göstərilir. Aşağıda qeyd olunmuş şeirlərini Ağa Mirzə Həsən öz dəst-xətti ilə yazıbdır.***

## MİRZƏ HƏSƏN ƏLİ YÜZBAŞI OĞLU

Divanə könlümü tari zülfünə aşina etdim,
Özümü aləmdə əcəb rüsvaylığa mübtəla etdim.

Qara, məst gözlərini görəndə özümdən getdim,
Səni ahuya oxşatdım, bağışla, xəta etdim.

Hüsnü rüxsarını gördükdə varlığıma vida etdim,
Hüsnü  ruyin yolunda canü dilimi tamam fəda etdim.

Elə ki, eşq piyaləndən mehrü vəfa meyi nuş etdim,
Ey gözəl, könlümdən iki aləmin mehrini cüda etdim.

Sənin rəna qamətinlə uca sərv yaddan çıxdı,
Qaşlarını yad etməklə, öz qamətimi iki qat etdim.

Heç vaxt gül üzündən cana vəfa iyi gəlməz,
Səhv etdim, səndən vəfa təmənna etdim.

Saçlara könül verəndən bəri bəxtim qara oldu,
Onun hər telini ayaqlarıma rüsvayçılıq zənciri etdim.

Nigara, sənin eşqin yolunda ürəkdən can verdim,
Şükr Allaha ki, can verməkdə öz əhdimə vəfa etdim.

---

* Nəvvab sonradan Mirzə Həsənin 1322-ci ildə (1904-05) vəfat etdiyini haşiyədə qeyd etmişdir.

Mənim gizlətdiyim eşqi sənin hüsnün aşkar etdi.
Mehrindən necə avrıla bilərəm ki, onu canla tanış etdim?

Həsən, əgərçi ayüzlülərin eşqində canü dil qoydum,
Lakin bu sevdada özümü aləmdə ucuz etdim.

## YENƏ

Əgər ürək naləni göylərə qaldırsa,
Qorxuram ki, xalqı odla tanış edə.

Əgər fələkdən nalə etsəm, eyib deyildir,
Çünki hər dəm məni başqa əzabla tanış edir.

O sənəm ki, hər ləhzə bizə sarı baxır,
Qəlbimi yüz bəla odu ilə tanış edir.

Sənin al dodaqlarını yad etməklə ayrılıq günü,
Ürək qanım ağlayaraq, gözlərimlə tanış olur.

Gecə sübhədək ürək yanğısı ilə nalə edirəm,
Hanı o bəxt ki, naləni təsirli edir?

Fələyin tufanından çox gileyim var,
Ki, könlümü qəm-qüssə ilə doldurur.

Yarım özünü mənə göstərdikdə,
Gözümdə böyük qiyamət əyan oldu.

Şirin dodaqlı ləblərinə işarə etsə,
Dünvanı bir anda şəkkərlə doldurar.

Hər gecə Həsən o nigarın saçını yad etməklə,
Səhərlər fəryadü nalə edir.

## YENƏ

Ey nigar, məst gözlərin fitnə ilə doludur, ağlaram,
O fitnələrdən qəlbim daim sıxılır, ağlaram.

Səhər fəqanların nə vaxt qəlbinə təsir edəcək,
Ki, həmişə o ay mənimlə vuruşur, ağlaram?

O daşqəlbli sevgili məhəbbətimdən qəzəblənibdir,
Eşqimdən murad almağı ar bilir, ağlaram.

Xəncər qaşlarından canımda çox yaralar var, ağlaram,
Hicrində könlüm nalə ilə həmahəngdir, ağlaram.

Mənim ayım surətdə məhi-Kən’ana oxşar, deyirəm,
Mənim qəmim Yəqubun qəminə oxşar, ağlaram.

Ürək eşq qəmindən yaman çırpınmaqdadır,
Bədən saçın hər telindən çəng tək nalə edər, ağlaram.

Fələk həmişə mənim muradım əksinə dövr etməkdədir,
Odur ki, könül güzgüsü onunla daima pas atmaqdadır, ağlaram

Həsən daim gözlərindən kuyinə ürək qanı səpməkdədir,
Onun göz yaşlarından o kuyin torpağı al rəngdədir, ağlaram.

**YENƏ**

Ey gözəllik sərvnazı, ey novbəhar  gülüm mənim,
Ey aramsız könlümün şadlıq mayası mənim.

Ayrılıq möhnətindən getdi bada hər şey:
Tabü-təvanım, taqətü səbrü qərarım mənim.

İxtiyarsız ahü naləmə bir dəm belə,
İnayət gözü ilə baxdınmı heç mənə?

Bir müddətdir həsrət gözüm yolundadır,
Həddən ötdü intizarım, ey yarım mənim.

Gecə səhərədək könül naləm göylərə çatar,
Ahü zarım sənə çatmır, ey sənəm!

Qaranlıq gecələr qəlb təsəllim zülfünü yad etdi,
Gündüzüm həmişə nalə oldu, ey qəmküsarım!

Əgər yolun qəbrim üstə düşsə, inan ki,
Məhəbbət otu baş qaldırar məzarımdan mənim.

Üzünün gülşəni olmasa, ey gülzarım mənim,
Hər çəməndə necə qərar tutar Həsənin?

## YENƏ

Sənin eşqindəyəm, qəza qol-qanadımı bağlayıb,
Xəbərsiz könlümü bəla toruna salıb.

Günəş camalının şöləsindən atılan yüz qəm oxu,
Sənə baxmağa mane olmağa həmişə hazır olubdur.

Sənin eşqinin atəşindən canıma od düşüb,
O şölədən həm qurum, həm yaşım alovlanıb.

Ləbi-lə'lini yad etməklə daim cigər qanım,
Gözlərimdən axaraq üzümdə qətrələnib.

Badi-səbadan başqa mənə bir məhrəm olan yoxdur,
Ki, sənə ərzi-halımdan bir xəbər verə, ey nigar!

Qəddi-rə'nan ilə, sən Allah, naz ilə get, ey nigar!
Ta ki, başımı yüz şövq ilə ayağına qoyum.

Gecə sübhədək Həsən çox nalə edər,
Ya rəb, səhər ahlarımın təsiri nə vaxt olacaq?

## YENƏ

O nazənində olan qamət hansı sərvdə vardır?
O ay üzlüdə olan surət hansı ayda vardır?!

Onun şirin sözləri mənə candan da şirindir,
Məgər o şəkər sözlünün dilində bal vardır?!

Dəhanı can bağışlamaqda İsanın nitqinə oxşar,
Ovcunun içində Musanın ağ əli vardır.

Onun məst gözlərinə qurban olum ki, hər baxışında,
Könül ovlamaq üçün torunda minlərlə müjgan oxu vardır.

Onun gözəl, gülnar üzü olan yerdə gülşənə
meyl etmərəm,
Mənim gözəlimdə həm gül, həm sünbül, həm
yasəmən vardır.

Cənnət xəzinəsinin xəzinədarı, niyə burursan zülflərini?
Hər kim kafərə aman versə, adət əksinə olar.

O zalım gözəlin cəfasından necə asudə olum,
Ki, həmişə sehrbaz və cadugər gözləri vardır?

İstər ki, dilü canı qamətinə qurban etsin,
Həsənin də ürəyində, ey ay, həmin arzu vardır.

## YENƏ

Əfsus ki, vəfa diyarında heç kəs qalmadı,
Məndə də dünya işrətinə həvəs qalmadı.

Bu dünyadan mənim dostlarımın hamısı getdi,
Əfsus ki, bu zəmanədə bir həmnəfəs də qalmadı.

Ey könül, nə vaxtadək yatacaqsan, karvan getdi,
Ayıl ki, artıq karvan zənginin səsi qalmadı.

Zəmanə adamlarının töhmət və hay-küylərindən,
Könül quşu uçdu, qəfəs küncündə qalmadı.

Qəm alovundan tənü cana od-alov düşdü,
Başdan-başa qəlb xırmanı yandı, çör-çöp də qalmadı.

Alçaq zəmanənin cövrü cəfasından ürəyim qan oldu,
Fəryad bu zülmdən ki, dadıma çatan qalmadı.

Bu alçaq zəmanə hadisələrinin tufanından,
Mehrü vəfa bağından bir ağac belə qalmadı.

Ey Həsən, əcələ müştaqəm, çünki artıq,
Dünyada səbrə taqətim, qəmə qüvvəm qalmadı.

## YENƏ

Ey nigar, elə ki qara zülfünün hədisin bəyan etdim,
O səbəbdən bu aləmdə çox bəlalarım əyan oldu.

Sənin hicran dərdinin hücumundan qəm küncünə düşdüm,
Möhnət və qəm hasarını özümə sığınacaq etdim.

Elə ki eşq atəşinin yanğısı canıma düşdü,
Qana dönmüş könlümü daim ona sahib etdim.

Sənin gül üzünün ayrılığı günlərində,
Xar olaraq, çəmən quşlarını öz naləmlə həmzəban etdim.

Hicranında gecələr sübhədək nə qədər ahü fəqan etdimsə,
Ey daşqəlbli, fəryadım sənə heç təsir etmədi.

Vəfadarlıqda üzün mehrini nəğd canımla aldım,
Bu sövdada əcəb bədnam oldum, çox ziyan etdim.

Ey Həsən, aşiqlik yolunda canü dilimi birbaşa,
O namehriban dilbərin qamətinə nisar etdim.

## QƏZƏL

Məgər dodağın qırmızı şərab badəsindən yoğrulub ki.
Xumarlığın o al dodaqların nəşəsindəndir?

Canü dildə qida olan o üzün qurbanı olum,
Ruha qida olan o dodaqlara heyran oldum.

Ey şux dilrüba, sənin qamətindən heyrətdəyəm mən,
Bu qamət ilə məhşər gününün nişanəsisən.

Sənsiz keçirdiyim gecələr matəmdir mənimçün,
Sənin vüsalında keçirdiyim gün ən böyük bayramdır
mənimçün.

Ya rəb, o müşk qabının ətridirmi, ya sərin külək,
Ya o iki ətirli qara zülfün iyidir?!

Xoşbəxt o kəsdir ki, xəlvət gecədə, ə'yanlar məclisində,
Ay üzlü, gül yanaqlı nigarı yanında olsun.

Cana, üzün iki müşk ətirli zülfün arasında,
Qara buludlar arasında nurlu günəş kimidir.

Zahid, mənə badəni mən' – qadağan etmə ki, əzəldən,
Cama, badəyə, şəraba, piyaləyə meylim vardır.

Başında qıvrım saçların həyəcanı oldu, o qədər ki,
Axır məhvəşlər eşqi yolunda Həsən divanə oldu.

## YENƏ

Ey gözəllik padşahı, səni Allah himayət et,
Sənin cəfanın əlindən çox şikayətim var.

Ey xilaskar, fəryadıma yet, səndən başqa kimsəm yoxdur,
Dərdlilərin duasını, sən, ey kərəm sahibi, eşit.

Mənim fəxrim olan qamətin, mənim qiyamətimdir,
Ayağa durmağın məhşər gününün başlanmasına işarədir.

Mey piyalədə, gül çəməndə, ay səmada,
Hərəsi camalından bir hekayət danışır.

Əgər lütf edib mənə nəzər salsan, şad olaram,
Axı şahın gədaya inayəti daha xoş olar.

Canan, sadiq aşiqin qətlinə nə həvəskarsan,
Axı şəriətdə günahsız müqəssir olmaz.

Hər dərdin sonuna bir ümid olar,
Dərd odur ki, eşq dərdinin sonu yoxdur.

Qoca meyxanəçi məni meykədəyə apardı,
Bəli, o, Həsənə əcəb yaxşı yol göstərdi!

**YENƏ**

Üfüqlərdə bir zərrə belə yoxdur ki, onda sənin
təsirin olmasın,
Aləmdə bir işıq yoxdur ki, onda sənin nurun olmasın.

Hamı sənin eşqinin meyxanəsinin nəşəsindən xumardır,
Sənin dolu badəndən məst olmayan bir könül hanı?!

Üzün, gözəllik cilvəsi, hər könül zərrəsindən əyandır,
Bir canlı tanımıram ki, onda sən görünməyəsən.

Vəfa bazarında o könül qiymətsiz olar ki,
Bütün varlığı ilə sənin xəridarın olmasın.

Hər avarənin könlü sənin eşqinə layiq deyildir,
Hər naqisü naəhlin eşqi sənə layiq deyildir.

Dünyada sənin didarını istəməyən,
Cahanda özünü nəzər sahibi hesab etməz.

Ayıq və məstlərin hamısı eşqində rüsvaydır,
O kimdir ki, dünyada səni istəməsin?!

Üzün sevdasına Həsən tək könül verməyən,
Heç zaman dil əhli ola bilməz.

## YENƏ

Əgər o sərvqamət üzündən pərdəni açsa,
Xəlq içində büsbütün həşir-qiyamət qopar.

Qaşın oxu ilə şəhid olanın nə'şinə ayaq basma,
Məbada, ətəyini qanıma bulayasan.

Əgər gözəl Yusif yüz dəfə özün bəzəsə,
Gözəllikdə üzünə tay ola bilməz.

Fəqanım o iki xumar və məst gözlərdəndir,
Ki, əql və huşumu başdan, aramımı
könlümdən alıbdır.

Ənbər saçların ətir saçanda bilirəm ki,
Özünü sənin gül üzünə toxundurubdur.

Əgər aləmdə yüz belə vücud dünyaya gəlsə,
Ey nigar, ana dünya bir də sən tək övlad doğmaz.

Zavallı Həsən kuyinin torpağına baş qoyar,
O ümidlə ki, o ay bir an üzünü göstərsin.

## QƏZƏL

Ey könül, elə ki gözəlin eşq camından nuş etdim,
Özümü meyxanə əhlinə tay etdim.

Özümü onun saçına bağlayan gündən,
Cahan qeydindən azad olmuşam.

Gülüstanda üzün yad edərək nalə çəkmişəm,
Bütün bülbüllərin fəryadını xamuş etmişəm.

Elə ki üzün günəşindən könlümə bir işıq düşdü ,
O günəşi qucaqlayıb bağrıma basdım.

Üzün eşqi dilü canımda elə yer etmişdir ki,
Özüm-özümü yaddan çıxarmışam.

Dad sənin qıvrım saçlarına tapşırdığım könüldən,
Fəryad o baxışdan ki, sənin boynunu gördüm.

Sənin gülşən diyarından indi hara gedim?
Bir gül üçün min tikan sancısı dadmışam mən.

Artıq Həsən necə mey arzusu edə bilər,
Özümü sənin məst gözlərindən itirmişəm?

## YENƏ

Ey könül, gəl bir an məndən dərdü qəm hədisi eşit,
Mənim mehrü vəfama bax, o sənəmin cəfasın eşit.

Onun yolunda könül qoydum, amma onda yüz bəla gördüm,
Məndə bu mehribanlığı gör, ondan bu sitəmi eşit.

Ey nigar, gəl bir an ağlar ürəyimi eşit,
Zülfünün telini yad edərək naləmin zilü bəmini eşit!

Əgər istəsən bu işin sonundan xəbərdar olasan,
Ey dil, bunu Cami-Cəmin sərgüzəştindən eşit!

Qulağından qəflət pambığını çıxar, ayıq ol,
Hər qədəm dostlardan "ər-rəhil" sədasın eşit!

Ey Həsən, cananın hərəmxanasına ayaq basma
heç vaxt,
Nadanlıq etmə, hərəm əhlindən icazə eşit.

## QƏZƏL

Məstlik əsəri olan xumar gözlərinə qurban olum,
Qana dönmüş könül həmişə özündən bixəbər olur.

O sərvrəftarın dilrüba qamətinə qurban olum,
Ki, duruşundan qiyamət əsəri görünür.

İndi, ey pəri, dəli könül rüsvayi-aləm oldu,
Ki, başında saçlarının zəncirinin sevdası var.

Leylinin nazının mənim nazəninimə nə nisbəti var,
Ki, mənim dilnəvaz yarımın başqa bir işvə-nazı var.

Eşq çayı kənarında canım elə bir ağacdır ki,
Yarpaq və budağı möhnətdən, barı qəm və zillətdəndir.

Nigarın zülfündən gələn nəsim məni xoşhal edir,
O qasidə qurban olaram ki, mənə yarımdan xəbər gətirə.

Ayrılıq dərdindən biçarə aşiqi gör ki,
Daim qanlı göz yaşı, dağlı ürəyi vardır.

Ey nigar, hər tərəfdən mənə müşk ətri gəlir,
Sanki badi-səba saçının bir telinə toxunub gəlir.

Kəmər sənin nazik belini qucduğu üçün,
Həsəddən Həsənin həsrət gözləri daim kəmərdədir.

## QƏZƏL

Dəmadəm yadi-vəslin ləzzəti-ruhi-rəvanımdır,
Xəyali-firqətin sərmayeyi-ahü fəğanımdır.

Nə müddətdir könüldə navəki-qəmzən məkan tutmuş,
Ayırma təndən, ey can, sən onu, arami-canımdır.

Tökər hicrində daim xuni-dil çeşmi-rəməd didəm,
Binayi-səbrimi viran edən əşki-rəvanımdır.

Deyil əncüm fələkdə kim, ucalmış çaki-sinəmdən,
Şərari-atəşi-dil, şöleyi-ahi-nihanımdır.

Nə lazımdır mənə kim, seyri-sərvü gülsitan etmək?
Camalın gülşəni-eyşim, qədin sərvi-rəvanımdır.

Xəyali-kakilindən xali olmaz bir zaman könlüm,
Onun hər tarı bir can riştəsi, tabü təvanımdır.

Deyil xəm qamətim hərgiz fələk cövrü cəfasından,
Edən qəddim düta peyvəstə ol əbrukamanımdır.

Qəmi-hicr ilə zarəm, bir ənisü qəmküsarım yox,
Həsənlə yar olan ancaq bu çeşmi-xunfəşanımdır.

## YENƏ

Ləbi-lə'lin məzaqın şərbəti-şəhdü şəkər verməz,
Güli-ruyin ziyasın pərtövi-mehrü qəmər verməz.

Könül istər ki, çıxsın xaki-payinə nisar olsun,
Tutub mehrin sərasər cismimi, bir rəhgüzər verməz.

Xərabi-nərgisi-lə’lin ayılmaz, huşyar olmaz,
Ləbin tək badə olmaz, gözlərin tək mey əsər verməz.

Yanar eşq atəşinə daima könlüm səməndər tək,
Nedim kim, atəşi-dildən sənə bir kəs xəbər verməz.

Tapar zövqü səfa könlüm məhi-ruxsarını görgəc,
Yəqinimdir ki, bu zövqü mənə gülbərgi-tər verməz.

Xəyalın munisimdir, həmnişinim ahü naləmdir,
Bu bir bəzmi-səfadır, bir kəsə mütləq güzər verməz.

Şərari-ahi-sinəmdən neçün xəlq ehtiraz eylər?
Yanar ancaq mənim canım, bu od xəlqə zərər verməz.

Həsənlə olmasın karın ki, mən eşq ilə xoşnudəm,
Səfayi-eşqi hərgiz, zahida, virdi-səhər verməz.

**YENƏ**

Əcəb sultani-eşqəm kim, qəmü möhnət sipahimdir,
Şükuhim ahi-dil, ənduhü zillət izzü cahimdir.

Nə hacət şərh edim bir-bir dili-xungəştə əhvalın,
Üzümdə rəngi-zərdim, əşki-gülgunim güvahimdir.

Pərişanlıq mənə hərgiz deyil ol zülfi-pürxəmdən,
Dili-aşüftəni dərhəm qılan bəxti-siyahimdir.

Məni mən’ etmə çox, eşqin yolundan tərki-söhbət qıl,
Təriqim eşqdir, zahid, nigarım qibləgahimdir.

Deyil ayineyi-könlüm qübari-çərxdən əsla,
Onu tar eyləyən, billah, dəmadəm dudi-ahimdir.

Nə mümkündür kənar olmaq mənə ol məhliqadən kim,
Mənim yarım, nigarım, qəmküsarım, dadxahimdir.

Düşübdür atəşi-hicranə daim kim, yanar canım,
Səbəb öz taleyi-nasazü iqbali-təbahimdir.

Həsən səhrayi-eşq içrə gəzər sərgəştə ahu tək,
Onu yorğun salan bir dilbəri-ahunigahimdir.

## YENƏ

Dilər vəslin dəmadəm həsrəti-didar olan könlüm,
Cəfayi-nərgisi-bimar ilə bimar olan könlüm.

Kəməndi-eşq ilə pabənddir, hərgiz xilas olmaz,
Əsiri-türreyi-tərrari-ənbərbar olan könlüm.

Açılmaz, bir zaman bulmaz səfa, bir ləhzə şad olmaz,
Qubari-ahü ənduh ilə daim tar olan könlüm.

Nə mümkündür xəyali-gül edib,gülzarə meyl etsin,
Məlahət gülşənində talibi-rüxsar olan könlüm.

Kənar olmaz rəhi-eşqində bir dəm möhnətü qəmdən,
Bəlavü dərdə həmdəm, möhnət ilə yar olan könlüm.

Xədəngi-töhməti-əğyar ilə daim fıkar olmuş,
Cəfayi-eşqi-ruyinlə dəmadəm zar olan könlüm.

Səri-kuyində daim nalə eylər binəvalar tək,
Hərimi-vəslinə, ey məhliqa, əğyar olan könlüm.

Olubdur qəm yatağı, ey Həsən, qəmdən iraq olmaz,
Diyari-eşqdə zarü zəlilü xar olan könlüm.

## QƏZƏL

Qaməti-sərvin edər şurişi-məhşər peyda,
Olu hər ləhzə qiyamında qiyamət bərpa.

Səri-kuyindən olur vadiyi-iymən pürnur,
Yədi-beyzayə rüxün şöləsi vermişdi ziya.

Tari-zülfündən olur mə’niyi-“vəl-leyl” * əyan,
Vüzzəha şərhini rüxsarın edər xəlqə əda.

Ayeyi-nur cəmalında hüveydadı sənin,
Qabi-qövseyn qaşın tərhini eylər inşa.

Nə gözəl tərh çəkibdir sənə ustadi-əzəl!
Vərəqi-hüsni-rüxündən oxunur sün’i-xuda.

Yüzünə qarşı nə mümkündü dura mahi-fələk?
Ona xurşid camalın yetirir gündə ziya.

* Qur’an, əl-Leyl surəsi.

Xizrvəş zülməti-zülf içrə könül tutdu soraq,
Ləbi-meygununara tapdı əcəb abi-bəqa.

Dəftəri-hüsni-rüxündən sənin övhamü əqul,
Dəhənin sirrini fəhm eyləyəcək buldu fəna.

Mənbəi-hüsnü lətafətdi vücudun yeksər,
Mütləqa ruhdu cismin sənin, ey huriliqa.

Arizin mahi-dilaradı, üzün mehri-münir,
Tapar ayineyi-könlüm üzünü görsə səfa.

Həsəni ruzi-əzəldən səri-kuyində müqim,
Səfheyi-mahcəbinində yazıb dəsti-qəza.

**YENƏ**

Bulur xəm qamətim hər qanda bir əbrukəman görgəc,
Olur aşüftə könlüm türreyi-ənbərfəşan görgəc.

Güli-ruyin görəndə nalə eylər zar olan könlüm,
Onun tək kim, gəlir əfğanə bülbül gülsitan görgəc.

Deyil bihudə bitab olmağım lə’lin şərabından,
Nə mümkündür ki, təşnə səbr edə abi-rəvan görgəc.

Kənar olmaz könül bir dəm səri-zülfı-siyahından,
Bəli, quş məskən eylər harda bir xoş aşiyan görgəc.

Götür zülfün üzündən, ta ki, hüsnün aşikar olsun,
Xəyali-gənc edər hər yerdə mərdüm bir ilan görgəc.

Gedir səbrü-qərarım, dərdim artır, qan olur könlüm,
Həbibim, hər zaman sənlə rəqibi mehriban görgəc.

Dilər daim Həsən dərdin sənə, ey məh, bəyan qılsın,
Nedim kim, lal olur nitqim camalın hər zaman görgəc.

**YENƏ**

Cəfavü-cövrə raqibdir vəfadan dur olan yarım,
Vəfavü mehrdə daim qələtməşhur olan yarım.

Nə mümkündür kənar etmək könüldən bir zaman mehrin,
Hədisi-eşqi lövhi-sinədə məstur olan yarım.

Vəfa rəsmin unutmuş, qəsdi-can etmiş, məazallah,
Meyi-hüsn ilə daim gözləri məxmur olan yarım.

Xəyalın munisimdir, bir zaman onsuz qərarım yox,
Əzizim, nazəninim, dildə çox məzkur olan yarım.

Məni-məhcuri hicran ilə etmiş zarü dilxəstə,
Həmişə məhfili-əğyaridə məsrur olan yarım.

Qiyamət macərasın qaməti-sərvin əyan eylər,
Behiştü nəxli-tubadən mənə mənzur olan varım.

Qılıb əğyar bəzmin şəm' tək rövşən camalından,
Vüsali aşiqi-məhcurə naməqdur olan yarım.

Saqın ahi-Həsəndən, çox cəfacu olma, xof eylə,
Nigarım, mehvəşim, hüsnünə çox məğrur olan yarım.

**YENƏ**

Vəsfi-rüxsarını çün xəlqə nümayan etdim,
Şərh qıldım onu gün tək, əcəb ünvan etdim.

Sordular lə'li-ləbin vəsfini gülşəndə deyib,
Laləni dağa salıb, gül ürəyin qan etdim.

Sinəmə yetgəc oxun, şövqilə bağrıma basıb,
Varımı verdim ona, canımı qurban etdim.

Zahidə bəhs təriqiylə dedim zülf sözün,
Bu hədis ilə onu xeyli pərişan etdim.

Yadi-lə'linlə içib badə, tutub saqi əlin,
Baş əyağına qoyub, sidqilə peyman etdim.

O qədər başımı urdum səri-kuyin daşına,
Ta ki, qan ilə o yarın yolun əlvan etdim.

Küfri-zülfün görəli tökdü gözüm xuni-cigər,
Xaneyi-din ilə imanımı viran etdim.

Şöleyi-ah ilə qəmxanəmi hicran gecəsi,
Vəsl ümidilə, Həsən, türfə çirağban etdim.

## YENƏ

Gəl, ey xəyalı olan yarü qəmküsarım, gəl,
Gəl, ey ənisi-dili-zarü biqərarım, gəl.

Gəlir nəvayə könül firqətində sübhü məsa,
Tutub cahanı sərasər fəğanü zarım, gəl.

Gedibdi səbrü qərarım, yoxumdu tabü təvan,
Gəl, ey gözüm, əzizim, taqətim, qərarım, gəl.

Nə nazü qəmzədi, ya Rəb, nə işvədir, bilməm,
Bu nazü işvəni tərk eylə, ey nigarım, gəl.

Səmumi-hicr ilə gülzari-eyşim oldu xərab,
Pozuldu gülşənü gülzarü novbaharım, gəl.

Nə növ səbr qılım möhnəti-fəraqına mən,
Dönübdü qana, əzizim, dili-fikarım, gəl.

Qoyubdu sidq ilə can nəqdini yolunda Həsən,
Nisari-qaməti-sərvindi hər nə varım, gəl.

## YENƏ

Dili-aşüftəni geysuyi-mişkəfşana tapşırdım,
Salıb zəncirə, ol divanəni zindanə tapşırdım.

Gözün görgəc unutdum xəlqara huşyarlıq rəsmin,
Büsati-əqli yeksər nərgisi-məstanə tapşırdım.

Səri-zülfündə, ey məh, qana dönmüş bir könül qaldı,
Onu zülfə, səni ol xaliqi-sübhanə tapşırdım.

Nigarım qorxuram bidar olub, azürdəhal olsun,
Səri-kuyində yarın durma çox, əfğanə  tapşırdım.

Ləbi-lə’lin görən dəm zülməti-zülfi-siyah içrə,
Həyati-ömrümü ol çeşmeyi-heyvanə tapşırdım.

Nə çox eşqin cəfasın, yar cövrün zikr edər vaiz?
Cəfayi-eşqi mən ruzi-əzəldən canə tapşırdım.

Həsən müştaqdır çoxdan o zülfə, pay bənd etdim,
Bəla zəncirinə bir aşiqi-divanə tapşırdım.

## YENƏ

Gəl, ey gözüm işığı, taqətü təvanım , gəl,
Könüldə səbrü qərarım, tənimdə canım, gəl.

Nə vəqtədək qəmi-hicrana səbr edim, bilməm,
Tərəhhüm eylə, gəl, ey yari-mehribanım, gəl.

Mənim gülüm, çəmənim, gülşənim, əzizimsən,
Gəl, ey camalı gülüm, türfə gülsitanım, gəl.

Qəmi-fəraqilə eşqində od tutub canım,
Yetibdir ərşə bu gün ahü əl-amanım, gəl.

Bu qədr naləvü zarım əbəs deyil hərgiz,
Fəraqin atəşinə yandı cismü canım, gəl.

O zülfi-pürxəmə dil vermişəm nə müddətdir,
Boyunda həlqeyi-zəncirdir nişanım, gəl.

Təriqi-eşqdə məşhuri-aləm oldu Həsən,
Tutub cahanı, gözüm, türfə dastanım, gəl.

## YENƏ

Məni rüsva qılan, ey dil, o yari-məhcəbinimdir,
Nigarım, gülüzarım, sərvnazım, nazəninimdir.

Yanar aləm sərasər atəşi-ahi-dərunimdən,
Qılan bidar hər şəb xəlqi fəryadi-həzinimdir.

Nədəndir bilməzəm rüsvalığım, sordum ol gülrüxdən,
Dedi: Zənciri-zülfi-müşkbarü ənbərinimdir.

Əzizim, ömrlərdir kim, siyəh zülfün xəyalilə,
Düşən qeydi-bəlayə bu dili-ənduhginimdir.

Təmənna qılma vəsli, çəkmə zəhmət, olma sərgəştə,
Ki, nəxli-vəsl bar verməz sənə, ey dil, yəqinimdir.

Məni eşqin yolundan mən’ qılma, eyləmə gümrah,
Təriqim eşqdir, zahid, nigarım əsl dinimdir.

Xilas olmaz Həsən bir dəm səri-zülfün kəməndindən,
Ki, hər bir tarı bir can riştəsi, həblül-mətinimdir.

* * *

O gündən ki, yar meyindən sərxoş oldum,
Sarayına ayaq basdım, dildarı gördüm.

Öz qəmli könlümün halından baxəbər oldum.
Əzəldən işin aqibətin bildim.

Əzəldən öz gülşəni-qüds vətənimin hüması idim,
İndi isə vətəndə şüumsuz bayquş oldum.

Cənnətlər qəsrinin qülləsi mənim yuvam idi,
Bir danədən ötrü bu tələdə giriftar oldum.

Paxılların zülm və sitəm oxuna hədəf oldum,
Düşmənlərin tə'nə və töhmətlərinə hədəf oldum.

Vüsal zamanını, şad olduğumu yada salıb,
Sənin fərağına düçar olan vaxtdan ah çəkirəm.

Ey dost, məgər sənin mənimlə əhdin bu idi ki,
İndi bu qədər zillət ilə görüşünə həsrət çəkirəm?

Sənin peymanənin nəşəsindən bihal olsam da,
Şükür, yüz şükür ki, bihallıqda da huşyar oldum.

Sənin vücudunla öz varlığım mənə ağır idi,
Şükür Allaha ki, bu yükdən xilas oldum.

Cəmalının nurunun şöləsi könüldə cilvələnəndə,
Sinayda bu nurdan xəbərdar oldum.

Eşqinin badəsi indi Həsənçün Cami-Cəm oldu,
Elə ki dodaq-dodağa qoydum, sirlərə vaqif oldum.

## YENƏ

Xudavəndə minnətdaram ki, minacatım təsirindən,
Məni kuyi-muğanda kəramət əhli etdi.

Sənin eşqinin sayəsində məşhuri-cəhan oldum,
Rindlər başçısı, xərabat əhli oldum.

Rindlər kürsüsünün başqa bir haləti vardır,
Biganə əhvalımın necəliyini hardan bilər?

Şuşada bir pərizad könlümü fəth edib,
Bundan sonra ayələr oxumağın faydası yoxdur.

Ey dost, əgər mən gecələr səninçün dua etsəm də,
Sənin gözəllik məhkəməndə itaətdən xəcalətəm.

Sənin görüşündən bir ləhzə belə qafil ola bilmirəm,
Daim könül ayinəmdə sənin əksin görünür.

Zahid, bir də Həsənə Kə'bə yolun göstərmə,
Bütün diləklərim meykədədə hasil olub.

**YENƏ**

Heç bir baş yoxdur ki, zülfün həvəsi onda olmasın,
Hər hörüyünə vurğun olub, dərbədər olmayan
yoxdur ki, yox.

Lalə üzünün yadı ilə hamının sinəsi dağlıdır,
Ləbi-lə'lindən bağrı qan olmayan yoxdur ki, yox.

Biz hamımız hər tərəfdən camalına baxmaqdayıq,
Sənin tamaşana baxmayan yoxdur ki, yox.

Mənim sədparə könlümün ahından həzər et,
Könül ahımın əsər etmədiyi şey yoxdur ki, yox.

Hüsnünün badəsindən hamı məstü xumar olub,
Onun nəşəsindən özündən bixəbər olmayan
yoxdur ki, yox.

Ey dost, qorxuram ki, ahımdan cahana od düşə,
Çünki odu olmayan bir xəstədil yoxdur ki, yox.

Mehri-rüxün ucundan tək mən ağlar olmamışam,
Onun hər zərrəsindən gözləri nəm olmayan
yoxdur ki, yox.

Həsən onun fitnəsindən heç vaxt asudə olmayacaq,
Çün xətəri olmayan (gözlərinin) qəmzəsi
yoxdur ki, yox.

## YENƏ

Rindlər dövrəsində mənim mövqeyimə bax,
Piri-xərabatdan azadlıq xətti almışam.

Ey dost, özümdən xəbərsiz olduğumu mənə eyb hesab etmə,
Eşq meyindən sərgərməm, aşüftəxəyaləm.

Mənim gözəlim gözəllərin sərdəftəridir,
Onun üzünə heyranam, gözəlliyinə matam.

Səri-kuyini yad edirəm, çəmənə ehtiyacım yoxdur,
Nə cənnət bağına meylim var, nə cənnətin özünə.

Mehrini qəlbimə saldıqda yüz bəla oxu gördüm,
Eşqinin bəndəliyində mükafatım bu oldu.

Bütün gecəni onun üzünü yad edirəm,
Hər fikirdən asudəyəm, hər şeydən azadam.

Həsən həmişə Xudavəndin sənətinə afərin deyir,
Öz qüdrətilə yüz cürə aləm yaratmışdır.

**Vər. 220b**

## MƏMO BƏY MƏMAİ

**Zilqədətül-həramın əvvəli, 1309-cu il**
**(28 may, 1892)**

**Əsil-nəcabətli cənab Məşədi Məhəmməd bəy bin Hacı Əhməd bəy bin Hacı Məhəmməd bin Hacı Şərif bin Abdulla bin Məmay Qarabağın Şuşa əhalisindəndir. Xoşsurət, nəzakətli, eyibsiz, xoşxasiyyət bir cavandır. Sənəti tacirlikdir. Yaşı qırxdır. "Məclisi-üns"un üzvlərindəndir, altı şairdən biri hesab olunur. Çox vaxt "Məclisi-üns" də şeir deyir. Özündən eşitdiyimə görə, hər qəbildən və hər qisimdən şeirləri var. Ancaq pərakəndədir, divanı yoxdur. Təxəllüsü Məmaidir. Farsca və azərbaycanca yazılmış aşağıdakı şeirlər onundur ki, öz dəsti-xəttiylə yazıb.**

## MƏMO BƏY MƏMAİ

Ey pəri əndamlı, sənin könlünü öz naləmlə aşina etdim,
Qəlbi qana dönmüşə bu aşinalıqla cəfa etdim.

Sənin qantökən kipriklərindən kamım hasil olmadı,
Sinəmin yarasına nakamlıqla dəva etdim.

Ləblərini yad edərək ürək qanından bir badə içdim,
Elə sərməst oldum ki, qərarımı itirdim.

Əlimi naz ətəyindən üzmərəm, məndən üz döndərmə,
Sən naz etdin, mən arzu, cəfa gördüm, vəfa etdim.

Sən kimi bir ov çətin ki, ovçu toruna düşə,
Ey vəhşi ceyran, səni nahaq əldən verdim.

İlk baxışda hüzurunda özümdən getdim,
Bilmirəm, o məclisdə nələr dedim, nələr etdim.

Sənə hicran və könül qəmin şərh etməyə nə ehtiyac var?
Sənin gözlərindən iraq yüz mətləb əda etmişəm.

Xəstə könül məst gözlərinə şikar oldu, o səbəbdən,
Səni Çin ahusuna bənzətdim, xəta etdim.

Qəlb damarını qırıb zülflərinə bağladım,
Zülfünü açdıqda aləmi pərişan etdim.

Sənin zülflərindən azad olmaq artıq müşküldür,
Çünki ətirli zülfünə öz qəlbimi mübtəla etdim.

Məmai, onun gülzar üzündən bir gül iyləmədim,
Bülbül kimi hər zaman gülşəni-kuyində nəva etdim.

## QƏZƏL

Ey göz yaşları, bir dəm bu tər gözlərimi qurut,
Cigər qanımdan gözlərimi sərçeşmə eləmə!

Tale ovçusu qol-qanadımı elə bağlayıb ki,
Vəfa kuyində uçmağa taqətim yoxdur.

Göz bəbəyim qönçə kimi cigər qanıyla dolub,
Məclisi qanlı göz yaşları ilə gülzar edib.

Naləden ney kimi ağlamaqdan incəlib tük kimi oldum,
Nalə kimi məndən də bir əsər tapmaq olmaz.

Qəm naləsilə sənin hicrini şərh edirəm ki,
Bəlkə naləm sorağımı sənə çatdıra.

Əfsus ki, sərv bovunun vəslinin həvəsində
olmaqda ikən,
Hicranın barlı ağacımın kökünü qazdı.

Könül oxşayan bir nigarın üzünün yadı ilə,
Fələk gündüzümü gecə ilə bərabər etdi.

O vəfasız av bir an belə sormadı ki,
Məmai, qanlı ürəyinin haləti necədir?

## YENƏ

Yenə gözəllər kuyində sənin məstanə
siman göründü,
Meykədədəki nəşə sənin badənin nəşəsindəndir.

Sənin camının nəşəsindən sərxoş olan, tək
mən deyiləm,
Hamı sənin meyxanənin meyindən sərməstdir.

Sənin üzünün şöləsi dilü canıma od saldı,
Viranə könlümü yandırma ki, sənin öz malikanəndir.

Gözlərimin bəbəyi qamətinin cilvəgahıdır,
Ey dilbərim, qana dönmüş ürəyim sənin ev-eşiyindir.

Məcnunun zəncirinin həlqəsinə əl vurma,
Həyəcanın artırma, ey dost, axı o sənin divanəndir.

Sənin camalının şamından könül odlandı,
Şöləndə qol-qanadı yanmış pərvanə kimidir.

Dağçapan (Fərhad) və Məcnun dastanının vaxtı keçib,
Ey Məmai, cahanda ən yeni əfsanə səninkidir.

## YENƏ

Şövqi-badəndən camım islanmayıb hələ,
Naləvü fəqanımdan aramım qaçmaqdadır hələ.

Üstümdə daim qəm libası var,
Şadlıq paltarı əndamıma dəyməyib hələ.

Cismimdəki hər bir damar qəlbimin telidir mənim,
Necə mən pərvaz edim, ya Rəb, torum bağlıdır hələ.

Müqəddəs Kəbədə də, kilsədə də səni axtarmaqdayam,
Küfr ilə İslam arasında heyran qalmışam hələ.

Ey şirin dilli, ürəyimin kamı dağçapan (Fərhad) tək acı oldu,
Sənin şirin dodağından damağım şirin olmadı hələ.

Vüsalın ümidilə sona çatdı ömrüm, ey sənəm,
Canım boğazıma çatdı, adım dilinə gəlmədi hələ.

Vüsal arzusu ilə ürəyim kabab tək bişibdir,
Hicran odunda yandım, ancaq xamam hələ.

Zülfünün xəyalında yuxu və aramım qalmadı,
Ey Məmai, gecə ilə gündüzümün fərqi olmayıb hələ.

## YENƏ

Ciyər yandıran qanlı göz yaşları ürəyin novbaharını pozdu,
Gül-yarpaq yerinə ürəyin budaqlarından qan tökülür.

Ürək məndən artıq qısıldı, mən ürəkdən artıq pozuldum,
Ürək məndən heyrətdədir, mənsə ürəyin işinə heyranam.

Ürək meylindən mən oddayam, ürək qana qərq olub,
Ürək məndən biqərar olub, mən də ürəyin dözümsüzü.

Sən indi həsrət barmağını ürəyimin telinə vursan,
Canımın hər tükündən şur və nəva şivən edər.

Bu zalım fələk qəlbimə minlərlə qəm oxu vurdu,
Ciyər qanı ilə tökülən göz yaşları ürəyin ətrafını bürüdü.

Harda səni yad etdimsə, göz yaşlarım lalə tək oldu,
Gözümdən qan çeşməsi ürəyin arxından axır.

Dildarın üzünün həvəsindən qan oldu ürəyim,
Üzünün ayinəsi olmayanda ürəyin qubarı artır.

Qantökən kipriklərin oxundan ürəyim gülüstan oldu,
Sanki gül kimi ürəyin novbaharında yara bitir.

Heç vaxt mənim ürəyim ovçu şikarı olmadı,
Fəxr edirəm ki, məst gözlərin daim ürəyi şikar edir.

Şuşada bir dilbər ürəyin səbrü qərarını əlindən aldı,
Məmai, iztirab budur ki, ürəyin ixtiyarı əlimdə deyil.

## YENƏ

Ev zahid, haqq yolundan nə vaxtadək məni döndərəcəksən,
Mən eşq kafiriyəm, müsəlmanlığa nə nisbətim (var)?

Aşiqlərin qibləsi dilbərin cüt qaşlarıdır,
Mehrab qarşısında məni düzlükdən əyriliyə çağırırsan.

Çox sakitlik mənim qanunuma ziddir,
Heyranlıq qanun və dindən uzaq edib məni.

Qapı torpağının zərrəsi günəşdən işıqlıdır,
Sənə köləliyim sultanlığa qaldırır məni.

Zülflərin qıvrımından özgə ömrümə heç nə hasil olmadı,
Müşkbar zülfün təki məni nə qədər dolayasan?

Örtüyü qaldır, bir an örtüksüz görün,
Canım sənə qurban, qurtar bu örtükdən məni.

Sənin lütfünün dəryası kənarında susuz qalmışam,
Rəhm buludunun qətrəsilə nə vaxt doyduracaqsan məni?

Ahımdan qamətin tək göylərə yüz şölə baş çəkər,
Sən də bir an otur, məni nə qədər odda oturdacaqsan?!

Ey Məmai, bu pərişanlıqla mən necə rahat ola bilərəm ki,
Onun zülfü belə pərişan edir məni?

**YENƏ**

Ey mərhəmətli hökmdar, könlümün halı yamandır,
Sən tək bir şaha bəndədən kəmlütflük çətindir.

Bu müvəqqəti həyat mənə ar gəlir,
Bu halda diri olmaq mənə çətindir.

Fəxr et ki, bir ömürdür lütfün üçün yanıram,
Bu xoşbəxt talenin qayıtması çətindir.

Əgər gülsəm, qəlbim qönçə kimi çak olar,
Bu qanlı ürəklə gülmək mənə çətindir.

Axşamdan sübhədək şam təki yanmaqdayam,
Od tutmuş ürəyin qorxması çətindir.

Bu gecə gözəllər saçı tək pərişanam mən,
Ey vay, belə pərişanhal olmaq çətindir.

Ey Məmai, Xarəzm möhnətü dərdlə doludur.
Bu çərxi-fələkdən kiminsə şad olması çətindir.

**YENƏ**

Bu nə mey idi süzdün canıma, ey dost,
Ki, onun bir qurtumundan daim məstəm, ey dost!

Məstlikdən bir addım belə ata bilmirəm,
Ah, bu vəziyyətdə sanki damın qırağındayam, ey dost.

Eşqinin atəşindən canü tənim, ürəyim yandı,
Eşqindən nə qədər püxtə olsam da, yenə xamam, ey dost!

Əşrəflər məni qovur, kasıblar məndən qaçır,
Vay halıma ki, nə əşrəflərdənəm, nə kasıbdan, ey dost.

Gah Xarəzmə, gah da Qıpçağa çəkirsən məni,
Sənin sorağındayam, amma arzuma yetməmişəm, ey dost!

Əgər nəzərdən salsan, qara torpaq (zərrəsi) olaram,
Əgər nəvaziş etsən, səxavətindən bədrlənmış ayam, ey dost!

O şirin sözlülükdən şəhərin məşhuru oldu Məmai,
Sənin al dodağından kamım şirin oldu, ey dost!

## YENƏ

Sənsiz gözümdən üzümə gövhərlər axır,
Gecələr naləm, səhərlər ahım vardır mənim.

Mən yazığın ah şöləsindən qafil olma,
Ki, sinə atəşgahımda odlar vardır mənim.

Eşqinin qəmindən qəlbimdə nihal əkmişəm,
Ki, onda göz və qəlb qanımın barı vardır.

Sən ayinəyə baxırsan, lakin məndən qafilsən,
Sənin üzünün ayinəsində isə nəzərim vardır.

Sən mənim xəstə ürəyimdən xəbərsizsən,
Mənimsə sənin o məst gözlərindən xəbərim vardır.

Mənim qamış qələmimdən bu gün şəkər axır,
Sənin ümid dodaqlarının şəkərinə ümidim vardır.

Ey Məmai, demə ki, ürək ahlarım əsərsizdir,
Bu şölədən daş qəlbdə əsərim vardır mənim.

## YENƏ

Ay üzünə dalğalı zülflərini, ey nigar, salma ki,
Onun hər dalğası yüz Çinü Maçini pərişan edir.

Saçların gülşəndə sünbülün zülfünü pərişan edib,
Üzün çəməndə nəsrinin surətini oda salıbdır.

Rə’na qamətinlə, ey gözəl büt, əgər naz ilə gəzsən,
Bütün Çin bütxanəsində qiyamət qopar.

Əgər bir an dünyada o gözəl üzü görməsəm,
Ey nigar, sənsiz görən gözlərimi dünyadan yumaram.

Qəm gecəsi üzünün ayı olmasa, üzümə inci səpərəm,
Ağlamaqdan (göz yaşından) Ay və Ülkəri heyrətə salaram.

Şirin dodaqlarının həsrətilə canım boğaza yığılıb,
Ki, bəlkə o şirin dodaqların ona nəsib ola.

Əgər bir an torpağıma gümüşü dizlərini qoysan,
Torpağımda qəlbimin yarasından al güllər bitər.

Məmai gözəlin meyindən məst olub özündən getdi,
Bu məstlikdə, ey saqi, ona al rəngli badəni vermə.

**YENƏ**

Ey dost, əlim ətəyində, çəkmə ətəyini məndən,
Çaki-giribanından qəlbimdə yüz dağ var.

Əlin qoy ürəyimə,gör sənin əlindən nə haldadır,
Ey dost,sənin əlindən hamının əli qoynundadır.

Cana, qəlbimin kamı, dodağından şirin olmadı,
Qönçə gülüşündən könlüm qan oldu qönçə tək.

O iki qara, məstü xumar gözlərinə qurban olum,
Onlardan da artıq kipriklərinin oxuna müştağam.

Cananım, gözəllər məclisinə sərməst gəlmə sən,
Şəhidlərinin qanı ilə ətəyini qana bulaşdırma!

Bu qızğın başım atının yəhərindən asılmağa layiq olsa,
Başımı top kimi sənin meydanına ataram.

Zülfündə sənin ürəklər toplusu görürəm,
Sənin pərişan zülflərindən hamısı pərişandır.

Ey badə sındıran, Məmainin əhdini gəl sındırma,
Səninlə əhd bağlayanda can badəsi sınıbdır.

* * *

Elə ki eşqin yolunda dara çəkilməli olduqda,
Mənsurun halətindən xəbərdar oldum.

Elə ki camalının nuru qəlbimdə cilvələndi,
Sənin nurundan divar naxışı tək oldum.

Məsciddən, həm də kilsədən üz döndərdim,
Qəlb hərəmxanasında sirlər məhrəmi oldum.

Şeyx söylədi ki, vüsalını can ilə satırlar,
Başım əlimdə, əlim ürəyimdə bazar başına rəvan oldum.

Sənin pərişan zülfünə əl vurduğum vaxtdan,
Təsbih və zünnar silsiləsindən azad oldum.

Pərişan qəlblərin halını yaxşı bilirəm,
Çünki mən sənin dağılmış zülfünə giriftar olmuşam.

Qıpçaq torpağı ürək qanından qana bulandı,
Çünki al dodağının yadı ilə çox qan ağladım.

Xarəzm əhli hamısı qəflət meyindən məstdirlər,
Vay mənim halıma ki, səni gördüm, hüşyar oldum.

Ey Məmai, kim mənim qəlb təbibimə deyər ki,
Əlimdən tut. çünki sənin əlindən əldən düşmüşəm?

## YENƏ

Eşqində sənin gah kafirəm, gah münacat əhliyəm,
Gah kəbənişin, gah xərabat rindiyəm.

Bir ömrdür ki, qəlb güzgüsünü sənin üzünə tutmuşam,
Ancaq güzgümün üzünə sənin əksin düşməyir.

Elə ki sənin üzünün günəşi ürəyimdə parladı,
Hər zərrəm dünyanı bəzəyən bir günəş oldu.

Səni axtaran kəs nə üçün ayat istəsin?
Özümdə səni görürəm, mən ayatın özüyəm.

Ey xisləti varlığıma isbat olan,
Əgər varlığımı inkar etsən, mən səninçün isbatam.

Sənin qəm vəzirin qəlb mülkündə bir atı vurdu,
Ey şah, sən top (üz) göstər, gör necə mat olmuşam!

Sənin saçın gülşəndir,məni cəhənnəmə çağırsan belə,gələrəm,
Sənin kuyin cənnət bağından belə mənimçün əzizdir.

Səni necə vəsf edim, sən paksan, mən torpağam,
Sən əbədi dirisən, mən ölümə gedən diriyəm.

Əgər Məmaini bir dəfə öz yanına səsləsən,
Ayağın altda ölərəm, qurbanın olaram.

**YENƏ**

Ey gözəl, məst gözlərinin sehr doğuran qəmzəsi vardır,
Pusquda duran minlərlə yatmış fitnəsi vardır.

Sənin incə bədəninin əcəb nəzakəti vardır,
Sənin nazənin camalının nazənin lətafəti vardır.

Üzündən təravət, dodağından məlahət yağır,
Sənin könülaçan üzündə həm o, həm də bu vardır.

Çin gözəlləri camalını görsələr, səcdə edərlər,
Hansı gözəlin sənin tək qıvrım saçları vardır?

Asimanın sən tək könülaçan bir günəşi yoxdur,
Haradan günəşin belə ənbər qoxulu saçları vardır?

Ey asiman, öz ay və günəşinlə fəxr etmə,
Mənim ayımın üzündə nurlu günəş, alnında ayı vardır.

Məmai gözəl üzünün fəraqından necə nalə etməsin,
Ki, daim əllərində gözündən süzülən ürək qanı vardır?

**YENƏ**

Gəl, ey can munisim, könlümün dərd naləsin eşit,
İşrət nəğməsin eşitdin, gəl qəm sazının nəvasını da eşit.

Mənim ahü naləm fələyə təsir edir,
Bir an rəhm et, ey sərvinazım, sən də eşit!

Sənin zülmündən yaralı, xəstə könlüm qan olub,
Qoy əlini qəlbimə, ey zülmkar, fəryadımı eşit!

Bədənimin hər telindən canyandıran nəğmə qalxır,
Dərd nəğməsin məndən eşit, sazdan az eşit!

Mənim qəlbim yoxluqdan qəm naləsilə yaranıb,
Nalədən yox oldum, naləni yoxluqdan eşit!

Hərəm gülşənində də mən sizinlə daim nalədə idim,
İndi hərəmdən uzaq, ey hərəm quşu, fəryadımı eşit!

Qəlbim daim sənin kuyinin Kə'bəsində dolanır,
Hərəmdən kənarda, hərəkətsiz ayağımın sədasını eşit!

Zülfünün hekayəsi uzun oldu, müxtəsər olmadı,
Sən qəmlilərdən bu dalğalı saçın əhvalatını eşit!

Məmai üzünün şöləsindən büsbütün odlandı,
Yandırıcı odlar içrə, ey sənəm, fəğanımı eşit!

## YENƏ

O dalğalı saçlarına yüzlərlə ürək bağlıdır,
Onda olan bu zülf məcnunların zənciridir.

Onun eşq yolunun məsdərinin cam və səbusu yoxdur,
Onda olan bu nəş'ədən bütün aləm sərməstdir.

Ey camalı hər rəngdən üstün olan,
Gülşəndə güllər rəngi və ətri səndən alır.

Torpaqdan boy atan gül tikansız olmaz,
Tikanlı demə, bil ki, hər eybəcərdə bir gözəllik var.

Gülüzlülərin rüxsarı eşq yolunun sərməşqidir,
Bu hevrət güzgüsünün ikiüzlü təsviri vardır.

Eşq əhli itaətdən başqa heç nəyi qəbul etməz,
Aşiqlər ürək qanları ilə daim dəstəmaz alarlar.

Fənanın şeirləri çox gözəl və şirin olsa belə,
İncə qəzəl yaratmaqda Məmainin öz səbki vardır.

## YENƏ

Eşqində can versən də, qəmini canımda can etmişəm,
İndi qəlb ölkəsinə eşqini rəvan etmişəm.

Eşqin yolunda tam möhnətlə dil və canımı qoydum,
Sən mənə zülm və cəfa etdin, mənsə yüz qat artıq
məhəbbət etdim.

Mənə deyirsən: Hüsnünün eşqindən, canından qorxursan,
Məgər eşqindən sənin,ey canımın rahatlığı, canımı
itirməkdən qorxuram!?

Başında saçlarının sevdası vardır, ey pəriüzlüm,
Zülfünün sevdası ucundan canımı bəlayə salmışam.

Qönçə dodaqlarının yadı ilə qəlbimdən yaralar açıldı,
Yaralarım  gül tək açıldı, ürəyimi gülüstan etdi.

Alçaq rəqiblər sənin hüzurunda şadlıq edirlər,
Buna həsəd etdim, ona həsrət çəkdim.

Əfsus, sən daşürəkli üçün naləm təsirsiz oldu,
Bir an keçmədi, hər an eşqinin qəmindən fəğan etdim.

Məmai, sənin qələmindən ürək naləsi aşkar oldu,
Ney qələmdə belə bir atəşi pünhan etməyim əcəb deyildir.

## YENƏ

Ey əfsus, Şuşada bir həmnəfəs qalmadı,
Qəlbimin köksündə aramı qalmadı.

Dost-yarlar hamısı bu çəməndən getdilər,
Gülüstanda hal-hazırda heç kəs qalmadı.

Sədaqət gülüstanının gülləri bada getdi,
Vəfa gülşənində kol-kosdan özgə bir şey qalmadı.

Dərd və qəmimi gedib kimə söyləyim?
Dərd odur ki, dərd əhlinin biri də qalmadı.

Bu zaman güllərindən vəfa iyi gəlməyir,
Məndə gülü gülşən görməyə həvəs qalmadı.

Bilik, elm və hünər sahibləri ümidsiz oldular,
Mənim də dünya əhlinə bundan sonra ümidim qalmadı.

Himmət başçımızın karvanından geri qalmışıq,
Bu karvandan zəng səsindən özgə bir şey qalmadı.

Hər nəfəsdə bulbul tək nalə edirsən,
Bir nəfəs dər, ey Məmai, nalə etməyə daha nəfəs qalmadı.

**YENƏ**

Necə cəm olum mən, saçların tək pərişanam,
Ey nigar, saçının hər tükü məni pərişan edir.

Ey ürəklər qibləsi, sənə könül verəndən bəri,
Qaşlarının qövsü cavanlığımda qamətimi əymişdir.

Qəlbimin telləri hörüklərinə elə bağlanıb ki,
Ürəyim yüz zəncirlə məni sənin kuyinə çəkir.

Ətirli zülfünün söhbəti araya gəlsə,
Mənim pərişanlığım ətrindən aradan qalxar.

Qəlbləri ovlamaqçün dayanıb hər tərəfə nəzər salırsan,
Əfsunkar gözlərin daim hörüklərini kəmənd halqası etmişdir.

Ey nigar, məst gözlərin maqnit tək olub,
Qaş-gözünün hər baxışı qəlbimi məndən alır.

Sən tək dildardan Məmai qəlbini necə qorusun?
Qara xalın adamdan göz qarasını alır.

**YENƏ**

O qədər ahü nalə etdim ki, fəryada tabım qalmadı,
O qədər səndən dad etdim ki, fəqana taqətim qalmadı.

Qəminin sevdasından damarda qanım alovlandı,
Həsrətdən başqa qəmli canü dilimdə heç nə qalmadı.

Dost yolunda hər şeyimi sərf etdim, heç nəyim qalmadı,
Allahın bəxş etdiyi eşqdən başqa canü dilimdə heç nə qalmadı.

O qədər dostu yad etdim ki, varlığım xəyal oldu,
Dost xəyalından başqa indi yadımda heç nə qalmadı.

Hər gecə mənim halıma şam sübhədək ağlar,
Gündüzlər kölgəmdən başqa imdadıma heç kəs qalmadı.

Şirin canımı sərf etdim, yar şirin (söz) demədi,
İndi Bisütunda Fərhadımın fəryadı qalmadı.

Məcnun tək gözəllər məclisinə həsrətəm,
Leylinin mənzilində küləkdən başqa bir qasidim qalmadı.

Məmai, qəlbinin ney səsindən nəfəsdən düşdün,
Çanü dilim sakit oldu, fəryada taqətim qalmadı.

**YENƏ**

Ey gözəl, gecələr səni xəyal içrə ağuşuma aldım,
Səhər səni yanımda tapmayıb, nalə və fəryada başladım.

Sənsiz ki, o qədər fəryad etdim, fəryaddan zəiflədim,
Dünyanı yaralı gözlərimin yaşı ilə islatdım.

Sərv qamətindən bir an bəhrələnmək ümidilə,
Həyat ağacını həsrət ucundan bəhrəsiz etdim.

Xumar gözlərindən o qədər məstəm ki,
Onun yadı ilə hər gecə sübhə tək məstanə nalə etmişəm.

Demirəm qəlbin daşdır, ey qəflət güzgüsü,
Qəlb güzgüsün sındırdım ki, qəlbini xəbərdar edim.

Gözümdən peymanə-peymanə al göz yaşları axır,
Badə həstərilə qəlbimin peymanəsini ciyər
qanı ilə doldurdum.

Zülfünün dastanı başa çatmadı, ömrüm başa çatdı,
Bununçün də Məmai zülfünün dastanını müxtəsər etdi.

## YENƏ

Ey gülüzlülər şahı, mən yazığın halını soruş,
Nə qədər məni gözdən salacaqsan, halımı soruş!

Sən gözəllik padşahı, mən sənin qulunam,
Öz qullarının halını, ey padşah, soruş!

Canü dilimi sənin razılıq yolunda qoymuşam,
Qəlbimin halını, sən Allah, soruş!

Əgər zülfünün əsirlərinin halını soruşsan,
Məni onlar arasında, onlardan ayrı soruş.

Yanıqlı ürəyin halını bilmək istəsən,
Öz məclis şamından soruş!

Mən aramsızın halının pərişanlığını,
Ya zülfündən soruş, ya badi-səbadan.

Qəlb və gözlərimin səndən şikayəti var,
Bu macəranı qəlb və gözlərdən soruş!

Mən sənin əhd və vəfan üzündən fəna oldum,
Əgər inanmasan, sən Allah, bu Fənadan soruş!

Onun ruhuna həmişə haqqın rəhməti olsun,
Bu beyti, gəl, Səlmanın sözündən soruş!

Bir sözlə, bütün qəlbisınıqların halını övrən,
Mən daha qəlbisınıq olduğum üçün əvvəl məndən soruş!

Qəlbimin yarası heç kəsin mərhəmindən sağalmaz,
Ey Məmai, qəlbinin dərdinə dərmanı o aydan soruş

## YENƏ

Rəvadırmı, könül, naəhlə bir dəm kəşfi-hal etmək?!
Məqali-hailə nafəhmə təfəhhümi-məqal etmək?

Nə bilsin əhli-dərdin halını bidərd olan kəslər,
Nə hasil biməlal əşxasə izhari-məlal etmək?

Küdurət əhlini müşküldü qılmaq mehriban, ey dil,
Olurmu abi-xakaludi bizəhmət zülal etmək?

Təkəbbür etsə nadan, dövlətü malə nədir sudi?
Səmər verməz ərusi-zişt üçün qönçi-dildil etmək.

Qədəm çək, ey könül, yox istiqamət əhli-aləmdə,
Kifayətdir bizi hər nakəsə cüz'i-cəlal etmək.

Yetən həddi kamala uğrayar, bişək, zaval üzrə,
Fələyin adətidir bədr olan mahı hilal etmək.

Yetibdir hansı aşiq vəsli-məş'uqə cahan içrə?
Xilafi-eşqdir üşşaqə ümmidi-vüsal etmək.

Olaydı kaş daim gül gül ilə, xar xar ilə,
Cəfadır, ey fələk, naəhli yari-əhli-hal etmək.

Məmai, zinətı-bəzmi-səfadır dürri-əş'arın,
Sənə lazımdı daim mə'niyi-rəngin xəyal etmək.

## YENƏ

Etdi sərməst məni nərgisi-pürxablərin,
Çəkdi zəncirə əcəb türreyi-pürtablərin.

Qarət etmiş o siyəhməst gözün dil mülkün,
Taqətü tabın alıb aşiqi-bitablərin.

Qıldı ruyin fələyin bədrini hər ayda hilal,
Əydi qaşın, sənəma, tağını mehrablərin.

Görsə hər kimsə ləbin üstə düşən xalü xətin,
Dərk edər rəsmi-xətin nöqteyi-ə'rablərin.

Səfheyi-ruyinə yazmış qələmi-sün'i-xuda,
Xuni-üşşaq ilə şərhi-qəmi-dilbablərin.

Dürri-əş'arə xiridar hanı Şişəara?
Varmı bir müştərisi lölöi-kəmyablərin?

"Məhfili-üns"ə yazıb tazə qəzəl səbki-Məmai,
Ta aça təb'i qəzəl kuyini əhbablərin.

## YENƏ

Gəl indi kim, ölürəm, ayrılıq zamanıdı,gəl,
Bahari-ömrümün, ey nazənin, xəzanıdı, gəl.

Təbəssüm eylər olub halıma könül zəxmi,
El içrə faş olub ol zəxm kim, nihanıdı, gəl.

Qübari-xaki-rəhin pak edərdi müjganım,
Səpən su yollarına çeşmi-xunfəşanıdı, gəl.

Gülüm, gül olmasa bülbül nəvası etməz əsər,
Xarab gülşənara bülbül aşiyanıdı, gəl.

Pozuldu gülşəni-ömrüm, bahari-can soldu,
Sirişki-ali-rüxi-zərd qəm nişanıdı, gəl.

Biya, biya ke, mara taqətl-fəraq toi,
Məro, məro ke, konun mərhəmət zamanıdı, gəl.

Məmai, qafiyə təng oldu, özgə mətlə yaz,
Qəzəlsəralıq ilə vəqti-imtəhanıdı, gəl.

## YENƏ

Gəl, ey qərari-dilü cani-natəvanım, gəl,
Tükəndi taqətü tabım, gəl, ey təvanım, gəl.

Könüldə sən gedəli qalmayıbdı taqətü tab,
Dəvayi-xatiri məcruhü xəstə xanım, gəl.

Sən olmayanda olur əndəlibi-natiqə lal,
Gülüm, səfayi-dilim, yari-mehribanım, gəl.

Qiyami-qamətini yad edəm, qiyamət olur,
Qiyam eylə, gəl, ey sərxoşü rəvanım, gəl.

Tutardım eşqini nihan, gözüm yaşı,
Edibdi faş cahan içrə dastanım, gəl.

Sınıbdı balü pərim, yoxdu taqəti-pərvaz,
Dağıldı gülşəni-dəhr içrə aşiyanım, gəl.

Qəzəlsərayi-Məmai əndəlibi-gülşəni-hüsn,
Üçüncü mətləi yaz, türfə xoşbəyanım, gəl.

## YENƏ

Gəl, ey ənisi-dili-müstəməndü zarım, gəl,
Qərari-xatiri-məcruhü biqərarım, gəl.

Xəzan olubdu fəraqında gülşəni-ömrüm,
Gülüm, gül olmaz əvəz ruyinlə, baharım, gəl.

Sən olmasan, mənə yox nəş'ə cami-işrətdən,
Fəda olum gözünə, gözləri xumarım, gəl.

Kəməndi-silsileyi-zülfə bağlıdır könlüm,
Tərəhhüm eylə, sən, ey zülfi-müşkbarım, gəl.

Gələndə bas qədəmin cana, cana minnətdir,
Nisari-xaki-rəhindir dili-fikarım. gəl.

Düşəndə yadıma, cana, xurami-qaməti-sərv,
Gözüm yaşından olur gülsitan kənarım, gəl.

Ümid qıldı məni naümid vəslindən,
Yetişdi başa, gözüm nuru, intizarım, gəl.

Məmaı naləsi yetmiş süpehri-ə'layə,
Yetişmədi sənə bir ləhzə ahü zarım, gəl.

## YENƏ

Getmə, ey munisi-can, ruhi-rəvanım, getmə,
Bağlıdır silsileyi-zülfünə canım, getmə.

Yoxdu hicranına tabım, dəxi arami-dilim,
Qoyma bitabü təban, tabü tavanım, getmə.

Qıldı bimar məni nərgisi-bimarlərin,
Olub innab ləbin quti-rəvanım, getmə.

O qədər ağlaram, afaqı tutar su, getsən,
Gil edər yollarını əşki-rəvanım, getmə.

Sən olanda olur aram mənim dərdi-dilim,
Getmə, faş olmaya bu dərdi-nihanım, getmə.

Getməyin oldu qiyamət qəmu ərbabi-dilə,
Gəl, qiyamət eləmə, sərvi-rəvanım, getmə.

Sərqətari-qəmü möhnətdi Məmai könlü,
Cərəsi-naqən olur ahü fəğanım, getmə!

## YENƏ

Bu necə dağ idi eşqində, mənim canımdır,
Bu necə dərd idi, sərmayeyi-dərmanımdır?!

Zülfü ruxsarınara küfrdə iman tapıb,
Bu gecə küfrdü kim, mayeyi-imanımdır?!

Verirəm canımı yüz can ilə, verməm zərrə,
Xaki-payini ki, sərçeşmeyi-heyvanımdır.

Səndən, ey can, ola haşa dilara xaşaki,
Xarü xaşaki-cəfalər gülü reyhanımdır.

Mənə derlər ki, könül vermə sənin tək yara,
Məgər, ey şux, könül bəndeyi-fərmanımdır?

Həlqeyi-türrələrin silsileyi-payi-dilim,
Pərdeyi-mahrüxün bari-ğəmi-canımdır.

Ey Məmai, eləmə eşqi-pəriruləri tərk,
Kim, əzəldən bu mənim əhd ilə peymanımdır.

## YENƏ

Könlüm edər həmişə səni, dilbər, arzu,
Od urdu cismü canımara yeksər arzu.

Sən bir girami gövhərsən, mən fəqiri-eşq,
Müflis olan həmişə edər gövhər arzu.

Gözdən salıb o nərgisi-bimarlər məni,
Müddətdi məst gözlərini gözlər arzu.

Mən kafəri-məhəbbətəm, ey təl’əti-behişt,
Bicadı, gər behişti edə kafər arzu.

İslam görsə qamətini, bütpərəst olur,
Bütxanə içrə vəslin edər bütlər arzu.

Tənha nə mən müqəyyədəm ol zülfi-ənbərə,
Aləm edər o türreyi-müşki-tər arzu.

Gəl bir xuramə, mən dolanım başına,Məmai,
Daim o sərv qamətini eylər arzu.

**YENƏ**

Pərişan eyləyən halım səri-zülfi-nigarımdır,
Qılan xəm qamətim ol sərvqədd gül’üzarımdır.

Camalın görməsəm bir dəm, mənə hərgiz qərar olmaz,
Mənim ol məh şəkibimdir, rəvanımdır, qərarımdır.

Dedim: Huşyar ikən, cana, məni sərxoş qılan kimdir?
Dedi: Bu kəc nigahım, nərgisi-məstü xumarımdır.

Ləbindən sordum, ey gül, qönçə tək kim qan edib könlüm,
Təbəssümlə dedi: Sorma, ləbi-şiringüvarımdır.

Dedim: Kimdir qılan pabəsteyi-zəncir üşşaqı?
Urub əl tari-geysuyə: Bu zülfi-müşkbarımdır.

Əlimdə ixtiyar olsa, əsiri-zülf olmazdım,
Məni pabənd edən zülfə dili-biixtiyarımdır.

Xəyali-xali-ruyinlə şəbi-hicrində, cananım,
Ənisim şəm’, yarım dideyi-əncümşümarımdır.

Dönübdür qanə könlüm Şişə içrə, yox bilən halım,
Buna şahid rüxi-zərdim, bu çeşmi-əşkbarımdır.

Məmai, ol pəridir huriyi-gülzari-firdövsim.
Camalındır behiştim, gülşənü bağü baharımdır.

**YENƏ**

Səri-zülfi nigarə gər pərişanlıq səbadəndir,
Mənə daim pərişanlıq o zülfi-müşkasadəndir.

Əsiri-qeydi-zənciri-səri-zülfı-nigar oldum,
Siyəhbəxt olduğum, yarəb, o geysuyi-dütadəndir.

Dəvayi-dərd derlər, ey sənəm, ol lə'li-gülfamı,
Mənim dərdim, əzizim, nazəninim, ol dəvadəndir.

Könüldə nuki-müjganın açıbdır çak-çak üzrə,
Dilaramım, könül zəxmi o çeşmi-dilrübadəndir.

Vəfa etdikcə daim, dilbərim, səndən cəfa gördüm,
Mənim fəryadü əfğanım sənin tək bivəfadəndir.

Qəriqi-bəhri-eşqəm, kəştiyi-canım şikəst olmuş,
Mənə ümmid sahili, ey könül, bir naxudadəndir.

Şikayət etməzəm hərgiz mənə əğyar cövr etsə,
Məmai, şikveyi-dil bir vəfasız aşinadəndir.

### YENƏ

Çəməndə nərgisi-şəhla gözün fikrilə məst olmuş,
Olub bimari-hicranın, onunçün paybəst olmuş.

Kəməndi-zülfı-mişkinə düşən afətdən eyməndir,
Bu zənciri-cünun ərbabi-halə tazə bəst olmuş.

Ləbindən sordum ahəstə dəhanın sirri-pünhanın,
Dedi: Bilməz ədəm sirrin olar kim, meypərəst olmuş.

Dəyibdir tə'nə daşı könlümə bir şux rənadən,
Dəxi peyvəst olmaz şişeyi-xatir, şikəst olmuş.

Atıb min navəki-müjgan o çeşmi-nərgisi-məstin,
Sərasər qanlı könlümdə o navəklər nişəst olmuş.

Olubdur binəva könlüm həmişə dərd yığnağı,
Mənə dərdü bəla qismət məgər ruzi-ələst olmuş?

Olub biganəpərvər, aşinalar bivəfadırlar,
Məmai, nəxli-peymanü vəfa aləmdə pəst olmuş.

### YENƏ

Süzgün baxanda aşiqi-nalanə gözlərin,
Min naz oxun vurar bu dilü canə gözlərin.

Bir dəm baxıb gözümdən axan qana gözlərin,
Aya, olurmu dərdi-dilim qanə gözlərin?!

Qaşınla çox yeganədi, bilməm nə fitnə var,
Əyri ilə olub yenə həmxanə gözlərin.

Tel-tel açanda həlqeyi-geysunu bağladı,
Hər tari-zülfə min divanə gözlərin.

Bimari-hicrinəm, nola bir sorsa halımı,
Ey ahuvəş, o nərgisi-məstanə gözlərin?

Bənzətsə çeşmi-məstinə ahu nigahını,
Eylər şikar navəki-müjganə gözlərin.

Ey kaş, zülf silsiləsin boynuna salıb,
Qədd üzrə dara çəkdirə şahanə gözlərin.

Həsrətsiz, ey Məmai, gedərdin bu dəhrdən,
Baxaydı can verən dəm o cananə gözlərin.

## YENƏ

Başımda çini-zülfi-siyahın havası var.
Ya Rəb, bəlalı başımın axır xətası var.

Bel bağlama o tari-səri-zülfə, ey könül.
Gər var isə bu mərdümi-çeşmin vəfası var.

Könlümü tari-zülfi-pərişandan istərəm,
Bilsəm əgər o çeşmi-sivahın rizası var.

Tənha nə mən müqəyyədi-zülfi-siyahınam,
Hər türrəsində mən kimi min mübtəlası var.

Zülfün hədisi şərhi-mütəvvəldir, ey sənəm,
Gəlməz bəyana həşrə kimi, intəhası var?

Hər guşədə o nərgisi-məstanə gözlərin,
Məcnunu var, müqəyyədi var, aşınası var.

Dildən düşüb əgərçi, Məmai, sınıq könül,
Ney tək nəvayə gəlməyə şurü nəvası var.

## YENƏ

Eyd oldu, gözüm görmədi ol mahcamalı,
Ol sərvqədü lalərüxü arizi-alı.

Əfsus ki, mən görmədim əbruyi-nigarı,
Eyd eylədilər xəlq görüb tazə hilalı.

Eyd ol dəm olur mən kimi məhzunü fikarə,
Can kimi basam bağrıma ol tazə nihalı.

Dövrani-dəni qoymadı bədr olmağa, ya Rəb,
Tez tapdı mənim taleyimin mahi-zavalı.

Aşüftəliyim baisidir zülfi-pərişan,
Sərgəştəliyimin səbəbi daneyi-xalı.

Hicran qəmi öldürdü məni-zarı, Məmai,
Bundan sora müşküldü görəm ruzi-vüsalı!

## YENƏ

Hər dəm düşəndə səfheyi-ruxsarə tellərin,
Yandırdı, ey sənəm, məni odlarə tellərin.

Tel-tel açanda həlqeyi-zülfi-müənbərin,
Sədparə qıldı könlümü sədparə tellərin.

Ömrüm yetişdi baga, əlim zülfə yetmədi,
Axırda bağladı məni bir tarə tellərin.

Niy tari-zülf, riştəyi-canımdürür mənim,
Qılmış cəbini üzrə onu parə tellərin.

Bir dəm kənar olmadı ol məhcəmalidən,
Olmuş hicab arizi-gülnarə tellərin.

Salmış kəməndə, tirü kəman ilə oxlayır,
Şəhla gözün, hilal qaşın, qarə tellərin.

Səyyadvar dami-səri-zülfə bağlayıb,
Etdi şikar nərgisi-bimarə tellərin.

Etmiş əsir silsileyi-zülfi-pürxəmə,
Məcnunsifət çəkib məni bazarə tellərin.

Cana, Məmai dərdinə dərman bulunmadı,
Ey kaş, edəydi dərdinə bir çarə tellərin.

## RÜBAİ

Dünən gecə pəri üzlü, şirin dillim,
Gümüş bədənli, gül yanaqlı ayım.
İstədi mənim kamımı öz dodağından versin,
Nəhayət, canım burnuma gələndə arzuma çatdım.

## RÜBAİ

Ey hilal qaşlı, orucluq ayının ay parası sənm qaşın
gorunduyu səbəbdən,
Onun görünüşü gələn ilə qədər uzandı.
Məmai bayram günündə sənin üzünü görəndə,
Hevrətdən halı tamam başqa cür oldu.

**Məmo bəy Məmainin şeirləri 1309-cu il zülqədənin əvvəlində (iyun, 1892) tamam oldu**.

**Vər. 235a**

## MİR MÖHSÜN NƏVVAB
## AĞAMİRZADƏ QARABAĞİ

**Mir Möhsün Nəvvab bin mərhum MirƏhməd bin Mir Fərzənd bin Mir Fəsih bin Mir Səburdir. (Allah onların məqamını yüksək ersin). Mərhum Mir Fəsih də həmin kəsdir ki, Şuşa şəhərinin cənub tərəfində məqbərəsi var və bu şəhərin əhalisinin ziyarətgahıdır.**

**Nəvvab 1249-cu ildə (miladi 1833) Şuşa şəhərində anadan olub. Yeddi yaşından elmləri öyrənməyə başlayıb. Ərəb, fars və Azərbaycan dillərində məharət göstərmiş, bu üç dildə həm nəsrlə, həm də nəzmlə əsərlər yazmışdır. "Cefri-camei-Murtəzəvi" bu qəbildəndir, 28 iqlimdən ibarətdir, hər iqlimi 28 şəhərdən, hər şəhəri 28 məhəllədən, hər məhəlləsi 28 evdən, hər evdə də 4 müstəqil hərf. Bu kitabın çoxlu xüsusiyyətləri var. Məsələn, hərgah bir şəxs iynəni fal hərflərindən birinə batırsa, birinci, ikinci və ya üçüncü səhifədən hər hansı birinə, kitabın axırıncı səhifəsində o hərfdən (iynə) çıxacaq. Məsələn, bir şəxs birinci səhifənin birinci evindən iynəni birinci evin ikinci hərfi olan "əlif" ("a" hərfi) hərfindən batırsa, bütün səhifələrdə "əlif " hərfindən çıxacaq və ya "ba", "cim" və başqa hərflərdən, hər hansından istəsəniz, yenə belə olacaqdır.**

**İkinci xüsusiyyəti: Əgər bir şəxs istəsə ki, keçmiş və ya gələcək əhvalatlardan "Cefri-came" (vasitəsilə) xəbər tutsun, istədiyi dildə istədiyi sözlə kifayətlənə bilər. Ancaq istintaqı, yəni onun cavabını haman dildə və sözlə tapacaq. Ərəb əlifbasında və dilində olmayan bir neçə hərfdən başqa. Onları ya ərəbləşdirmək və ya da farslaşdırmaq lazımdır. Xülasə, bütün xüsusiyyətləri yazmaq uzun olar. Mən bu kitabı 14 ayın müddətinə yazdım — nə az, nə çox. Hələ üzündən köçürdüyüm nüsxəni hesab etmirəm. O nüsxəni adlı-sanlı, səxavətli və böyük şahənşah Nasirəddin şah Qacarın adına xətm etmişəm. Nasirəddin şaha yazdığım bir neçə fərdi, xoş olsun deyə, bu kitabda da verirəm.**

### NASİRƏDDİN ŞAHIN MƏDHİ

Dünya şahənşahı xoşbəxt olsun, şöhrətli olsun.
Şahənşahlar tacının gövhəridir, dünyanın pənahı,

Allahın kölgəsidir, müsəlmanların köməyidir.
Onun pak vücudunu zəmanə alqışlayır.

Əzizlik mülkünün şəhriyarı, qüdrətli padşahdır.
Padşahlar yadigarıdır, cah-cəlallı tacidardır.

Dinköməkçisi, dünyanın sahibi, din hamisidir.
Nasirəddin şah alidir, ona qurban olum.

Şöhrəti daima yer üzündə var olsun,
Əzəmətinin ay və günəşi Ay və Günəş tək parlasın.

Şərq və Qərb əhli deyər: İran şahı var olsun!
Ulduzlar qədər ordusu olan o şah yaşasın, var olsun!

Şahənşahın mədhini Nəvvab dəftərə yazdı.
Dövlətinin günəşi hər il, hər ay parlasın.

**Əlavə olaraq aciz bəndənizin yazdığı əsərlər içərisində nəzmlə yazılmış iki cildlik "Kənzül-Mihən və Bəhrül-Həzən", bir cildlik "Muxtarnamə" əsərləri də vardır. Bunların hər üçü təqribən 12 min beytdən ibarət olub, Kərbəla əhvalatına, 12 imam müsibətinə, imamlığına, şəhidliyinə və dəfn olunmasına həsr olunmuşdur. Həzrəti Davudun "Məzamirin"ə bənzər bir cild "Məzamir" əsəri, bir cild "Batilüs-Sehr" - İslam əlifbasının xeyri və onun başqa əlifba ilə əvəz edilməsinin zərəri haqqındadır. "Nəsihətnamə" kitabı 500 faydalı həkimanə öyüd- nəsihətdən ibarətdir, bir cildlik "Şəmsül-hidayə" kitabı - protestant ruhanilərinin iradlarına öz kitablarına əsasən cavab, nücum elminə aid "Kifayətül-ətfal" kitabı, Məhəmməd peyğəmbərin şəriət əhkamlarının faydası haqqında "Nurül-Ənvar" risaləsi, Qarabağ şairlərinin təzkirəsi kitabı, farsca və türkcə şeir kitabları, üç cildlik hamı üçün favdalı təmsil və hekayətlərdən ibarət "Kəşfül-həqiqə" məsnəvisi, aydın və qısa şəkildə musiqi elmi haqqında " Vüzuhül-Ərqam" kitabı, peyğəmbərlərin müsibəti haqqında "Məsayibəl-əxyar" kitabı, "Asarül- əimmə" kitabı – peyğəmbərlərin və şiə imamlarının həyatına həsr olunub, bir cild nəsrlə yazılmış "Muxtarnamə", məl'un babi tayfasının rəddinə yazılmış bir cildlik "Ziyaül-Ənvar" kitabı, bir cild "Erməni və müsəlman davasının tarixi" kitabı, bir cild türkcə "Müsibətnamə" kitabı da var və hamısı hal-hazırda mövcuddur.**

**Bu mövzuların yazılmasında öz həmdəmlərimə və millətə səmimi xidmətdən başqa bir məqsədim olmayıb. Ümid edirəm ki, Allahın yanında qəbul olunacaq və din qardaşları məni xeyir-duası ilə yad edəcəklər.**

**Bunları ömrümdən altmış il keçən vaxt yazıram. 29 yaşında evlənmişəm. Zəmanənin elmlərindən ancaq bəzi qəribələrinə xüsusi həvəs göstərmişəm və öz ömrümü bu elmlərə həsr etmişəm. Cefr və rəməl, üstürlab, nücum, musiqi, kimya, simiya, himiya, rimiya, limiya, vüfuq, xəvatim, şairlik, rəssamlıq, ruhların təsxiri - üç il bundan əvvəl Allahın köməyi ilə əlimə düşmüşdü, istədiyim hər müqəddəs ruhu çağırıb, onunla sual-cavab edə bilirəm.**

**Təzkirənin məqsədi zəmanə şairlərinin həyat və yaradıcılığını dövran ariflərinə çatdırmaq olduğundan mən bu məqsədə əməl etdim, aqillərə əziyyət verib, bu sətirləri yazdım. Və həmçinin məlumdur ki, həmdövranların**

**başağrısına və ariflərin iradına səbəb ola biləcək bir şey yoxdur. Cavanlıq illərimin əvvəllərində yazdığım bəzi şeirlər də ərz olundu.**

**Allahın köməyi və göstərişi ilə 1309-cu ilin rəbiül-əvvəl ayında (1891, oktyabr) yazıldı.**

## TÖVHİD

Ey işığı kövnü məkandan zahirü peyda olan,
Ey böyüklüyü yuxarı (göydən) və aşağıdan (yerdən) aşkar olan!

Ey dərgahı bütün başçıların səcdəgahı olan,
Sənin torpağın Musa və İsanın busəgahıdır.

İki dünyanın arif və alimləri qapının məcnunudur,
İki dünyanın aşiqü şeydaları qapının məhbubudur.

Getdiyim bütün yollar sənin kuyinə bağlandı,
Hər böyüklük axtardımsa, sənin qapında tapdım.

Hara baxdımsa, səndən başqasını görmədim,
Haradan keçdimsə, sənin calalını gördüm.

Ey Kə’bədə, kilsədə, xərabatda görünən,
Hər yerdə sən varsan, sən olmayan yer yoxdur.

İstəkli sənsən, səndən özgə məqsədimiz yoxdur,
Məqsədimiz sənsən, səndən özgə heç kəs yoxdur.

Ey dərgahı ciyərxun Nəvvabın sığınacağı olan,
İndi də, gələcəkdə də sən onun başında bəzəkli tacsan.

**Vər. 238a**

## NƏVVABIN TÖVHİD HAQQINDA TƏRBİİ (dördlüyü)

Ey zəmanə səxavət və kəramətinə minnətdar olan,
Sənin kəramət dənizinin həddi-hüdudu yoxdur.
Ey aşiqlərin qəlbi sənin qəm oxuna hədəf olan,
Xalq səni düşünür, sənsə aramızda qeyb olmusan.

Badə və meyxanədən məqsədim sənsən, sən,
Peymanə və xümxanədən istəyim sənsən, sən,

Kə’bə və bütxanədən məqsədim sənsən, sən,
Məqsəd sənsən, Kə’bə və bütxanə — bəhanə.

Minbər və mehrabdan könlüm incikdir,
Kilisə və xərabatdan cana gəlmişəm.
Hacılar Kə’bəyə can atır, mən isə səni istəyirəm.
O, evi axtarır, mən isə ev sahibini.

Məbədgahım gah dağ və biyaban olur,
Gah bağ və gülüstanda abid və sacid oluram.
Gah kilsədəyəm, gah da məscid sakini,
Yəni ki, səni xanəbəxanə axtarıram.

Haraya getsən, parlaq işıq görmək olar,
Harda olsan, parlaq şölə görmək olar.
Hər verdə yar üzünün əksini görmək mümkün ikən,
Dəli deyiləm ki, xanəbəxanə gəzim.

Bütün aləm sənə yaxın olmaq istər,
Hamı kuy kimi sənin ardınca qoşur.
Hər kəs bir səslə səni tərif edir:
Ney öz nəvasilə, mütrüb öz təranəsilə.

Nəvvab sənin hərəminə ayaq basmağa haqqı olandır,
O sənin səadətli dərgahının yetişdirməsidir.
Ay kimi incəlsə də, kərəminə ümid edir.
Yəni ki, günahın bundan yaxşı bəhanəsi yoxdur.

## NƏVVABIN TƏXMİSİ*

Cana, sənin bal sözün baldan yaxşıdır,
Dodaq və ağzının balı südlə şəkər kimidir.
Yəqin sənin acı sözün kövsər suyu kimi dadlıdır.
Söz nədən getsə də, dost sözü daha yaxşıdır.
Dostdan gələn xəbər ruhpərvər olur.

Məndən nə üçün vəhşi ahu tək hürkmüsən,
Nazü nəzakət gülüstanında gəzirsən,
Hüma quşu tək göylərə uçubsan,
Sanki hazır-qayibin varlığını eşidibsən?
Cəmiyyət içrə qəlbimin yeri başqadır.

---

* Sə’di Şirazinin bir qəzəlinə təxmisdir.

Bizim nə cananımız, nə şamımız, nə həmsöhbətimiz var,
Nə gülüstan, nə gülzar, nə də bağü çəmən seyrimiz var.
Nə vüsal şadlığımız, nə də ayrılıq dərdü-qəmimiz var,
Əhali bağ və çəmənə gedən zaman,
Nikbinlər üçün bağü çəmən dilbərin kuyidir.

O ətirli gül getdi, gözdən pünhan oldu,
Canımdan ruhi-rəvanımı aldı.
Hicrdən bənövşə tək başıaşağı olmuşam,
Kaş mənim hirslə küsüb getmiş yarım,
Qayıtsın ki, müştaq gözlərim qapıdadır.

Ömrümün günəşi qəmindən qüruba düşdü,
Bədənim hilal tək nazilib zar olub.
Qəm toruna düşdüm, ey nalə, nalə qan ağla!
Sənsiz gecələrim gordur xəyalımda,
Sənsiz səhəri məhşər günü hesab edirəm.

Dostsuz əziz ömrüm tamam oldu,
Ayrılıq günü mənimçün qaranlıq gecə tək oldu.
Nazü işvə bağında səni naz ilə gedən gördüm,
Ənbər iyli saçların boynunda hörüklənmişdi,
Gülüzlü məşuqun bəzəyə nə ehtiyacı var?!

Nəvvab ömrünü vüsal vədəsilə başa vurdu,
Gözlərindən nuru getdi, lakin vüsala çatmadı.
Ey canü dil, müjdə verirəm ki, vüsala şəhid olubsan.
Ey Sədi, nahaq yerə sevinərək vüsala ümid bağladın.
Hicrin vüsalı öldürdü, hələ də hicran içindəyəm.

**QƏZƏL**

Elə ki yarın xəttü xalını və dodağını  yad edirəm,
Özümü zülfün zəncirinə giriftar edirəm.

Zahid öz sənəminə səcdə etdiyi kimi,
Mən də dildarın qaşının kamanına səcdə edirəm.

Gizlində rəsmini yazıq ürəkdə çəkirəm,
Aşikarda rəsmini mən divarda çəkirəm.

Gül üzünə bülbüllər tək nalə edirəm,
Özümü onun gül budağında tikan edirəm.

Gah sabit ulduza, gah səyyarəyə şikayət edirəm,
Gah onun hicrinin dərdilə qəlbim nalə edir.

Ahım göylərə qalxdı, göz yaşlarımın seli isə,
Yerə axıb, tüğyan etdi.

Gah gündüz, gah da qaranlıq gecədə,
Kilsədən, xanəgahdan, məsciddən onu tələb edirəm.

Gah Kə'bəni, gah da Kərbəlanı bəhanə edirəm,
Gah da dildarın sorağını meyxanədən edirəm.

Mənim ixtiyarım onun əlində olduğu üçün,
Daha vəsl və hicrdən söhbətin mənası varmı?

Nəvvabın ancaq canü başı var,
Onu da avağının torpağına qurban edirəm.

## RİYAKAR ZAHİDLƏRƏ

Yusal gecəsidir, bu bürovuz paltarı mən nə edirəm?
Yun cübbəni, bəzədilmiş qəbaları mən nə edim?

"Mənim-bizim" (təkəbbür) xirqəsini mən kimə verim?
Bu mürəkkəb səccadəni (canamazı) kimə satım, nə edim?

Məndə olan bu on yüz dənəli təsbihi hara qoyum?
Zahidliyi satsam əgər, on batmanlıq dəftəri nə edim?

Bu dolaşıq əmmaməni kimə kirayə verim?
Sonra boynumdakı bu zahidlik "təhtül-hənəki"
(çalmanı) nə edim?

Musadan qalmış bu daş-qaşlı əsanı,
Kimə tapşırım? Bəs bu möcüzəli əlimi nə edim?

Bir belə zəngulələri, boğaz səsləri, yoğun səsləri,
Bir belə ağlı, biliyi, kəmalı nə edim?

Bu təkəbbür balıncını, bu zərif zərli taxtımı,
Hara qovum? Bu aşkar hökmü nə edim?

Bir belə fəsahətli, bəlağətli və dərin ibarələri,
Bir belə müəyyən işarələri və kinayələri nə edim?

Qaşı, iki gözü, uzun iki tərəfli bığı,
Bu vəsməli, sürməli, rəngli saqqalı nə edim?

Nəvvaba eyib tuturlar ki, (əcəb) gözəl seçibdir,
Göz gördü, könül seçdi, mən nə edim?

* * *

Ey ay üzlü, sənin al çöhrən nurludur,
Xalü xəttin cənnət bağı tək ətirlidir.

Saçların zəncirvari, novbahardan (da) ətirlidir,
Üzün göy qübbəsindəki ay və günəş kimidir.

Bir an gəl bağın tamaşasını seyr et:
Sənin qəddin olan yerdə sərvin, çinarın nə həddi var?

Eşqin canü qəlbimə elə yoğrulub ki,
Elə bil, günəşin halqası öz nuruna qərq olub.

Sənin vüsal gecən mənimçün huri-cənnətdir,
Sənin ayrılıq günün mənimçün məhşər günüdür.

Hər gecə taleyim qaradır, zülmət gecələr kimi,
Hər saat sənsiz ruhi-rəvanım od-alovdadır.

Sənin eşqin Nəvvaba şirin düşəndən (gələndən) bəri,
Dağçapan tək (Fərhad tək) hər ölkə-şəhərdə məşhur oldu.

**Vər. 240b**

## İRAN ŞAİRİ ÜNQA VƏ MAHMUD BƏY QARABAĞİYƏ NƏVVABIN CAVABI (1284 hicri – 1867-68 miladi)

Nigarımın göy qübbəsində tayı-bərabəri yoxdur,
Hicrinin odunda qəlbimi ud kimi yandırdı.

Məscidə gəldi, qaşlarının mehrabını gördüm,
Şükr etmək üçün səccadənin üstünə də səcdəyə düşdüm.

İşvəli üz-gözü ilə gözlərimi bağladı,
Sunəmdən nazü qəmzə ilə qəlbimi apardı.

Sirlə dolu ürəklə yanına getdim, düşdüm ayaqlarına,
Arzı üzündən Ayazın ayağına düşən Mahmud kimi.

Onun şəm qamətinin ətrafında pərvanə tək dolandım,
Çünki niyyətimin (istəyimin) Kə’bəsi o idi.

O ay üzlü, daş ürəkliyə yalvarıb dedim,
Ki, nə vaxtadək hicrdə ud kimi yandıracaqsan məni ?

Üzümə baxdı, elə ki gördü titrəyirəm,
Gül qönçəsi tək, bu təranəyə başladı:

Ki, ey səməndər, ayrılıq ocağında yanan,
Hicran qəmində yanma, ud çal, nəğmə oxu.

Elə ki gecənin zülməti bir küncə çəkilib getdi,
Ey səhər quşu, buna göz yumma, səadət dəmi elə budur.

İndi canım əlimdə, gözüm yoldadır,
Günəş tək üzün göstərsə, ayaqlarına canımı ataram.

Ötəri eşq həvəsindən Ünqa kimi qaçdı,
Tərki-dünyalıq Nəvvabın nəsibi oldu.

Mahmud tək dönsə də bütpərəstlikdən Nəvvab,
Dünya gözəlləri yanında tərifə layiq oldu.

**Vər. 241a**

## MİR MÖHSÜN NƏVVAB BİR DOSTUNUN XAHİŞİ İLƏ 1314-CÜ İLDƏ (1896-97) MƏRHUM SEYİD ƏZİM ŞİRVANİNİN QƏZƏLİNİN ƏKSİNƏ DEMİŞDİR

Səmayi-övci-rif’ətdə nə xoş mehri-vəfasanmış,
Şəbistani-məlahət içrə şəm’i-pürziyasanmış.

Rüxün səthində aləmlər nümayan olmağın gördüm,
Yəqinim oldu kim, ayineyi-gitinümasanmış.

Olubdur Kə’beyi-kuyin qamu aşiqlərə qiblə,
Minayi-eşqdə zairlərə sə’yü səfasanmış.

Mütaa, məhcəbina, məhvəşavü mehriban yara,
Cahanda əhli-ürfana mətaü müqtədasanmış.

Şüai-şəmsi-ruyindən münəvvərdir kəvakiblər,
Şəbi-zülmati-heyrətdə məhi-leyləd-dəcasanmış.

Nə xoş maqnit kimi cəzb qıldın əqlimi sərdən,
Əzizim, gözlərim, canım, məgər ahənrübasanmış?

Ləbi-lə'lin kənarında yazıbdır xameyi-qüdrət,
Xəti-səbz ilə kim, ətşanlara maül-bəqasanmış.

Qalan bu külbeyi-hicran içində bikəsü zarın,
Dili-suzanına daim dəvasanmış, səfasanmış.

"Siratül-müstəqim"ə nuri-ruyin çəkdi Nəvvabı,
Necə Musanı eyməndə əcayib rəhnümasanmış.

* * *

Məni dildardan ayrı salan dildarsız qalsın,
Gül üzlü yardan təfriq edənlər yarsız qalsın.

Edən könlüm evin viran, salan hicrə məni-zarı,
Dağılsın xaneyi-qəlbi, görüm me'marsız qalsın.

Edən viranə bülbül aşiyanını gülüstanda,
Pozulsun rövnəqi gülzarının, gülzarsız qalsın.

Məni biçarə, bikarə edən bazari-dəhr içrə,
Müşəvvəş nöqteyi-qəlbi olub, pərgarsız qalsın.

Xudavənda, məni biqədr edən əğyarlar daim,
Hüzuri-yarda hər dəm, görüm, miqdarsız qalsın.

Mənim könlüm quşun ol zülfdən rəm eyləyən səyyad,
Qırılsın dami-ömrü, bazsız, şonqarsız qalsın.

Vüsali-yardan məhrum edən biçarə Nəvvabı,
İlahi, həşrə kimi şaxi-ömrü barsız qalsın.

* * *

Canan yolunda kimdi mənim kimi xar olan?
Daim bulaq kimi tutulub, əşkbar olan?

Gülzari-hüsni-pakına həsrət qalan bu gün,
Bülbül kimi nəvavü fəqanə düçar olan?

Şəm'i-camalına yana pərvanələr təki,
Xani-qüdumi-pakına gərdü ğübar olan?

Suzi-fəraqı ilə sızıldar yaralarım,
Mən kimi kimdi səbr edib, əncümşümar olan?

Nərgis kimi dikən gözünü yollara müdam,
Boynun əyən bənövşə kimi sövgvar olan?

Leyla xəyali ilə keçən günləri qara,
Vəhşilər ilə yarü vətənkuhsar olan?

Nəvvab kimi kimdi bəlaya düçar olub,
Mənsurvar şövqlə mənzuri dar olan?

* * *

Əğyarlər ayırdı məni kuyi-yardən,
Oldum kənar, heyf, o gülgün üzardən.

Yansın fəraq atəşinə mən kimi görüm,
Hər kəs məni ayırdı o çeşmi-xumardən!

Əfqanü zar eyləməsin, netsin əndəlib,
Ol dəm ki, ayrı düşdü güli-növbahardən!?

Könlüm quşu müqəyyəd olub dami-zülfünə.
Olmuş əsiri-zülf, nə qəm şahmardən?

Geysuyi-ənbərinə çatammaz əlim, nedim?
Yetməz məşami-cana o müşki-tatardən.

Sənsiz nə tabü taqətü aramü nə şəkib,
Vallahi, keçdi səbrü qərarım qərardən.

Əfsusü ah, yetmədim ol sərvqamətə,
Gün keçdi, iztirabü gecəm iztirardən.

Əncümşümar olubdu fəraqında gözlərim,
Al canımı, xilas elə bu intizardən.

Etməm umid vəsli-rüxi-yara həşrara,
Ta bir xət almasam ələ həştü çahardən.

Gər müjdeyi-vüsal cəzadə yetişməsə,
Heyhat, əgər ki, baş götürəm mən məzardən!

Nəvvabi-zar atəşi-hicranə qərq olub,
Pərvanəyə nədir dəxi pərva şərardən?

* * *

Ömrüm qurtardı dərdü qəmü ahü zar ilən,
Səbrim tükəndi hicri-rüxi-mahi-yar ilən.

Gülzari-hüsnə, heyf ki, bir etmədim nigah,
Bir ləhzə söhbət eyləmədim gül’üzar ilən.

Ahu nigahı ilə edib könlümü şikar,
Ya rəb, nə eyləyim belə şahinşikar ilən?

Şami-fəraqın ilə keçər günlərim qara,
Sevdayi-zülfün ilə gecəm şahmar ilən.

Bülbül kimi o gül üzünə həsrət olmuşam,
Allah rizası, qoyma ölüm intizar ilən.

Yüz min xəyali-ləşgəri-hicrani-bikəran,
Biçarə, bir nəfər neləsin səd hezar ilən?

Sayə kimi ayağına baş qoymuşam bu gün,
Olmaz riza, qalam belə mən əngisar ilən.

Nəvvabi-zar ahü fəqan ilə ruzü şəb,
Gözlər yolun bu dideyi-əncümşümar ilən.

* * *

Ey qəddü qamətli, cavan saqi,
Eşq meyindən nə vaxtadək pəhriz edəcəksən?

Zahidlər bir qətrəsini haram etmişlər,
Onların acığına mənə badələri doldur ver!

Mən ki yarınla eşqbazlıq edirəm,
Necə etməyim ki, başqa yolum yoxdur?

Allah etməmiş, onun eşqindən,
Məhşər gününədək tövbə etmərəm.

Əgər eşqindən Fərhad təki ölsəm,
Əziz təxti-tacda sanki yenə Xosrovam.

Günəş üzlü, ay üzlü o saqi,
Bal süzən, ənbər saçan o saqi.

Üzün döndərdi Nəvvaba tərəf,
Ağlını başından alıb qaçdı.

* * *

Bunu arzu edirəm ki, bütiin ayüzlülər,
Yanımda ola, mən də onların üzünə baxam.

Elə ki, onların üzünün nurundan qəlbim səmər götürdü,
O nurdan ruhi-rəvanım təzələndi.

Hara baxıramsa, yarın cilvəsini görürəm,
Ona görə bütün ağ buxaqlara gözucu nəzər salıram.

Dildarın üzünün günəşi əyandır, lakin,
Şamın ləzzətini kar və korlar nə bilər?

Hər gecə gündüz astananın arzusunu çəkirəm,
Bütün şahlar onun süpürgəçiliyi həsrətindədirlər.

Yarın üzünün eşqində yersiz dəm vursalar da,
Nəvvab tək yarın ləzzətini kim bilər dünyada?

* * *

Min dəfə demişəm: Yəmən əqiqisən,
Min dəfə görmüşəm ki, çox gözəl lə'lsən.

Min dəfə demişəm ki, sənin bülbülünəm,
Cənnət bağında sən də gül budağı kimisən.

Əgər gizlində dürrsən, mədəndə gövhər,
Min dəfə görsəm də, mənimçün günəş kimisən.

Kipriyinin oxundan sinə və ürəyimə,
Rüstəmin zərbəsi tək, min ox sancılır.

Min Xosrov, Şapur, Məryəmü Fərhad,
Sən tək şirin və şəkərağızlı görməmişdir.

Rəqib astananda uzun gecələr dayanıb,
Süleymanın qarşısında dayanan Əhrimən kimi.

Sənin cilvəndən qəlbimdə və gözümdə nur var,
Yə’qubun gözləri tək (Yusifin) köynəyini görür.

Sənin üzünü nə mədh edir bu yazıq Nəvvab,
Mehrü mahımsan, ya ki gül-çiçək bağımsan?

* * *

Maşallah ki, belə ali gövhər tək dilbərsən,
Pis gözdən uzaq, günəş və ay tək cilvələnirsən.

Sənin ürəkaçan qəddin vanında çay kənarındakı sərv
çox alçaqdır,
Güllükdən keçəndə gül sənin iyindən ətirlənir.

Hicrindən can yandıran göz yaşı tökürəm gecə-gündüz,
Lakin mən ağların halından sənin xəbərin yoxdur.

Göz və ürək Allahdan sənin vəslini istər,
Gecənin duası, səhərin ahü naləsilə.

Vüsal üfüqündə ümid səhərləri görünər,
Hər gecə gözləyirəm, ta ki, bir əsər görəm.

Səbirdən özgə vüsala bir çarə yoxdur,
Bəlkə, səba zülfünün ətrini hər səhər burnuma vetirə.

Gecə-gündüz Nəvvab sənin hüsnünü mədh edər,
Məftun bülbül tək, ya da ki, dağ kəkliyi tək.

**Vər. 243b**

## FATMA XANIM KƏMİNƏ XORASANDAN QAYIDAN ZAMAN NƏVVAB MİR MÖHSÜN ONA AŞAĞIDAKI ŞEİRİ YAZIB (hicri 1312-ci ildə – miladi 1894-95)

Şükr olsun, gözəllər ayı yenə Xorasandan gəlib,
Sanki yox olmuş Yusif Kən’ana tərəf gəlib.

Müştəri şərəfləndi, Zöhrə şadlıqlar etdi,
Eyvandakı ay indi Keyvana (Zühəl) gəlib.

Qəmgin qumruya müjdə ver, artıq qu-qu etməsin,
Gülüstana indi nazlı xuraman (gözəl) gəlib.

Müşk küləyi əsmişmi, karvan ətirgahdan keçmişmi,
Ki, belə xoş reyhan iyi gəlib?

Oruc adamlar tək şaşqın idilər "Əhli-xamuşan",
Onlar üçün bayram oldu, çünki nurlu ay gəlib.

Bir müddət idi bizim "Fəramuşan" xamuş idi,
İndi isə bülbül kimi bütün güllər üçün qəzəlxan gəlib.

Xan Qaradağı, Baki, Növrəs hər zaman,
Şaddırlar, işrət məclisinə ruhverən gəlib.

Gül tək açıldılar, büsbütün şad oldular,
Sanki İsgəndər üçün dirilik suyu gəlib.

Dövranın qəmindən qəmli idi bu qəmli Nəvvab,
Şad oldu, çünki Kəminə şad və xəndan gəlib.

## NƏVVAB BU ŞEİRİ XAN QARADAĞI HƏSƏNƏLİ AĞAYA O, "MƏCLİSİ-FƏRAMUŞAN" DOSTLARINI UNUDAN ZAMAN YAZMIŞDIR (hicri 1314-cü ildə – miladi 1896-97)

Keçdi o günlər ki, çatılmış qaşların var idi,
Kipriklərinin oxundan mənim halım pərişan idi.

Keçdi o günlər ki, yüz nazü qəmzən var idi,
Mənim sənə min ümidim, min arzu-niyazım var idi.

Keçdi o günlər ki, ətir qoxulu zülfün var idi,
Qaranlıq gecələr o, boynumda zəncir idi.

Keçdi o günlər ki, məst gözlərin var idi,
Dodağının zülalı məni badəpərəst etmişdi.

Keçdi o günlər ki, behişt tək üzün var idi,
Gözlərimdən yerə qanlı göz yaşları axar idi.

Keçdi o günlər ki, bahar tək hüsnün var idi,
İşim aşiq bülbül tək nalə etmək idi.

Keçdi o günlər ki, lalə tək yanağın var idi.
Yazıq qəlbimdə min dağ var idi.

Keçdi o günlər ki, Nəvvab qəlbisınıq və ağlar idi,
Eşqin odunda yandırdın məni səməndər kimi.

* * *

Ey vaxtını nazü nemət və şadlıqda keçirən,
Qorxuram ki, axırda bu işdən xeyir görməyəsən.

Yoxsulların urək yandıran ahı göyün ərşinə çatdı,
Səninsə gecədən sübhədək naləmdən xəbərin yoxdur.

Dinini dünyaya satarsan, heç qorxun yoxdur sənin,
Bir tikə çörəkçün gəda kimi qapılara düşərsən.

Heyvanlar gündüzlər yük daşıyarlar, gecələr yox,
Sənsə hər gecə-gündüz başqasına yüksən.

Minnət yükü çəkərsən, dünya nemətin dadmazsan,
Karvan gedib, sənsə səhər yuxusuna qərqsən.

Kəyumərs, Firidun, bütün şahlar hardadır?
Addan başqa onlardan heç bir əsər qalmayıb.

Əgər vaxtsız toxum əksən, biçin vaxtı,
Peşimançılıqdan başqa bu əkindən bir səmərin olmayacaq.

Nəvvabın nəsihətini sən ürək xəzinəndə qoru,
Sərraf təki bu gövhərin qiymətini bil.

**Vər. 244b**

## NƏVVABIN ÖLDÜRÜLMÜŞ NASİRƏDDİN ŞAH QACARA YAZDIĞI MATƏM ŞEİRİ

**Şah Əbdüləzimdə ibadət edərkən Kirman əhli olan Mirzə Rza adlı bir qəddar babi tərəfindən tapança gülləsi ilə öldürülmüşdür. 1896-cı il martın 19-da.**

Yenə də fələyin zülmündən aləmə od düşdü,
Matəm qovğası şöləlendi, can və qəlbə od düşdü.

İzzət dünyasının günəşi qaralıb tutuldu,
Qüdrət dünyasının ayının üzü tutuldu.

Qəflətən bağa şiddətli payız küləyi əsdi,
Sanki İrəm ağacı Kövsər (bulağının) üstünə düşdü.

Məliklər şahı olan Nasirəddin şah,
Şəhid oldu, babinin zərbəsindən tacı başından düşdü.

Məl’un babi dünya düşmənlərinin fitvası ilə,
Elə ki, İran şahının qətlinin fikrinə düşdü,

İbn-Mülcəm tək qətl alətini əbası altında gizlətdi,
Elə ki, şahənşahın gözü o alçağın üzünə düşdü.

İstədi ona iltifat etsin, lakin qəflətən,
Atəşdən bir güllə o nurlu şahın cisminə düşdü.

O qüdrət dünyasının cəsədi torpaq üstünə düşdü,
Qiyamət qopdu, sanki göyün qübbəsi yerə düşdü...

Elə ki şəriət naminə şirin canından keçdi,
Şahlar içində şöhrəti aləmə düşdü.

Ah, o andan ki, o alçaq, bihəya cəhalət üzündən,
Böyük və qüdrətli şahın qətli fikrinə düşdü.

Qan yağdır, ey asiman, ağla, ey buludlar,
Şahın meyidi, qızıla vurulan damğa kimi yerə düşdü.

Dünya babilərinin qanı şahın qan pulu olmaz,
Şahənşahın bir qətrə qanı dünyadan artıqdır.

Qan bahası Allaha qalıb, verər cəzasın!
Savabı hurilər, cənnət, həm də Kövsər olacaq.

Eyş-işrət məclisi qurulmuşdu şahənşah üçün, lakin,
Zülm küləyi qalxdı qəflətən, əlindən badə düşdü.

Yüksəklik şahini alçaq bir qarışqanın şikarı oldu,
Simurqun qüvvəsi arıq ağcaqanaddan da aşağı düşdü.

Dünyada heç kəs görməyib ki, simurq sərçəyə şikar ola,
Dünyada belə bir alçağın yaranması qəribə işdir.

İbn-Mülcəm din şahənşahının qətlinə müvəffəq oldu,
Bu məzlumun qətli isə kafir babiyə qismət oldu.

Kərbəla şəhidi qəm və kədərlə qətl olundu,
Pak boğazı alçaq Şümürün əlinə düşdü.

Ah və fəryad bu zülmdən, bu xalq şivənindən,
Bu zülmdən bütün dünyaya məhşər həyəcanı düşdü.

Bu zülm və sitəm ki, babilərdən çıxdı,
Onların qanı hədər oldu, qətlləri aşkar oldu.

Alçaq babi və Şümürə Allahın lənəti olsun!
Qiyamətə qədər daimi lənət hər ikisinə olsa, yenə azdır.

İl min üç yüz on üçüncü il idi ki,
Bu qədim və böyük dünyanın başına qəm daşı düşdü.

Bu müsibətdən qeyrət alovu ürəklərdə şölələndi,
Yazıq Nəvvabın ağlar canına da od parçası düşdü.

**RÜBAİ**

Qanlı göz vaşı axıt, ey yaralı ürək,
Bu firlanan dünya şahının məzlumluğuna.
Kim belə dövranı görmüşdür ki,
Tülkü qızmış şiri şikar etsin?!

**RÜBAİ**

Ey göz, ağla, Zayəndə çayı kimi yaş axıt,
Mavi göy qübbəsinin hiyləgərliyindən.
Belə bir şahı göylərə qaçırdı,
Sanki şahənşah heç vaxt olmayıbdır.

**Vər. 245b**

## MÜZƏFFƏRƏDDİN ŞAH QACAR HAKİMİYYƏT BAŞINA GƏLƏRKƏN ONA MƏDH OLARAQ YAZILIB (1314-1896)

Min şükür ki, baharın başqa səfasın gördüm,
Min şükür ki, yar gülzarə gəldi.

Hər tərəfdə gül, nəsrin, sünbül və süsən,
Sərvdə - şurlu qumru, qönçədə - oxuyan bülbül.

Firidun tək gül oturdu öz taxtına,
Qarşısında tikanlar ox-nizə kimi düzüldü.

Açıldı gülüstanın lalə gülləri,
Hamısının əynində qırmızı paltar, başında duvaq.

Gül budağı kölgəsi altda məst nərgiz yuxulamış,
Sərvin altında qırqovul, budağında nalə edən qumru.

Şadlıq nəğmələri bütün dünyanı bürümüş,
Bülbülün, əndəlibin, həzardastanın şurundan.

Yaşıl çəmən gözəllərin ayağı altda tapdalandı,
Elə ki arif və huşyarlar bağın seyrinə toplaşdı.

Ney səsi, tütək səsi, həm də şaqraq nəğmələr,
Qopuz, tənbur, tar səsi, həm də musiqar səsi.

Gah zil və bəm, gah da alçaq-uca,
Gah Mahur və Şur nəğməsi, gah da Həsar,

Gah Ərağ və Hicaz, gah Müxalifə, Məğlub,
Böyük-kiçik, Üzzal, gah da Bəstənigar,

Gah Nəva və Nişabur, gah Çargah və Segah,
Gah Dügah, gah Rah və gah da Xücəstə və Nar.

Şərəf evinə daxil oldu Ay və Günəş.
Xoşbəxtlik bürcündə sanki Müştəri tutdu qərar.

Qüdrət sarayına qədəm basdı Müzəffərəddin şah,
Dünya bir anda oldu sanki gülzar.

Ədalət taxtına əyləşdi zəmanə şahənşahı,
Padşahlıq tacını qoydu başına o nurlu şah.

Şöhrət və cahü cəlal dənizinin o yeganə gövhəri,
Qalib Müzəffərəddin şah, o sirlər mənbəyi.

Dünya şahının ətrafına vəzir və nədimlər dövrə vurdular,
Günəş və Ayın ətrafında səyyar ulduzlar dövrə vuran kimi.

İslam camaatı üçün böyük bir bayram oldu,
Sanki Heydəri-Kərrarın mübarək bayramı idi.

Payızın tufanından gülüstan solmuş idi,
Sanki cənnətə döndü büsbütün aləm.

Elə ki zəfər bürcünün Günəşi üzün göstərdi,
Yaramazlar nəhs, uğursuz bayquş kimi
mağaraya süründülər.

Ümidvarıq ki, nizamlı ola millətimiz,
Əvvəlki nizamdan yüz dəfə yaxşı ola.

Qulağıma dedi mənim o pak Cəbrayıl ki,
Nə qədər çalışsan, faydasızdır, huşyar ol!

Dünya şahına dua oxu daim, hər zaman,
Ki, odur həm kiçiyə, həm böyüyə Allahın kölgəsi.

İlahi, zamanın hadisələrindən sən qoru onu.
Dünya şahının vücudunu, Məhəmməd peyğəmbərin xatirinə!

Min şükür ki, azad oldu büsbütün dünya.
Yenidən bəzədi dünyanı şahənşah dünya qədər.

Böyük nemətinə təşəkkür etmək üçün,
Gərək mənə min dil verilsin.

Nəvvab, sənin qədər kim onu tərif edə bilər,
Əgər bulbul tək oxusalar da min belə şeir?

## NƏVVAB BU ŞEİRİ "MƏCLİSİ-FƏRAMUŞAN" ŞAİRLƏRİNƏ YAZIB (1311-ci ildə – 1893-94)

Gül mövsümü çatdı, baharın saflığı oldu aşikar,
Hardadır xoş xasiyyətli, şirindil saqi ?!

Niyə getdi ay camallı, mələk üzlü xanəndə,
Ki, yarın qəm evində naçar qalmışam?

Ki, bir anda qəlbimdə olan dərdi, qəmi silə,
Dəfin, tənburun, neyin, musiqarın səsi ilə.

Könül alan saqinin səfası, xanəndə və neyin nəvası,
Yardan, yarın naz-qəmzəsindən xəbər verir.

Tamaşa et ki, hər meyvə və yarpaqda nigarın adı var,
Tale onların üzünə qübar xəttilə yazıbdır.

Canü dildən eşit Quran ayəsini,
Ki, yarın üzü görünür hər qapıdan, hər divardan.

Qəmü heyrətdən əqlin cilovu əldən çıxıbdır,
Nə etdin, səhər yeli tək gah Rumdayam, gah da Tatarıstanda.

Öz qəlbinin güzgüsünə bir nəzər sal,
Gecə-gündüz həsrətində olduğun o kəsi gör!

Ki, yar (dost) sənin qəlbində hər zaman işıq nöqtəsi kimidir,
Sən bixəbər, nə pərgar dövrəsi tək dolanırsan?

Bəs elə ki, nəzər saldım,
Dünyanı və onda olan bütün böyük-xırdanı vahid gördüm.

Eşq olsun o gözələ ki, hər iki dünya meydanında,
Özü təkdir, cilvəsi min-min.

Zahidin, müftinin sözünə qulaq vermə sən,
İtaət var-yoxunu ver yarın cilvəsinə.

Öz ömrünün əsasını nisyə sözlərə qurban vermə,
Bu nəqd mənfəəti əlindən buraxma.

Dikbaşlıq edib,çox lovğalanma,
Ki, tezliklə kəllən ilana yuva olacaq.

Dünyanın qızıl-gümüşünü özünə qiblə etmə,
Səcdəgahının mərkəzi büt və zünnar olmasın.

Ürəyinin (qapısını) heç kəs üçün dar etmə,
O gülü üzmə ki, tikanın cürbəcür zəhmətini görəcəksən.

Dünya və onda olanlar büsbütün puçdur,
Əgər ağıllısansa, heç birinə könül vermə!

Dünyanın neməti şirini-acısıyla çox qəribədir,
Bir dəm güldünsə əgər, sonra ağlarsan zar-zar.

Bədəninin tükləri ucundan belə nalələr aşkar olar,
Bütün damarlarından avaz qalxar (tar simindən qalxdığı tək).

Sənə vəfa etmir, işi onun cəfadır,
Bu dünyanı mən yüz dəfə sınamışam.

Hanı Adəm, Nuh, Xəlil, İsmayıl?
Hanı Musa, İsa, hanı Məhəmməd (s.ə.s)?

Bütün dünyanın şahları torpaq altına getdi.
Gözəllər, bütün dünya torpaq altında tapdı qərar,

Bütün cəlalları yox oldu, evləri viran,
Camalları yox oldu, malları qurban getdi.

Vücudları büsbütün bir-birinə qarışdı,
Fəna dəyirmanında toz-torpaq oldular.

Min şükür ki, canan bizi görüb tanıdı!
Astanasının torpağına canımı qurban edərəm.

Böyük nemətinə (yaxşılığına) təşəkkür etmək üçün,
Gərək mənə min dil verilsin.

Nəvvabın nemət hüququ büsbütün tamam oldu,
Xar olmadan nigarın üzünü gördü.

## BAKİNİN NƏVVABA 1311-Cİ İLDƏ (1893-94) YAZDIĞI NƏZİRƏ

Ey qüdrətli və xeyirxah cənab,
Sənsən ali nəslin başının iftixar tacı.

Sözün yenidən ölünün canına can verdi,
Ağlar süsən çəmənində nisan qətrəsi kimisən.

Cansız gülün qəmzəsində, baharın işvəsində,
Min zümzümən, min minnətdarlığın vardır.

Hər adam özü bir gülüstandır,
Vücudu gülüstan, gözü gül, kiprikləri isə tikandır.

Lalə gülünün üzünün rəngindən demə, özündən danış,
Əynində məhəbbət paltarı, başında buxara papağı var.

Bülbülün hər nəyi varsa, bəli məndədir,
Bülbül mən divanənin naləsindən nalədədir.

Hər il çəmən gözəllər ayağı altda payimal olar,
Bakinin vücudu həmişə nigarın ayağına düşər.

Kimdir Ənvəri, Sədi, Hafiz, Hatif,
Bilmirəm kimdir Növrəs, Müştəri, Muxtar?!

Səadət göylərinin hüması bizə Nəvvabdır,
Xətti-hümayun odur və biz xətti-qübar.

Əgər qəlbin sinə yanğısından yansa belə,
Hər nə məndən eşitsə, onu söyləyər.

Çəngin səsi, neyin sədası mənim fəğanımdandır,
Bütün musiqar aşiqlərdən bir nişanədir.

Mənim naləm həmişə Dügahdan çıxır,
Sən ölç, birini yüz min hesab elə!

Xudbin şair hardadır, bizə cavab verə?
Ağlar nalələrim Xakinin canına od salıb.

Keçmiş və indiki şairlər nöqtə kimidirlər,
Bakinin gözü özü kimi pərgar görməyibdir.

**Vər. 248a**

## MİRZƏ MUXTARIN CƏNAB NƏVVABA NƏZİRƏSİ (1311 – 1883-84)

Gül gəlini elə ki duvağı (niqabı) üzündən çəkdi,
Minlərcə bülbül nalə və fəğan çəkdi.

Zəngulə vur, müğənni, saz və setarı çal!
Ağla, ey məftun bülbül, gəldi fəsli-bahar.

Ey mütrib, sən "Hisar"la, "Şur"la çalmağa başlamısan,
Tar isə "Müxalif" guşələrdə fəğan edir.

Ey saqi, eşq şərabı var, nigarı yad edərək,
Qəlb piyaləsi qəm şərabı ilə dolubdur.

Elə ki, hər tərəfdən bülbüllər gül üzünü gördülər,
Bundan nəğməyə başladılar musiqar səsiylə.

Baxın görün, xəstə nərgiz məni öldürmək üçün,
Kirpiklər sırasından nə əcəb qoşun çəkmişdir.

İtmiş qəlbimi axtarıb gördüm ki,
Zülfləri Mənsur təki onu dara çəkibdir.

Gah zahid təki Kəbəyə ehram tutmuşam,
Gah rahib təki kilsəyə gedib, boynuma zünnar taxmışam.

Məgər sən nəqşi-nigarsan, məgər sən surəti-çinsən,
Ki, nəqşi-nigardan heç kəs belə surət görməmişdir?

O nə adamdır ki, ipəkdən libas geysin?
Nəccar ağacdan yaxşı bir adam düzəldər.

Müştəri, Baki, Növrəs və Nəvvabın sözləri,
Ürəyin güzgüsündən pası silmişdir.

Başqa saqidən demə, saqiyi-Kövsərdən danış,
Muxtarın şəfaət əlacı yalnız ondadır.

**Vər. 249a**

## QƏZƏL

Yarın küçəsindən keçməyə icazəm olsa idi,
Onun torpağını gözümə sürmə edərdim.

Pərvanə tək kuyinin Kə'bəsinin dövrəsinə,
Min dəfə dövrə vurardım, əgər hünərim olsaydı.

Yarın xəyalı əgər səfərdə həmdəmi olsa idi,
Kə'bəyə getmək ehtiyacı qəbul olardı.

Yarın camalı Ay və Günəşə tay olmaz,
Bu ikisindən əlavə Ay və Günəş olsa belə.

Nəvvabın ömür xırmanını hicran odu yandırardı,
Bütün aləm qığılcımla dolu olsaydı belə, yanmazdı.

## TƏCNİS

Eylə ruyindən o zülfi-siyəhi yanə bu gün,
Salgilən şəşəeyi-hüsnünü hər yanə bu gün.

Açgilən bircə o məhtəl'əti məstanə bu gün,
Ta ziya bəxş ola şəm'i-şəbistanə bu gün.

Şəmi-ruyinə mənəm sevgili pərvanə bu gün,
Aşiqi-suxteyəm yanmağa pərvanə bu gün.

O bilurin ələ aldın yenə peymanə bu gün?
Düşəcək rəxnə yəqin əhd ilə peymanə bu gün.

Döndərib gözlərini mey yenə al qanə bu gün,
Salacaq aşiqi-biçarəni al qanə bu gün.

Gözlərim yaşı dönübdür yenə ümmanə bu gün,
Nə düşər yadıma şahid, nə də peymanə bu gün.

Ahü naləm yetişib xirgəhi-Keyvanə bu gün,
Yox əsər yarıma kim, bir çıxa eyvanə bu gün.

Zülfi-mişkinə məgər yar çəkib şanə bu gün,
Ki, düşüb ətir iyi kuhü biyabanə bu gün?

Eylə Nəvvabını bir yad, çıxart yanə bu gün,
Od tuta ta ki, rəqibin dili, bir yanə bu gün.

* * *

Ey dil, bu dilbərin nə gözəl xəttü xalı var,
Bu sərvqədd işvəgərin xoş camalı var.

Gər ahu gözlü söyləsəm, eyni-xətadı bu,
Dəşti-Xütən nə vəqt bunun tək maralı var?

Dövri-rüxündə zülfi-müənbərşikənləri,
Guya ki, gündü, dövri-bərində hilalı var.

Şirin ləbində cuyi-şəkər, təşnə kuhkən,
Qəlbində kuh-kuh bu dərdin məlalı var.

Əbruyi-qövsi, xalü xəti, mahtəl’ətin,
Can almağa bu hər birinin bir məqalı var.

Ahu kimi rəmidələnir, gah ram olur,
Bu gülşənin nə nazlı, çəmidə ğəzalı var.

İnsafı yox, mürüvvəti yox, zülmü çox munun,
Bu rəhzənin nə çox qoşunu, çox cəlalı var!

Nəvvab ahü nalə edər, səngdil gülər,
Bu gülməyin, bu ağlamağın özgə halı var.

* * *

Va həsrəta ki, oldu günüm ahü zarlər,
Gülzardən çü çəkdi ayaq gülüzarlər.

Va fırqəta ki, gəldi xəzan, keçdi novbahar,
Qan ağla, gözlərim, necə əbri-baharlər.

Od tutdu firqətində səməndər təki bu can,
Ol nardən alışdı qamu kühsarlər.

Künci-cəfada buyqu kimi ahü zar ilən,
Sənsiz necə keçirdim əbəs ruzgarlər.

Olmuş əsir o türreyi-tərrarə, ey əcəb,
Min zəxmdar mən kimi nalan şikarlar.

Əldən o vəqtdən ki, çıxıb daməni-vüsal,
Xunbar gözlərim olub əncümşümarlər.

Badi-səba, yetir o güləndamın ətrini,
Et bir səvab, eyləgilən müşbarlər.

Nəvvabın əlləri yetə gər bir də vəslinə,
Ta həşr olunca eyləməz o ahü zarlər.

* * *

Va həsrəta ki, oldum o məhpeykər ayrısı,
Bir mahru, firiştəliqa dilbər ayrısı.

Bir mahparə saldı məni dəşti-firqətə,
Tabım yox ikən, eylədi min illər ayrısı.

Düşmüş xüsufə mah kimi can mədardə,
Olmuş rəqib cövrü ilə xavər ayrısı.

Bəzmi-vüsalə atdı fələk səngi-iftiraq,
Oldum cəfavü möhnətilən illər ayrısı.

Bülbül kimi nəvayə gəlib, eylərəm fəğan,
Oldum o gülüzarü səmən tellər ayrısı.

Fərhad tək bağışladı Şirin rəvanını,
Nəvvab oldu çün o məhi-ənvər ayrısı.

* * *

Fəraqi-yarda karım olub fəğan, ölürəm,
Solubdu gül kimi pəjmürdə cismü can, ölürəm.

Bəlavü möhnətə salmış bu ruzigar məni,
Gecə-gündüz çəkərəm ahü əl-aman, ölürəm.

Kimə deyim qəmimi, bəs nə eyləyim çarə,
Fəraqın atəşinə yandı xəstə can, ölürəm.

O tari-zülfünə vəhşi könül düçar olalı,
Nə təndə tab qalıbdır, nə canda can, ölürəm.

Fəqanım ərşə çıxıb bülbüli-bahar kimi,
Bahari-ömrümü hicrin edib xəzan, ölürəm.

Yetişsə bir də əlim daməni-vüsalə əgər,
Dəxi mən istəmənəm hurü həm cinan, ölürəm.

O gül'üzar ki, eylər cəfalar aşiqinə
Vəfası çoxdu rəqibə, vəli nihan, ölürəm.

Fəda o qamətinə, mahü mehri-təl'ətinə,
Nihali-sərvini, gəl, eylə sayəban, ölürəm.

Tələttüf eylə bu Nəvvabə, ey mələkmənzər,
Tərəhhüm eylə ki, halım olub yaman, ölürəm.

* * *

Fəraqi-yar edib qəlbimi fikar, ölürəm,
Urubdu hicri ruxü cismü cana nar, ölürəm.

Vüsalə talib idim əldə nəqd canımla,
Fəraqı canım alıb, etdi xarü zar. ölürəm.

Həzar hiylə ilə dam vəsl uçün qurdum,
Xütən ğəzalı kimi eylədi fərar, ölürəm.

Bu növ dərdü qəmə, ey xuda, nə çarə edim?
Kəsibdi sayəni sərdən o gül'üzar, ölürəm.

Səvadi-türrələri evləyib günümü siyah,
Şərarə cana salıb atəşinüzar, ölürəm,

Düşəndə yadıma şirin ləbi, şəkkər dəhəni,
O mahü mehr camalında zülfi-tar, ölürəm.

Xəzan olanda tökər barü bərgini əşcar,
Mənim xəzanıma bax kim, olub bahar, ölürəm.

Edibdi Qeys kimi dəhr içində Nəvvabı,
Olubdu məskən ona dəştü kuhsar, ölürəm.

* * *

Dil eyləyib qönçə kimi ləblər arzu,
Məh tək cəmalın üzrə qarə tellər arzu.

Şirin dəhanın üzrə şəkər sözlərin müdam,
Fərhad kimi eşqə düşən eylər arzu.

Könlüm quşu uçubdu vüsalın havasına,
Kuyində dövr edər,üzünü eylər arzu.

Eşqin salıbdı Qeys kimi dəşti-firqətə,
Leyli havası ilə edər çöllər arzu.

Hicrində odlaşan qanadı bu səməndərin,
Ümmidi-vəslilən eləyir şəhpər arzu.

Yəqub tək yolundadı xunbar gözlərim,
Yusifmisal vəslətini eylər arzu.

Öz qanına xizab ola qanlı könlümü,
Səndən savayı eyləsə bir dilbər arzu.

Nəvvaba gər nəsib ola şəhd ləblərin,
Məhşər günündə eyləməz o Kövsər arzu.

* * *

Əvvəl ol dildarın adına ki, oldur dadgər,
Xaliqi-ərzü səmavü sanei-cinnü bəşər.

Abü xakü atəşü badi odur icad edən,
Əhsən ət-təqvimdə insanı etmiş cilvəgər.

Tuti təbim səməndər kimi yanmış atəşə,
Şəkkərin güftarə xu etmiş, yenə istər şəkər.

Bir güləndamın bu gün sevdası düşmüş başıma,
Yəni bir insani-kamil, surəti şəmsü qəmər.

Səbr bünyadımı hicranı edibdir tar-mar,
Xaneyi-təşkibimi eşqi edib zirü zəbər.

Ey nigarım, gülüzarım, novbaharım, lütf qıl,
Guşeyi-çeşminlə bir Nəvvabına eylə nəzər.

Həsrəti-ruyinlə Sən'an kimi düşmüş çöllərə,
Vəslinin şurilə Məcnun kimi olmuş dərbədər.

Nuri-ruyin çünki ləm'an oldu Turi-eşqdə,
Tutmadı heç aşiqin canı mənim kimi şərər.

Rövzevi-rizvandı vəslin ləzzəti hər ləhzədə,
Dərdi-hicrü firqətin hər dəmdə çün nari-səqər.

Şəms ruyin leyli-muyində nihan olcaq, yəqin,
Müztərib pərvanə tək ruhum urar hər yanə pər.

İltifatın şamil et Nəvvaba ruzi-rəstaxiz,
Et şəfaət, cənnətül-məvadə ta  tutsun məqər.

* * *

Ey məhliqa, gəl, eyləmə viranə könlümü,
Salma bəlavü möhnəti-hicranə könlümü.

Bəsdir o zülmlər mənə bu çərxdən yetib,
Qoyma dəxi cəfa oduna yanə könlümü.

Zalım olubdu xalü xətin, mahtəl'ətin.
Zülm ilə çəkdirir hərə bir yanə könlümü.

Nərradi-eşq şeşdəri-heyrətdə mat edib,
Bir rah vermədi çıxa bir yanə könlümü.

Zöhdü riya xarab qılıb xanimanımı,
Viran qıldı səbheyi-səddanə könlümü.

Təsbihü tilsani atıb, tutmuşam səni,
Sən'an kimi buraxma biyabanə könlümü.

Əncümşümar olubdu bu xunbar gözlərim,
Bilməm nə vəqtədək salacaq qanə könlümü.

Cürmüm nədir, neyləmişəm, tövbələr edim?
Yandırma sən bu atəşi-suzanə könlümü.

Nəvvab ahü nalə ilə düşdü çöllərə,
Şurun edibdi məst bu məstanə könlümü.

* * *

Gəl əyləş, ey gözümün nuru, bir zaman, getmə,
Eşit bu dərdi-dilim, çarə qıl, aman, getmə.

Gözün gözümə otur, ta görüm o gül üzünü,
Danışgilən, eşidim, ey şəkərzəban, getmə.

Səni görəndə bu qəlbim gülü şükuftələnir,
Əgər görməyəm ol dəm, olur xəzan, getmə.

Tələttüf eyləgilən, kəsmə sayəni sərdən,
Təhərrüm eylə ki, halım olub yaman, getmə.

Əgər gözümdən uzaq olsan, ey gözüm nuru,
Yəqin qıl salı gözdən məni zaman, getmə.

Əlim üzülsə o tubamisal qəddindən,
Dəxi mən istəmənəm hurü həm cinan, getmə.

Yəqin eylə ki, sənsiz fəğanım ərşə çıxar,
Dəxi nə kara gəlir cismim içrə can, getmə.

Ki, ta qiyamətədək doymanam vüsalından,
Fəraqa tab gətirməz bu xəstə can, getmə.

Gözü üzündədi Nəvvabın, ey mələkmənzər,
Gecə-gündüz eşidir ahü əl-aman, getmə.

**Vər. 252b**

## DÖRDLÜKLƏR

Elə ki, insana can və ürək verildi,
Ürək və canı canan üçün yaratdılar,
Məni ağlar gözlə,
Səni gülər dodaqla yaratdılar.

*

Qəddini cənnət sərvi yaratdılar,
Üzünü şöhrət günəşi yaratdılar,
Xəttini zülmət təki,
Dodağını dirilik suyu yaratdılar.

*

Əzəldən elə ki, dünyanı düzəltdilər,
Məni hicran dərdilə yad etdilər,
Dünyanı üzüqara icad etdilər,
Səni nurlu günəş yaratdılar.

*

Canü dildən təmiz əl üzməmişəm mən,
Hicrandan hər iki gözüm nəmnak olub,
Yusifi Kən’anda yaradan zaman, Züleyxa,
Misirdə paltarın çak etdi.

*

Qəm torunda bülbül təki giriftaram,
Gül həsrətindən lalə təki sinəsi dağlıyam,
O çahi-zənəxdanı  yaradanda,
Könül Yusifi quyuya düşdü.

*

Hicrindən məni zar və qəmli görüb,
Günəş əynindən paltarın çak etdi,
Pərişanlar torpağa pərişan getdilər,
Məni onların torpağından yaratdilar.

*
Elə ki, eşq şərabını xümxanə etdilər,
Nəvvabın ürəyini peymanə (badə) etdilər,
Elə ki, şəm’i-şəmistanı yaratdılar,
İşığı bir gecə pərvanə yaratdılar.

*

Dünən gecə yolum şərabxanəyə düşdü,
Gözəl üzdən qəlbimə əsər düşdü.
Qoca başıma cavanlıq eşqi düşdü,
O sirr ki, ürəkdə (gizli) idi, dillərə düşdü.

*

İşvəgər gözəlim qorxdu, hiyləyə düşdü,
Ay Allah, gör canım əlimdən nə tədbirlə getdi.
Baxmaqdan ürəyimin quşu pərvaz etdi,
Ey göz, bax gör o hansı tora düşdü?

*

Qüvvət bədəndən düşdü, göz bəbəyim gözdən,
O ruhi-rəvan nəzərimdən qəzəblə dolu getdi.
Dərda! O muşk ətirli ahudan və o qara gözlüdən,
Müşk kimi qəlbimin qanı çox axdı ciyərimə.

*

Elə ki bütün aşiqlər məhəbbət topunu oğurladılar,
Hüzn və ələmdən onlar bir an belə dincəlmədilər.
Onun qəm yükünü hər kəsə dedilərsə,
Hamı aciz qaldı, bu püşk mənim adıma düşdü.

*

Heyhat! Ovsun ilə saxsı lə'l olmaz,
Həştadı keçmiş qoca cavan ola bilməz.
Can versən belə, qara daş  lə'l olmaz,
Əsli zatlı nə etsin, özü pis zat isə?

*

Nəvvab ki, daima şərab xıltı içərdi,
Hər an, hər dəqiqə hüzn və ələmdə idi.
Hafiz ki, gözəllərin zülfünə əl çəkərdi,
Çox gözəl hərif idi, indi yadıma düşdü.

## MÜRƏBBE

Bir nigari-növbaharın gül camalın istərəm,
Cuybari-hüsnara, şəhdi-zülalın istərəm,
Mey içib, məstan gəzən çeşmi-ğəzalın istərəm,
Lölöi-tər tək camalı üzrə xalın istərəm.

Aşiqin tərk eyləyib, amma özü məstan gəzər,
Naz edər hər dəm rəqibə, bağara şadan gəzər,
Yadına bilmərrə düşməz, əhd ilə peyman, gəzər,
Bir belə insafsız yarın vüsalın istərəm.

Yarını həsrət qoyub, aləmara xar eyləyən,
Sındırıb iqrarını, firqətdə bimar eyləyən,
Şad edən əğyarını, hər ləhzə təkrar eyləyən,
Gərdəni-mina, qədi-tubamisalın istərəm.

Baği-gülzar içrə ahu kimi hər yana baxan,
Aşiqi-zarın canın hicran ilə nara yaxan,
Etinalar eyləyib əğyarə nazilə axan,
Dərgahi-payində əğyarın zavalın istərəm.

Rövzeyi-hüsn içrə guya ahuyi-tatardır,
Xali-mişkini zənəxdanında ənbərbardır,
Ləbləri gül, dişləri həm lölöi-şəhvardır,
Bir belə rəna ğəzalın xəttü  xalın istərəm.

Bülbüli-şuridə tək cəh-cəh uran, dad eyləyən,
Məst olan, tavus tək məstan geyib, məstan gəzən,
Aşiqin görcəyin tərlan kimi gərdən çəkən,
Naz edən, nazik bədən, tuti məqalın istərəm.

Əl çəkib Nəvvabdan, yarəb, o yari-bivəfa,
Naz ilə eylər ona hər ləhzə min cövrü cəfa,
Bir deməz: Biçarə məndən görmədi zövqü səfa,
Rəm yeyən, ram olmayan vəhşi ğəzalın istərəm.

**Vər. 254b**

* * *

Əzzəl günü, ey məh, sənə dildar mən oldum,
Axırda yenə həsrəti-didar mən oldum.

Gül qönçəsi tək bağrımı qan eylədi qəmzən,
Bülbül kimi əfğana giriftar mən oldum.

Hicr atəşinə canı yanan yoxdu cahanda,
Amma qamusundan da günü tar mən oldum.

Saldın nəzərindən məni, ey Leyliyi-dövran,
Məcnun kimi vəhşilər ilə yar mən oldum.

Fərhadsifət tişeyi-qəm saldı ayaqdan,
Şirin ləbinin həsrəti, xunbar mən oldum.

Sən mülki-bədən içrə yəqin qütbsən, ey mah,
Başinə dalanmaqlığa pərgar mən oldum.

Əğyar olub Kə'bevi-kuyində mükərrəm,
Hicrində vəli xarü diləfkar mən oldum.

Nəvvabı çəkib dari-ğəmə bir büti-tərsa,
Sən'an kimi avareyi-kuhsar mən oldum.

**QƏZƏL**

Əfsus ki, yar məndən rəhm etmədən qaçdı,
Ahu kimi dağlara üz tutub qaçdı.

Hicrdən ürək və sinəyə dağlar çəkdi,
Üzüylə dağları, çölləri laləzar etdi.

Elə ki, o səadət hüması kölgəsin başımdan çəkdi,
Ya Rəb! Rəqiblər qol-budağında qərar tutdu.

Leylanın eşqi Məcnunun bədənindən qüvvət aldı,
Səbrin Əzrası Vamiqin qəlbindən fərar etdi.

İntizar gözləri, dərd qəlbləri,
Nobahar buludu tək nəmlə doldurdu.

İşıqlı qəlbimi gündüz gecə tək qaranlıq etdi,
Gözlər hicran çəkib, gecələr ulduzları saydı.

Nəvvab elə ki bütün dünya əhlindən ürək üzdü,
Yüz ümidlə pərvərdigarın qapısına pənah apardı.

**Vər. 255a**

* * *

Nuri-rüxün aşiqlərə icab deyilmi?
Bayram ayı tək görməyə bitab deyilmi?

Ayinə nədir, gül üzünü etsə əhatə,
Əksi-rüxün ayinəyə cəzzab deyilmi?

Qaş ilə gözün tir çəkib tutdu kamanı,
Can almağa bu hər iki pürtab deyilmi?

Simin zənəxin, şəms rüxün şə'şəə salmış,
İqlimi-dilə hər biri məhtab deyilmi?

Minu kimi rüxsarınara abi-dəhanın,
Kövsər təki firdövsdə mirab deyilmi?

Olmaqlığa layiq həcərül-əsvədi-xalə,
Əbruyi-hilalın mənə mehrab deyilmi?

Şut etməyə beytüllahını, ey məhi-taban,
Kə'bə kimi kuyin yenə ətyab deyilmi?

Əğyarların canına, ey nəcmi-səadət,
Müjganın oxu əşhəbül-əşhab deyilmi?

Xaki-dərinə səcdə edən çoxdu cahanda,
Sərkərdə o sacidlərə Nəvvab deyilmi?

* * *

Dərdliyəm, qəmxarım yoxdur, nə edim?
Dərdim artıb, dildarım yoxdur, nə edim?

Taqətim tükəndi, səbr üzdü məni,
Bu qan axıdan gözdən başqa bir şey yoxumdur, nə edim?

Baxan gözlər dildar edir, lakin mənim,
O yardan əl çəkməyə tabım yoxdur, nə edim?

Zahid məni eşqdən hər gecə-gündüz mən' edər,
Mənim ki, bu dünyada bundan özgə işim yoxdur, nə edim?

Hiyləgər gözəlin fərağında ürəyim əzabdadır,
Qaranlıq gecədən başqa bir həmdəmim yoxdur, nə edim?

Əğyarların cövrü, dünya əhlinin zülmü,
Bu iki zülmə çarəm yoxdur, nə edim?

Nəvvabın məqsədi yardan özgə bir şey deyildir,
Bəxt əgər yar olsa idi, yarım yoxdur, nə edim?

**Vər. 256a**

## DÖRDLƏMƏ (Tərbi')

Dünən gecə özümlə söhbətdə idim,
Qayibanə bir səs qulağıma dedi:
Şərəfi-nəfs səxavətdədir, kəramət səcdədə,
Hər kəsdə bu ikisi olmasa, yoxluğu varlığından yaxşıdır.

Ürək və dini olan hər kəs vəzifə üçün çalışır,
Nəsihət verirəm, canü dillə qulaq as,
Dünyanın nemət-nazına qürrələnmə,
Bu dövrdə daimilik imkanı çətindir.

Ey daima hüzn-ələmdə, dərd və məlalda olan,
Sənin səbr ayağın xəyal zəncirinin qıvrımındadır.
Ey kasıblıq və pərişanhalıqda olan,
Səbr et ki, bu iki-üç gün başa çatar.

Dünyaya ürək vermə, onun qəmindən qorxma,
Yoldan azanları gələcək dünyaya doğru yönəlt.
Keçdiyin yolun torpağına sakin ol,
Ki, o gözdür, göz qapağıdır, qəddü qamətdir.

Sabahın qəmini yemə, gun elə bu gündür,
Döyüş qalib olsa, şadlıq qızıldır.
Bu həman dünyanı işıqlandıran günəş çeşməsidir,
Ki, keçmiş hökmdarların aramgahında parlayırdı.

Dünyadan bütün şahlar getdi, lakin dünya qaldı,
Hanı Kəyumərs, Firidun, Cəmşid, hanı bütün kəyanlar?
O şad Misir torpağını görmürsən ki,
Həman Misir torpağıdır, lakin Fir'onun və ordunun başı üstədir.

Əgər ipəkdən, xəzdən paltar geysələr də,
Bezdən savayı bu dünyadan axirətə heç nə aparmazlar.
Dünyanın o qiyməti yoxdur ki, onunçün göz yaşı tökəsən,
Ey qardaş, nə həsəd aparılan qalacaq, nə həsəd aparan.

Gədalıq üçün hər alçağın qapısından keçmə,
Heç kəsin qapısında xeyirdən əsər görməzsən.
Ehtiyac əlini uzadırsansa, Allaha uzat ki,
O, kərimdir, rəhimdir, mehribandır, çox sevimlidir.

Şahidi-qüdrət Odur, ilahiyyatlıq O,
Təkdir, vahiddir, müqəddəs Allahdır O.
Yerdən ulduzlaradək hər şey onun itaətindədir,
Hamı Onu anar, dua edər, Ona baş əyər.

İxtiyar Onun əlindədir, hər iki dünyanın nemət verəni Odur.
Dünya şahları kiçiyidir Onun,
Səxavəti hədsizdir, neməti sonsuz,
Heç bir nemət istəyən bu qapıdan məyus getməz.

Nəvvabın nəsihətləri ki, səadətlə doludur,
Düşmənin canına ildırım parçası olsa da,
Sə'dinin nəsihəti ki, səadət xəzinəsinin açarıdır,
Ancaq onu bəxtəvərlər əldə edə bilər.

**Vər. 257a**

## BİR GÜN MOLLALARDAN BİRİ NƏVVABDAN XAHİŞ ETDİ Kİ, BİR ŞEİR YAZSIN. ONUN MİSRALARINDAN BİRİ "ÇÜNKİ BU SÖVDAYİ-KAMİL GÜLRÜXAN SÖVDASIDIR" OLSUN. NƏVVAB BU MÜRƏBBE'Nİ YAZDI

Bir nigarı istərəm, aləmlərin ə'lasıdır,
Ruzigarın bağı içrə növgüli-rə'nasıdır,
Can ona qiymət deyil, qiymətlərin ədnasıdır,
Çünki bu sövdayi-kamil gülrüxan sövdasıdır.

Nazla nazik baxanda dinü imanı alır,
Qəmzəsi ahənrüba tək cismdən canı alır.
Qiyməti-lə'li-ləbi İranü-Turanı alır,
Çünki bu sövdayi-kamil gülrüxan sövdasıdır.

Xalü xəttü təl'əti firdövsi-ə'laya dəyər,
Qaməti-şümşadı min-min sərvi-tubaya dəyər.
Zülfünün hər tarı yüz Leylavü Əzraya dəyər,
Çünki bu sövdayi-kamil gülrüxan sövdasıdır.

Zahida, bu bez deyil kim, əlli qat başa qoyub,
Şidü salusilə biçarə əvami tovluyub.
Ac qurt kimi cəmi'ən pulü malını soyub,
Bəlkə bu sövdayi-kamil gülrüxan sövdasıdır?

Yox məlamət aşiqi-biçarə gər candan keçə,
Bir belə canan yolunda xanü həm mandan keçə,

Bu deyil həlva ki, molla dinü imandan keçə,
Bəlkə bu sövdayi-kamil gülruxan sövdasıdır?

Bu deyil yaqutü almas, zəbərcəd zivəri,
Hər dənizadə alıb, zinət verə duşü bəri.
Bu döyil dinarü dirhəm kim, yığa hər sərsəri,
Bəlkə bu sövdayi-kamil gülrüxan sövdasıdır?

Yoxdur insafı, sənə, Nəvvab, bir etməz nigah,
Bülbüli-şevda kimi gər edəsən əfğanü ah.
Kəbeyi-kuyində ömrün mayəsin et sən təbah,
Çünki bu sövdayi-kamil gülrüxan sövdasıdır.

## QƏZƏL

Harada onu yad etsəm, sinəm köz olur,
Vay, əgər üzünü görsəm, daha şöləvər olur.

Hər şəxsin dünyada bir sənəti olar, lakin,
Zahidlər qilü qaldadır (səs-küydədir), aşiqlər isə kar olur.

Axırda günəş və ay mənim ahımdan qaralacaq,
Yanar sinəm tor-tor olacaq, ulduz kimi.

Əgər üzün göstərsə, hər iki dünyanı ələ alır,
Onun hüsnü hər iki dünyanı fəth edər, ürəyim kimi.

Mirvari və mərcan kimi göz yaşımı və ürək qanımı
Yoluna səpərəm, çünki gözəllər qızıl ardınca qaçır.

Əgər onun fərağında Nəvvab dünyada məşhur olsa da,
Orucluq ayında olduğu kimi hilal olar.

**Vər. 258a**

## MÜRƏBBE’

Yox qəmi ol kimsənin ki, dilbəri dilbər ola,
Şöhrəti misli-günəş, alimlərə əşhər ola.
Asimani-hüsn içində bir məhi-ənvər ola,
Rəhmü insafü mürüvvətdə dəxi əşhər ola.

Olmaya kibrü qüruru yarin, azar etməyə,
Kəc baxıb, ayna qaçıb, hicrə giriftar etməyə,

Aşiqi-biçarəsin aləmara xar etməyə,
Meyli-əğyar etməyib, əğyarına əqhər ola.

Naz ilə nazik baxanda dinü imanı ala,
Qəmzəsi ahənrüba tək cismdən canı ala.
Bir xumar baxmaq ilən İranü Turani ala,
Əhdü peymanda vəfadarü vəfapərvər ola.

Qəddi-mövzunu ola şümşadü tubayə misal,
Gül yanağı cənnətül-məvadə hurayə missal.
Xalü xətti təl'əti firdövsi-əlayə misal,
Ləbləri gül qönçəsi tək nazikü əhmər ola.

Bir bu növi dilrüba Nəvvaba gər məqdur ola,
Xaki-payinə əgər canın verə, mə'zur ola,
Qorxum oldur, vəsli naməqdur, özü məhcur ola,
Şeyx Sən'an kimi sirri aləmə əşhər ola.

* * *

Fəraqi-ruyi-mahında fəğanü zarü ahım var,
Nə bu dərd içrə bir munis, nə bu qəmdə pənahım var.

Məni bu dərdi-hicrana salan əğyardır, billəm,
Və gər nə yar yanında nə bir zərrə günahım var.

Görəndə şəm'i-rüxsarın yanar pərvanə tək cismim,
Şüayi-ruyinə, ey məh, duayi-sübhgahım var.

Nə yadımdan çıxar hər dəm, nə yadına salar bir dəm,
Mənim üşşaqlar içrə nə bədbəxtü siyahım var!

Qəmində sövgvaram mən, vüsala biqəraram həm,
Yetiş fəryadıma kim, sən kimi izzətli şahım var.

Əlimdə eşq tuğrası, sərimdə yar sövdası,
Nə qəm, məhşər günü, yara, sənin tək dadxahım var.

Səri-kuyində, cana, binəva sən sanma Nəvvabı,
Qəmü dərdü məlalü rəncdən çox-çox sipahım var.

* * *

Qərarü ixtiyar əldən o məhru aşkar aldı,
Sanasan bir tülək tərlan şığıb yerdən şikar aldı.

Tükəndi taqətü tabım, mənə dərdü ələm qaldı,
Mədarü iqtidarım ol şəhi-gülgunsəvar aldı.

Urub müjgan oxun hər dəm, kəsib aramımı təndən,
Necə Rüstəm qərarını əzəl İsfəndiyar aldı.

Gülüstan içrə sünbüllər şükuftə oldu, həm güllər,
Fəğanə gəldi bülbüllər, gülü şax üstə xar aldı.

Müsəlsəl çü rəvan oldu, bənəfşə sərgiran oldu,
Bəzəndi gülsitan səthi, yəqin badi-bahar aldı.

Cahan gülzara döndü, leyk açılmaz mənim könlüm,
Fəzayi-qəlbimi rəncü qəmi-hicrani-yar aldı.

Xüsuf etdi qəmər, çün dudi-ahimdən kədərləndi,
Küsufə düşdü gün, dudi-dilimdən çün qubar aldı.

Edib təsxir, çün dil kişvərin bu şuxi-bipərva,
Təni-suzanıma atəş urub, canım şərar aldı.

Gətirməz yadına Nəvvabı bir oğrun nigah ilə,
Deməz: Eşqimdə biçarə Səməndər kimi nar aldı.

**Vər. 259a**

* * *

Əcaib düşdü başım qilü qalə,
Qəmi-hicran məni saldı nə halə?

Dedim: Ey dil, cəmali-yara uyma,
Düçar etmə özün dərdü məlalə.

Sözümü tutmadın, ey qana dönmüş,
Düş indi zəhmətü rəncü məlalə!

Sənin hicrində, ey şuxi-sitəmgər,
Vücudum gül kimi yetdi zəvalə.

Vüsalın görməmiş övci-şərəfdə,
Düşübdür kövkəbi-bəxtim vəbalə.

Qədi-şümşadımı döndərdi yayə,
Qəza cismi-zəifimi hilalə.

Rəqibin cövrünü, yarın cəfasın,
Çəkim mən, ya ki, bülbül kimi nalə?

Gül üzlü yar vəsli çıxdı əldən,
Fələk saldı məni vüz min xəyalə.

Sənin ahından, ey Nəvvabi-məhcur,
Gün ilə ay tutdu göydə halə.

* * *

Səthi-damağ tapdı kədər dudi-ah ilə,
Hicrində ağlaram, gözəlim, salü mah ilə.

Heyhat, gər yetişsə əlim bir də vəslinə,
Güman etməm bu şövkəti bəxti-siyah ilə.

Əncümşümar gözlərini bu şikəstənin,
Olmaz ki, şad eyləyəsən bir nigah ilə?

Min gəz dedim: Usangilən, ey dil, usanmadın,
Çeşmi-xumara uyma o müjgani-siyah ilə.

Sınmış sipahü bisərü pa rənc ləşkəri,
Müşkül müqabil olmaq olur padşah ilə.

Et bir kənar tellərini ruyi-mahdən,
Şəmsin üzüni tutma o miği-siyah ilə.

Nəvvab ahü nalə ilə vəslin axtarır,
Əfganü zarü əd’iyeyi-sübhgah ilə.

* * *

Saqi, ud, çəng, ney səsilə sən mey gətir,
Ki, ömür xəzan oldu, getdi əldən bahar.

Xalis (təmiz) şərab ver mənə, gözəl yarın xatirinə,
Atəşimi söndür mənim, başımdan xumarımı apar.

İşvəgər yarın eşqindən qəlbi-canım od-alov tutdu,
Gülüzlülərin hicrindən gəda, dərbədər oldum.

Nigarım rəqs edərkən, ceyranım otlarkən,
Hicrindən gözlərimdən çaylar axar.

Nigarım mənim, nigarım mənim, gül üzlü nigarım mənim,
Qərarımı alma mənim, məndən qaçma uzaqlara.

Kimdir o nigarım mənim, kimdir gül üzlüm mənim,
Kimdir nobaharım mənim, Məhəmməd Mustafadır.

Rəsuldur, bütün canlıların peyğəmbəridir,
Hər iki dünyada peyğəmbərlər ona tüfeylidir.

O Büraqa minib yüz cəlal və təmtəraqla,
Nurdan, oddan keçib, doqquzuncu göyə çatdı.

Nəvvab onun üzün görüb, onun saçı kimi pərişan olub,
Minlərlə mənim kimisi onun qapısının torpağının qurbanı olar.

**Vər. 260a**

## PUÇ DÜNYANIN VƏFASIZLIĞI HAQQINDA NƏVVABIN TƏXMİSİ

Bu dünyada nə çöp-çöp yığırsan,
Bülbül kimi nə nazlanırsan qəfəs küncündə?
Məgər zəngdən bu fəqanı eşitmirsən ki,
Dünya, ey qardaş, heç kəsə qalmaz,
Ürəyini cahanı yaradana bağlasan, bəsdir.

Çox şəxslər bu kobud dünyada,
Dünya yaratdı, ancaq,
Qəbrin darlığından və bir neçə kərpicdən başqa bir şey görmədi.
Dünya mülkünə sən arxalanma,
Ki, sənin kimi çoxlarını yaradıb və öldürübdür.

Get, çiynini yükaltı etmə,
Eyş paltarını parça-parça et.
Bəslənmiş canın qəbrə gedəcək,
Təmiz canın dünyadan köçmək istərkən,
Ya taxt üstündə, ya torpaq üstə ölməyin nə fərqi?

Bu nəsihəti sən Nəvvabdan eşit,
Özünü əzab-əziyyətə salma.
Dünyanın "niyə, nə üçün"dən başqa məzəsi yoxdur,
Qəm, dərd, kədər, yas və bəladan başqa,
Bu fani dünyada bir şey tapmazsan.

Qəflət etmə, ədalətli, qadir Allahdan qafil olma,
Özünü boş yerə xəyala salma.
Çox danışıb dəm vurma, çətin düzələr,
Ancaq dünyanı doldurarsan qilü qal ilə (dedi-qodu ilə),
Bütpərəstlərə mənsub olarsan.

Haraya baxırsan, hər şey onundur,
Haradan keçirsənsə süfrə onundur.
Bütün qəm və dərdlərə dərman odur,
Əzəldən əbədə əhdü peyman onundur,
Bütün zəminü zaman (yer-göy) onun fərmanına tabedir.

## NÖVRƏS MİRZƏ ƏLİ ƏSGƏR NƏVVAB MİR MÖHSÜNƏ YAZMIŞ VƏ CAVAB İSTƏMİŞDİR

Ey eşq, sənin əlamətlərin hər an məndə aşkar olunur,
Muğamat sirləri sənin mərhəmətindən mənə
məlum olmuşdur.

Min şükr ki, müsəlmanlıq bəndindən azad oldum,
Şeyxin qapısından qovulmuşam, xərabata
qəbul olunmuşam.

Nə behişt tamahındayam, nə cənnət istəyirəm,
Dərviş kimi, hər an "ya hu" deyənəm.

Öz varlığımı inkar etdim, çünki mən eşq
yolunun mərdiyəm,
O görüşlərin hamısı məna aləmində sübut oldu.

Ey başı uca sərvim, qamətinin cilvəsindən,
Gözlərinin baxışından, bəlalardan asudəyəm.

Vüsalının zövqündən, hicrandan azadam,
Üzünün şövqündən, hər dəm bəlalardan uzağam.

Məhşər mərəkəsində günaha qərq olmuşam,
Ya Rəb, nə ilə bitəcək mühimmatım mənim?!

Əgər müvəffəqiyyət istəyirsənsə, təslim və razı olmaq
daha xoşdur,
Növrəs, bu nahaq xəyalın nə faydası var?

**Vər. 261b**

## NƏVVABIN MİRZƏ ƏLİ ƏSGƏR NÖVRƏSƏ CAVAB VƏ NƏZİRƏSİ

Ey eşq, sən bütün ibadətlərimi zay etmisən,
Habelə sən mənim bu hiylələrimi yaymısan.

Ey eşq, bu riyakarlıq sövməəsi səndən viran olub,
Habelə bütün xəyalımı sən dağıtmısan.

Bu yüz dənəli təsbeh, bu buxaqaltı şal hiylə əlamətidir,
Səndən bu kəramətlərim hədərə getdi.

Sən olmadığın vaxtda mən həmişə gənc (cavan) idim,
Səninlə yaxın olandan daim xürafatdavam.

Məni Kəbədən, məsciddən, monastırdan qovurlar,
Nə meyxanəyə yolum var, nə də xərabata.

Elə ki dua etmək üçün əlimi qaldırıram, cin, mələk və insanlar,
Səsimi eşitməmək üçün qulaqlarını tuturlar.

Mən məftun olunmuşa nə yer var, nə mə'va (sığınacaq),
Nə torpağın altında yerim var, nə də göylərdə.

Nə cəbərutdənəm (səmadanam), nə göylüyəm, nə torpaqlı
(mələklər və ruhlar aləmi),
Nə də mələkutdanam, öz yaranışımdan mat qalmışam.

Bağdan (cənnətdən) qovurlar məni, oda (cəhənnəmə)
çağırırlar məni,
Xərabat pirinin yanında xəcalətli və avarayam.

Ey qara saçlı ceyran, ey gözəl boylu, xoşxasiyyət sərv,
O qaşın qəmzəsindən bəlalar dəryasında qərq olmuşam.

Üzünün gözəlliyindən, o iki füsunkar gözlərinin nazından,
Heyran, mat qalmışam,
Nəvvab sənin həvəsindən hər tərəfdə "ya hu" çəkir,
Mənim bütüm sənin kuyindən cəzb olunur.

## M.M.NƏVVABIN
## MİRZƏ Ə.NÖVRƏSƏ QAFİYƏSİ

**16 şəvval gecəsi, 1309-cıı il – 20 oktyabr, 1891**

Növrəs, nə yatıbsan qəflət içində?
Ağırlaşıb gözün, qana dönübdür.
Bahar olub, yəqin yoxdur xəbərin,
Səthi-cahan gülüstana dönübdür.

Xəl'ət geyib zümürüddən ağaclar,
Çiçəklərdən boynun əyib budaqlar.
Şəbnəm düşüb, tazələnib yapraqlar.
Səthi-cahan gülüstana dönübdür.

Açılıbdır bağda gülü lalələr,
Dəstə bağlar gülü gözü alələr.
Bülbül kimi oxur xürdəsalələr,
Səthi-cahan gülüstana dönübdür.

Cəh-cəh vurar bülbül çəmən içində,
Səmənbulər yatıb səmən içində.
Əqiq kimi kani-Yəmən içində,
Səthi-cahan gülüstana dönübdür.

Seyr eləyir səhraları məhrulər,
Tel-tel olub gül yanaqda geysulər.
Qumru çəkər ağaclarda yahulər,
Səthi-cahan gülüstana dönübdür.

Hələ vurub çəmənlərdə göyçəklər,
Əfşan olub üzdə qara birçəklər.
Zülflərinə sancıb əlvan çiçəklər,
Səthi-cahan gülüstana dönübdür.

Bir tərəfdə dəstələnib uşaqlar,
Gülbərg tək xumarlanıb yanaqlar.

Yaqut kimi bərraq olub dodaqlar,
Səthi-cahan gülüstana dönübdür.

Yelpəkləyib badi-bahar üzlərin,
Xumarlanıb yumur nərgiz gözlərin.
Şəkkər kimi şirin edir sözlərin,
Səthi-cahan gülüstana dönübdür.

Şuru düşüb məhrulərin cəhanə,
Nazlar satar naziklərə şəhanə.
Düşməz ələ, Növrəs, belə bəhanə,
Səthi-cahan gülüstana dönübdür.

Bu məhvəşlər qoynu cənnət bağıdır,
Həm sineyi-simi bostan tağıdır,
Şamamasın üzüb, dərmək çağıdır,
Səthi-cahan gülüstana dönübdür.

Gülüstanı gül ləşkəri alıbdır,
Ahü əfğan bülbüllərə qalıbdır,
Sün'i-Yəzdan fərşi-əlvan salıbdır,
Səthi-cahan gülüstana dönübdür.

Nə mürvətdir bu mövsümdə qəmlənib,
Bayqu kimi günəş üzdən gizlənib,
Çiçəklərdən, güldən dünya düzlənib,
Səthi-cahan gülüstana dönübdür.

Təshib edir xaliqinə ağaclar,
Zikr eləyir əfğan edəndə quşlar,
Zahir edir sane'in dağlar, daşlar,
Səthi-cahan gülüstana dönübdür.

Bu aləmdə yoxdu zövqü səfalar,
Gülruxlardan kimlər görüb vəfalar?
Xəzan yetər, Hatif çəkər sədalar,
Səthi-cahan gülüstana dönübdür.

Nəvvab, qıl şükri-xudanı izhar,
Sün'inə bax, saneinə pey apar,
Zahid edir cilvəsini bu asar,
Səthi-cahan gülüstana dönübdür.

Vər. 263a

## MİRZƏ ƏLƏSGƏR NÖVRƏSİN NƏVVABA CAVABI

**18 şəvval 1309-cu il – 22 oktyabr, 1891**

Nəvvabdan yetdi mənə mənzumə,
İltifatı bu samana dönübdür.
Nəzmi-səbgi əcəb olub pürnizam,
Kuhi-təb'i Bədəxşana dönübdür.

Yazmaq gərək bu Nəvvaba xoş cavab,
Olmaz dəxi belə səadətməab.
Bir qafiyə nə xoş edib intixab,
Şirin sözü şəkərstana dönübdür.

Seyr eyləmək, ağa, Xuda hikmətin,
Şükrün edək biz də belə ne'mətin.
Nazil edib Tanrı bizə rəhmətin,
Yer göyərib, asimana dönübdür.

Olmuş əcəb şaxi-gül üstə xətib,
Şuri ilə avaz qılır əndəlib.
Heyf döyül xara gül olsun nəsib?!
Bülbülə bax, nəğməxana dönübdür.

Gül varpağın tər buxağa düzəllər,
Türrələrin bərü duşə bəzəllər.
Seyrə çıxıb hilal qaşlı gözəllər,
Bu vəchdən qəd kamana dönübdür.

Bir belə mövsümdə gərək şad olaq,
Nüzhət üçün yeksərə mö'tad olaq.
Sərvə baxıb, qüssədən azad olaq,
Çünki çəmən bir canana dönübdür.

Xoşdu bu mövsümdə meyü meygüsar,
Mütrübü tənburü neyü gəştzar.
Xassə, əsə orda nəsimi-bahar,
Saqi hanı, könül qana dönübdür.

Lalə tutub gör necə zərrinə cam,
Hardasan, ey sərvqədü xoşxüram?
Çərxi-fələkdən alayım intiqam,
Göz yaşımız, gör, ümmana dönübdür.

Tapılmadı bu fəsildə əhli-hal,
Qəm əlində əcəb oldum payimal.
Tutub, yaran, qəlbi-Növrəs yüz məlal,
Gülşən ona bir zindana dönübdür.

## NÖVRƏS NƏVVABA YAZIB, CAVAB İSTƏMİŞ

**22 şəvval, 1309-cu il – 26 oktyabr, 1891**

Şanəvü məşşatədən çün tapdı piçü tab zülf,
Aldı bu vəchilə könlümdən qərarü tab zülf.

Oldu ta rizvansifət cənnət qapısında müqim,
Yüzümə açsa nolur firdövsdən bir bab zülf ?

Gecəvü gündüz ləbin küncündə çün tutdu məqam,
Ömr edər yüz il, içər abi-bəqadan ab zülf.

Həşr olunca tale'i-məs'ud yüz verməz mənə,
İnqilabi-dil edər baxdıqca üstürlab zülf

Kafəri-birəhmdir, daim həzər qılmaq gərək,
Kim, olur qarətgəri-imani-sixü sab zülf.

Vəsli-halın, Növrəsa, nə vəchilə təqrir edim,
Qeyrəti-ənbərdi, ya ki, rəşki-müşki-nab zülf?

## NƏVVABIN NÖVRƏSƏ CAVABI

**23 şəvval, 1309 – 27 oktyabr, 1891**

Tapdı çün badi-səbadan tab ənbərbar zülf,
Aşiyani-mürği-ruhum etdi tarmar zülf.

Oldu gülzari-behişti-ədəndə çün bağban,
Tapdı yarın gülüzarında çü istiqrar zülf.

Rövzeyi-rizvan içində həlqələndi hər tərəf,
Adəmü Həvvanı iğva eyləyən şahmar zülf.

Şəbnəmi-rüxsardan sirab olur hər ləhzədə,
Tellənir hər dəmdə çün gülzarda əzhar zülf.

Əqtiran etdi çü bürci-sə’d içində şəmsilən,
Ta əbəd düşməz vəbalə, bəxtəvərdir tar, zülf.

Ənfüsü afaq ol dəmdə edərlər inqilab,
Kim, müşəvvəşlik özünə eyləyə əş’ar zülf.

Hər kəsi gördü, müqəyyəd eylədi tərsasifət,
Şeyx Sən’an kimi saldı boynuna zünnar zülf.

Saldı qeyd daminə Nəvvabı, insaf etməyib,
Sirri-eşqin eylədi aləmlərə əşhar zülf.

## NƏVVABIN MİRZƏ FATMA KƏMİNƏYƏ RAZILIQ BİLDİRMƏSİ

**28 şəvval, 1309 – 1 noyabr, 1891**

Kəminə, nəzmü əş’arın yetişdi, şadman oldum,
Cavahir nəzmdir vəh, vəh və ya dürdür, səmin olmuş.

Gözəl əş’ardır, məzmunları həm şeirdən nazik,
Bəyanı çox mübəyyəndir, məzamini mətin olmuş.

Nə xoş mənzumədir, göyçək, qəmu mənası müstəhsən,
Nəbatü qəndü şəhd ilə məgər yeksər əcin olmuş?!

Əcəb lölöi-qəltandır, çəkilmiş rişteyi-nəzmə,
Şəkərləbdən büruz etmiş ki, böylə şəkkərin olmuş.

Yəqin bil, övci-ə’layə dayandı nücmi-iqbalın,
Belə daim kitab içrə ki, əqvalın qərin olmuş.

Riza Nəvvabdır səndən həmə övqatü hər saət,
Xəyalı gər pərişandır, sizə leykən müin olmuş.

## MİRZƏ FATMA KƏMİNƏNİN MİR MÖHSÜN NƏVVABA CAVABI

Bu gün iqbalü bəxtimdə gümanım çox mətin olmuş,
Ki, Nəvvabın mənə əltafı sidq ilə yəqin olmuş.

Nəvaziş eyləyib gər bürdəni bu xülqi-əhsandir,
Nəcibü əsl olan kəsdə bu surətlər mübin olmuş.

Çəkibdir rişteyi-nəzmə Nizami kimi əlfazi,
Baxanda lütf ilə hər biri bir dürri-səmin olmuş.

Təfaxür eylərəm kim, qabili-dəftər olub şerim,
Mənim də yazdığım sözlər ki, əş'ara qərin olmuş.

Görünür, mənzilində qeybətü reybü riya yoxdur,
Elə pakizə məclis rəşki-firdovsi-bərin olmuş.

Bu bir tövfiqdir həqdən sənə kim, həqqə rağibsən,
Yəqin eylə ki, həq lütfü sənə, əlhəq, müin olmuş.

Kəminə beytül-əhzanda kəsib ülfət xəlayiqdən,
Ona hər guşə qəmdən ötrü, billah, bir kəmin olmuş.

* * *

Ey bivəfa, qoyubsan əcəb qalə tək məni,
Hicran odun əhatə edib halə tək məni.

Bilməm nə etmişəm sənə, zalım, nə zülmdür,
Etdin kəbab atəşi-cəvvalə tək məni?

Allah rizası, etməgilən xar eşqdə,
Aşiqlər içrə dağlama sən lalə tək məni.

Bir ləhzə gər üzülsə əlim qürbi-vəsldən,
Eylə yəqin ki, yandırı sədsalə tək məni.

Nəvvabı zarü zərd edib, oxşatdı qəmlərin,
Divari-qəmdə nəqş olan əşkalə tək məni.

**QƏZƏL**

Saqi, badə gətir, çək bu pərdəni (hicabı),
Od vur şeyxin və cavanın ibadətgahına.

Mey ver ki, dost kuyinin qapısı açılsın,
Ta diriltsin bu qanlı xarab ürəyi.

Xumardır, məstdir, yuxulu-xəyallıdır bu ürəyim,
Meydən onun üzünə gülab vur (ki, ayılsın).

Bu eşq nəvası ney yarı yad edəndə,
Çəngin və rübabın səsi mənə çox xoş gəlir.

Göz yaşına qərq olmuşam, ey dost, əlimdən
tut (kömək et),
Əlim sizdən başqa heç kimə yapışmır.

Eşq yolunda qafilədən geridə qalmışam,
Hanı himmət Xızrı ki, mənə kömək etsin?!

Zülfün bulud tək aya halə vurubdur.
Bir dəm üzündən o buludu kənar et.

Sənin üzünün yadı olmasa, Nəvvab ölüb-dirilər,
Sən Allah, sən o niqabı at üzündən.

* * *

Gecə-giindüz yenə nə tədbir edirlər,
Bahar küləyi yenə nə təsvir edir?
Ey könül, sənin qəm və kədərini artıq artırırlar,
Bilirsənmi ki, ud və çəng nə söyləyirlər?
Badəni gizli için ki, sizi kafir adlandırarlar.

Bu zahidlər ki, yalançı xirqəyə bürünmüşlər,
Həmişə səninlə yol göstərib, rəhbərlik edirlər.
Gah sənin malını yeyirlər, gah aparırlar,
Eşq namusunu və aşiqlər pərdəsini yırtırlar,
Cavanlara eyb tutur, qocaları hey danlayırlar.

Abid ki. əynində şadlıq xirqəsi var,
Gündüzlər və’z edər, gecələr xurma şərabı çəkər.
Cənnət, cəhənnəmdən söz açıb, qorxu və şadlıq törədirlər,
Deyərlər, eşq rəmzi deməyiniz, eşitməyiniz,
Çox çətin hekayətlər söyləyirlər.

Bu adamlar ki, həris olub, bir yerə toplanırlar,
Rumdan, Hinddən, Sinddən, həm də Hicazdan gəlirlər.
Bunların hamısı hoqqabaz müridlərdir.
Yenə piri-muğanın (mürşidin) diqqətini yayındırırlar,
Bu müridlərə bax ki, bu qoca (mürşid) ilə nə edirlər.

Ahu sifətlilər dilü candan taqəti apardılar,
Nazü nəzakət gülüstanında otlayırlar.

Onun xəttü xalı ürək aramımı apardı.
Yüz ürək mülkünü yarı nəzərlə almaq olar,
Gözəllər bu müamilədə (alqı-satqıda) hələ az tələb edirlər.

Ey ürək, dünya zərü zinətlə dolu olsa da,
Bir yüksəklik var, baxmayaraq ki, yüz yeniş var,
Tanış yox, dost yox, yar yox, həbib yoxdur,
Biz qapının bayırında (durub) yüz aldatmaya məğrur olmuşuq,
Özləri isə o pərdə arxasında nə tədbirlər edirlər?!

Əgər olsa da sənin əlində yüz min şəhər,
Ya yüz min zəhmli qaniçən ordu (ləşgər),
Ya yüz min uca boylu, ay, günəş üzlü,
Müxtəsər, dünyanın sabitliyinə etimad etmə,
Ki, bu bir karxana, tez təğyir tapar.

Nəvvab, qəm yemə sən məstliyindən mühtəsibin,
Rəqibin bacarıqlığından, mühtəsibin hərəkətindən,
Saqi, badə gətir, sağlığına mühtəsibin,
Mey iç ki, şeyx, hafiz və müfti, mühtəsib,
Əgər yaxşı baxsan, bunların hamısı riyakardırlar.

**Vər. 267b**

## MİRZƏ ƏLƏSGƏR NÖVRƏSİN NƏVVABDAN QƏND İSTƏMƏSİ

Nəvvab, əya mövla, varam sənə bir bəndə,
Nəvvabi-dərin ollam qalsam nə qədr zində.

Aləmdə müsəlləmdir xoş xülq, xoş ətvarın,
Əzbəs ki, nəcabət var hər iki tərəf səndə.

Söz müxtəsəri xoşdur hər sahibi-idrakə,
Möhtac olub Növrəs girvənkə olan qəndə.

## “MƏCLİSİ-ÜNS”ÜN HƏMMƏCLİSLƏRİNDƏN 6 ŞAİRİ, YƏNİ MƏHƏMMƏD ƏLİ BƏY MƏXFİ, MİRZƏ HƏSƏN, HACI ABBAS AGƏH, MƏMO BƏY MƏMAİ, MİRZƏ ƏLƏSGƏR NÖVRƏS VƏ İSMAYIL BƏY DARUQƏNİN SUAL-CAVABINDAN NƏVVAB MİR MÖHSÜN AĞAMİRZADƏ QARABAĞİNİN ŞEİRİ

Əssəlam, ey səfalı müşfiqlər,
Əssəlam, ey vəfa həmməclisləri.

Əssəlam, ey təcrübəli mürşidlər,
Əssəlam, ey dünyanın pirmərdləri (ağsaqqalları).

Sizin “Məslisi-üns”unüz abad olsun,
Qəlbiniz dərdü qəmdən azad olsun!

Hər kim məclisinizə həsəd aparsa,
Həm ölüsünə, həm dirisinə lə’nət olsun!

Xoş o məclisə ki, bu qədər iştirakçısı vardır,
Nitq, kəlam, şeir və söz söyləyəni vardır.

O məclisə heç vaxt yol tapmayacaq,
Paxıllıq, şöhrətpərəstlik, lovğalıq, böhtan və riya.

Həmməclislərinin nitqləri əla olsun,
Məclisləri gözəlli, şərablı olsun!

Sirli sözlər deyən Məxfi layiqli bir xəzinədir,
O, dünya şairlərindən gözəl danışıq əxz edib.

O dünya şairi Mirzə Həsən,
Onun şeirinin mənim tərifimə ehtiyacı yoxdur.

Elə ki, Məmai şeirə başladı,
Şairlər Şuşada heyrətə düşdü.

Agəhinin qələmi ətir iylidir,
Şeirə şahənşahlığı o veribdir.

İsmayıl, o, elmü ədəb xəzinədarıdır,
Onun sözlərindən canü dil şadlıqdadır.

Növrəsin qələmi elə ki, yenidən təsvir etdi,
Qəlb dünyasını yenidən fəth etdi.

Məxfi, sənin sevgilin ilik kimi,
Cana məxfi girdi, gizlincə girdi.

Ey fəzilət zirvəsinin kamal günəşi,
Ey cəlal mücrüsünün yeganə gövhəri.

Ey səndən qəzəl gülüstanı bəzənmiş olan,
Sübhanlığı sənə əzəl sübhanı verib.

Hər elmin mərkəzisən, həm də böyüksən,
Ariflər dövrəndə fırlanırlar pərgar kimi.

Ey Həsən, ey bütün söz-söhbətləri gözəl olan,
Nəzminin hər telindən (cənnət) dürrü ilə dolııdur.

Ey hikmət elmində böyük ustad olan Hörmüz,
Heç bir ana bu zəmanədə sən tək övlad doğmayıb.

Dünən gülüstanda bir bülbül gördüm,
Ürəkaçan bir nəzm ilə cəh-cəh vururdu.

Sordum ondan: Kimindir bu gözəl kəlam?
Dedi ki, Mirzə Həsən, Mirzə Həsən.

Ey Məmai, ey hünər zirvəsinin ayı,
Nəzm bağı (ağacı) vücudundan təzə-tər olub.

Zəmanədə Nizami, Ənvəri kimisən,
Səndən üstün daha nurlu (bir şəxs) yoxdur.

Sənin gözəl şeirlərin can bəxş edir,
Ruha bolluca qüvvət verir.

Ey İsmayıl, ey varlığa həqiqət lütfi olan,
Sənin səxavətin bütün səxavətlilərdən üstündür.

Ey məclisdə gülşən kimi ətir saçan,
Ey döyüşdə can alan, möhkəm qılınc!

Cismü can da sənin nəzmindən tazə-tərdir,
Sənin şeirindən ruhi-rəvan şadlanır.

Agəhi, ey həqiqət sirlərindən agah olan,
Bu neməti sənə Allah-təala vermişdir.

Söz gülzarı səndən rövnəq alıbdır,
Səndən alıbdır qədim şeirlər təravəti.

Növrəs, ey təmiz etiqadlı sufi,
İki yüz paklıq sənin təbiətində var.

Şadlıq namələri səninlə bəzənmişdir,
Kədər dəftəri səninlə bəzənmişdir.

Ey dilbərlər fərağında Səməndər olan,
Ey gümüş sinəlilər yanında (divanə) bülbül olan.

Nədəndir ki, hərdən su olursan, hərdən od-alov,
Gah şad görürəm səni, gah gözləri yaşlı?

Gah qəmdən azad bağdakı sərvlər kimi,
Gah qəmlə dolu hər tərəfdə “ku-ku" (ahü nalə) edirsən?

Qələmin məcazi eşqdən dəm vurur,
Ayıq qəlblərə qəm-kədər doldurur?

Dərviş paltarını sat, teylisanı çıxart,
Özünü bu məcazilikdən xilas et.

Həqiqət tərəfə bir zaman qədəm qoy,
Ki, zirü bəm sədası səni məst etsin.

Dostlarının cavabında Nəvvab (bunları) dedi,
Bu beytlərin incisini belə deşdi.

**Vər. 269b**

## “MƏCLİSİ-ÜNS”ÜN SƏFALI AĞSAQQALLARININ SUALLARINA NƏVVABIN CAVABI

Sizin suallara bir nəzər saldım,
Həm də müxtəsər cavab yazdım.

Ey ki, sordun nədir dünyada yalan,
Onun mənası gizli qalmaz.

Onunçün Quran belə buyurmuşdur:
Tanrı yalançıları sevmir.

Yalançılar Allahın düşmənidirlər,
Allahın düşməni mütləq şeytandır.

İnsanın mənasın bilmək istəsən, bu rəvadır,
Onun mənası sizin “Məclisi-üns”unüzdür.

Çün dostluq məhəbbətindən sual etdin,
Əgər yoxdursa qəm-kədərin, deyirəm:

Dostluq üç cür olar dünyada,
Çörək dostu, can dostu, bir də ürək dostu.

Dil dostundan onun əhvalını,
Hər an onun halın mülayim görəndə soruş.

O ki çörək dostudur,
Çörək baha da, ucuz da olsa, ona çörək ver.

O ki can dostudur, ona canını qurban elə,
Hər zaman, hər dəm, gecə-gündüz.

Bir belə adam dünyada ənqa kimi az tapılar,
Bütün dünya onun səxavəti qarşısında heçdir.

Çün lovğalıq və qürurdan sual etdin,
Sənə yüz sevinc ilə ərz edirəm:

Lovğalıq alçaq iblisin sənətidir,
Lovğalıq onu behiştdən qovdurdu.

Nifaqdan o kəs ki, qürur satır (qürurlanır),
Qiyamət günündə onun həşri qarışqa kimi olar.

Yəni, o, ayaqlar altda qalacaqdır,
Mənzili kədər olacaqdır.

İndi əvvəlki söhbətə qayıdım,
Başqalarının əkdiyini biçim.

**Vər. 270a**

## NƏVVABIN "MƏHFƏLİ-ÜNS"ÜN HƏMMƏCLİSLƏRİNƏ HƏQİQƏT HAQQINDA SUALI

Ey əzizlər, dərdimə dərman edin,
Can yaralarına mərhəm qoyun.

Həqiqət nədir bu dünyada,
Ki, xalqın dilində bu qədər şöhrət tapıbdır?

O yeməlidir, ya döşəməli,
Görməlidir o və va atılmalı?

Ey ariflər, onun kəmiyyəti və keyfiyyəti nədir?
Hər kəs onu bir cür bəvan edir.

Sizə bu xitab əyan olduğu üçün,
Gərək tez göndərilə cavab.

## “MƏCLİSİ-ÜNS” ÜN ÜZVÜ MİRZƏ HƏSƏNİN CAVABI

Ey Möhsün, ey ehsan və bəxşiş əmiri,
Ey vücudu səxavət və kəramət təcəssümü.

Ey Möhsün, ey fəzilətli və ədəbli əmir,
Ey alinəsəbli yeganə gövhər.

Ey Əhmədi məclisinin şamının şüası,
Ey qəddi əbədilik bağının sərvi.

Ey peyğəmbər sülaləsindəki yeni yetişmiş gül,
Ey qəbul əhlinin ürəyindəki sevinc.

Ey hikmətdə dünyada əvvəlinci şəxs,
Ey surətdə kamil, zamanda tayı olmayan.

Ey kamal bürcünün parlaq ayı,
Ey şərəf və cəlalın parlaq gövhəri.

Ey elmdə pak və nöqsansız,
Ey şeirinə ürəklərin əsir olduğu.

Ey şəkər yağdıran təb’ sahibi,
Nə gözəldir nəzmin sənin, kəlamına mərhəba!

Bəh, nə gözəl nəzmdir, lap ürəkaçandır!
Bəh, nə gözəl şeirdir, lap canalandır!

Sənin sözündən məclisimizə hurilər həsəd apardı,
Qəlb evimiz nurla doldu Tur (Sinay) kimi.

Qəlboxşayan kəlamından,
"Üns”un həmməclislərinə sirlər əyan oldu.

Əlqərəz, bizim ağamızın sözündən,
Bu “Səfa” əhli üçün hər şey müəyyən oldu.

Məndən və məclis üzvlərindən,
Həqiqətin şərhini istərlər yəqin.

Həqiqətdə kəmal sahibləri yanında,
Bu sualın cavabı çətin olsa da.

Lakin gərək o alicənabın xatirinə,
Deyə bildiyim qədər cavab deyəm.

Ey Möhsün, ey vəfa əhlinin munisi,
Ey qəlbi zövqü səfa xəzinəsi.

Əgər o hünər sahibi qəbul etsə,
Həqiqəti müxtəsər şərh edərəm.

Hər nə ki, yoxluqdan varlıq olubdur,
Onun həm surəti vardır, həm də mə’nası.

Bütün surət məcazdan aşkar olmuşdur,
Bütün məna həqiqətdən yaranıb.

Misal üçün, əgər ağıllı rəssam,
Dünyada gözəl bir surət yaratsa,

Və o gözəl surət,
Xalq arasında yayılmış olsa.

O ki məcaz əhlidir, surətpərəstdir,
Dünyanın qeydindən zəhmətdədirlər.

Onların gözü ancaq həmən naxışı görür,
Bu dünyada ancaq naxışlara bağlıdırlar.

Onlar üçün o nəqşi-nigardan başqa,
Bir şey dünyada karına gəlməz.

O ki, göz sahibi və qəlb əhlidir,
Bütün çətin mənalardan vaqifdir.

Baxmayaraq ki, dünyada surət tərəfə gedirlər,
Lakin zahirdə mənadan dəm vururlar.

Kamil insanlar məcaz işlərdə də,
Açıq gözlərlə həqiqətə baxmışlar.

Dünyada nəqşlər görsələr də,
Onlar hamısı nəqşbəndlik istərlər.

Xoş o könül halına ki, özün məcazdan,
Xilas edib, başını ucaldar.

Xoş o adamın halına ki, daim riyasız,
Həqiqətdə özünü fəna edir.

O ki mən qoca və gücsüzün idrakına uyğun idi,
Və ağlar, zəlil ürəkdə pünhan idi.

Şirin sözlərlə şərh etdiın onu,
Əgər qəbul olarsa, budur, vəssəlam!

**Vər. 271b**

## HƏQİQƏTİN MƏNASI HAQQINDA AGƏHİN CAVABI

Saqi, ey həvəs camına bağlı olan (vurğun olan),
Karvan keçdi, daha zəng səsi yoxdur.

Nisyan (unutma) suyundan mənə bir damcı içirt,
Ta ki, ruhum bu qəlbdən çıxsın.

Saqi, ey sevgi düşkünlərinin nuri-çeşmi,
Meydən bir qurtum dodağımıza yetir,

Bir dəm qəm qeydindən azad et,
Bu viranə bədəni abad et.

Qəlbim ağlar bulbul tək olub,
Məkan mələyinin cavabında.

Möhsün, ey Ali-əbanın yetirməsi,
Mustafa bağının yeni qönçəsi.

"Səfa" dostlarını yoxladı,
Həqiqəti, o, vəfa bağının gülü bilmək istədi.

Möhsün, ey kamal və zəka mayəsi,
Sualının mənasını dərk etmək çətindir.

Dürr səpən bir kəlamla sual etdin,
Onun həqiqətli olmasına heç söz yoxdur.

Açıb deyirəm, o şey ki, gəlir xəyala,
Əgər təmiz qəlbinə kədər gəlməsə.

Əbədi olan Allah elə ki, əzəldən,
Məxluqatı yoxluqdan vücuda gətirdi,

Əşya qara torpaqdan yarandı,
Otdan,sudan, havadan, özü də səhvsiz.

Öz kəramətindən insanı, nitqdə və hünərdə,
Bütün məxluqatdan üstün edib.

Cismimiz, əqlimiz, ruhumuz, bütün canımız,
Ünsürlərdən tərkib tapıbdır.

Ruh və ağıl, can və hiss (nəfs) birdir,
Bütün bunlar, şübhəsiz, onlardan olub.

Nəfs və hiss həqiqətdir,
Bu isə ünsürün qəlbində var idi.

Nəfsdəki işıq Allahın feyzindəndir,
Bu, Allahın mərhəmət xəzinəsindəki bir gövhərdir.

Nəfs mələklərdən ayrılmışdır,
Doqquz fələkdən insanın bədəninə enmişdir.

Ruh mücərrəd bir gövhərdir,
Bədənlərdə olan bir gövhərdir.

Biz isə özümüzdə qulaqdan və başdan başqa bir
şey tanımamışıq.
Yeməkdən və yatmaqdan başqa bir şey nəzərimə gəlmir.

* * *

Onun nəfsi həqiqətdən və söhbəti,
Peyğəmbərlik kəlamlarından ibarət idi.

Xalq öz nəfsini, tam yol göstərəni tanımalıdır,
Peyğəmbərlərin sonuncusunun sözünü dərk etməlidir.

Öz nəfsini tanımayan şəxs,
Allahın təkliyini necə dərk edə bilər?

Biz öz gövhərimizdən baxəbər olsaq,
Torpaqdan yaranmış cismimizlə fəxr edirik.

Cismi barədə fikirləşən şəxs,
Öz nəfsindən necə agah ola bilər?

Qeyd-şərt tələlərindən özünü qurtarmaq üçün,
Özünün cismini yol azmaqdan qoru.

Özünü həyat eşqindən ayır,
Axirət dünyasına bir addım yaxınlaş.

Ey iti fikirli, o dünyadan qulağına,
Çağırış səsi çatır.

Nə qədər ki, qol-qanadın qığılcımdan od tutmayıb,
Söz bura çatdıqda, ey Agəh, daha uçma.

## NƏVVABIN "MƏCLİSİ-ÜNS" ÜZVLƏRİNƏ İKİNCİ SUALI

Ey əzizlərim, ey ürəfa əhli,
Ey tərif edənlər, ey həqiqət söyləyənlər.

Nəyə görə "Beytüs-səfa" bağlandı?
Nə səbəbə vəfa məclisimiz bağlandı ?

Məgər hikmət gülşəni taracmı oldu?
Və ya sinələr qəm oxuna hədəfmi oldu?!

Bəlkə söz gülüstanına birdən-birə,
Zəhərli xəzan yeli əsdi ?

Bəlkə Fərhad məhv olmuşdur ki,
Daha Bisütundan külüng səsi gəlmir?

Bəlkə də söz quşu (ənqa) kimya tək,
Dağlıq yerdə birdən yoxa çıxdı ?

Növrəs qələminin səsi kəsilən kimi,
Bülbüllərin də ahü fəğan səsi daha gəlmir.

Zatı pak olan Məxfi şeirləri də,
Dirilik suyu kimi yoxa çıxmışdır.

Məmai və əsərlərindən əsər yoxdur,
Əsər yoxsa, onu da tanımaq olmaz.

Gecə qara, yol qorxulu, hər yerdə qəm,
Nə məş'əl işığı vardır, nə də gecə gözətçisinin məş'əli.

Agəh də həqiqət sirrindəm dəm vurdu,
Üzünü hikmət ənliyi ilə bəzədi.

Mərhəba bu xoş kəlama,
Mərhaba belə gözəl kəlama.

Maşallah, sənin sözün adama can verir,
Adamın ruhuna çox qüvvət verir.

Ey bu çəmənin yeni yetişmiş Növrəsi,
Nə işlə özünə xidmət edəcəksən?

Sənin "Səfa" qardaşlarından qorxun yoxdur,
Yainki dünya üzündən vəfa yox olmuşdur?!

Ey şeirləri tərifə layiq olan Həsən,
Afərin sənin gövhər nəzminə!

Məqsədinin uzaq mənzilinə çatmış olan.
Sözünə afərin, yüz afərin!

Mətləb məğzinin kələfinin ucu göründü,
Onu hər tərəfə, hər yana çəkə bilərsən.

Müşk əgər bağlı yerdə də olsa,
Onun ətri damdan-bacadan ətrafa yayılar.

Əgər həqiqətən üzündən pərdəni açsan,
Üzün və uzaq mətləb peyda (kəşf) olar.

Sənin adına Kaşifi təxəllüs oldu,
Bu həm də sənin yaxşı yetirən adına ləqəb oldu.

Ləqəblə şeir qoşmaq daha yaxşıdır,
Sirlərin gövhərini açmaq daha xoşdur.

Kaşifa, ey həqiqət sirlərinin kaşifi,
Sənin məqsədin günəş kimi şəfəq saçmaqdadır.

Eşq nədir və bu dünyada aşiqlər kimdir?
Ürək və candan bu eşqin müştaqı kimdir?!

Bu, həqiqətdən və ya məcazdan anlaşılar,
Çünki sirri sirr əhlindən başqa heç kəs anlamaz.

Bunu öz kitabında fərmayış edir,
O cavanların, qocaların şeyxi - şeyx Bəhai.

Ki, aşiqlik elmindən savay ayrı elm yoxdur,
Qalanı bədbəxt iblisin uydurmasıdır.

Gözəl üzə vurula bilməyən şəxslər,
Ona yaxınlaşıb bağlana bilməz.

Aşiqlik nədir, o yar kimdir?
Eşq nə olan şeydir, zünnardan məqsəd nədir?

Hər kəs ki, o nigarın eşqindən dəm vurdu,
Axırda ağlar qaldı.

Bu halı qarışmışın təb'inin bülbülü,
Dərd, qəm və məlaldan yarımcan oldu.

Öz qürur və kibrindən bu yazıq Nəvvab,
Qarışqa kimi torpaqda yıxılıb qalmış.

Nə gülüstan fəzasında uça bilir,
Və nə tikan altda bir an sakitləşə bilir.

**Vər. 274a**

## MİRZƏ HƏSƏN KAŞİFİNİN NƏVVABIN EŞQ HAQQINDA OLAN SUALINA CAVABI

Saqi, ayağa qalx və mey (camı) gətir,
Mey üçün məni nə qədər həsrətdə qoyacaqsan?!

Dost xatirinə mənə bir damcı mey ver,
O damcı mənə bir dünyadan yaxşıdır.

Mən o meyi istəmirəm ki, can alır,
Başımdan ağlımı, ürəyimdən imanımı aparır.

O ruh verən meydən gətir, ey saqi,
Ki, məqsədə doğru yönəltsin.

Qəbul əhlinin zümrəsinin başçısı,
Peyğəmbər nəslindən olan seyid.

Mustafa bağında olan o sərv boylu,
Bizim eşqimizi təhqiq edir.

Ey bikəslərin dadına çatan Allah,
Ey bütün məzlumların həmdəmi!

Mənim coşqun təb'imə qüvvət ver,
Nitqimin bülbülünə nitq ver.

Ey elm və sənətin sədrində duran seyid,
Ey bu dünyada bilik və səxavət sahibi.

Elə ki, "künti-kənzən" hədisi* əyan oldu,
Eşq birdən həmin dəm pevda oldu.

Eşq dünyanın icadının baisi oldu,
Aləmin yaranmasına eşq bais oldu.

Eşq vəfa əhlinin ürəyinin meracıdır,
Eşq uluların xəzinəsinin açarıdır.

Eşq binəvaların yol göstərənidir,
Eşq aşiqlərin Cəbrayılıdır.

Eşq qaranlıq gecələri işıqlandırandır,
Eşq vəfa əhlinin ürək güzgüsüdür.

Eşq İsanı bu fəna dünyadan,
Aparıb dördüncü göydə yerləşdirdi.

Eşqin sirrindən agah olan tək,
Musa da Allahla danışan adlandırıldı.

Böyük Allah Nəmrudun atəşini,
İbrahim Xəlil üçün gülüstana çevirdi.

* "Mən gizli bir xəzinə idim" – məşhur hədisdir.

Mustafanın nəsibi eşq olduqda,
Allah yaxınların arasında yer tapdı.

Eşqin müjdəçisi canandan xəbər gətirəndə,
Mustafanı göylərə qaldırdı.

Mürtəza Əli ibadət mehrabına qərq olan tək,
O da şövq və görüş girdabına qərq oldu.

Eşqin atəşi elə şöləlləndi ki,
“Ya Allah” deyib, canını tərk etdi.

Ənbiyaların müddəası eşq olmuşdur,
Kərbəla macərası da eşq olmuşdur.

Neynəva şahı eşqin Minasında,
Dostun xəyali ilə bəlaya düşdü.

Qurbanlıq üçün yetişmiş iki tənə,
Kəfəndən xələt verdi o.

Xoş o kəslərin halına ki, qəlbi eşqə verib,
Bəli, bəli, canını eşqə qurban verib.

Ey şirin sözlü, mənim fikrimcə,
Mətləb dediklərimdən ibarətdir, vəssalam.

Sonra ey mir, ey ustad, ey pir,
Ey ariflər bəzminə başçı olan.

Kaşifi ləğəbini bizə əta etdin,
Ey ali nəsəbli ulu seyid.

Kaşifi gərək gizli sirlərdən,
Baxəbər olsun, bəyan (kəşf ) edə bilsin.

Mən hara, sirlərə vaqiflik hara?
Mən hara, belə işin kəşfi hara?

Dünyada aşiqlər adsız olurlar,
O aşiqlər adsız, nişansız olurlar.

Mahiyyətin əsl məzmununu bizə şərh et ki,
Ürəyimiz onun mənasından səfalansın.

## MAHİYYƏTİN NECƏLİYİ HAQQINDA MİR MÖHSÜNÜN HƏSƏN KAŞİFİYƏ CAVABI

Kaşifa, ey gizli sirrin kaşifi,
Ey kəlamı zəmanə əhlinin iftixarı.

Ey söz düzən, bəlağətli, haqq tərəfdarı,
Haqq danışan, haqq axtaran və haqq tanıyan,

Ey bütün rəmzlərin rəmz öyrədəni,
Sənin rəmz anlamağın işıqlı gündən də parlaqdır.

Nəzmində mütləq meyar vardır,
Sən sirlərin mütləq kaşifisən.

Sonra, ey yüksək rütbəli arif,
Ey ariflərin bəzmində hörmət sahibi.

Mahiyyətin əsl mənasını bilmək istəyirsənsə,
Bu təb'və məlal ilə ərz qılım.

Dünyada olan hər bir şeyin surəti vardır,
Və hər surətin də bir mahiyyəti vardır.

Sözsüz, hər bir hissi olan şeyin,
Keyfinə (keyfiyyətinə) mahiyyət sidq etmişdir.

Əgər bir şeyin üzünü (üstünü) açsan,
Mahiyyət əyan olur.

Çünki zatın əsli o şey üçündür,
Zatın əsli ilə sifət başqa-başqa şeylərdir.

Təb', zat və surət hamısı bir yerdə,
Materiya halını alır, lakin fərqli halda.

Elə ki parçalandılar, ondan mahiyyət,
Qızıl mədən torpağından ayrılan kimi, nümavan olur.

Mahiyyət keyfiyyətin içində,
Dəmirdə qızılın olduğu kimidir.

Çün varlıq mahiyyətdən asılıdır,
Mahiyyətin də bir surətə (formaya) ehtiyacı var.

Bu kateqoriyalar ayrılıqda ola bilməz,
Onlar bir-birinə möhtacdırlar.

Şəriət, məntiq, astronomiya, təbiət və hikmət əhli,
Hərəsi elə bir sirrə qail olmuş ki, açılsa, mətləb çox uzanar.

Dünyada mövcudun və hadisənin,
İnsan və ya başqa canlı olmağından asılı olmayaraq,
mahiyyəti vardır.

Tək, qədim və pak olan Allahın zatından başqa,
Onun bütün keyfiyyəti bizim təsəvvürümüzdən yüksəkdədir.

Bu gördüklərimizin hamısı sonradan əmələ gəlmişdir,
O elə qədim varlıqdır ki, ona bu sifətlər yaraşmaz.

Əgər desən ki, Allahın da mahiyyəti vardır,
Bu mahiyyətin bizimkiylə fərqi yeganəlikdir.

O bizim anlağımızdan, sorğu-sualımızdan,
Şüurumuzdan uzaqdır.

Gərçi hər məkanda özünü göstərir (zühur edir),
O hər müqayisədən və gümandan yüksəkdir.

Məqsədimiz üçün fəza darısqal olduğundan,
Nəvvab bu qədərlə kifayətləndi.

**Vər. 276b**

## MİR MÖHSÜN NƏVVABIN ÇƏTİNLİKLƏRLƏ ÇULĞAŞAN XƏYALINDAN VƏ ONUN YALANÇI BOŞBOĞAZLIĞINDAN “MƏCLİSİ-ÜNS”Ə ŞİKAYƏTİ

Ədalətli olan “Məclis”, yetin imdadıma bir dəm,
Bu bipərvayə əmr eylin, bu nə şurü nə qövqadır?

Xəyalın söyləyir hər dəm mənə: Key aşiqi-bidil,
Gəhi adım qoyar qumri, gəhi söylər ki, şeydadır.

Əgər mən aşiqi-zarəm, mənə mə’şuq olan kimdir?
Mənə bu sözləri bağlar, bu nə növ’i-müəmmadır?

Yetişdi sinnimiz sittinə, leykən bir usanmaq yox,
Bu nə şurişdi kim, salmış bu aləm içrə peydadır?

Məni yoldan iraq eylib, gəhi min nazilə söylər,
Ki yarın qəddi-zibası qamu nemətdən üzmadır.

Behişti axtaran kəslər, cinanə meyl edənlər həm,
Nigarın xalü xəttü təl'əti firdövsi-ə'ladır.

Gəhi ol taqi -əbrusin edir taət üçün qiblə,
Həcər xalı, ləbi zəmzəm, səri hər sirrə daradır.

Gəhi nisbət verir  yarın qəddini nəxli-tubaya,
Gəhi sərvü gəhi ər'ər, gəhi şümşada həmtadır.

Gəhi eylər məni Məcnun xəyalım, gah divanə,
Behəmdüllah, nə Məcnunam, nə fikrim vəsli-Leyladır.

Məni rüsva edibdir bu pərişan güftgu yeksər,
Yenə fikrində Vaqimdir, yenə zikrində Əzradır.

Yəqin meyl etmənəm ol nərgisi-xummara, gər etsəm,
Təni-lərzəm ruxi-zərdimdən, əlbəttə, hüveydadır.

Nigarım, novbaharım, gül'üzarım söyləyir hər dəm:
Nigarım kimdi, yarım kim, baharım nərdə peydadır?

Hanı Kə'bə, hanı Zəmzəm, Həcər qanda nümayandır?
Hanı ol sevdiyim yarın vücudu, yoxsa ənqadır?

Hanı Leyla, hanı Əzra, mənim onlara nə dəxlim?
Nədir həllay-bullay sözlər ki, bu zalımda inşadır.

Bu nə xəlvət, bu nə şahid, bu nə saqi, nə peymanə?
Nə böhtandır mənə söylər, bu nə ziştü nə zibadır?

Belə işlər biruz etmiş nə vəqtə məndən, ey yaran,
Yetin imdadıma kim, bu nə sövdadır, nə səfradır!

Nə bəngə, çərsə mötadəm, nə tirvak atmanam, billah,
Bu həzyanlar xəyalidir, başında bu nə sövdadır?

Bu nə şuridəlikdir kim, məni salmış bu aləmdə?
Həsən kəşf eyləsin bu sirri, çün əsrarə danadır.

Məmai lütf edib, imdadə gər yetsə, kərəm eylər,
Belə hikmətlərə, billəm, cənabı çox təvanadır.

Əgər Agəh məni agəh edə bu sirri-pünhanə,
Ki, bu əsrari-pünhanlar nə gənc içrə hüveydadır.

Özüm inşad edən şerin özüm mənasını bilməm,
Nə qamətdir, qiyamətdir, nə gözlər, məhz şəhladır.

Təcəllayi-rüxi-alı edib mədhuş Nəvvabı,
Belə kim, hiç bilməz, bu nə Sinadır, nə Musadır.

## MİR MÖHSÜN NƏVVABIN ÖZ PƏRİŞAN XƏYALINDAN "MƏCLİSİ-ÜNS" ÜZVLƏRİNƏ İKİNCİ ŞİKAYƏTİ

**19 rəbiüs-sani, 1309 – 23 noyabr, 1891**

Xəyali-hazirə bir əmrü bir nəhy olmadı, yaran,
Mənim odlara yanmağım sizin halə nə müsradır?

Yığıbdır başa o başı edir, hər bir xəyal etsə,
Qılır aləmləri bərhəm, bu nə gəbrü nə tərsadır?

Əgər şahid sizə lazımdı çox, çoxlu güvahım var,
İqamət eyləyim bir-bir əminlərdir, nə molladır?

Güvahım şəm'dir, pərvanədir, həm arizi-zərdim,
Yenə məcruh çeşmimdir ki, hər dəm əşk paladır.

Yenə şahid varımdır kim, biri sabit, biri səyyar,
Dəxi şahid məhi-taban, dəxi Əqdi-Sürəyyadır.

Biri Xani-Qaradaği, biri Bakiyyi-şuridə,
Ki, onlar da mənim kimi xəyalə bəndi bərparadır.

Biri Mirzayi-Növrəsdir ki, o, vaqifdi əsrara,
İla ət-təxsis bu işdə ki, o məndən də danadır.

Girib mehrabi-əbruyə, urum əl müshəfi-ruyə,
Xətü xalü siyəh muyə ki, tahavü fətəhnadır.

Qəsəmlər eyləyim gülgün yanağa, nərgisi-məstə,
Birisi qəmzə məxmuru, biri kəş-şəmsi-beyzadır.

Mühəqqəq oldu çün bu şikvələr ol bəzmi-ürfanə,
Siyasətlə nəzər bir eyləyin, bu özkə dəvadır.

Çəkin zənciri-zülfə boynunu həm paybənd eylin,
Salın çahi-zənəxdana ki, o, bir təngi-mə’vadır.

Özünə Yusifi-Misri deyir hər ləhzə bu idbar,
Həm öz məşuqinə söylür ki, bəh-bəh! Nə Züleyxadır!

Əgər amadə yetməklik sizə lazım deyil, yaran,
Nə vacibdir, nə sünnətdir həmin bir qövli-bicadır.

Edin mə’lum ta “Beytüs-səfay”ə eyləyim şikvə,
Deyirlər kim, ədalətə “Səfa” əhli müsəffadır.

“Fəramuşan”da “Üns” əhli qoyub məzlum Nəvvabı,
Xəyaliylə cədəl eylər ki, bunlar nə təmənnadır?

**Vər. 278a**

**Yuxarıdakı şeirləri “Məclisi-üns”ə yazdım. Bütün beytlərdə onun cavabı aydın olmasına baxmayaraq, onlardan kafi cavab gəlmədi. Çünki avam və mənasız olduğundan məktəb uşaqlarının da gülməyi gələrdi. Ona görə də bu dəftərə yazmağa layiq olmadı. Və Mirzə Növrəs aşağıdakı cavabı əsəbi halda yazır:**

Əya, Nəvvabi-ali, məntiqi-nitqin nə guyadır,
Bu elmində xassə zahirü-batin də daradır?

Nəticəbəxş olub suğrayi-kübra üzrə ünvanın,
Bu tərtibü qəziyyə, filhəqiqə, elmi-kübradır.

Bu nəhv ilə əgər sərf olsa elmin, mərdümi-aləm,
Rümuzi-mazivü müstəqbələ hər halda danadır.

Olubsan baniyi-zici-fələk, ey mürşidi-kamil,
Nücum əhlinə səndən xətti-üstürlab peydadır.

Yetişdi nameyi-mişkin xitamə “Məhfili-üns”ə,
Onun əhli həmişə sən kimi mövlaya mövladır.

Əya, Nəvvabi-ə’zəm, miri-əkrəm, mürşidi-kamil,
Sualın xoşdur, amma xahişim müşkül müəmmadır.

Sual etmişdin, ey növbavə, xətmi-rüsul bizdən:
“Nigarım kimdi, yarım kim, baharım nərdə peydadır?"

Şikayət etmisən, ağa, sən öz ə’la xəyalından,
Xəyalın qüvvəsi hər bir qəvadən xeyli əqvadır.

Buyurmuşdun: Səfa ilə xəyalm rəf'ini eylin,
Sualın aləmi-mə'nada axir eyni-mə'nadır.

Xəyalat olmasa, adəm üçün təskini-qəlb olmaz,
Rüsux eylər əruq içrə, ona hər yerdə mə'vadır.

Odur, dünyavü mafiha hər əf'al üçün bais,
Düşən bu aləmə ondan həmişə şurü qovqadır.

Gəhi Məcnunu eylər aşiqi-hüsnü rüxi-Leyla,
Gəhi Vamiq üçün Əzra vüsalı çox təmənnadır.

Gəhi dərd artırır hər dildə, gəhi şadman eylər,
Ki, bilməm başımızda axırı bu necə sövdadır.

Odur zənciri-zülfə yüz könüllər eyləyən pabənd,
Cahanda aqilü divanəlik ondan hüveydadır.

Xəyali-fasidim, ağa, kəsalət artırır hər dəm,
Budur ancaq kim, ol eşq aləmində ruhəfzadır.

Özüm də hər zaman qərqəm bu dəryayi-xəyalata,
Mənə dünyada sufistanlıq rəsmi güvaradır.

Münəqqəş olmayıb ancaq sənin lövhi-zəmirində,
Qəm etmə, mübtəla bu dərd üçün ə'lavü ədnadır.

Düçar olsun onu, ya Rəb görüm ki, tiri-müjgana,
Fəraqətlik mənə yoxdur, başıma təng dünyadır.

Səbur ol, şikvə qılma, məhv qıl dildən xəyalatı,
Belə təzyihi-övqat eyləmək, Nəvvab, bicadır.

Xəyalatın həsarın bərhəm et, şah, təsəvvürlə,
Təsəvvür hər qəvayə cism içində bəs ki, daradır.

Məni mə'zur tut, Nəvvabi-ali, ruzigar içrə,
Həmin bu Növrəs əbyatı xəyalat ilə inşadır.

* * *

Bu gecə bəxtim gör necə müsaidə etdi,
Yarım mənim yanıma naz ilə şuxluqla gəldi.

Görəsən, bu gün bayrammı və ya büsatmıdır ki,
Mən belə xoşbəxt və xoşkirdaram?

İki gözüm surətinə dikilib və qulaqlarım sənin
əmrinə müntəzirdir,
Bütün vücudumla bu gecə ayığam.

Mənə xoşdur, əgər o dilbər öz saçı ilə,
Məni dara çəksin.

Mən qara fikirli rəqiblərimin qorxusundan,
Bir qönçə tək ürəyimin qanını içərəm bu gecə.

Əgər zehnimə hicran qoxusu gələrsə,
Gözlərimdən qanlı yaş axıdaram bu gecə.

Məbada yarın zülfünü Nəvvabın əlindən,
Bu çərxi-fələk çəkib, çıxara bu gecə.

* * *

O vaxtdan ki, öz ürəyimi köhnə dünyadan üzmüşəm,
Dayələr məni yuyundurub bələdilər.

Ey qana dönmüş ürək, qalx ayağa, şadlıq et,
Ki, bundan artıq fələk bizə şadlıq verməz.

Artıq qalan meyi gətir və bu meyi iç qurtar ki,
Məhşər qorxusu çəkməyəsən.

Həsrət, dərd, qəm, zillət, kədər və ayrılıq,
Mənim bədənimi ayın haləsi tək əhatə etmişdir.

Nəvvabın əlindən tutsan, bu təəccüblü görünməz,
Onun iqbal günəşi sənin eşqindən yaranmışdır.

Əgər mənim ayım (ay üzlüm) üzündən pərdəni açsa,
Öz işığıyla günəşi xəcil edər.

O, mənim xumar gözlü nərgizim, şux dilbərimdir,
Daha şərabın məstliyinə nə ehtiyacım var?

Bal dodağı qənddən də artıq damır (şirindir),
Təşnə  adamın xoşuna sudan artıq gəlir.

Əgər onun xəyalı adamın yuxusuna girsə,
Ayrılıq dərdi adamın canından və qəlbindən çıxar.

Onun eşqinin sevdası başımdan çıxmır,
Susuz adama bulaq nə qədər qiymətlidirsə, bu sevda da
mənə elə görünür.

Nə qədər naz və qəmzə ilə könül mülkünü dağıdacaqsan,
Bu ürəyi xarab olmuşu nə qədər qana batıracaqsan?

Ürəyim məğlub oldu və qəm mühasirəsində qaldı,
Ud, rübab və mahnıya daha coşğunluğum qalmadı.

Nəvvab eşqin yolunda yorulub qaldı,
Hanı Xızr hümmətli adam ki, bir savab etsin?

* * *

Kim məndən ulduzların şahına (günəşə) xəbər apara bilər ki,
Ədalət axtaranın səsini eşidə bilsin?

Nə qədər üzünə fanus şəm'i tək hicab çəkəcəksən,
Ay üzünə saçlarınla bulud çəkəcəksən?

Ey sərv boylu, sərvi-xuraman kimi gedirsən,
Ey günəş üzlü, başına zərli papaq qoyursan.

Daima sənin qəmzəndən ney kimi fəğan edirəm,
Pəjmürdə şah bülbülü tək ahü nalə edirəm.

Nə qədər sənin fərağında gözü yaşlı qalım,
Ahımın tüstüsünü ərşdən keçirim?!

Səni Kə'bədən axtarım, ya Kərbəladan,
Məsciddən istəyim, ya atəşgahdan?

Qiyamət günündə ətəyindən yapışaram,
Ayağına ataram bu ölmüş canımı və ürəyimi.

Sənin eşqini zamin tutaram məhkəmə günü,
Günahı öz üzrümə üzr kimi tutaram.

Ey gözəllik padşahı, üzünün nurundan,
Yolunu itirmiş Nəvvabı bağışla.

* * *

Məndən yüksək məqamlı padşaha kim salam apara bilər?
O padşaha ki, ay onun torpağıdır.

Ey badi-səba, sən yazıqların qasidisən,
Dostların sevgisindən ona bir xəbər çatdır.

Ey müşk saçlı ay,  öz üzünün gülüstanından,
Bizə bir ətr itlifat et.

Saqi, yarın eşqinin məstedici badəsin gətir ki,
Bu qanlı və xam ürəyimi bişirsin.

Müddəilərin acığına hər dəm şərab iç!
Utanmaz zahidin sözlərini sən eşitmə.

Mütrib, yarın surətinin gözəlliyini sən üstüörtülü de,
Ki, müddəi kəlamın zövqünü başa düşməsin.

Nəvvab eşq yolunda yorulub qaldı,
Hanı Xızr hümmətli adam ki, onu məramına çatdırsın?

**Vər. 281a**

* * *

Xosrov odur ki, Şirin ağızlı ilə arası saz olsun,
Şəkər dodaqlı ilə gecə-gündüz həmavaz olsun.

Dost yolunda başına Fərhad tək külüng çalsın,
Dost qapısının ağzı həmişə ona açıq olsun.

Cananın vəsli yolunda canından keçsin,
Canbaz dostunun yolunda fədakar olsun.

Aşiq o deyildir ki, həmişə şənlik axtara,
Aşiq odur ki, dərdə-qəmə şərik ola.

Hər yerə baxarsa, yarın cilvəsini görsün,
Kəbədə, Bağdadda və ya monastrda olsa da.

Cananın surəti fərağında şikayət və ah (nalə) etməsin,
Dərd və qəmlə uzlaşsın.

Nəvvab təki dostun surəti xəyalıyla can versin.
Bülbül kimi bağçaya pərvazda olsun.

* * *

Ey ruhi-rəvan, səndən canımın və ürəyimin gileyi var,
Ey can bağçası, səndən gülüstanın gileyi var.

Şümşad qamətindən, lə’li-ləbinin həsrətindən,
Cənnət ağacı Tubanın və lə’li-Bədəxşanın gileyi var.

Günəş kimi parlayan üzünün nurundan,
Qulamlar İrəmdə, hurilər cənnətdə gileylənir.

Ay üzlüm naz ilə eyvana çıxsa,
Onun həzzində Venera (Zöhrə) və Saturnun (Keyvan)
gileyi var.

Ol büti-tənnaz əhdə vəfa etdi, vəli,
O qədər cəfa etdi ki, peymanın gileyi vardır.

Görüş vüsalının ətrini bir anlığa görməyən sərgərdan rəqib,
Onun haqqında giley edir.

Nəvvab hicran gecəsində elə nalə çəkir ki.
Onun naləsindən fəqanın gileyi vardır.

## NƏVVABIN MİRZƏ MUXTARA CAVABI

Zahid, sən bu yaxşı və pislikləri gəl oxuma!
Huri və behişti özün üçün axtar.

O yar ki, bütün kainatda cilvələnir,
Kə’bədə, monastrda və sinaqoqda da görünür.

Daha mənim zahidin sözünə nə ehtiyacım var,
Biz hər iki ovcumuzu onun kərəmiylə doldurmuşuq.

Bahar gəldi, amma heyf ki, biz bu çəməndə,
Ay üzlü huriləri və mələk üzləri görmədik.

Gül ətrini canımla hiss etdim,
Ənbərə oxşar zülfunün ətrini duydum.

Bu gün qənimətdir deyə, bağın seyrinə çıx, ey könül,
Çünki sabah, ola bilər, başının altına kərpic qoysunlar.

Yoxluq viranəsilə yollanmağın yəqindir,
Bu taleyi şah da, gəda  da qəbul etməlidir.

Nəvvab eşq yolunda yorulub qaldı,
Onun varlığını od yandırdı.

* * *

Allahdan gecələr xoşbəxt tale arzulayıram ki,
Sənin hüzurunda günlərimi şadlıqla keçirim.

Hicran əlindən ürək yandıran ahım ulduzlara çatır,
Heç kim bu ürəyi yanan qədər nalə etmir.

Sənin məskənin mənə cənnət kimidir,
Dünyanı işıqlandıran günəş sənin üzün kimi ola bilməz.

Kipriklərin ox kimi hər dəm bu yanar ürəyə batır,
Qaşların kaman təki ürəyə yüz ox atır.

Üzünün işığı ürəyimin qaranlığını işıqlandırdı,
Bayram ayının günəşi novruzu işıqlandıran kimi.

Hər gecə, gündüz sənin vüsalını xatırlamaqla yaşayıram,
Belə günləri Nəvvab qənimət sayır.

**Vər. 282a**

## 1314-CÜ İLDƏ ŞABAN AYININ ORTASINDA (avqust, 1896) BARAT GECƏSİ NƏVVAB BU QƏZƏLİ  DEMİŞDİR

Bayram və barat gecəsidir, nə deyim, ey yar,
Sənin gözəlliyini vəsf etməkdən başqa zikr və duam qalmayıb.

Əlhəmdüllah ki, yenə bir bayram gördüm,
Feyz almağa yenə bir ümidim də oldu.

Sənin kuyinin Kə’bəsini bütün varlığımla axtarıram,
Sənin rüxsarının nurunu bütün səyimlə axtarıram.

Mən sənin pak dərgahından başqa bir qapını döymərəm,
Qoy zahidlər nə deyirlər desinlər.

Sənin rüxsarının fikrində olmaq mənim dərdlə dolu
ürəyimə dərmandır,
Sənin sözünü danışmaq da mənim dağlı sinəmə şəfadır.

Yüz əziyyətlə də olsa, sənin dərgahından ayaq çəkməyəcəyəm,
Fələk təki vəfa yolundan zərrə qədər də sapınmayacağam.

Sənin vəslinin şövqü, dərdi, ələmi, atəşi,
Belə ağır yüklə mən o dünyaya yollanmaram.

Sənin hüsnünün cilvəsi Nəvvabın ürəyinə düşsə,
Əbədilik suyundan içmiş Xızr kimi daima yaşar.

**RÜBAİ**

Qış fəslində, ey gülüzlü sənəm,
Bülbül kimi pəjmürdə və zar idik.
Güllər indi çəməndə açıldı,
Bülbül fəqanə gəldi və nalə çəkdi.

**RÜBAİ**

Ey könül, qalx gedək gülşənə sarı,
Nə əkmişsə onu da biçək.
Ömrün gülşəninə xəzan küləyi əsir,
Ağacların yarpaqları tək pərakəndə olaq.

**NƏVVABIN ALLAHA MÜRACİƏTİ**
**1310-CU İLDƏ YAZILMIŞDIR (1892-93)**

Ey nəfəs, çox da bu dünya evində,
Bica işlə məşğul olma!
Ey saqi, minalı cama mey tök ki,
Səndən meydən başqa təmənnam yoxdur.

O ay üzlü pərivəş canımı aldı,
Bədənimdən tabü təvanımı onun məğrurluğu apardı.
Saqi, haradasan, o pak su ilə,
Allah xatirinə, mənim camımı doldur.

Mən nə vaxta qədər eşqdən danışacağam,
Zikr edəcəyəm ki, onun misli yoxdur?
Dalbadal "ya hey" oxuyacağam,
Amma ondan heç nişanə tapmayacağam?!

Canım onun saçının telinə qurban,
Onun yükünü öz çiynimdə daşıyacağam.
Onu axtarmaq üçün məhəlləsinə qaçaram,
Və onun arzusunda ölərəm orada.

Onun hicrində ürəyim qana döndü,
Düz qamətim əyildi onun qəmindən.
Qəddim Məcnun söyüdü kimi əyildi,
Leyli tərəfə bir yol tapmadım.

Keçmiş günlərdə dərd və möhnət,
Dilbər öz aşiqinə rəva görəndə.
Aşiqin dərmanı ney və mahnı oldu,
Vamiqin də şəfası Əzranın vüsalı oldu.

Ey zahid, və’zinlə məni öz yolumdan çıxarma,
Məni quyuya sarı aparma.
Ki, o özü bilir ki, mənim günahım çoxdur,
Daha ondan nə təmənna?

Hanı o müğənni ki, neyin naləsinə,
Ondan (yardan) bir soraq, nişan versin.
Yusif camalını, Key calalını,
Mənə müjdə gətirənlərə bəxşiş edim?

Yarın hicrindən zar və qəmgin,
Ahın Pərvindən, Aydan güzar etdi.
Ey Nəvvab, sən zərli camını qaldır, iç,
Eşqinin dərdi ilə müdara et!

Mən də Mənsur kimiyəm, məqsədim yardır,
Ulduzları sayıram, ürək biqərardır.
Yarımın şövqündən bədənim odla doludur,
Hər yerdə ki, tikan var, orda gül də vardır.

Ümidsizlik və uyğunsuzluqdan,
Aciz və sınmış kimi idim.
Nagah yarımdan xəbər gəldi ki,
Ey kor, yaxşı bax.

O kəsi ki, istəyirsən, gözünün qarşısındadır,
Ürəyinin gözü ilə bir də nəzər et.
Ay üzlüdən aya ağılla nəzər sal,
Ərşi-ə’ladan ta ki, yerin dərin qatlarında gör.

Hər yerə baxsan, onu görərsən,
Hər yerdən köçdün, onu görərsən.
Xeyir və şər işlərdə də onu gör,
Səhrada, boşluqda onu gör!

Kainatda hər bir şeyə baxsan,
Hər görsənən şeydən sənə əyan olar.
Cismə candan da daha yaxındır,
Cümlə əşyadan aşikar olur.

Sudan və qurudan, ayələrdən və əsərlərdən,
Qurudan, yaşdan o əyan olur.
Dağlardan və çöllərdən, ağaclardan və güllərdən,
Kə'bədən və kilsədən zühur edər.

O, cümlə cahandan görünür,
Parlaq işıqdan da, gizli yerdən də.
Musa heyrətdə, İsa isə heyrandır,
Kə'bədə müsəlman, kilsədə xaçpərəst də onlar kimi...

Elə ki, gizli yarı gördüm,
Allah deyə-deyə üz üstə düşdüm.
Titrək bədənlə, ağlar gözümlə,
Dedim sənsən, sən, haqda heç bir kəs.

Cümlə əşyada onun şəklini gördüm,
Hər gizli və aşkar şeydə onu gördüm.
Daha zahidin moizəsindən mənim nə təmənnam?
Mənə bica iş lazım deyil.

Gizli sirr bu cür bəyan olduqdan sonra,
Zahidin yalanı ay kimi əyan oldu.
Sən dediyin tək olmadı,
Onun gizli şeyi qarşımda ifşa oldu.

Gah sorağını Kə'bədən verdin,
Gah məbəddən xəbər verdin.
Gah əqlinə etimad etdin,
Gah məsciddə, gah kilsədə.

Hanı dilkəş nəvasının müğənnisi ki,
Suyuma atəş vurub, məst etsin?
Saqi, gətir o pak sudan ki,
İndi şərabım ləzzətlə nuş olur.

Ey Nəvvab, büllur qədəhi qaldır iç,
Qəmgin zahidin acığına.
Üzünün rəngini rəngli lələ oxşat,
Sən Allah, fürsəti əldən vermə!

Başından şeytan qürurunu çıxart,
Ürəyindən müsəlman nifrətini çıxart.
Paxıllığı və tamahı sən uzaq et.
Ürəyini sən pak və saf et.

İşlərində təvəkkül et ki,
Muradının şaxəsi gül yetişdirsin.
Allahdan başqa heç kimə bağlanma,
Hər binəvanın halını soruş!

Zahidin sözüylə ürəyini dəyişmə,
Abidin fe'lilə sən Allaha baxma.
Bunların iman gözəlliyi yoxdur,
Ənqa quşu tək onlardan qaç.

Duz-çörəkli dostuna sən süfrə aç,
Dil dostunu dil ilə yola sal.
Canbaz dostunun yolunda candan keç,
Düşmənlərinlə müdara et.

Fürsəti bir an belə əldən vermə,
Ruzi üçün ürəyinə qəm gətirmə.
Öz qismətindən nə az, nə də çox,
Ey canım, görməzsən.

Xoşbəxtlərə nəzər salma,
Aşağıda duranlara sən nəzər sal.
Alçaq təbiətlilərdən həzər et,
Şərəfsiz adamlarla oturub-durma.

Əgər sən bu dünyada kamil adam olmaq istəyirsənsə,
Səfil adamla bir an belə oturub-durma.
Belə adamlardan qaç, ey aqil kişi,
Tamahkarlardan, acgözlərdən, mollalardan...

Alim əgər haqdan qaçırsa,
Şəriəti pozub bid'ət edirsə,
Küfr edib dil açırsa,
Allahsızlığı özünə rəva görər.

Hər müridə məzhəb yox oldu,
Puldan ötrü haqqı satar.
Bica sözə yüz il çalışar,
Hiylə ilə gədanı  tələyə salar.

Dinə, imana xələl gəlməz,
Ə'yan nəslindən, şahlar sinfindən.
Molladan, müridbazlardan başqa,
Onlar Allahın dinini viran etdilər.

Əgər huşyarsan, cəhalətdən qaç,
Hümmət et, ağlınla ölç.
Küfrdən qaç, pəhriz saxla,
Dini küfrlə qarışdırma.

Əgər ağlın varsa, Nəvvabı eşit,
Bu nəsihətləri huşla qəbul et.
Özünü cəhalətlə girdaba salma ki,
Hər iki dünyada kərəm sahibi olasan.

**Vər. 285a**

## MİRZƏ NÖVRƏSİN NƏVVABA NƏZİRƏSİ

**1314-cü il (1896-97)**

Bizim bu dünyada nə işimiz var ki,
Onun var-dövlətini də axtaraq?
Bu dünya evindəki bica ömürdən,
Təmənnamız eşqdən başqa bir şey deyil.

Əgər dost sevənsənsə, özünü azad et,
Onun yarasına əlac et.
Özünü bu zəncirlərdən azad et,
Ki, vüsalda mütləq fənanı tapasan.

Təslim yolunda razılıq içində ol,
Dostlarınla da vəfalı ol.
Yolunu itirmişlərə yol göstər,
Səfa gözü ol açıq gözlə sən.

Əgər sənin xəyalında yüz arzun vardırsa,
Sən muradının kamına çata bilməzsən.
Əyyamdan (zəmanədən) şikayət etməkdənsə,
Ürəyinin güzgüsünü təmizlə.

Dünyanın bu mənası gizli qalmasın ki,
Axar suyu zəhər kimidir.
Əgər yol adamısansa, bu günəşdən keç ki,
Qəlbdən şadlıq görünsün.

Divanə zahid nə vaxtadək nəsihət verəcək?
Nəsihəti ağıllı adam verə bilər,
Arif adam tərki-dünyalıqla kifayətlənməz (razılaşmaz),
Nə vaxtadək canının hayına ağlayacaqsan?

Əgər şah da olsan, həminsən.
Bir ovuc torpaqdan başqa məkan yoxdur.
Bu əsl vətənə sığınacaqsan.

Dərd əlindən cana gəlmişəm,
Zəmanənin zülmündən qanım qaradır.
Növrəsi danlama ki, çox qəmlidir,
Ey ağamız Nəvvab!

## BAKİNİN NƏVVABA NƏZİRƏSİ

Ey uca göylər,
Nə vaxta  qədər İsa ilə fəxr edəcəksən?
Yarımın hüsnünə tamaşa et ki,
Ona iki yüz Məsih "əhsən" deyib.

Möcüzələrindən Məsih xəcildir,
Musa isə heyrət ümmanına düşmüş.
Bir işarə ilə,
Min İsanı canlandırar.

Zülfünün tələsinə zahid düşmüşdür,
Saçının küfrünə ümid bağlamışdır.
Aydındır ki, onu gözlərimiz,
Gah məsciddə və gah kilsədə görür...

Fərhad yuxuda Şirinin eşqi xülyasında olarkən,
Ondan soruşdum ki.
Onun məhəbbətindən xoş bir şey var?
Dedi ki, yoxdur.

Min aqil Məcnuna fəda düşmüşdü,
O isə qan girdabında idi.

Onun göz yaşının selindən Fərat və Ceyhun,
Dənizə sarı axır.

Canım dərd əlindən doyub,
Qəm görməyən ürək gildir.
Mən bilirəm ki, Yusifin eşqindən,
Züleyxanın ürəyi nə çəkib.

Cah nigarım məni naz ilə öldürür,
Yaramın qanına nə çarə edim?
Cah da işvə ilə məni canlandırır,
Dəstəmaz alıb namazını qılır.

Nəvvaba de ki, halıma küləklər əssin,
Növrəs mənim qəm və məlalımı artırmışdır.
Baki eşqinə, gah Məcnuna,
Gah da Leyliyə nalə çəkirəm.

**Vər. 285b**

## ABDULLA BƏYİN NƏVVABA NƏZİRƏSİ

Ey Allahın nuru, ey rə'na boylu,
Ey şux gözəl, əl-ayaqdan düşdüm.
Canım boğazıma gəldi, üzünü göstər,
Halıma rəhm et.

Ev sərv boylu, oduna yanıraın,
Zülfünün telini üzündən çək.
Ürək ahü fəqandadır, təb'im təşvişdə,
Ürəklər saçına dəyən daraqdan şikayət edir.

Ey ənbər zülflü, ey aya bənzər,
Aləm sənin saçının ətrinə fəda olsun.
Sənin dodağının şirinliyi Kövsərdən yaxşıdır,
Ağzın müəmma məskənidir.

Saçlarının fikrindən gecələr yatmayıram.
Pərişan və ağlar, iztirabdayam.
Eşqin heyrətindən iztirabdayam.
Ona görə ki, qəlbim saçlarının arasındadır.

Dünyanın cövründən canım pəjmürdədir,
Rüxsarının hicranından bilsən ki, necəyəm.

Öz varlığıma şübhə edirəm,
Sanin eşqin bizi rüsvay etmişdir.

Gözünün xumarı qanımı tökür,
Ürəyimin qanı gözlərimdən axır,
Sənin yıxdığın adam,
Dünyaya yüz İsa da gəlsə, qalxa bilməz.

O gur qıvrılmış saçların,
Od görmüş bəd xasiyyətli ilandır.
Gözlərin ahu gozü tək məndən hürkür,
Qara xalın isə bəla tələsidir.
Eşqbazlıqda ustad olan Fərhad idi,
O da Bisütunda yüz nalə çəkdi.

Fərhadı yada salanda ürəyim qana dönür,
Ney kimi məndən nəvalar yüksələr.
Leylidən ötrü Qeys Məcnun oldu,
Çöl və biyaban onun məskəni oldu.

Eşqbazlıqda onun göz yaşı Ceyhun çayına döndü,
Yüz şur və qovğa etdi.
Bu fani dünyada vəfa əhli yoxdur,
Eşq yolunda da həya qanunu yoxdur.

Özünü öyməkdə paklıq yoxdur,
Ürfan əhli ilə gərək oturub-durasan.

Ali Nəvvab şirin sözlüdür,
Baki də Növrəs kimi nəzmdə alidir,
Bu üç nəfər ali-məali bilik sahibidirlər,
Bunu aşkar deyirəm mən Abış!

## KƏMİNƏNİN NƏVVABA NƏZİRƏSİ

Şux dilbər, sənin üzünün hicrindən,
Ürəyim daim şur və qovğadadır.
Bu dərd ürəyimi rüsvay etmişdir,
Daha davam edə bilmirəm.

Nə qədər sənin rüxsarını vəsf edim,
Zülfünü və qara saçların vəsf edim.

Rəna qəddindən, üzündən, ətrindən,
Qönçə dodağından İsa nitqini vəsf edim?

Bu ürək dərdimi heç kimə demirəm,
Sənin eşqinə yoldan başqa bir yol axtarmıram.
Təbiblərdən dərman istəmirəm,
Sənin eşqinin dərdinə ə’zalarım adət edib.

Lakin iki gözüm halıma ağlar,
Bax gör, hicrindən necə canim doyub.
Yaşamağa daha gümanım yoxdur,
Canım o dünyaya köçməyə hazırdır.

Yusifin hicrindən,
Yəqubi-Kənanın gözlərinə ağ gəldi.
Yusif zindanda məskən saldı,
Züleyxa isə öz məkrinin peşmançılığını çəkdi.

Ey külək, o qara zülfün üzərindən əs,
O zülfün çinlərini ayır.
Bir rəsm ilə damağımıza bir ətir çatdır,
O Çin ətrini qoxula!

Mən eşq məktəbində təhsil aldım,
Eşq ağıldan yaranıbdır.
Müəmma elmini öyrənib məşq edirəm,
Onun qönçə ləbinin “yox-yox” deməsinin səbəbini başa düşdüm.

Öz qara xalı, ovsunlu gözləri,
Zülfünün teli və ağ biləyi ilə,
Çox gözəllərə üstün gəldi,
Hanı gözəllikdə onun tayı-bərabəri?

Aya, kim sənin üzün təki ay görüb,
Ya sənin camalın kimi çiçək kim dərib?
Sənin rüxsarın təki rüxsar hələ yaranmayıb,
Sənin gözəlliyin ancaq sərv boylu huridə ola bilər.

Nəvvab bizə həmişə rəhbər olmuş,
Baki də, Kəminə kimi bu cür qəmgindir.
Növrəsin şeirləri yenidir,
Mən onu tanımıram, üzürlüyəm.

Nəvvab ustadımızdır,
        Növrəs və Bakini də o yada salır.
Abış da zəmanədə şaddır.
        Kəminə isə onlar kimi yaza bilməz.

## "MƏCLİSİ-FƏRAMUŞAN" ÜZVLƏRİNƏ, ŞABAN, 1310 (fevral, 1893)

Aşiq oldum nagəhan bir şuxi-bipərvayə mən,
Saldım axır öz-özümü bir əcəb qövqayə mən.

Şövqi-vəsli eylədi Vamiq kimi şeyda məni,
Həsrət öldüm, ey diriğa, yetmədim Əzrayə mən.

Tuf qıldım Kə'beyi-kuyini zairlər kimi,
Yetmədim səd heyf, bir dəm Zəmzəmi-Minayə mən.

Bir qədi tubadan ötrü keçmişəm rizvandan,
Dikmişəm heyrət gözümü bir gözü şəhlayə mən.

Aldı şirin canımı ol xosrovi-xuban, nedim,
Kuhkən tək salmayım səs dağəvü səhrayə mən?

Olmuşam Sən'an kimi məşhuri-bəzmi-xasü am,
Ol zamandan kim, müqəyyəd olmuşam tərsayə mən.

Etmənəm hicr atəşinə səbr, daim söylərəm:
Gəlməyəydim, ey xudaya, bu fəna dünyayə mən!

Çün məcazi eşqdən çəkdim əlim Nəvvab tək,
Bağladım sidqi-dil ilə rəhməti-üzmayə mən.

**Vər. 287a**

## ABIŞ BƏYİN NƏVVABA NƏZİRƏSİ

Olmuşam aləmdə aşiq bir büti-tərsayə mən,
Qalmışam həsrət, nedim, ol gül üzü həmrayə mən.

Qanda görsəm bir qədi sərv, sənubər dilbəri,
İstərəm ta xaki-payində olam çün sayə mən.

Göz görə qanım tökər, bir qəmzəsi min can alır,
Düşdüm axır eşqara bu vərteyi-üzmayə mən?

Şanəvü badi-səbadən xatirim aşüftədir,
Ey dili-bəxtiqara, ta düşməzəmmi payə mən?

Tari-muyi tək vücudum riştəsi lərzan edər,
Zülf sövdasında düşdüm bir belə sövdayə mən.

Oğrun-oğrun qəmzəsi min canü dil yəğmasıdır,
Ey Kəminə, aşiqəm, billah, bu məhsimayə mən.

Ey təriqi-eşqdə hadi olan aşiqlərə,
Çarə qıl bir dəm mənə, qurban olum Həvvayə mən.

Rəhmsiz tərsabeçə eşqində nalan olmuşam,
Etməyim ondan şikayət həzrəti-İsayə mən?

Bakidən bak eyləməz Növrəs, cünuni-eşqdir,
Eyləməz təsir ona Nəvvab, oxur yüz ayə mən.

Abışa, söylər Qaradaği diyari-hicrdə,
Ruzi-vəsli verməzəm, tanri bilir, min ayə mən.*

## BAKİNİN NƏVVABA NƏZİRƏSİ

Kafərəm, cana, səni etsəm bərabər ayə mən,
Verməzəm dırnağını, billah, yüz dünyayə mən.

Yarı peyğəmbər bilib, ta bəndeyi-eşq olmuşam,
Yetməsin yara əlim baş endirsəm İsayə mən.

Qaşü göz lazım döyül tirü kaman çəksin mənə,
Hazıram can verməyə, göz dikmişəm imayə mən.

Qeys Məcnun olmağa Leylidən ötrü fəxrdir,
Qoymuşam canan yolunda can kimi sərmayə mən.

Yüz hədisi-qüds yazsa Abışü Növrəs əgər,
Eylərəm Nəvvab üçün təqrir beş yüz ayə mən.

Gər Qaradağı Kəminə kuyinə yetmək dilər,
Yetə bilməz, taleyim var, olmuşam həmsayə mən.

Bakidir bu dəhrdə, billahi, eşq İsmaili,
Ey sənəm, gör başım əldə gəlmişəm Minayə mən.

* Şeir təzkirənin çap nüsxəsində 19 beytdir.

**Vər. 287b**

## MİRZƏ FATMA KƏMİNƏNİN NƏVVABA NƏZİRƏSİ

Eşqdə sud etmədim, düşdüm dəxi sövdayə mən,
Tapmadım bir sud, oldum böylə bisərmavə mən.

Beytül-əhzanə girib, Züleyxa tək qəm çəkməyim,
Yey deyil ondan düşəm Məcnun kimi səhrayə mən.

Can ağuşun açıb, qəmlər basıb qan könlümə,
Cümlə ətfali-qəmə ta olmuşam bir dayə mən.

Ağlamaqdan qan gözüm çün əksilib nuri-bəsər,
Baxmazam bu dəhrdə ta bir gözü şəhlayə mən.

Kuhü səhrayə düşüb, Məcnun kimi qıldım şitab,
Aradım şaxü budağı, tapmadım bir sayə mən.

Arifü saliklərin pəşminə dəlqin verməzəm,
Dəhrdə, tanrı bilir, yüz ətləsü dibayə mən.

Bulmamışkən əsl ürfanın məzaqın dəhrdə,
Uğradım nahaq yerə bir şuxi-bipərvayə mən.

Kuyi-eşqə girməyə könlüm dəxi etməz həvəs,
Pah pür aşubdur, düşdüm əcəb qövğavə mən.

Xaki-kuyi-dərgəhi-Nəvvab olaydım kaş ki,
Bulmuşam bəxtimi, yetməm rütbevi-ə'layə mən.

Abışa, bilmiş Qaradaği, Kəminə dağlanıb,
Olalı sərkar Növrəs, Bakiyə həmsayə mən.

## NƏVVAB

Yarım niqabını üzündən çiyninə çəkdi,
Üzü gül kimi pərdə altdan cilvələndi.

Ay kimi üzü göründü,
Günəş təki buludların altı şölələndi.

Ürək nur ilə şənliklə doldu,
Gözlərə savab yolu göründü.

Ürəyin güzgüsündə ə'yan olduqda,
Can damarı  şadlıqdan rübaba döndü.

Gözlərimin önündə parladısa da,
Ömür kimi tələsən oldu.

Heyf bahar fəslində olan gül əyyamından,
Heyf gənclik vaxtı ay kimi rüxsardan.

Nəvvab onun eşqinin şərabından,
Məst və bihuş oldu, şərabdan məst olanlar kimi.

## NƏVVAB BU ŞEİRİ 1312-Cİ İLDƏ (1895), NOVRUZ BAYRAMININ ORUCLUQ AYINA DÜŞDÜYÜ ZAMAN DEMİŞDİR

Ayla günəş yenə həyat bürcündə göründü,
Əfv və nicat gecəsi novruzla birləşdi.

Şükr olsun ki, yenə bir qədr gecəsinə çatdım,
Ümid var ki, yenə belə tarixlərə çatım...

Xoş o şeyda aşiqin halına ki,
Yarın üzünün şamından əlində pərvanə tək təzə baratı var.

Hara baxıramsa yar naz və cilvədədir,
Üzünün nuru güzgü kimi hər yeri şö'ləndirir.

Üzünün rüxsarı inamın Tur dağından göründü,
Həmçinin mən də Musa kimi mat qaldım.

Kilsə və məsciddən etiqadımı döndərmərəm,
Çünki hər ikisində həqiqət özünü nümayiş etdirir.

Ey dostum, sənin hicranının qəmində sabitəm,
Sənin eşqinin yolunda hər ləhzə yüz sədəmə görsəm də.

Hamı sənin dirilik suyundan sirabdır,
Mən isə Fərat suyu sahilində təşnəyəm.

Mən bütün ömrümü sənin üzünü vəsf etməkdə keçirdirəm,
Zahidlər isə hər gecə və gündüz dua oxuyurlar.

Hər kim sənin rüxsarının bir xəttini görməsə,
Qiyamətədək möhnət və əziyyət çəkər.

Nəvvab sənin üzünü hər ləhzə görərkən,
Təmiz ürəklə həmd oxuyub, minlərlə salavat çevirər.

Hanı o kəslər ki, riyasəti riyadan seçsinlər?
Onlara deyin ki. bu pak dərgahda ali məqam var.

**RÜBAİ**

Dedim necə olsun, ey xoş hərəkətli sənəm,
Öz rüxsarının gülşənindən bizə tazə barat əta et.
Bu gün çün Novruz yetişir,
Bu gecə qədr gecəsi, ümid, nicat və bağışlanma gecəsidir.

**RÜBAİ**

Şərəf mücrüsünün dürrüsən, nəyə görə bunu inkar edim?
Şadlıq bürcünün günəşi sənsən, bunu niyə takrar edim?
Novruzla qədr gecəsi bir-birinə yaxın oldu, nə gözəldir,
Buna görə də bu iki şərəfdir deyə, gözəlin üzünə baxıram.

**RÜBAİ**

Mövlamız Əmirəl-möminin,
Dini-mübin taxtına dayaqlandı.
Külli-kainatın icadına bais oldu,
Əhmədi-Mahmudun (peyğəmbərin) canişini oldu.

**Vər. 289a**

**NƏVVAB 1309-CU İLDƏ (1891-92) ALLAHIN TƏKLİYİ HAQQINDA DEMİŞDİR**

Həmd olsun yoxluqdan yaradan Allaha ki,
Yoxluqdan işıq və zülməti yaratmışdır.

O yaradan ki, Onun yaratdığından aləm vücuda gəlmiş,
O qadir ki, Onun qüdrətindən lövh və qələm icad oldu.

O xaliq ki, kainatı, insanı, cini yaratdı,
Onun qəhrindən (qəzəbindən) şahlar şahı cansız və
nəfəssiz kimidir.

O elə əvvəldir ki, Ondan əvvəl bir zərrə belə yoxdur,
O elə axırdır ki, Ondan sonra bir an işıq və zülmət yoxdur.

O elə zahirdir ki, Ondan başqa dünyada qeyri bir şey
aşkar ola bilməz.
O elə batindir ki, Onun elmindən heç bir şey gizli
qala bilməz.

O elə alimdir ki, qayib və şahiddir, odur külli vücudun banisi,
O,varlığın və yoxluğun qadiri, zülmət və işiğın yaradanıdır.

O, müsəlmanların və yəhudilərin məbudu, hindlilərin
və xristianların isə məqsududur.
O məqsuda səcdədən külli-vücud xoşlanır.

Nə yaradanı olmuş, nə vələdi,
Nə ata, nə anadır, nədə ki, cəddi vardır.

Boq, Astvas və ya Allah, fərqi yoxdur, o elə Allahdır,
Allahdan başqa ibadət edilən yoxdur, o bütün millətlərin
səcdə edilənidir.

Pənah - Allahdır, təqlid edilən - Allahdır,
mətləb - Allahdır, məqsəd - Allahdır,
Hamının məhbubu olduğu üçün daha qəm yoxdur.

Keyfiyyəti məlum deyil, mahiyyəti hiss edilmir,
Onun kəmiyyət və keyfiyyətini vəsf etməyə qələm acizdir
və dil yolunu azır.

Zati-şərifi müqayisə olunmaz və əvəzsizliyi şübhəsizdir,
Onun sifətlərinin təsvirində Nəvvab acizdir.

## DÜNYANIN VƏFASIZLIĞI HAQQINDA

Çərxi-fələyin altındakılara nəfəs verdi, nəfəsi
olanlar necə oldu,
Bu qəfəsi sındırdı, bəs uçan quşları nə oldu?

Adəm, Nuh, Xəlil və Musa haradadır?
İsa harada, xaçı və belbağısı nə oldu?

Davudun şövkəti, Süleymanın cəlalı hanı?
Bəxtünnəsrin nəsli və qəddar Calut necə oldu?

Gərçi Bilqeys və nazı, izzəti torpaq altda qaldı,
Bəs zərli taxtı, rəngli tacı, büllur qəsri necə oldu?

Əgər onun ağ bədəni torpaq altda gömüldü və üstündə
tikan bitdi,
Və ya gül bitdisə, bəs o gülü və tikanı necə oldu?

Kəyanilərdən ancaq ad qalmış və Əşkanilərdən xəbər,
Bəs dəmirçi Gavənin bayrağı və sərkərdə Giv necə oldu?

Taxtları torpaq altda qaldı, bəxtləri qəbir altda,
Qəsrləri bərbad oldu, bəs qəbr və əsər-əlaməti necə oldu?

Bəhram Gurun və Hirmanın günbədləri hanı?
Yox oldularsa, bəs Bəhram və sevgilisi necə oldu?

Dikbaşlıq təbili çalan Fir'on, Şəddad, nə əcəb,
Onların hər ikisi torpaq altda qaldı, bəs bağları, ağacları
nə oldu?

Dəğyanus özünü Allah adlandırmasına baxmayaraq,
Bəs şəhəri və zərli qəsri necə oldu?

Zərdüşt dini Gəştasbdan aşkara çıxdısa,
Bəs Zənd (Avesta) hanı, işıq və zülməti necə oldu?

Darab və Dara məmləkət və mülkdən getdi,
Məmləkət qalmaqdadır, bəs xarab edəni hanı ?

Gürgan şəhəri qalıb, hökmdarı Gurgın hanı,
Nişapur şəhərinin memarı Şapur necə oldu?

Sonsuz zülm etdilər İbn Ziyad və tərəfdarları.
Onlara oxunan haqlı lənət qaldı, bəs o şər adamlar necə oldu?

Bu beytləri Nəvvab dəftərçəsinə yazdı,
Dəftər qalmaqdadır, bəs o yazıq canı necə oldu?

* * *

Şəms ruyinə salıb cövdi-müsəlsəl sayə,
Guyiya gün tutulub, əks düşüb dünyayə.

Çəkmə sərvi-qədini övcə, əya, mehri-camal,
Aşiqin xəstədi, qoy üstünə düşsün sayə.

Turi-eşqində həmişə “ərəni” zikr edirəm,
“Ləntərani” yetə gər, necə yetib Musayə.

Şövqi-vəslü qəmi-əğyar ələmü dərdi-fəraq,
Düşməyim Qeys kimi bəs necə mən səhrayə!?

Bu necə eşqü nə əğyarü nə vəslü nə fəraq?
Nə yaman yerdə düçar oldu sərim sevdayə?

Gəh soraq eyləyirəm məscidi, gahi deyri,
Şeyx Sənan kimi düşdüm bu əcəb qovğayə.

Bircə cür’ə mey ilə tutsa əlim piri-muğan,
Fariğ ollam, yetərəm mərtəbeyi-üzmayə.

Səri-kuyində qalıb canı əlində Nəvvab,
Xaki-rahinə salam, müntəzirəm imayə.

**Vər. 290b**

* * *

Yenə başımda, bilməm, bu necə şurü nə qovğadır?
Həvayi-ruyi-canandır və ya bir özgə sevdadır?

Bu nə şuridəlikdir kim, tutubdur aləmi yeksər,
Qəmu zərrati-aləmdə təcəllalar hüveydadır?

Olubdur cilvəgər dildari-əzzəl cümlə məxluqə,
Cahan vadiyi-iyməndir, bu nə Turü nə Musadır.

Qəmu aləmdə zahirsən, qəmu aləmdə bahirsən,
Nə müslümdür, nə məscid, nə kəlisadır, nə tərsadır?

Şüayi-mehri-rüxsarın salıb Məcnunu kuhsarə,
Ona virdi-zəban sənsən, bəhanə əldə Leyladır.

Gecə-gündüz çəkib ahü-fəğani Vamiqi-bidil,
Onun fikri yenə sənsən, vəli zikrində Əzradır.

Çapıbdır kuhkən, bixud əgərçi dağları, leykən,
Vəli Şirin deyirsə, mətləbi səndə hüveydadır.

Həzarə naləsi, qumri səsi, bülbüllər əfğanı,
Tutubdur aləmi yeksər, əgərçi şurü-qövğadır.

Sədası qumriyi-izarın, fəğanı bülbülün daim,
Buların məqsədi sənsən, nə güldür, sərvi-baladır.

Əgər ərşə çıxam, sənsən, zəminə gər batam, sənsən,
Baxam, ya baxmayam, sənsən, rüxün kəş-şəmsi-beyzadır.

Nolur gər zahir etsən iltifatın bu pərişana,
Ona bir cilvə etsən, daima hər sirrə danadır.

Gündüzlər biqərarəm, əşkbarəm hicri-ruyində,
Gecə əncümşümarəm, bir mənəm, bir də Sürəyyadır.

Sənin təşviqi-ruyindir ki, saxlar zar Nəvvabı,
Və gər nə, xaki-qəmdə fanivü-nacizü-bicadır.

* * *

İllər ilən aləmi etdim sorağ,[*]
Eşitmədim sən kimi rövşən çırağ.

Nə qəddin tək ər'ərü-şümşadü-sərv,
Nə xəttü xalın kimi gülzarü bağ.

Yox nəvası bülbüli-biçarənin,
Çulğayıb ətrafı fəğani-kəlağ.

Qəmdən olub bənəfşə zarü-negun,
Şəqayiqin bağrı olub dağ-dağ.

Vəfası yox bu dünyanın, ey əziz,
Eyləgilən qəlbini qəmdən fərağ.

Sərv kimi hanı xüram edənlər?
Xakə dönüb lə'lləbü gülyanaq.

[*] Şeir Nəvvabın farsca qəzəlinin "özü" tərəfindən edilmiş tərcüməsidir.Bu qəzəlin farscasının əvvəlində Nəvvab yazmışdır:"Nəvvabın Xan Qaradaği və qeyrilərilə sual-cavabı"

Mahvəşlər xakilə yeksan olub,
Xakləri olubdu həm xişti-bağ.

Nəvvabın nəsihətin guş qıl,
“Və ma əl ər-rəsul əllil-bəlağ".

**Vər. 291b**

## NƏVVABIN XAN QARADAĞİYƏ HİCRAN QƏMİNDƏN ŞİKAYƏTİ

Əya, Xan Qaradaği, yetiş fəryadıma bari,
Mənim halımı seyr eylə ki, aləm əhli heyrandır.

Məni bir şurü qovqaya salıb bir səngdil dilbər,
Qədi sərvü sənubərlər, yüzi həm mahi-tabandır.

Xətü xalı müənbərdir, üzü gülbərg tək tərdir,
Qəmu xubanə əfsərdir, bu bir lə’li-dirəxşandır.

Məni-şeşdari heyrətdə qoyubdur bir büti-tərsa,
Könül Sən’an kimi kuhü biyaban içrə heyrandır.

Zənəxdanında hindu xalını görgəc bu mürği-dil,
Şikənci-zülfə bənd oldu ki, o bir təng zindandır.

Gülə həsbənd olan könlüm olub bülbül kimi bəsməl,
Onun əhvalına sünbül, bənəfşə zarü giryandır.

Mənim əhvalıma ağlar gül ustə bulbüli-şeyda,
Tökər gül üzrə əşki-qəm, əza bəzmi nümayandır.

Fəğanım ərşə çıxmağını sən badi-səbadan sor,
Mənim halımdan agəhdır, bəridi-pakbazandır.

Nəzər et sərvü şümşada ki, qu-qu aləmi tutmuş,
Qara boynunda qumrilər əsasi-qəm nümayandır.

Gözünlə görmək istərsən, səhər bağa xüram eylə,
Mənim könlüm qanından gör çiçəklər necə əlvandır!

Qoyub hicranda, Nəvvabın kəsibdir taqətü tabın,
Yığıb başına əhbabın, özü sərməstü xəndandır.

**Vər. 292**

## HƏSƏNƏLİ XAN QARADAĞININ MİR MÖHSÜN NƏVVABIN MƏKTUBUNA YAZDIĞI CAVAB

**24 noyabr 1891-ci il (19 rəbiül-əvvəl, 1309), Şuşa şəhəri**

**Cavab şeirini təzkirəyə Qaradaği özü yazıb.**

Əya, Nəvvab Mir Möhsün, yenə bir nameyi-namın,
Yetişdi mən dili-zarə, bu nə fəryadü əfğandır?

Bu nə şurü bu nə qovğa, nə şivəndir, nə vaveyla,
Ki, gəlməz xatirə əsla sənin tək kimsə nalandır?

Bu nə gecə oyaqlıqdır, bu nə gündüz qaranlıqdır?
Bu nə sən ağlamaqlıqdır, budur vəhmim ki, tufandır?

Bu nə səndən şikayətdir, qiyamətdən əlamətdir?
Bu nə eşq oduna yanmaq, bu nə vəslü nə hicrandır?

Bu nə dərdü bu nə möhnət, bu nə qüssə nə xiffətdir?
Bu nə qəmdir, küdurətdir, bu nə ahü nə əfğandır?!

Bu nə zülfi-müəttərdir, bu nə ruyi-münəvvərdir?
Bu nə xali-müənbərdir, bu nə çeşmani-məstandır?

Bu nə güldür, bu nə bülbül, bu nə reyhan, bu nə sünbül?
Bu nə qumri, bu nə sülsül, bu nə sərvi-xuramandır?

Bu nə Məcnun, bu nə Leyla, bu nə Vamiq, bu nə Əzra?
Bu nə Sən’an, bu nə tərsa, bu nə küfrü nə imandır?

Əgər doğrisə yar almış, dilü canü qərar almış,
Əlindən ixtiyar almış, bu yerdə əql heyrandır.

Gələ gər Falisü Boqrat, Ərəstalisü Soqrat,
Bu dərdə nə Fəlatundur müdava, nə də Loğmandır.

Çağır fəryadına sübhan yetişsin bir dəxi cəddin,
Sənin də dərdinə dərman edən, əlbəttə, Rəhmandır.

Bu dərddə mən dəxi varam fəğanü ah ilə zarəm.
Giriftarəm, diləfkarəm, gözüm qan-yaşlı giryandır.

Ola gər padşah, sultan, gələ həm qeysərü xaqan,
Nə etsün, eşqə yox divan, Qaradaği də gər xandır.

Müyəssər olsa sən neylə, yetiş dildarına söylə,
Cəfayi-hicrə səbr eylə, bu dərdə böylə dərmandır.

Dua məndəndir əhbabə, salamım Növrəsi-zarə,
Əgərçi növcəvan, şişədardır, leyk pirandır.

## HƏSƏNƏLİ XAN QARADAĞININ MİR MÖHSÜN NƏVVABA ÜZRXAHLIĞI

Və’də verdim gecə gəlib oturaq,
Naxoş oldum haman gecə, ay ağa.
Ondan bəri bəstəriyəm, yatıram,
Duan gələ indi vecə, ay ağa.

Belə düşüb bu il mənim hər karım,
Dəvaya, təbibə qismətdi varım.
Tamamən məsumlar varımdı yarım,
Xuda qoymaz şəfa keçə, ay ağa.

Həmdillah, indi bir az babatam,
Az qalmışam yorğan-döşəyi atam.
Hüzura yetişəm, ixtilat qatam,
Keçinibsən görüm necə, ay ağa?

Ərzü salam o kəslərə vardılar,
Sizə müxlis, bəndə üçün yardılar.
Müxtəsər, dideyi-növbahardılar,
Gələ bir də haman gecə, ay ağa.

Bizim ölkə indi hallay-bulaydı,
Əhvalat qarışıb, iş naqolaydı.
İlahi, görəydim bir də nolaydı,
Qaradaği gələ vecə, ay ağa.

## NƏVVABIN QARADAĞİYƏ CAVABI

Səndən çox intizar idi bu qəlbim,
Şükrillah, oldu gülşad. ay ağa.
Tə’liqəniz vüsul olcaq şad oldum,
Sənsiz olmaq olurmu şad, ay ağa?

Əldən getdi bu gecə ixtiyarım,
Yarsız oldu yara dili-fikarım,
Xürrəm keçdi əgərçi rüzigarım,
Sənsiz olmaq olurmu şad, ay ağa?

Tale oldu şəmsi-işrət bu gecə,
Lame oldu mali-izzət, bu gecə,
Şərəf buldu nəcmi-rif'ət bu gecə,
Sənsiz olmaq olurmu şad, ay ağa?

Mənzil əgər behişt ola filməsəl,
Huri kimi yarlar ola, bibədəl,
Bülbül təki nitqə gələ hər gözəl,
Sənsiz olmaq olurmu şad, ay ağa?

Tezlik ilə özün yetir bu yarə,
Qəlbini qəm oxilə etmə parə,
İşrət günü gər gəlməyə şumarə,
Sənsiz olmaq olurmu şad, ay ağa?

Qəza yazmış Nəvvaba iftiraqı,
Hər ay nəsib edər ona mihaqı,
Xani-valiyə çoxdur iştiyaqı,
Sənsiz olmaq olurmu şad, ay ağa?

**Vər. 294a**

## NƏVVABIN BƏHRAM BƏY FƏDAİNİ MƏDH ETMƏSİ

**Cəmadiəl-əvvəl, 1309 – dekabr, 1891**

Əya, Bəhrami-züləkrəm, müin olsun sənə davər,
Cəlalını cəlil etsin, camalını məhi-ənvər.

Şikarın tiri-xahişlə həmişə xarzar olsun,
Necə Bəhram Gurə seydlər məğlubdu məqhər.

Sənin səhmin ola üdvanə müsri daima nafiz,
Necə Bəhrami-pəncümdən qəmu əflakilər titrər.

Dərində cümlə hasidlər qulami-kəmtərin olsun,
Necə Bəhram Çubinə dərində bir böyük ləşkər.

Nə layiqdir səni nisbət verim fərzanə Bəhramə?
Ki, şənin ondan üzmadır, məqalatındı həm şəkkər.

“Fəramuşan”ın əhlinə olubsan hübb ilə həmdəm,
Olar gər qütbdür, leykən cənabın həm dəxi məhvər.

Biri Xani-Qaradaği ki, şə’ni alidir, ali,
Onun həm şə’ni, həm şe’ri “Fəramuşan"dadır əşhər.

Biri Mirzai-Növrəsdir ki, pirandır “xəmuşan”ə,
Odur əş’ar elmində qəmu şairlərə rəhbər.

Əla ət-təxsis Baki kim, odur əş’arda dana,
Ona təqlid lazımdır dəraviş əhlinə yeksər.

Neçün Əttarü Şəmsü Mövləvidən imtiyaz almış?
Buların nükteyi-şeiri onun qəlbində müzmərdir.

Fədaisən vəfalı, bivəfalıq səndə yox əsla,
Vücudun sırf urvandır, ülumi -şeirə həm məzhər.

Sənin mədhin gərək şə’nin kimi ətul ola, amma,
Məni mə’zur tut kim, üzrlə oldu belə əqsər.

Sənə Nəvvab daidır, sənin mədhində saidir,
Fəramuş etmə yadından, odur övladi-peyğəmbər.

## BƏHRAM BƏY FƏDAİNİN NƏVVABA CAVABI

**Cəmadiyəl-əvvəl, 1309 – dekabr, 1891**

Əya, Nəvvabi-valayi-süxəndanü süxəngüstər,
Vücudi-kamilin mənada elm əhlinədir rəhbər.

Kamalın əkməliyyətdən keçib, hər elmə daradır,
Sizə məxşufdur seyrü sübati-əncümü əxtər.

Ütarid Müştəridir sürtməyə əqdamına ruyin,
Bu sabitdir, sənə Bəhramdır bir kəmtərin çakər.

Mürəbbidir vücudun külli-Şişə əhlinə, əlhəq,
Mürəbbidir necə küllı-vücudə neyyəri-əkbər.

Düruci-əqlü təb’u danişə bir dürrsən yekta,
Büruci-clmü fəhmü binişə bir mahsan ənvər.

Səni xəlq eyləyib xəllaqi-aləm, əşrəfi-adəm,
Qulami-kəmtərinindir sənin Daravü İskəndər.

Sənin büğzün həmin müftahilvabi-zəlalətdir,
Sənin hübbün “siratəl-müstəqim”ə hadivü rəhbər.

Sənin tərifü təhsinində təqrir əlkənü əbkəm,
Sənin təmdihü tərifində dil biçarəvü müztər.

Bağışla, olmadı tövsifin ərçi, şə’ninə layiq,
Necə xurşid vəsfin eyləsin bir zərrə əhqər ?

“Fəramuşan” olub ərbabi-hala qibleyi-taət,
Ona vacibdi səcdə eyləyək biz əkbərü əsğər.

Xoşa hali-Qaradaği, xoşa Baki, xoşa Növrəs,
Olurlar müstəfeyz əltafınızdan hər zaman yeksər.

Mənim də var çox şövqüm hüzurunda olam daim,
Nedim, verməz muradım bir zaman gərduni-dunpərvər.

Fədai gərçi qaibdir neçə müddət hüzurundan,
Vəli ismi-şərifindir dilində sübhü şam əzbər.

**Vər. 295b**

## MİR MÖHSÜN NƏVVABIN
## ÖZ TƏNGDİLLİYİNDƏN
## XAN QARADAĞİYƏ ŞİKAYƏTİ

**Şaban ayı, 1309-cu il – mart, 1892**

Qəmim biyarlıqdan etdi tüğyan,
Yetir Xan Qaradağini, ya Rəb.
Əritdi cismü canım nari-hicran,
Yetir Xan Qaradağini, ya Rəb.

Neçə gündür görünməz mahi-növ tək,
Bulut tutmuş üzün, ya kuhi-ətrək?
Olub əğyardan rəncidə bişəkk,
Yetir Xan Qaradağini, ya Rəb.

Məni salmış bəlayi-nagəhana,
Özün ənqa kimi çəkmiş nihana,

Gülüstanda gəlib bülbül fəğana,
Yetir Xan Qaradağini, ya Rəb.

Səba, gəl güzər qıl kuyi-Xanə,
Sölə hali-dilimi yanə-yanə,
Nədir bu nazü qəmzə, bu bəhanə?
Yetir xan Qaradağını, ya Rəb.

Rəqibi-rusiyəh itsin cahandan,
Məni bizar qıldı xanimandan,
Ayırdı cismi-zarı pak candan,
Yetir Xan Qaradağini, ya Rəb.

Gəl, et Nəvvabına bir dəm nəzarə,
Fəraqında olan zarü fikarə.
Vüsalından onun dərdinə çarə,
Yetir Xan Qaradağini, ya Rəb.

## HƏSƏNƏLİ XAN QARADAĞININ MİR MÖHSÜN NƏVVABA CAVABI

Yenə ol Mir Möhsün Mirzadə,
Yada salmış Qaradağini, ya Rəb.
Yazıb bir namə tazə nəzm üzrə
Yada salmış Qaradağini, ya Rəb.

Qəmi əfzun olub, dərdi ziyadə.
İlahi, sən yetiş fəryadə, dadə.
Hüzura istəyib ol Mirzadə,
Yada salmış Qaradağini, ya Rəb.

Görünür ol cənaba yar yoxdur,
Ənisü munisü-qəmxar yoxdur,
Əgər çoxsa, bu gün ol var, yoxdur.
Yada salmış Qaradağini, ya Rəb.

Unutmuşdu məni ol Mirzadə,
Olub əğyara mail, dost yadə,
Görüb indi cəfa həddən ziyadə,
Yada salmış Qaradağini, ya Rəb.

Sabah gəlləm, hüzuri-yarə varram,
O möhnətkeşlicə dildarə varram.

Deməsin bir də mən əğyarə varram,
Yada salmış Qaradağini, ya Rəb.

Bəli Nəvvab çün bir pak zaddır,
Paka maildürür, napaka yaddır,
Bununçün raqibi-paketiqaddır,
Yada salmış Qaradağini, ya Rəb.

**Vər. 296b**

## TƏZKİRƏYƏ DAXİL ETMƏK ÜÇÜN ŞEİRİNİ GEC GÖNDƏRDİYİNƏ GÖRƏ MİR MÖHSÜN NƏVVABIN FATMA XANIM KƏMİNƏYƏ MƏKTUBU

**8 ramazan, 1309 – 6 aprel, 1892**

Sənin, ey aliyyə, şeirin məgər izhar olmazmı?
Dübarə ərzi-hal etmək məgər təkrar olmazmı?

Yetişdi aləmin şeiri qəmü dəftərdə səbt oldu,
Yetə səndən genə şirin-şəkər güftar, olmazmı?

Nədən tutmuş bulut mahi-mübarək ayının ruyin,
Məgər badi-səba əsməz, bu məh əşhar olmazmı?

Deyirlər bir dənizadə bəxalətlə xəbər vermiş,
Bəxilin zərfi-ömrü mövtilə sərşar olmazmı?

Mənim bu işdə nəf'im yox, sizə məlumdur, xahər,
Bunun zəhmətkeşi xəlq içrə bimiqdar olmazmı?

Qərəz dünyada bu əş'ar bir asardır, qalsın,
Qəmu şairlərin adı məgər asar olmazmı?

Binayi-xeyirdir şairlərə kim, qəsd edib Nəvvab,
Ona yar olmayan kəslər məgər əğyar olmazmı?

## MİRZƏ FATMA KƏMİNƏNİN MİR MÖHSÜN NƏVVABA CAVABI,

**9 ramazan, 1309 – 7 aprel, 1892**

Tutan cami-peyapey saqiyi-xoşrəftar olmazmı?
Meyi-gülgün ilə əldə qədəh sərşar olmazmı?

Gəhi dövri-qəm içrə, gah nəqşi-eyş-işrətdə,
Dolanan daima pərkar tək pürkar olmazmı?

Şərabi-təlxi-mərdəfkən alan kəs saqiyi-qəmdən,
Ola gər məst layəql, yenə hüşyar olmazmı?

Yatan kəs xabi-qəflətdə, həmişə bəstəri-qəmdə,
Nəsimi-sübh dəysə, miri-mən, bidar olmazmı?

Eşitsə "ləntərani" baz Turi-Musa tək,
Hərif içrə məgər bir talibi-didar olmazmı?

Nə bədgudur mənə mane, nə qəflətdir, əya, Nəvvab,
Həmişə möhnətü hicran çəkən bimar olmazmı?

Qalıbdır Şişədə mey tək qəmü əş'ar sərbəstə,
Səbəb olsan qəmusi açılır, əşhar olmazmı?

Yazılsa xətti-naməqbul ilə əşari-namətbu,
Kəminə şairan yanında bimiqdar olmazmı?

## NƏVVABIN YAXIN DOSTLARI İLƏ SƏYAHƏTİ

Bir gün səyahət üçün tələsdik,
Yol yoldaşlarıyla savab iş gördük.

Mən və yüksək nəsəbli cavan Qaradaği ki,
Söz anlayan və arif' idi.

Zərif, söhbətcil, gözəl xasiyyətli,
Zəmanənin nəcibi, Xosrov təki ad-sanlı.

Üçüncüsü çox bilikli seyid idi ki.
Səyahətçi, mehriban və səmimi idi.

Dördündücü də Molla Vəli idi,
İkisi Məhəmməd idi, biri də Əli.

Biri bizim İbrahim idi, bir-iki nıəşhədi,
Hər biri şimal ulduzu.

Yüksək dağın zirvəsinə qalxdıq,
Dağın yüksəkliyi ölçüyə gəlməz idi.

Orada bir mağara göründü ki,
Onun içində dincəlmək olardı.

Onun içində əlvan fərş saldılar.
Və şadlıq məclisinə başladılar.

Orada oturub söhbətləşdik,
Dünyanı şadlığa bürüdük.

Lakin mağara tutqun və dar idi,
Özümə söz verdim ki, bahar vaxtı,

Buraya bir usta gətirim ki,
Bu dar mağaranı genişləndirsin.

Mağaranın içindən bu daş, torpağı təmizləsin ki,
Dar mağara genişlənsin və ucalsın.

O biri il usta elə ki mağaranı yaxşılaşdırdı,
Nəvvabdan bu yadigar qaldı, ürək bu işləri yada saldı.

Molla Vəli çayını içən təki,
Nəğmə ilə şadlıq gətirdi.

Şur və Şahnaz, suzü güdaz,
Rəhavi, Mahur, Türki və Hicaz.

Hümayun, Üzzal, həm də Kabili,
Ərağ, Şahənşah və həm Zabuli.

Hisar, Müxalif, Dügah və Segah,
Əcəm, Çargahi və Pəncgah.

Ürəklər məst oldu,
Bülbül çəməndə oxuyan kimi.

Üşşaq zənguləsindən Rasta keçdi,
Gizlənmiş əcəm ərəbdən qələbə istədi.

Daha nə deyim, o gün necə bir gün idi ki.
Lap novruz bayramı kimi idi.

Əldən, ayaqdan kənarda olmaq,
Bu aləmdə hökmdarlıqdan yaxşıdır.

Qiybətçilikdən və yaramazlıqdan,
Hər qəlbi kor müfsidin fəsadlarından uzaq.

O açıq ürəkli qoca nə yaxşı deyibdir:
Bu sözü eşit və öyrən:

“Pis fikirli insandan uzaq bir an su içmək.
Yetmiş, həştad il ömür sürməkdən yaxşıdır”.

Şadlıqdan çöl və dağlar vəcdə gəldi,
Lakin qəm mənim qəlbimdən çəkilmədi.

Ki, bu fani dünya heçnədir,
Burda dərd və qəmdən başqa heç bir şey yoxdur.

Qəm niştəri ilə hər şadlığı pozur,
Şadlığın ardıyca qəmginlik gəlir.

O kəslər ki, bu dünyada bizdən əvvəl,
Şad və xürrəm idilər.

Bu mağarada məclis qurub, kef etdilər,
Dünyanı şadlığa bürüdülər.

İndi isə onlar torpaq altdadırlar,
Büllur bədənləri indi parça-parçadır.

Biz də bu dünyadan köçəcəyik,
Allaha sarı yönələcəyik.

Hamımız əliboş və azuqəsiz,
Bütün əməllərimiz çirkin halda.

Nə edək, çarə nədir?
Bu böyük dərdimizə kim ağlayacaq?

Ümidim sənədir, ey Allah,
Nəvvabı sən bağışla, ey rəhimli Allah!

Təvəkkül kainatı yaradana ki,
Ondan başqa dünyada amanımız yoxdur.

Ki, Səndən başqa onun heç bir pənahı yoxdur,
Hər iki dünyada fəryada yetiş.

## NOVRUZ BAYRAMINDA (hicri 1308 – mart, 1891) MƏŞHƏDİ ƏYYUB BAKİ NƏVVABI TƏBRİKƏ GƏLİB BU FƏRDİ YAZMIŞDIR

Ey böyük Nəvvab, evin yaşıllıq və ürək açandır,
Nə yerdir, nə göy, bəlkə ərşi-əladır.

**Vər. 299a**

## MİR MÖHSÜN NƏVVABIN BAKİYƏ CAVABI

Nə vaxtadək, ey Baki, göylərdə gəzəcəksən,
Ərşi-əlada yuva salacaqsan?

Gah yoxluğa merac edirsən,
Gah da pak ruhla həmdastan olursan.

Gah da üfüqləri özünə məkan edirsən,
Qızğın təb atının cilovunu yığa bilmirsən.

Gah mövcud olursan, gah da vücud,
Bu varlığını bəs kim yaradıb?!

Aşiq nə desə, rəvadır,
Göylərdə və torpaq altında olsa da.

Pak qəlbin Allahın evidir,
Pak təb’in ər-Rəhmandan ilham alır.

Cümlə aləm yüksək göylərin altındadır,
İsa və Musa bu dərgahda gədadırlar.

Nəvvab qəm, dərd və məlaldan,
Halı qarışmış və yarımcan bülbül kökünə düşmüşdür.

Gülüstan fəzasında uça bilməyib,
Ya ki, tikan altda bir an rahatlıq tapmayıb.

## SAİL TƏXƏLLÜS MƏŞƏDİ HÜSEYN MİR SƏYYAF OĞLU BİR MƏCLİSDƏ ZARAFATLA MİR MÖHSÜN NƏVVƏBA AŞAĞIDAKI ŞEİRİ DEMİŞDİR

### (Hicri 1309/miladi 1891)

Ağa, sənə diş dur,* dedimmi, demədimmi?
Bir gün edərəm mən sənə şər-şur, dedimmi, demədimmi?

* Dinc dur!

**Vər. 299b**

## MİR MÖHSÜN NƏVVABIN MƏŞƏDİ HÜSEYN SAİLƏ CAVABI

Məşədi, özünü eyləmə məcbur, dedimmi, demədimmi?
Ta olmayasan şəhrdə məşhur, dedimmi, demədimmi?

Gəl həccə sarı əzm qılıb, canını qurtar,
Ta olmayasan həşrdə məqhur, dedimmi, demədimmi?

Et vasitə, tut damənini ali-rəsulun,
Muzdun puç olu, boş yerə muzdur, dedimmi, demədimmi?

Əl çəkməgilən ürvətül-vüsqa ətəyindən,
Ta Məscidi-Əqsa* ola məmur, dedimmi, demədimmi?

Hər məclisara salma belə şur-bəqağət,
Şurun salı bu aləmara şur, dedimmi, demədimmi?

Sürtüşmə bu şəhbaz kimi təb'imə, Sail,
Çalma özünü qaynağa, üsfur, dedimmi, demədimmi?

Günçişk olur yox kimi şahini görəndə,
Ənqanı görən vəqtdə bir mur, dedimmi, demədimmi?

Bir zaviyənin küncünə gir, bayqu kimi yat,
Xurşidi görən vəqtdə şəbkur, dedimmi, demədimmi?

Nəvvab olan bəzmdə, ey arifi-dövran,
Min bə'd danışma, demə, diş dur, dedimmi, demədimmi?

## NƏVVABDAN ACIĞI TUTDUĞU ÜÇÜN ONUN ŞEİRİNİN BƏHRİNDƏ HƏSƏNƏLİ XAN QARADAĞİYƏ YAZMIŞDIR

Ruzigarın rəvişi kəc olacaqmış, nə bilim!
Sayeyi-yarı başımdan alacaqmış, nə bilim!

Firqəti-yari-vəfadarda rəngim saralıb,
Hicri-ruyində qədim xəm olacaqmış, nə bilim!

---

* Məscidi-Əqsa – burada Məşədi Hüseyn Sail məscidinin adı nəzərdə tutulur.

Ney kimi nalə edib, gözlərim qan-yaş axıdıb,
Sinəmi laləsifət dağlayacaqmış nə bilim!

Şeştəri-heyrətə salmış məni nərradi-fələk,
Sinədə möhreyi-dil mat olacaqmış, nə bilim!

Hər zaman söyləyirəm həsrət ilə “va əsəfa”,
Gözlərim Yusifə həsrət qalacaqmış, nə bilim!

Əzm qıldım ki, edim dərdi-dilim yarə əyan,
Qəlbi-məhzunidə dərdim qalacaqmış, nə bilim!

Xani-valayi-Qaradaği məni dərdə düçar,
Eyləyib, sinəmə min dağ vuracaqmış, nə bilim!

Gənci-şayanını əldən çıxarıb, həsrətlə,
Künci-pünhanidə Nəvvab olacaqmış, nə bilim!

**Vər. 300b**

## TƏZKİRƏYƏ DAXİL ETMƏK ÜÇÜN ŞEİRLƏRİNİ GECİKDİRƏN, ƏVVƏL LƏQƏBİ RƏHZƏN OLAN MİRZƏ ƏBDÜL ŞAHİN İLƏ NƏVVABIN YAZIŞMASI

Əya, Şahini-seydəfkən, neçün nəzmin tamam olmaz?
Sənin kimi tülək tərlan şikar etməkdə xam olmaz.

Üqab olmuş məgər Rəhzən künam içrə qalıb Şahin,
Bahar əyyamıdır, Şahin, kunam içrə mənam olmaz.

Qəzali-təb’iniz dami-xəyalə düşdüyün billəm,
Yəqin şiri-məşağildən rəmandır, hiç ram olmaz.

Olub əş’ardan məxzən, açıbdır sünbülü süsən,
“Fəramuşan”* olub gülşən, gül əyyamı müdam olmaz.

Məgər təhtəş-şüa almuş mübarək ayının ruyin,
Və ya miğ altına girmiş, bu müddətdə ğümam olmaz.

Bu bir asardır şairlərə kim, əzm edib Nəvvab,
Əgər tə’viq məqsəd olsa, əncami-məram olmaz.

---

* “Fəramusan” Nəvvabın mənzilinin adıdır ki, şair və zəriflərin məclisidir (Nəvvabın öz qeydi)

**Vər. 301a**

## MİRZƏ ƏBDÜL ŞAHİNİN NƏVVABIN MƏKTUBUNA CAVABI

**(Şəvval, 1309 – may, 1892)**

Yetişdi nameyi-namın məni-biyarə, ey ağa,
Əcayib mərhəm oldu bu dili-əfkarə, ey ağa.

Sizə ədbi-zəliləm mən, cənabın pak mövladır,
Nə qürbüm var belə lütf ilə bu əş’arə, ey ağa.

Nə fərmayiş ki, etsən, qulluğunda çakərəm, çakər,
Cənabın şə’ni üzmadır, bizik biçarə, ey ağa.

Sənin elmü sənin helmin kimə məqdurdur, mövla?
Deyil möhtac əqlü fəhminiz əxbarə, ey ağa.

Çirağı-hər şəbistansan və ya ki, nuri-imansan,
Günəşsən, yetə zülmətdə qəmu əbrarə, ey ağa.

Sizə Şahindir bəndə, hüzurunda sərəfkəndə,
Dua qıl ta ki, möhtac olmasın əğyarə, ey ağa.

## MİR MÖHSÜN NƏVVABIN XAN QARADAĞİYƏ ÜZ VERMİŞ HÜZN MÜNASİBƏTİLƏ ONA TƏSƏLLİSİ

**(21 şəvval, 1309-cu il – 19 may, 1892)**

Sənin hasidlərin, Xana, həmişə xarü zar olsun,
Sənə əğyar olan kəslər cahanda şərmsar olsun.

Səni məqsuddən ayrı salanlar sərnigün olsun,
Səni məhbubdən təfriq edənlər tar-mar olsun.

Qəm etmə, qıl təvəkkül dərgəhi-paki-xudavəndə,
Ki, ta rəncü ələmdən şüğli-düşmən ahü zar olsun.

Təvəkkül çövşənin əyninə gey, Xana, Təhəmtən tək,
Ziyan etməz əgər hasidlərin İsfəndiyar olsun.

Sənə hami çü Yəzdandır, onun lütfü firavandır,
Nə lazım qüssə etmək düşmənin gər səd həzar olsun?

Sizə təstir olan təqdirdən, Xana nə mümkündür,
Cahan düşmən ola, bir zərrə kəsrü əngüsar olsun.

Məramı müddəinin şeşdəri-heyrətdə mat olsun,
Vətən bədxahü əşrarın vücuduna məzar olsun.

Sizə təqrib olan dünya hüdusindən əmin olsun.
Cahanda daima şə'nü cəlalı bərqərar olsun.

Qulami-kəmtərin olsun dərində cümlə hasidlər,
Cəlil olsun cəlalın, şövkətin həm paydar olsun.

Xəzanın sərsəri gülzari-ömründən bəri olsun.
Gülistani-vücudun daima fəsli-bahar olsun.

Sənə Nəvvab daidir, əyandır, intişar olmuş.
Sənin lütfündə lazımdır cahanda iştihar olsun.

**Vər. 302a**

## HƏSƏNƏLİ XAN QARADAĞİNİN MİR MÖHSÜN NƏVVABA CAVABI

**(1309-cu il – miladi 1891)**

Əya, Nəvvabi-Mir Möhsün, ağalıq səndə var olsan,
Yığılsın daima molla, qapında bəndəvar olsun.

Ola nafız mollayə həmişə hökmü fərmanın,
O qanun ki, sənin vardır, cahanda intişar olsun.

Nə zülm olsun, nə də hiylə, nə də büxlü həsəd, kinə,
Görüm insafü ədl ilə bu dünya paydar olsun.

Həqiqət nameyi-namın məni xursəndhal etdi,
Bizə bədxah olan kimsə həmişə sövgüvar olsun.

Tökülsün gözləri, çıxsın tənindən canı bədxahın,
Cahanda yaxşılıq görməz, yaman dərdə düçar olsun.

Mənim bir Rəbbdən qeyri cahanda bir müinim yox,
Köməksiz kimsəyə daim kömək ol girdigar olsun.

Nə bir kəslə sərü karım, nə bir şəxsə var azarım,
Nə də bədhal rəftarım, kor övladə de kar olsun.

Adın müslüm qoyan dinsizü imansız biimandır,
Ona dünya gərək, üqba nə hacət, qoy dinar olsun.

Qoyub xəllaqını, rizqin dilər məxluqi-ərzəldən,
Şüuruna tamaşa qıl, belə biarə ar olsun.

O kəs ki, bir müsəlmanın tifaqını nifaq istər,
İlahi, qan udub  yeksər, həmişə əşkbar olsun.

Sabah meyl eyləsən seyrə, gəlim mən də, gedək bağa,
Fədai, Növrəsü Baki, Vəliylə Məşhədi var olsun.

Uzun illərdi zəhmətdə, Qaradaği əziyyətdə,
Məşəqqətdə olub didə, ona da bir bahar olsun.

## ŞEİRİNİ GECİKDİRDİYİNƏ GÖRƏ NƏVVABIN MEHDİQULU XANIN QIZI XURŞİDBANU BƏYİM NATƏVANA MƏKTUBU

**(15 zilqədə, 1309 – 11 iyun, 1892)**

Əliyye-aliyyə, ağa cəlilə,
Neçün əş'arınız olmaz hüveyda?
Qəmü əş'arlər əncama yetdi,
Sizinkindən əsər olmazmı peyda?

Hilali-növ kimi düşmüş xifayə,
Xətti-müşkininiz dönmüş hümayə,
Və ya iksirə, ya kim, kimiyayə,
Bilinməz bir əsər manəndi-ənqa.

Mənim qəsdim budur, banuyi-ə'zəm,
Sizin əş'ariniz olsun müqəddəm.
Bu namə-nami olsun həm mükərrəm,
Və gər nə, rövnəq olmaz bunda əsla.

Kalamınız gərək sərdəftər olsun,
Cəvahir nəzminizdən əşhər olsun,
Kütüb təzyinə düşsün, ənvər olsun,
Necə xurşidi-ənvərdən bu dünya.

Əya, mahi-münəvvər, nücmi-əzhər,
Cəlalət bürci içrə şəmsi-əşhər,

Camalın günbəgün olsun münəvvər,
Tapa mir'ati-hüsnün həm mücəlla.

Günəş ruyin, əya, xurşidi-izzət,
Şərəf bürcündə tapsın övci-rüf'ət,
Sizə əhbab olan tapsın səadət,
Mərarət bəhrinə qərq olsun ə'da.

Olubdur müntəzir itmamə əhbab,
Cavahir nəzmdən olsun şərəfyab,
Sizə peyvəstə daidir bu Nəvvab,
Duadan qeyri yoxdur bir təmənna.

## MEHDİQULU XAN CAVANŞİRİN QIZI XURŞİDBANU BƏYİMİN MİR MÖHSÜN NƏVVƏBA CAVABI

**(Zilhiccə, 1309 – iyul, 1892)**

Əya, Nəvvab, valayi-süxəndan,
Yetişdi naməniz, dilşad oldum.
Qəmü dərdim firavan idi, amma,
Behəmdüllah, künun azad oldıım.

Sərasər şeiriniz əz ruyi-hikmət,
Qəmu məzmunları mehrü məhəbbət,
Mühübbə rəhmətü ədvanə zillət,
Bu şirin ləhcəyə mötad oldum.

Sizə lütfi-xuda olsun müraqib,
Əta qılsın dəxi ə'la məratib,
Yetə bədxahə gər şihabi-saqib,
Xərab olsam da gər, abad oldum.

Qəmi-əyyamdan çox natəvanəm,
Əliləm, naxoşam, əfsürdəcanəm,
Bu tə'tildən özüm də bədgümanəm,
Məgər kuhi-qəmə Fərhad oldum.

Unutma sən duadan Natəvanı,
Əlilü naxoşü əfsürdəcanı,
Cənabından səva yoxdur gümanı,
Əgər yaddan çıxam, bərbad oldum.

* * *

Keçindi ahü zar ilə günüm, oldu qara sənsiz,
Nə lazımdır mənə olsa əgər bu masəva sənsiz?

Yanar eşq atəşinə sineyi-suzan hər ləhzə,
Yetə gər rövzevi-rizvanidən abü hava, sənsiz.

Günüzlər biqərarəm, əşkbarəm hicri-ruyində.
Olur neyran kimi bəstər mənə leyl əd-düca, sənsiz.

Gədalıq rütbəsi xoşdur sənin dərgahi-pakında,
Müti olsa əgər, mən neylərəm şahü gəda sənsiz?

Əgər Cəmşid olam, yara və ya İskəndərü Dara,
Deyül lazım mənə ayineyi-gitinüma sənsiz.

Cəhənnəm yadi-vəslinlə mənə firdövsi-ə'ladır.
Haram olsun behişt, əgər edəm seyrü-səfa sənsiz.

Əlim yetsə əgər ki, Xızrvəş ol abi-heyvanə,
Yəqin et, içmənəm bir cür'ə mən abi-bəqa sənsiz.

Təvafi-kuyi-pakın olmasa Nəvvaba gər qismət,
Minayi-eşqdə neylər dəxi sə'yü səfa sənsiz.

**Vər. 304a**

## NƏVVAB BİR DOSTUN XAHİŞİ İLƏ MƏRHUM SEYİD ƏZİM ŞİRVANİNİN QƏZƏLİNİN ƏKSİNƏ DEYİB

Səmayi-övci-rif'ətdə nə xoş mehri-vəfasanmış,[*]
Şəbistani-məlahət içrə şəm'i-pürziyasanmış.

Rüxün səthində aləmlər nümayan olmağın gördüm,
Yəqinim oldu kim, ayineyi-gitinümasanmış.

Olubdur Kə'beyi-kuyin qəmu aşiqlərə qiblə,
Minayi-eşqdə zairlərə sə'yü səfasanmış.

[*] Qəzəl təzkirənin 241a vərəqində də getmişdir.Eyni qəzəlin iki variantda verildiyini nəzərə alaraq təqdimini məsləhət bildik. (bax: səh.290-291, hazırkı nəşr)

Mütaa, məhcəbina, məhvəşavü mehriban yara,
Cahanda əhli-ürfana məta'ü müqtədasanmış.

Şüai-şəmsi-ruyindən münəvvərdir kəvakiblər,
Şəbi-zülmati-heyrətdə məhi-leyl əd-dəcasanmış.

Ləbi-lə'lin kənarında yazıbdır xameyi-qüdrət,
Xəti-səbz ilə kim, ətşanlara maül-bəqasanmış.

Qalan bu külbeyi-əhzan içində aşiqi-zarın,
Dili-suzanına daim dəvasanmış, səfasanmış.

Əcəb maqnit kimi cəzb qıldın əqlimi sərdən,
Əzizim, gözlərim, canım, məgər ahənrübasanmış?

"Siratəl-müstəqim"ə nuri-ruyin çəkdi Nəvvabı,
Necə Musanı Sinadə, əcayib rəhnümasanmış.

* * *

Yenə xunbar olan könlüm görüb ol şuxi-zibanı,
Odur bülbül kimi salmış cahana şurü əfğani.

Görəndə şəm'i-rüxsarın, yanar pərvanə tək cismim,
Düşər mədhuş payinə, çəkər ahı, verər cani.

Məzəmmət yoxdu ol şəxsə ki, görmüş nuri-rüxsarın,
Nə etsin kuri-biçarə ki, görməz çeşmi-şəhlani?

O çini-zülfdə mürği-rəvanın aşiyan etmiş,
Pərişan olmasın, ya Rəb, görüm zülfi-çəlipani.

Züleyxaya deyin, fəxr etməsin Yusif camalına,
Gətirmiş çərxi-gərdun tazədən bir Yusifi-sani.

Necə ol mahruyə baxmayım, şükr etməyim daim,
Nümayandır o məhrüxsardə ayati-sübhani.

Dirildibsə Məsiha bir neçə əmvat ömründə,
Mənim yarım qılar hər dəmdə zində min Məsihani.

Olubdur nuri-ruyi cilvəgər cümlə cahan içrə,
Münəvvər eyləyibdir məscidi, deyri, kəlisani.

Xəyali-ruyi-mahi rövzeyi-rizvandı Nəvvaba,
Olur neyran ona görsə əgər bir ləhzə hicrani.

## MİR MÖHSÜN NƏVVABIN HƏSƏNƏLİ XAN QARADAĞİYƏ ÜZRXAHLIQ MƏKTUBU

Və'dələşdik Xana ki, ba səd şikvə,
Seyran edək mağareyi-Lə'lkuh.
Vacib işlər düşdü, qəm oldu ənbuh,
Hüzuruna yetmək mümkün olmadı.

Məhəmmədə tapşırdım ki, ey oğlan,
Xani-vala hüzuruna ol rəvan.
Ərz etgilən vəqaye'i kəmakan,
Seyrə çıxmaq bu gün mümkün olmadı.

O da gedib mücaviri göndərir,
Camhir məl'un öz vaxtını itirir.
Nahar vaxtı ərzi sizə yetirir,
Ki, xidmətə yetmək mümkün olmadı.

Cənabınız Lövhi ilə zəhmətə,
Düşdü dəxi Baki qəmü-möhnətə,
Bu zəhmətlər saldı bizi xiclətə.
Hüzura çün vetmək mümkün olmadı.

Nəvvabınız sizə nəvaxan olub,
Bu qissədən qəmi firavan olub,
Əfv eləyin ki, əfv edən Xan olub,
Hüzura gər yetmək mümkün olmadı.

**Vər. 305b**

## GÖVHƏR AĞANIN TAPŞIRIĞINA GÖRƏ CAME MƏSCİDİNDƏ BƏRAT BAYRAMI MÜNASİBƏTİLƏ CAMAAT ÜÇÜN VERDİYİMİZ EHSAN ZAMANI ŞƏBİHGƏRDAN KƏRBƏLAYİ İBRAHİM ALLAHVERDİ OĞLU MİR MÖHSÜN NƏVVƏBA YAZMIŞDIR

**(15 şaban, 1321 – 4 noyabr, 1903)**

Könül istər, əlim yetməz, nedim, bir şiş kabab olsun,
Bu şərtilə yanında ol kababın narşərab olsun.

Gəlib hücrə qabağından keçəndə ol ətə baxdım,
Rəvadır ətdən ötrü qan udum, didəm pürab olsun?!

Qocalıq haləti, billah, məni salmış əcəb dərdə,
Rəvadırmı, ağa, qəlbim mənim böylə xərab olsun?

Bu ehsanı görəndə kimdi səbr etsin bu dünyada?
Ola Rüstəm və ya Bərzu və ya Əfrasiyab olsun.

Nə zər, nə zur bazum var, keçib həştaddan sinnim,
Ola hər kimdə bu möhnət, gərək yırtıq corab olsun.

Keçər rahi-xudadə sahibi-ne’mət təamından,
Fəqirə rəhm edən, ya Rəbb, cahanda kamyab olsun.

Tərəhhüm vəqtidir, ağa, tərəhhüm yoxdu dünyada,
Gərək rəhm eyləyən Nəvvab tək naib mənab olsun.

Odur ağa, odur mövla, odur rəhmü kərəm kanı,
Kərəm əhli onun kimi gərək vala, cənab olsun.

## NƏVVAB XƏSTƏ OLAN ZAMAN HƏSƏNƏLİ XAN QARADAĞİNİN ONA YAZDIĞI (QOŞMA)

**(1309/1891)**

Bəs deyilmi ürəyimiz çatladı,
Bu qədər bəstəri olubsan, ağa?
Qələt etdi zökəm sənə də dəydi,
Gün kimi saralıb solubsan, ağa.

Görünür ki, yorğan-döşəkdi rahət,
Otağın istidi, yanın fərağət,
Ənisin kitablar, işin kitabət,
Münşilik fikrinə düşübsən, ağa.

Eşitdim acığın bu qış bülbülə,
Tutubdur, qəfəsdə dəxi sülsülə,
Buna görə evdə saxlanan gülə,
Əl urub, təmamən yolubsan, ağa.

Harda qalıb Molla Vəli, bəs Məcid,
Hacı Hüsü, Məşdi İsi, ol Həmid,
Sadiqi-xoşnəvaz, Haşimü Cəmşid,
Bu qədər qüssəli olubsan, ağa.

Qaradaği sizə gəlir bu gecə,
Qoymayacaq sizə keçə bəd gecə,
Mənzilə gəlməyi qoymusan gecə,
Əlhəmdüllah, səhhət bulubsan, ağa.

## NƏVVABIN CƏNAB XAN QARADAĞİYƏ CAVABI

**(Cəmadiyəl-əvvəl, 1309 – dekabr, 1891)**

Bəstəriyəm gərçi bəstər içində,
Leyk bilməm necədi halın, ağa.
Zökəm döyül məni naxoş eyləyən.
Naxoş edib şövqi-vüsalın, ağa.

Fəraqında işim ahu zar olub,
Təni-zarım zarü diləfkar olub.
Görən devir: "Filani bimar olub”,
Müntəzirəm görüm cəmalın, ağa.

Güllərimi qarğa-quzğun yolubdur,
Bülbül ilə qovqaları olubdur.
Xəyalımın gülü yeksər olubdur,
Yetişməsə şəhdi-zülalın, ağa.

Bülbül, yəni Vəli, Məcid, İsadır,
Qarğa, quzğun məndəfəli molladır,
Hara düşsə bular, cəngü qovğadır,
Bulardandır sənin məlalın, ağa.

Əlhəzər et bu qövmdən hər zaman.
Din rövnəqi pozulubdur bulardan,
Nəvvab edər bu qövmdən əlaman.
Sənin də var boylə xəyalın, ağa.

## 1310-cu il SƏFƏR AYINDA (sentyabr, 1892) VƏBA NAXOŞLUĞU ZAMANI NƏVVABLA NÖVRƏSİN SUAL-CAVABI

***Nəvvab:***

Ahın yenə, Növrəs, şəbgir olubdur,
Suzi-dildən nədən çəkirsən nəva?
Bulut kimi qəmdən qəlbin dolubdur,
Üns əhlindən məgər görübsən cəfa?

*Növrəs:*

Nəvvabi-müəzzəm, məxdumi-vala,
Suzi-dildən neçün çəkməyim nəva?
Qəmlər ilə qəlbim niyə dolmasın,
Neçə anlamazdan görmüşəm cəfa?

*Nəvvab:*

Nə olubdur ahü əfğan edərsən?
Qonşuların rahatlığın kəsərsən,
Gərdan olub, hər tərəfə gəzərsən,
Bu bitablıq səndə nədir, ey əxa?

*Növrəs:*

Əbəs deyil ahü nalə binası,
Məhv olubdur aşinalar vəfası,
Qalmayıbdır dəxi könül səfası,
Gedib məndən tabü təvan, seyyida.

*Nəvvab:*

Naxoşluğun övd eyliyibdir məgər?
Qızdırmadan üzündə var bir əsər,
Sənə düşmür, dəxi gəl etmə səfər,
Yatan vaxtda orda urubdur hava.

*Növrəs:*

Məndə yoxdur əsla mərəz əsəri,
Nə tabü lərzü nə də cuül-bəqəri.
Görəndə bir neçə zadeyi-xəri,
Az qalır ki, gələ başıma hava.

*Nəvvab:*

Həkim yoxdur məgər dərdini bilsin,
Hər gün gəlib başın üstün kəsdirsin,
Gah gülübən, gah da səni güldürsün?
Çarə yoxdur sənə həkimdən səva!

*Növrəs:*

Həkim yoxdur edə təşxisi-mərəz,
Cövhərində olmaya bilmərrə ərz,

Ünas nəbzin tutanda qılmaya qərz,
Çoxuna, doğrusu, budur müddəa.

***Nəvvab:***

Həkimlərə dərdini eylə izhar,
Təbabət etsinlər dərdinə zinhar.
Meyil etmə şirə-şərbət, hər nə var,
Çəkməyəsən dəxi şurü vaveyla.

***Növrəs:***

Hanı həkim əhli, etsin təbabət,
Əlaci-dərdə edə əz ruyi-hikmət?
Yox bularda hərgiz insaf, mürüvvət,
Tələf olub bu il beş yüz füqəra.

***Nəvvab:***

Dərdi-dilin dualıq olsa əgər,
"Fəramuşxanə"yə sən eylə güzər,
Nəvvabınız yazar sənə dualər,
Suyun içən kimi tapasan şəfa.

***Növrəs:***

Mənim dərdim deyil, ağa, dualıq.
Dua əmri mənə olmaz müvafiq,
Tərbihü təslisə deyüləm şayiq.
Dua suyu verməz Növrəsə şəfa.

**Vər. 308a**

## QARADAĞININ NƏVVABA YAZDIĞI ZARAFAT MƏKTUBU

**(Şaban, 1309 – mart, 1892)**

Dağa çıxdım, bağa döndüm, bir gəlin,
Gördüm, onda gülşənara gül açıb.
Cilvələnib, çətirlənib tavuz tək,
Bülbül kimi hər bir gülə dil açıb.

Güldən yığıb, gül əlilə gül tutub,
Satikinin zərfi guya mül tutub.

Dörd yanını süsənü sünbül tutub,
Sərvqəd də qumrisifət dil açıb.

Hərarətdən qönçə ləbi büzülüb,
Mirvarid tək ərəq üzə düzülüb.
Məst gözü xumarlanıb, süzülüb,
İncə beldən kəmər alıb, bel açıb.

Bağa girib, əhval bildim kimdi bu,
O çağı ki, bir zəvvarə vardı, o,
İstiğfar eyləyib, söylədim, yahu,
Qaçdım ondan, nerdə ki, sünbül açıb.

Qaradaği burda səni gözləyir,
Ət doğrayıb, kabab üçün duzlayir,
Oturmağa çala-çuxur düzləyir,
Nəhib urub, daş qoparıb, gül açıb.

**Vər. 308b**

## NƏVVABIN QARADAĞİYƏ CAVABI

**(Şaban, 1309 – mart, 1892)**

Mənsiz nə lazımdır seyranə çıxmaq,
Dağü bağda əgər ki, çox gül açıb.
Bahar olub hər küncdə, bilirəm,
Əlvan-əlvan süsənü sünbül açıb.

Bülbüllərin səsi dünyanı alıb,
Qəlbim gülü leyk saralıb-solub.
Bulut kimi məlalü qəmdən dolub,
Didələrin hər tərəfə sel açıb.

Nə qıza meylim var, nə də gəlinə,
Nə qəddinə, qamətinə, telinə.
Nə üzünə, dodağına, dilinə,
Yanaqları əgərçi gül-gül açıb.

İncimişəm bu dünyada hər nə var,
Ruhanilər qəlbim edib tarümar.
Səfa yoxdur bu qövmdə, cəfa var,
Hər biri bir beydəqi-ğülğül açıb.

Təhtül-hənək salıbdılar gərdənə,
Tərtib edib meysərəvü meymənə.
Tor quralar hər gələnə, gedənə,
Bid’ət salıb, öz nəfinə dil açıb.

Bu qövmdən, Xana, sən eylə həzər,
Nəvvabdan eşit, olma dərbədər.
Bir ağacdır bular ki, verməz səmər,
Budaqları şər ilə xinbil açıb.

## NÖVRƏSİN NƏVVABLA SUAL-CAVABI

**(20 səfər, 1310 – 16 sentyabr, 1892)**

***Növrəs:***

Nəvvab, əlac eyləgilən hövsələ getdi,
Neylim, sölə axir mənə, dünya belə getdi.

***Nəvvab:***

Növrəs, sənə lazımdı ki, bu hövsələ getsin,
Təng olma, deyil mövsimi, qoy sən, hələ getsin.

***Növrəs:***

Bilməm nə deyim rövnəqi-bazari-əvamə,
Əfsus, xəvas əhli təmamən elə getdi.

***Nəvvab:***

Çün kəlb deyib bunlara mövlayi-mükərrəm.
Dallarına üsyan yükünü şələlə, getsin.

***Növrəs:***

Hər kim ki, mənə və'də verə, hərgiz inanmam,
Əncamı onun eylə yəqin, yüz ilə getdi.

***Nəvvab:***

Hər kəs unuda ayeyi-ufuni*, yəqin bil,
İmanı onun pufdu, ver indi yelə getsin.

***Növrəs:***

Etdim bəyü xanü qaziyə şeir ilə izhar,
Dərdi-dilimi, axir aradə selə getdi.

***Nəvvab:***

Çün ali-Əlidəndi silə şairə vermək,
Bəy, xanı, qazını ver sən məzbələ getsin.

* "Ey iman gətirənlər! Əhdlərə sadiq olun..." (Quran, əl-Maidə surəsi, 1-ci ayə)

***Növrəs:***

Dünyanı müsəxxər eləyib firqeyi-nadan,
Rəhmət ola üqbada kim, əhli-dilə, getdi.

***Nəvvab:***

Nadan odur, dinini dünyaya dəyişdi.
Bidin gedib, qəbrinə kərtəngələ getsin.

***Növrəs:***

Var idi əzəl tülküsifət bir neçə ğali,
Məzhəb yoluna qurdu qəribə tələ, getdi.

***Nəvvab:***

Hər kəs ki, ola ğali və ya qali imamə,
Kafərdi, ulağ kimi onu dürtmələ, getsin.

***Növrəs:***

Bundan sora məsmu' olunur elmi-müzəxrəf,
Məfqud olub, şər'i-nəbi, məs'ələ getdi.

***Nəvvab:***

Təbdi' edən dində, müzəxrəf danışanlar,
Hər yana gedə, canına lənət gələ, getsin.

***Növrəs:***

Ey mərifət əhli, kütübi-rahi-zəlalət,
Bidin qılıb çoxları, əldən-ələ getdi.

***Nəvvab:***

Bir şəxsə ki, hadi ola lütfılə xudavənd,
Mümkündümü həqqi unudub, batilə getsin?

***Növrəs:***

Agah deyil kimsə mənim hali-dilimdən,
Növrəs, bu cahan böylə gəlib, həm belə getdi.

***Nəvvab:***

Nəvvab əgər hali-dilindən ola agah,
Qoymaz o sənin hali-dilini belə getsin.

**Vər. 309b**

## NƏVVABIN BAXIŞ BƏY SƏBURDAN RAZILIQ ETMƏSİ

**(19 səfər, 1310 – 15 sentyabr, 1892)**

Səbura, yetdi əş’arın, əcəb xürsəndhal oldum,
Cəvahir nəzmdir, vəh, vəh, nə xoş lölöi-ğəltandır.

Əcəb vaqifsən əş’arə, vüqufin Zakirə bənzər,
Fədai müftəxür olsun, özü gər fəxri-ürfandır.

Sənə gər xaldur Asi, bəradərdir mənə Azər,
Əgər nə’m əl-bədəl sənsən, yəqin bu bəxşi-Yəzdandır.

Zamandır ziri-zülmətdə qalıb əş’arlər zu’i,
Bəhəmdullah ki, bürci-Sə’ddən yenə nümayandır.

Neçə əyyam idi məh müxtəfiydi cahi-üzlətdə,
Təşəkkür eylərəm kim, Yusifidən indi-tabandır.

Fədai iltifat etməz, “Fəramuşan”a bir gəlməz,
Gəlib bir dərdi-dil bilməz, bu necə əhdü peymandır?

Dizaq içrə, Səbura, gərçi sən salari-ürfansan,
Rücuin hadiyə yoxdur ki, o bir pak pirandır.

Sizə bədxah ola aləm ziyanı mu qədər yetməz,
Neçün, Nəvvab peyvəstə sizə qəlbilə xahandır.

## BAXIŞ BƏY SƏBURUN NƏVVABA CAVABI

**(Rəbiüs-sani, 1310 – noyabr, 1892)**

Əya, Nəvvab, məktubundan oldu çeşmü dil rövşən,
Bəli, sən nuri-bahirsən, kəlamından dirəxşandır.

Kəlami-nurbəxşin tariki-əş’arə əfsərdir,
Bu məna arifan çakər sənə olmağa bürhandır.

Hərimi-mə’niyə məhrəmdi tutıyyi-məqalatın,
Neyi-kilkin niyazi-şeirdə bəs şəkkərəfşandır.

Tuta əqvalını kimsə bərabər dürrü lölöyə,
Zəhi xaib bu nisbət vəsfi-əş'arına nöqsandır.

Sənin məxluqa məşruf olmağın məş'ufdur, mə'ruf,
Dua tərhin tutum, mədhin nə hacət kim, nümayandır.

İlahi, günbəgün Nəvvab lütfün eyləsin, guya,
Ki, ondan bizlərə həmvarə aid lütfü ehsandır.

Məgər saldın nəzər lütf ilə, məqbul oldu əş'arım,
Ki, yoxsa hər sözü nəfyi-rümuzi-şeiri-tabandır?

Cəhalət babətindən etdi piran Hadini təkzib,
Bu namərğub şeirindən Səbur indi peşimandır.

**Vər. 310b**

## "MƏCLİSİ-FƏRAMUŞAN"IN ARİFLƏRİNƏ

Ey hərzə danışan və hərzə şüarlı ürək,
Nə vaxatadək hərzəliklə tanınacaqsan?
Nə qədər gözəlin xəttü xalından danışacaqsan?
Bir anlıq qəflətdən ayıl.
Bu sözü gecə-gündüz vird et ki,
Ürək evimdə yardan başqa heç kim yoxdur.

Nə vaxtadək özünü lovğa və dikbaş kimi,
Xalqa göstərəcəksən?
Nə vaxtadək hər yerdə, hər kimlə oldu oturacaqsan?
Solmuş gülüstandan uzaq keç,
Şeyda bülbülə qulaq as, o deyir:
Ürək evimdə yardan başqa heç kim yoxdur.

Nə vaxtadək böyüklərin həmməclisi olacaqsan,
Çiyinə salınmış zərli əbalara uyacaqsan?
Əcəl arxadan qurd kimi pusqu düzəltmiş,
Qulaq as, hər tərəfə ayıq bax.
Bu nəvanı zamandan və məkandan eşit:
Ürək evimdə yardan başqa heç kim yoxdur.

Hanı Kəyumərs, Cəmşid, Ad və Səmud?
Hamısı qara torpaq altda yatmış.
Ömür nəticəsiz keçdi, nə faydası?
Gəl rindlərin şadlıq məclislərinə,
Çəng və ney mahnısına qulaq as:
Ürək evimdə yardan başqa heç kim yoxdur.

Zahidlərin tərkidünyalıq şüarına qulaq asma,
Qumar və şərab dostlarından əl çək.
Ey gözü açıq adamlar, bu zəmanəyə yaxşı baxın...
Bütün dünya işarə cilvəsidir,
Hamının fikri və zikri bu şeirdir ki:
Ürək evimdə yardan başqa heç kim yoxdur.

İndi gəl öz halımıza nalə edək,
Şeh kimi qanlı yaş axıdaq.
Daşı lalə rənginə boyayaq,
Ürəyimizin ahıyla ayın dövrəsinə halə çəkək.
Hər zaman bu sözü söyləyək:
Ürək evimdə yardan başqa heç kim yoxdur.

Mən də pak nəsildənəm və pakəm,
Gül deyiləm, lakin dibi tikanlıyam.
Ey Allah, günahkar bəndəyəm.
Necə olsun ki, yüküm yüngülləşsin?
Qaranlıq gecədə və gündüz hey deyirəm:
Urək evimdə yardan başqa heç kim yoxdur.

Şəms, Əttar, Sə'di və Səkkaki,
Ənvəri, Ünsüri və Əflaki.
Xan Qaradaği, Abış və Baki,
Növrəs, Kəminə və Şakinin
Bütün şeirləri deyir ki,
Ürək evimdə yardan başqa heç kim yoxdur.

Əgər Nəvvabı qiyamət günündə,
Mənsur kimi dara çəksələr.
Məcazi eşqə, yara, nigara görə,
Zülfü xəttü xalı olan yara görə.
Dar ağacında da bu sözləri söyləyəcək:
Ürək evimdə yardan başqa heç kim yox.

## ABIŞ BƏYİN NƏVVABA NƏZİRƏSİ

Saqiya, ey qiyamət gününün zamini,
Yarın qəmində naçar qalmışam.
Nə ənis, nə munis, nə də ki. qəmxar,
Nə yoldaş, nə yar, nə də ki, dildar.
Dəmbədəm deyirəm, izhar edirəm:
Ürək evimdə yardan başqa heç kəs yox.

Saqiya, ey hər iki dünyanın əzizi,
Kainat sənin hökmün altındadır.
Şahlar sənin əmrindən boyun qaçırmaz,
Həyatın qəmindən ağlar qaldım.
Ey dost, deyirəm aşkarda və gizlində:
Ürək evimdə yardan başqa heç kim yox.

Saqiya, ey cəza gününün dəlili,
Riza üçün ürəyimin qanımı içirəm.
Dünya evi mənim üçün sığınacaq deyil,
Gecələr mənim etdiyim səcdələr nəyə dəyər?
Ev zahid, mənim dediyim budur, bu:
Ürək evimdə yardan başqa heç kim yox.

Saqiya, qalmışam çox naçar,
Alçaq dünyanın saysız qəmindən.
Yardan hər an şikayətlər edirəm,
Qəddar zəmanənin cəfasından,
Zahidlərin mənlə nə işi ki,
Ürək evimdə yardan başqa heç kim yox.

Saqiya, meylə cam gətir ki,
Mən yenə xumar olum.
Zinhar öz işindən bixəbər olma,
Xatirimdə yardan ayrı heç kim yox.
Mənim dərdim qiyamət gününə kimi budur:
Ürək evimdə yardan başqa heç kim yox.

Mən kibrdən və məğrurluqdan ağlamıram,
Ürəkdir hicran əziyyətindən ağlayan.
Məcburiyyət diyarında qalmışam,
Əgər məni qovsan da, sən üzürlüsən,
Məndən uzaq gəzmə, dediyim budur:
Ürəyimdə yardan başqa heç kəs yox.

Ey Növrəs, məni unutma,
Xan Qaradaği, Baki də işrətdədir,
Nəvvab qalmış heyrət və qəmdə,
Kəminə isə sür'ətlə yazır.
Abış da hey deyir:
Ürəyimdə yardan başqa heç kəs yox.

## MƏŞƏDİ ƏYYUB BAKİNİN NƏVVABA NƏZİRƏSİ

Ey ağ bədənli saqi, piyalə gətir,
Nigarın naminə bir neçə cam ver.
Sirlərin üzündən pərdəni qaldır,
Hərdən bir qəmzəylə xumarı sındır.
Əğyarsız eşq məclisidir,
Ürək evimdə yardan başqa kimsə yox.

Çərxi-fələk mənlə rəftar etməyir,
Bir xəstə bədəndə iki min dərdü qəm var.
Ey müğənni, kamançanı köklə,
Çənglə neyi də naləyə gətir.
Ey mütrib, bu fərdi də sən tarla söylə:
Ürək evimdə yardan başqa kimsə yox.

Ey yar, zülfünə daraq vurma ki,
Əqrəb xarabalıqdan bayıra çıxar,
Aqil divanəyə gülər,
Pərvanə odu məndən almış.
Zikrim budur mərdü mərdanə:
Ürək evimdə yardan başqa kimsə yox.

Nə əsirəm, nə də ki, azadəm,
Hərdən bir bəla məni yada salır.
Mən aşiqəm, lakin Fərhad deyiləm,
Məhəbbətdə Qeysə ustadəm,
Mən bu zümzümə ilə fəryad edirəm:
Ürək evimdə yardan başqa kimsə yox.

Zahidlər xudbin və xudpəsənddirlər,
Dillərində həmd, ürəklərində isə kin var.
Xoş o kəsin halına ki, ayini məhəbbətdir,
Aşiqəm, mənim dinim eşqdir.
Açıq deyirəm ki, məzhəbim budur:
Ürək evimdə yardan başqa kimsə yox.

Əslim torpaqdır, de, yenidən torpaq olum,
Canlandır, de, yenidən həlak olum.
Bəlkə bəndələrin pakı olum,
Nə vaxtadək hicrindən sinəm parçalansın?
Fədan olunca dediyim budur:
Ürək evimdə yardan başqa kimsə yox.

Qiyamət günündə biçarə və yazıq halda,
Gözlərim yaşlı, ürəyim parça-parçadır.
Mən avara başımı torpaqdan qaldıracağam,
Özbaşına kəfəni cıracağam.
Mən avara bu şeiri oxuyacağam:
Ürək evimdə yardan başqa kimsə yox.

Ey Kəminə, sən gəl qaşını kəc etmə,
Ey Fədai, get bunu Növrəsə de.
Abış badəni kuzədən doldurmuş,
Xan Qaradaği “ya hu" çığırır.
Bəli, Nəvvaba daima de:
Ürək evimdə yardan başqa kimsə yox.

Kafir uşağı imanımı apardı,
Yəqin bilirəm, dinimi də aparacaq.
Əgər müsəlmanamsa da, eşq kafiriyəm,
Mən Baki deyiləm, Şeyx Sən’anəm.
Bu sözə ürəyim və canım fədadır:
Ürək evimdə yardan başqa kimsə yox.

## MOLLA XƏLİL ABDAL ŞAKİNİN NƏVVABA NƏZİRƏSİ

### (1310-cu il – 1891-92)

Bu şeirlərə başlayıram,
İbadət edilən vahid Allaha həmd olsun!
Salam və dua olsun gecə və gündüz,
Peyğəmbərə və müqəddəs qohumlarına!
Mən Allahın vəhdətinə iqrar edirəm:
Ürək evimdə yardan başqa kimsə yox.

Mən demirəm ki, o var, ya yoxdur,
Və ya demirəm ki, o necədir, o nədir?
Şəriksizdir, bərabəri yoxdur,
Vahiddir, ondan başqa ilahi qüvvə yoxdur.
Həmişə vird edərək deyirəm:
Ürək evimdə yardan başqa kimsə yox.

On dörd məsum düz yola çəkəndirlər,
Bütün elmlərin alimidirlər.
Olub-olmayanları bilirlər,
Şiələri məhrum etmirlər.

Mən bu məfhumdan başqa bir məfhum tanımıram:
Ürək evimdə yardan başqa kimsə yox.

Ey ağlayan və aqibətini fikirləşən ürək,
Daha bu dünya üçün təşviş etmə.
Dünyanın ləzzəti tikansız olmaz,
Qarşıda səni nə hallar gözlədiyini fikirləş.
Öz dilində bunu vird et (həmişə):
Ürək evimdə yardan başqa kimsə yox.

Ömrün sonu zaval və fənadır,
Qəbahətə mürtəkiblik xətadır.
Aşiqlərin dostu dərd və bəladır.
Şərab və qədəh yox, nə də gözəl simadır.
Bütün bunlar bica ləzzətdir:
Ürək evimdə yardan başqa kimsə yox.

Ariflər heyif ki, dünyadan getdilər,
Candan gedən ruh kimi getdilər.
Ürək dostlarının hamısı qan axıdıb getdilər,
Tanışlar da bir-bir getdilər.
Bəli, bunlar da ki, belə getdilər:
Ürək evimdə yardan başqa kimsə yox.

Nəvvab şairlərin fəsahətlisi,
Xan Qaradaği xoş üzlüsü.
Növrəs və Kəminə vəfa əhlidir,
Abış və Baki ariflərin ümdəsi.
Şaki isə bunların hamısına deyir:
Ürək evimdə yardan başqa kimsə yox.

## MİRZƏ FATMA KƏMİNƏNİN NƏVVABA NƏZİRƏSİ

Ey ürəyi həmişə bahar olan,
Nə vaxtadək eşq səməndinə süvar olacaqsan?
Hər tərəfə xumar təki gedirsən,
Simintənləri və laləyanaqları mədh edirsən.
Gecə və gündüz həmişə vird et (bunu):
Ürək evimdə yardan başqa kimsə yox.

Saqiya, ey cəza gününün xilaskarı,
Sənə fəda bütün şahlar və gədalar.

Tək olan Allah rizasına,
Həqiqət qapısını mənim üzümə aç,
Ki, bütün üzvlər desinlər:
Ürək evimdə yardan başqa kimsə yox.

Zahidlər xudpəsənd və özbaşınadırlar.
Hər zaman hiylə toxumu əkirlər.
Biri-birindən daha pozucudurlar.
Hər dildə bir bid'ətləri var.
İlan kimi zəhərlə dolu bədənləri var.
Ürək evimdə yardan başqa kimsə yox.

Nə vaxtadək, ey xoş əhvallı ürək,
Çətin işlərdən dəm vuracaqsan?
Gah bəhs edib, gah da sübut axtarırsan,
Gah İsfəndiyar, gah da Rüstəm-Zal kimisən.
Onların cismi torpağa və kəsəyə dönüb.
Ürək evimdə yardan başqa kimsə yox.

Xan Qaradaği xoş əhvallıdır,
Abış, Baki ürkmüş ceyran tək,
Növrəs və Şakinin xisləti tərifə layiq,
Hamının sözləri şəkər kimidir.
İlin bütün aylarında dedikləri budur:
Ürək evimdə yardan başqa kimsə yox.

Nəvvab seyidlərin şərəflisidir,
Yoldaşları hamı pak sifətdir.
Bu nəğmələr Kəminədən əyan oldu,
O, təşnələr üçün abi-həyat kimidir,
Bu fərdin bütün mənası budur ki,
Ürək evimdə yardan başqa kimsə yox.

**NƏVVAB**

Dilinə düz sözdən başqa heç nə gətirmə,
Ürəyinə də "sənə ibadət edirik"dən başqa bir fikir gətirmə.

Eşq yolunda canımın və ruhumun əzizini verdim,
Mən o deyiləm ki, canımı ürəyimi əsirgəyim.

Sənin qədəm qoyduğun torpağa mən başımı qoyaram,
Göydəki iki ulduza torpağın xəzinəsindən bayraq sancaram.

Qatışıqsız badə gətir, andına xilaf çıxma,
Ki, bizim mənzilimiz qara torpaqdan başqa bir şey deyil.

Nəvvab, hər dəm ki, ürəyindən ah qopur,
Tüstüsündən (ürəyinin) ay və günəş, doqquz fələkin
üzü qaranlıqlaşır.

* * *

Heyif, göz və ürək ayrılıqdan zəif oldu,
Vüsal zamanı yetişdi, ayrılıq zamanı qurtarmadı.

Əzəldən nə bəxtim, nə də iqbalım olmadı,
Gah hicran qəminin kəfili, gah fəraqın zamini oldum.

Qəza mənim səbr cilovumu görən kimi,
Taqətimi tezliklə fəraq ipiylə bağladı.

O zamandan ki, sənin eşqinə mübtəla olmuşam,
Mənim tikəm (payım) gah hicrdən, gah da fərağ
süfrəsindən olmuşdur.

Heyif, əziz ömrün dərdlə sona çatdısa,
Nə hicrin, nə də ki, fəraqın sözü sona çatdı.

Səbatsız dünyanın dövrünə nə çarə edim ki,
Səbr quşu fərağın əlində qalıbdır.

Nəvvab çərxi-fələyin əlindən təəccübdə qaldı,
Öldürülmüş bülbül kimi fəraq astanasında qaldı.

* * *

Ey xoşbəxt quş, ey sabah bülbülü,
Yuxuda qərq olanlara de, qurtuluşa tələsin.

Yarın hicrində gecəm-gündüzüm yoxdur,
Ya xaliq, ya Allah!

Mənim qanlı göz yaşım ulduzların üzərindən keçdi,
Hanı Xızır hümmətli şəxs ki, kömək etsin?

Ürəyimin ahı ilə aya halə çəkdim,
Ürəyimin qanında nicat gəmisi qərq oldu.

Nəvvab qaranlıq gecələrdə nalələr çəkir,
Lakin sənin qulağına səs çatmır, ey xilaskar!

* * *

Ey yarımın qasid quşu - kağız,
Ey baharın bülbülü - kağız!

Neçə vaxtdır dildara yazmışam,
Yaralı sinəmdəki kağız.

Məlumdur ki, hicran yanğısı,
Nigarın dərgahındadır, kağız!

O ürəklərə qarışıqlıq salan nigar,
Heç vaxt öz zəif və ağlar dostuna kağız yazmamışdır.

Nəvvab venə öz nəmli gözlərilə
Yazdı kağız.

* * *

Sənin rüxsarının əsiri oldum, ey əsirlərinə nəvaziş edən,
Sənin kuyinin qəribi oldum böyük arzuyla.

Ey gözəllik diyarının padşahı, mənəm sənin qulamın,
Lakin Mahmudun (Qəznəvinin) ayağının torpağı olan qulamı
Ayaz kimi yox.

Gizli eşqimin alovundan heç kəs agah olmazdı,
Əgər mənim göz yaslarımın seli məni satmasaydı.

Mən sənin astanandan uzaqdayam,
Lakin rəqib sənin yaxınlığında və sirlərinə məhrəmdir.

Hürkmüş ürəyimdədir sənin vüsal xəyalın,
Milçək nə vaxt o şahin yüksəkliyinə uça hilər?

Bahar fəslində şeyda bülbül kimi,
Nəvvab sənin hicrinin dərdindən nəğmə oxuyur.

* * *

Yenicə açılmış gülüm hər tikana həmdəm oldu, əfsus,
Bülbülüm qarğalara yar oldu, əfsus.

Vəfa ilə can verdiyim bivəfa,
Bivəfa və cəfakar oldu, əfsus!

O dilruba ki, həmişə bizə yar idi,
İndi gör bizə necə bizar oldu, əfsus!

Hücrədəki zahid elə ki eşq şərbəti içdi,
Dildarın dərgahının xadimi oldu, əfsus!

Nəvvab ürəyini və canını bütlərə verdiyinə baxmayaraq,
İşi-peşəsi elə ağlamaq oldu, əfsus!

* * *

Gecə zülmət, yol xətərli, irəlidə və geridə dərd-qəm,
(Gecə) işıqsız, məş’əlsiz və gözətçisinin fanarı.

Bahar çağı yarın fəraqında,
Qəfəsə düşmüş bülbül kimiyəm.

Dəmbədəm dostun yolunda qədəm vururam,
Mənə bu yolda həmdəm olan bir kəs yoxdur.

Sənin hicrin mənim ürək və canıma od vurdu,
Sənin vüsalın üçün canım çör-çöp kimi yandı.

Zahidin moizəsini eşitmək istəmirəm,
Abidin sözünə də indən belə inanmıram.

Bəs Nəvvab nə vaxta kimi gecə-gündüz,
Carçı kimi sənin rüxsarının fərağında nalə çəksin?

* * *

Ey günəşə öz rüxsarından şüa verən,
Ay sənin üzünün həsədindən həmişə baş arğısındadır.

Mən sənin sərv qəddinin ucbatından dərd-qəmə düçaram,
Əğyar isə sənin kuyində çalğı və musiqidədir (kefdədir).

Zahid əgər qiyamətədək sənin eşqindən dəm vursa,
Yenə də dərdü qəm və qüssədən vida edə bilməz.

Aşiqlər sənin yolunda can verdilərsə,
Vay mənim halıma, əgər vəziyyət bu cür ola.

Nəvvabın başı sənin qədəmlərinin altına xalça
kimi salınsın,
Çünki məndə bundan başqa bir matah yoxdur.

* * *

Başımı qurban verdiyim, xudahafiz.
Canımı sənə verdim, xudahafiz.

Xiyməmizi açıb, qapından getdik,
Vəhşətlərə sarı, xudahafiz.

Sən daş ürəkli rəqiblə qal,
Mən isə ayrı düşdüm, xudahafiz.

Kimi görürəmsə, şikayət edirəm,
Bütün macəradan, xudahafiz.

Bizi qovdun qapından,
Gəda kimi dərbədər olduq, xudahafiz.

Nəvvabın daha başqa qapısı yoxdur,
Haralara gedir, (məlum deyil), xudahafiz.

* * *

Eşqinin qəm-qüssəsindən heç xilas ola bilmirəm,
Sidq ilə min-min ixlas oxusam da.

Zahid əgər ürəyimı sındırıb, eşq dalınca getmə desə,
Mən qisas üçün onun başını sındıraram.

O deyər, lakin etməz, mən edərəm, demərəm,
O riyakarlıq edir, mənsə ixlas edirəm.

Sənin qəm dəryanın dalğasına baxanda batıram,
Sənin hicran dənizinin ürəkdən qəvvasıyam.

Cümlə cahan sənin vüsalını istəyirsə də,
Nəvvab kimi heç kim həqiqi ola bilməz.

* * *

Sənin qəm oxunun hədəfi olmuş və yaralı sinə,
Sənin hicranının dərd və qəm ordusu səf-səfdir.

Sənin kuyinə mərdanə qədəm basdım,
Əzizim, ömrümün mayası sənin yolunda tələf oldu.

Sənin dərgahının torpağı ürəyimin gözünə sürmə kimidir,
Nə şərəflidir, əgər bu müyəssər olsa.

Heş vaxt mən sənin eşqindən üz döndərmərəm,
Bunu şərəf biləsən, ya da ki, əzab versən də.

Nəvvabın işi-peşəsi sənin xəttü xalını çəkməkdən başqa
bir şey deyil,
Sənin hüsnünün xətlərini ürək sinəsinə nəqş edir.

* * *

Ey hüsnü cənnət olan, bal dodaqlı,
Üzünün şamı yolunu azmışlara dəlildir.

Kirpiklərinin oxu, qaşlarının kamanı,
Mənim tək hər tərəfə yüz-yüz qurban yıxmışdır.

Çərxi-fələyin anası daha doğmayacaq,
Sənin ay üzün təki gözəl hüsn.

Musanın möcüzəsi nur saçan ağ əlidir,
Turun (Sinay dağı) işığı və ya Xəlil odudur.

Uzağı görməyən zahid əgər görərsə,
Çox danışmağından utanar.

Heç kəs öz işindən razı qalmaz,
Sirr öz hücrəsində zəlil qalar.

Üzünün cilvəsi nurla dolu olsun,
Müqəddəslər Cəbrayılla bərabər sənin məddahın olsun.

Səni tərifdə kədərli Nəvvab kimi,
Heç kim bu cür şeirlər deməmişdir.

* * *

Ey qəddi tuba, üzü mim və hey hərflərinin birləşməsi (mah-ay),
Camalına ay dedim və ya mim, ha və rey – (mehr-günəş)

Ey dilfərib, cadulu gözün nərgizə oxşar,
Saçların müşkü ənbər, ləblərin şəkər.

Sənin cəmalına aşiqəm, ey Məsiha nəfəsli,
Məcnun Leyliyə aşiq olan kimi.

Sənin nurlu ay üzünün fərağında hər ləhzə,
Dərd-qəm mənə Qaf dağı qədər üz verər.

Nə vaxtadək Nəvvab bülbül təki nalan olsun?
Vüsalın üçün onun cismi mim, vav və yeyə dönər – (muy-tük).

* * *

Ey pəri, mən divanədən nə vaxtadək ürkəcəksən?
Nə vaxtadək üzünü göstərib gizlədəcəksən?

Rəqiblərlə nə vaxtadək oturacaqsan?
Mənim acığıma nə vaxtadək söz eşidəcəksən?

Nə vaxtadək sənin ayrılığın mən yorğuna yoldaş olacaq?
Nə vaxtadək səni yada salıb, görə bilməyəcəyəm?

Sənin fərağında ürəyim yarımcan qırqovul kimi,
Nə vaxtadək qəm və əziyyət əlində çırpınacaqdır?

Səni görmək vüsalıyla heyhat ki, Nəvvab,
Canını nə vaxtadək sənin yolunda qoysun və sənə çatmasın?

* * *

Dünya aşiqləri məstdirlər, hüşyar hanı, huşyar hanı?
Şirin yuxudadırlar, oyaq hanı, oyaq hanı?

Dağı, daşı gəzdim ki, ondan bir nişan tapım,
Nagəhan bir səda gəldi: Dildar hanı, dildar hanı?

Pərvanə tək bu sədadan başdan ayağa od tutdum,
O məhliqanın üzünün şamı olmadan görüş hanı, görüş hanı?

Yarın ucbatından Məcnunam, həm sərsəri,
Divanə kimiyəm, ey pəri, tütəyim hanı, tütəyim hanı?

İtirdim gözəlimi, gah huşyaram, gah bihuş,
Dərd, qəm və hicran çəkirəm, qəmxar hanı, qəmxar hanı?

Nəvvab, sənin şeirlərindən aləmə ətir saçıldı,
Bu matahı almaq üçün əttar hanı, əttar hanı?

* * *

Sənin hicrində biqəraram, ey dost,
Bisəbr və dilfikaram, ey dost.

Bu gecə sənin xəyalınla yatmışam ki,
Canımı sənə tapşıram, ey dost.

Külək əsdi, zülfünün ətrini yetirdi,
Onun nəş'əsindən xumaram, ey dost.

Dünyada mən belə əzizəm,
Sənin dərgahındasa, necə xar olmuşam, ey dost.

Güllər hamı yerdən baş qaldırıb,
Mən isə torpaqda xar qalmışam, ey dost.

Yüz il ölümümdən keçsə də, əgər,
Qəbrimin üstünə gəlsən, ey dost,

Sənin ətəyindən tikan kimi yapışacağam,
Qəbirdən ah-fəqan qoparacağam, ey dost.

Nəvvab sənin hicrinlə xəzan idi,
Sənin vəslinlə bahar oldum, ey dost.

* * *

Ömrümü gözəllərə köməyə verdim,
Can və ürəyimi ay üzlülərə köməyə, ey dad!

Onlarla məşq etdim, görmədim bəhrə,
Onların eşqindən kömək görmədim, ey dad!

Şəkər suyundan dada bilmədim,
Həyat suyundan bir qətrə, ey dad!

Damağıma vüsal qoxusu dəyməmiş,
Heyif, hicrana düşdüm, ey dad!

Gecə və gündüz mən fəqan və nalədəyəm, lakin,
Onun lə'l dodaqları gülüşdədir, ey dad!

Zülfünün qulacları boyuna düşən tək,
Hər tərəfə və hər yana sürüyür, ey dad!

Qaşlarının işarəsindən,
Dövranın dövrünə çaxnaşma düşər, ey dad!

Nəvvab təkin hər tərəfə,
Yüz-yüz cansız eşq şəhidi düşübdür, ey dad!

* * *

Yenə başımda nə şur və nə qovğadır, kömək edin!
Ol büti-rənanın vüsalı sevdasıdır, kömək edin!

Mən gərçi seyyidəm, eşq mübtəlasıyam,
O isə mən yazığa mövladır, kömək edin!

Mənə onun vüsalını qadağan edən zahid,
Özü eşqin şurundan gör necə rüsvaydır, kömək edin!

Sufi, eşqdə məhəbbət camından xam idi,
Dadan kimi başı bəlalı oldu, kömək edin!

Nəvvab səri-kuyinə əziz canını verdi.
Ona şeyda bülbül kimi rəhm etmədi, kömək edin...

* * *

Ey bivəfa qoyubsan əcəb qalə tək məni,
Hicran odun əhatə edüb, halə tək məni.

Bilməm nə etmişəm sənə, zalim, nə zülmdür,
Etdin kəbab atəşi-cəvvalə tək məni.

Allah rizası etməgilən xar eşqdə,
Aşiqlər içrə dağlama sən lalə tək məni.

Bir ləhzə gər üzülsə əlim qürbi-vəsldən,
Eylə yəqin ki, yandırdı sədsalə tək məni.

Nəvvabı zarü zərd edüb oxşatdı qəmlərin,
Divari-qəmdə nəqş olan əşkalə tək məni.

* * *

İnsanın ürək və canını yaradan təki,
Ürək və canı cananlar üçün yaratdılar.

Qəddini cənnət sərvi tək yaratdılar,
Üzünü parlaq günəş tək yaratdılar.

Əvvəlcə dünyanı bina etdilər,
Məni də hicran dərdiylə yaratdılar.

Eşqdən nalan olan bülbüllər kimi,
İki gözümü zar və ağlar yaratdılar.

Bizi qəm və fikir dağına,
Sinəsi büryan olan lalə kimi yaratdılar.

Mənə dünyada Məcnun adı qoydular,
Səni dövrana Leyli yaratdılar.

Sənin yolunda şirin canı təkcə mən qurban vermədim,
Mənim tək min qurban yaratdılar.

Məgər təkcə Nəvvabı sənin rüxsarının eşqində,
Sən'an kimi şöhrətli yaratdılar?

Bir gör, bu mənim ayım, bu da göydəki ay,
Hansı birini daha parlaq yaratdılar?

**Vər. 323a**

## DİNƏ ZİYAN VURANLARIN VƏ YENİLİK YARADANLARIN, ŞƏRİƏTDƏ VƏ DİNDƏ AYRI-SEÇKİLİK SALANLARIN, DÖVLƏT VƏ MİLLƏTƏ XƏYANƏT EDƏNLƏRİN (PADŞAHA AĞ OLANLARIN) HƏCVİ

Beşno in zomzome əz mən ke, şəkərxənde-mən əst,
Soxəne-şəhdo şəkər, şohreye-hər əncomən əst.[*]

[*] "Bu dadlı gülüşümü eşit. Hər məclisi bəzəyən dadlı sözlərdir."

Əhli-İrana qələm xahiş edir həcv yaza,
Hansı kim, şahlarına cümlə xəyanət edən əst.

Zəmm edim mollavü dərvişü qapı adəmini,
Sahibi-mənsəbi kim, məzhəbə rəxnə salan əst.

Dın rəvacında olan qəlbi qara Gürgin tək,
Rəxnə salmaqlığa hər birisi bir Təhmtən əst.

O şahənşah ki, xəllaq özü nəsb qılıb,
Fikrü zikri o şəhin şər'ə himayət edən əst.

Xain olmaq necə insafdı bir böylə şəhə?
Millətə ömri-giranmayəsini sərf edən əst.

Əvvəla, mollayə tərif demək lazımdır,
Hansı ki, hökmi-xudanı qəmu təhrif edən əst.

## BİƏMƏL, ALÇAQ VƏ BAŞIBOŞ ALİMLƏRİN TƏNQİDİ

Məzhəbü dinə salan rəxnələri, bid'ət ilən,
Qəsd ilə şər'i-xudavənddə təşrih edən əst.

Cümlə təmahdı və əxxazdı, cüllab, yəqin,
Əlinə əl verənin barmağı əskik gələn əst.

Biri bədkardı, bədhalü bəd e'malü füzul,
Biri bədfitrətü bədxislətü ruyintən əst.

Sən'əti cümləsinin büxlü həsəd, kibrü riya,
Pox yeyən, puç danışan, it kimi cəmdək sökən əst.

Tovlayıb  xəlqi, soyub cümləsinin var-yoxun,
Başı boş, quşqunu xoş, zahidi-pürməkrü fən əst.

Od urasan ata-anasına, həm pul verəsən,
Şad olub, övcə çıxıb qah-qah ilən gülən əst.

Tor qurar Yevrapadan mollalara Mülküm xan,
Çün bilir, molla balıq kimi tora tez düşən əst.

Bu əbalis səpib aləmə şeytan toxumu,
Hər zamanda bir şeytan kimi baş qaxızən əst.

Haçana kimi müridbaz olub, din evini,
Yıxıban, məzhəbi-həqqanını pula satən əst.

Yada sal ruzi-qiyamın fəzə'i-əkbərini,
Xaliqi-ərzü səmaya nə cavab ərz edən əst.

Bu nə kibrü bu nə nüxvət, bu nə zöhdu nə riya,
Pulu mənzur qılıb xəlqə, ibadət edən əst?

Bunların ruyi-dili xaliqi-yektaya deyil.
Nəf'i-dünyadı yəqin, gərçü kühən pirəhən əst.

Əvvəla, vaqonu görcək deyir: "atəş-bezənid,
Bu şəyatin işidir, şeytanəti yol gedən əst".

Sonra çün xəl'ət alır, vaqona mincək, sölüyür:
"Mərhəba, mülhəm olubsuz, nə əcəb kərgədən əst".

Pak alimlərin adını bu halvaxorlar,
Batırıb, şövkətlü əclallərin sındıran əst.

Çakər eyliblə bular ali-rəsulu özünə,
Qul kimi cübbə götürdüb dalınca gəzdirən əst.

Soruşan yoxdu "a molla ki, rəsuli-əkrəm,
İki ağır şeyi dünyaya şifariş edən əst:

Biri Qur'ani-Xudavəndi-cahandır, o biri,
Sənmisən, yoxsa zəlilanə dalınca gedən əst?....

Seyyidin əksiyinə artığınız xadimdir,
Cəddi əthərləri şahənşəhi-külli-zəmən əst.

Bu kəsafətlə deyirlər ki, bizim qəlbimizə,
Vəqti-hacətdə qəmu elmlər ilham olən əst.

Kəşf olur yuxuda mətləb bizə hər bir gecədə,
Yuxuya kimdi şəriətdə ki, bavər edən əst?

Doludur şəhvətilə bir parası müftəxorun,
Əlinə düşməsə zən, heyvanata sürtüşən əst.

Biədəb, məclisara bir əlidir, bir paçası,
Alətin qarmalayıb ləhzədə bir böl edən əst.

Biri balitkaçıdı, həm o biri həlvaquşay,
Dolduran dolma yeyən, pox quyusu pulgüdən əst.

Biri xüdbaf deyir məsələni qat-tarışıq,
Birisi pak əhadisi yalan söyləyən əst.

Şeytəni mollaların şumluğundan bilirəm,
Eyşü işrət evi şahənşəhi-beytül-həzən əst.

Mümkün olmaz ki, təhəmmül edə bir kəs bulara,
Görə bilməz buları kimsə, əgər kunkən əst.

Ömür versin şahənşahə, xudavəndi-cahan,
Kəsməsin sayəsini, milləti çün hifz edən əst.

Şükür lazımdı cahan əhlinə hər dəmdə, neçün,
Gər bular olmaya, üsyan yükünü kim çəkən əst?

Gər bu dünyada imam zahid ola, pul da ola,
Qətl fitvası verib, pulu alıb, öldürən əst.

Şümürün üsyanını gər pula məvazin edəsən,
Götürüb pulu, günahı özünə yükləyən əst.

Gər bular olmaya üqbadə cəhənnəm xətibi,
Təbəqatını onun kim bacarıb, dolduran əst?

Doğrudur, kim ki, qiyamətdə dəyirman olacaq,
Dəni molla başıdır, molla başın üyüdən əst.

## DƏRVİŞLƏR VƏ ONLARIN ƏMƏLLƏRİNİN TƏNQİDİ

Kizbdir, hər nə danışsa, qəmu dərvişləri,
Əməli cümləsinin hiyləvü məkr əstü fən əst.

Cümlə laməzhəbü bidinü ləinü murdar,
Həqqdən durü şəyatin yoluna tez gedən əst.

Bəngü çərsi uduban, tiryak atan, böht aparan,
Qəlyani-tiryaka qodux kimi qüllab urən əst.

Dəvə nəvvalə udan kimi udar tiryakı,
Sifəti əqrəbidir, surəti ağu verən əst.

Dildə mövlanı deyir, sinədə şeytan çağırır,
Əsl şeytana bular cümləsi papaq tikən əst.

İşiyür baldırına şamü səhər misli-himar,
Cümlə ömründə təni qüsl suyu görməyən əst.

Doqquz uşağı gecə bir-birinə kəc dolaşır,
Xəlq içində biri baba, biri fərzənd olən əst.

Sürxəlişah deyirlər meyi-nabın adına,
Həm qumar oynamağın adına cəncəl deyən əst.

Bəngin adına deyirlər qamusu Səbzəli şah,
Künci-pünhana girib, çərsi yeyib, bəng çəkən əst.

Nə namaz var, nə oruc, bircə yalan dilləri var,
Oğru it kimi buradan çıxıb, ora girən əst.

Burnuna dəyməyib əsla ki, müsəlmanlıq iyi,
Millətə nəf'i nədir? Şər'ə necə yol gedən əst?

Bunların əlinə gər düşsə imam oğlu, yəqin,
Pulü malını soyub, həm özünü öldürən əst.

Bunların məshəbü dini özüdür, bir qara pul,
Sözləri kizbü yalan, lafü kəzaf, tük verən əst.

**Vər. 325a**

## XƏYANƏTKAR SAHİB-MƏNSƏBLƏRİN TƏNQİDİ

Bir neçə fərd yazaq sahibi-mənsəb sözünü,
Dövlətü millətə gör ki, nə xəyanət edən əst.

Biri babidi, biri sufi, biri əxbari,
Biri şeyxivü üsuli, biri xüdsər gedən əst.

İndi də tazə kərimxani çıxıb, faş söyər,
Cümlə alimlərə ki, bundan əzəl yol gedən əst.

Rükni-rabe çıxarıb, "qütb" deyə həm özünə,
Gahi abdalü gəh övtadü əmanət edən əst.

Özünə cilvə verib mülhəmi-yəzdan bilir,
Bavücud inki qəmu nəsli onun Əhrimən əst.

Damağı eyb edib, əqli çaşıbdır kişinin,
Bu necə sözdü, deyir: Gör necə çaşqın gəzən əst.

Mö'təqiddir oların bəzisi bu hədyana,
Parası erməni Mülkümxan ilə söz verən əst.

Biri zanidi, biri sadəpərəstü meyxar,
Çoxu tənbəldi, dəraviş ilə tiryak çəkən əst.

Padşəh bircə nəfər, qapıda yüz min belə xər,
Neyləsin, çarə nədir, bunları şəh neyləyən əst?

Yox birinin hünəri, olsa da gər, qeyrəti yox,
Qeyrəti olmayanın məzhəbi həm olmayən əst.

Şəhri-İranidə qeyrət var idi bundan əzəl,
Rüstəmi-Zal kimi Bijəni-qeyrət çəkən əst.

Kivü Qudərzü Fəramərz həman Tusidilər,
Qəmusu şah yolunda necə candan keçən əst.

Tülkülər indi tutub şirü pələngin yerini,
Cayi-simurğ nə cövlangəhi-zağü zəxən əst.

Yoxdu namusu bu biarların, olsa idi,
Tənbakudən ötəri bu nə çəkənhaçəkən əst?

Tənbaku, tənbaku satanü alan, cümlə şəhin,
Mənə nə dövlət işi, bu nə bizənhabizən əst?

Sən özün bircə nəfərsən, a ulaq, bircə nökər,
Götürüb hər yerə kim ki, gedəcəksən, gedən əst.

Bu nə icmadı dalınca gedər şamü səhər,
Nə berovhaberov əst in, nə yedək çəkdirən əst?

Dılqırın birisi fərraşbaşıdı, dəhbaşı,
Yol gedən vəqt o, küncünə bizənhabizən əst.

**Vər. 326a**

## YENƏ ALÇAQ VƏ BƏDƏMƏL MOLLALARIN TƏNQİDİ

Bir deyən yoxdur, a molla, bu cahanda nəçisən?
Bitini, çirkini yu, qarnını dərdin çəkən əst.

Niyə Mirzəyə yazırsan yalandan məsələni,
Şübhəli söz, o cənaba necə cür'ət edən əst?

Bu nə şərşur idi İranə salubsuz yeksər?
Aləmin xəlqi, a molla, sizə qəh-qəh gülən əst.

Adını şər’ qovubsuz, belədir xahişiniz,
Şər’i-qərrayə tərəf hansınız bir dəm gedən əst?

Yalü kupal ilə hər həftədə bir şur salıb.
Məzhəb icad edib, aləmi bidin edən əst.

Xəlqi yoldan çıxaran sizsiniz, ey batini kor,
Qəmu təqsir sizin boynunuza yüklənən əst.

Neçənizdən tutacaq həşrdə ol pak Rəsul,
Yüzünüzə tüpürüb, nari-cəhimə çəkən əst.

Bid’ət əhlinə belə həcv yazan kimsənələr,
Dərgəhi-paki-xudadan qəmu-xəl’ət geyən əst.

Bu neçə fərdi dedim ta ki, qəmu xəlqi-cahan,
Bid’ət əhlin tanıyıb, onlara lə’nət deyən əst.

Nə deyim bir belə məxluqa, xudaya, nə edim?
Bunların çarəsi qəhharü şəhidül-mehən əst.

Olsalar qabil əgər hidayət buları,
Yoxsa şeytan toxumu toxmi-şəyatin əkən əst.

## NƏVVAB 1291-Cİ İLİN ZÜL HİCCƏTÜL-HƏRAM AYINDA (yanvar, 1875) "ZİYA" QƏZETİNƏ ÜBEYDULLAHİ-SANİ, YƏNİ ŞEYX ÜBEYDULLAH KÜRDÜSTANİNİN TÜĞYANI BARƏDƏ YAZMIŞDIR

Ey "Ziyai", ibrət ilə gərdişi-dövrana bax,
Sabitü səyyarədən hadis olan dastana bax,
Dideyi-insafilən bir ləhzə Kürdüstana bax,
Laz kürdi şeyx Übeydüllah edən tüğyana bax.

Özünü hadi bilib, bulmaz hidayətdən xəbər,
Xəlqi irşad eyləyir, irşaddən bilməz əsər,

Oxuyur Quranü, Quran əhlinin qanın tökər,
Alimi-bielmi gör, bir qalibi-bicana bax.

Kərbəladə çün Übeydüllah ol ibni-Ziyad,
Pak olan qanlar töküb, aləmlərə saldı fəsad,
Şeyx Übeydullahdan qaldı yenə bir “yaxşı” ad,
Tişeyi-zülm ilə təmir etdi, qəbristana bax.

beydüllah saldı aləmə bir tazə şur,
Tiği-kin ilə nümayan eylədi şur, nə şur,
Qaldı bu kinü ədavət ta olunca nəfhi-sur,
Əhli-İslamın içində qoyduğu tufana bax!

Əvvəla ram eylədi Həmzə ağanı özünə,
Sürmeyi-zülmət çəkib ol bihəyanın gözünə,
Neçə min əhməqləri yandırdı zülmün közünə,
Zülmilən qalxızdığı bir şurişü əfğana bax.

Cəm’ qıldı kin üçün başına bir cəm’i-kəsir,
Lazü Kürdüstandən əgər olar bürnavü pir,
Əhdü peyman aldı çün ol qövmdən şeyxi-kəbir,
Onların əhdini gör, həm şeyx edən peymana bax.

Erməni qövmünü əvvəl qətlü qarət eylədi,
Bigünah ol qövmə zülmi-binihayət eylədi,
Qan töküb, xunxar oldu, qanə adət eylədi,
Cümlə viran eylədi, bir etdiyi virana bax.

Onların malü mənalını çü tarac eylədi,
Tiri-zülmə canlarını cümlə amac eylədi,
Sahibi-miknətlərin bir pula möhtac eylədi,
Şeyxi-alihimmətin bir tutduğu divana bax.

Ermənistanı çü tarac eylədi şeyxi-dəjəm,
Əmr qıldı ləşkərinə, saldılar şeypurə dəm,
Ondan İran səmtinə qalxızdı zülm ilə ələm,
Aləmi qovğa tutub, sən qəfləti-İrana bax!

Əvvəla Savucbulağ səmtinə etdilər güzər,
Cümləsini özlərinə ram edib, bəs keçdilər,
Neçə kəndi, qəryəni həm etdilər zirü zəbər,
Çün Miyandaba yetib, tazə yetən mehmana bax.

Çəkdilər övrət, uşağı qətlü qarət etdilər,
Bir axundun başını qoyun başı tək kəsdilər.
Urdular kin atəşi, bir məscidi yandırdılar,
Şöləsin qaldırdılar ta dərgəhi-sübhana, bax!

Çün hücum etdi o İslam əhli İslam üstünə,
Ac qurtlar necə kim, bir kəllə əqnam üstünə.
Çıxdılar tarac üçün tağü dərü bam üstünə,
Ah, vaveyla, çıxıb eyvandan Keyvana, bax!

Soydular övrət-uşağı, etdilər zarü əbir,
Xulivü Şümrü Sinan kimi pəs ol qövmi-şərir.
Qana qəltan oldu bəzi, bəzi oldu dəstgir,
Banuvani-isməti çəkdirdilər pünhana, bax.

Seyl tək axıtdılar çün əhli-İranın qanın,
Əhli-İran demə, degilən əhli-Qur'anın qanın.
Bigünah, gör kim tökər muncan müsəlmanın qanın!?
Xak-xun içrə düşən, min qanına qəltana, bax.

Çün Miyandabı çapıb, pəs eylədi əzmi-Benab,
Ləşkəri-əşrar ilə ol səmtə etdilər şitab.
Çün Benab əhli eşitdi, oldular püriztirab,
Var idi bir qazi onda, qıldığı bunyada bax!

Qolların çıplaq edib, aldı ələ şəmşiri-kin.
Xəlqi tərğibi-difa' etdi, çağırdı "ya munin",
Nasirül-müstəz'əfinsən, ya imanül-xaliqin,
Zalimin zülmünü gör, axıtdığı al qana bax!

Çün vəliəhdin hüzuruna yetişdi bu xəbər,
Xatiri-əşrəfləri bu qissədən tutdu kədər,
Əmr qıldı xazinə, gətdi hüzurə simü zər,
Ləşkərin müstəğni etdi, sərvəri-dövrana bax!

Naibi-şahi-cahan, yəni vəliəhdi-zaman,
Kürdlərin dəfinə dərdəm ləşkərin etdi rəvan.
Açdılar cürət əlin kürd əhli çün bəbri-bəyan,
Tökdülər vağmur tək, gəl, gülllədən barana bax!

Qırdılar Martin tüfəngilə o qövmi bigünah,
Olmadı ol binəva qövmə biri püştü pənah.

Bu vəqayedən çü müxbir oldu Tehran içrə şah,
Xişmlən sədri-ə’zəm üstə yazdığı fərmana bax!

Key sipəhsalare-ma, ey sədre-ə’zəm, in çe kar?*
Dozd əndər xane, to dər rəxte-xab əncomşomar.
Əmr kon, iraniyan əz kordha arəd dəmar,
Mən nəxahəm kordo Kordestano bağo bərgo şax!

Sədri-ə’zəm əmr qıldı, çəkdilər şeypurü nay,
Növcavanlar şiri-qərran kimi çəkdi huyü hay,
Necə qonceşk üstünə şahin şığar, ya qırqıçay,
Fövclər talan üçün oldu rəvan, talana bax!

Sədri-ə’zəm baqi qalsın dəhr içində payidar,
Qütbi-İrandır, onu hifz eyləsin pərvərdigar,
Demə Əflatun ola Bismarkdan tərcihi var,
Asiyada hərifi, mərddir, meydana bax!

Teymur ağa bir tərəfdən ləşkər ilə bidirəng,
Özlərin Benaba saldı cümlə ba tupü tüfəng,
Kürdləri araya alıb, eyləri bir türfə cəng.
Leş-leş üstünə töküldü, nüsrəti-Yəzdana bax!

Baqisi gərdan olub cümlə həzimət eylədi,
Rumiyə,Təbrizə şux ol dəm əzimət eylədi,
Təbrizin fərzanə əhli xeyli vəhşət eylədi,
Seyldən vəhşət edən dəryayi-bipayana bax!

Teymur ağa əhli-əkradi təaqib eylədi,
Şiri-ğərran dəstəsi əzmi-təğalib eylədi,
Bigünah məzlumu Yəzdan necə qalib eylədi,
Davərin dadını gör, dad ilə bir divana bax!

E’timadüddövlə həm bir neçə fövc ilə dəlir,
Şeyxin oğlilə təlaqi etdi çün rübahü şir,
Basdı nikbət şeyxin oğlun, oldu ta ki, dəstgir,
Aşikar oldu iradə tutduğu pünhana bax!

Şeyxdən nəqdinə rüşvət aldı ol dəm Etimad,
Oğlunu etdi rəha, aləmdə qoydu yaxşı ad,
Afərin İranın əhlinə ki, eylər etimad, etiqad,
Bir belə nadana, nadan etdiyi üsyana bax!

---

* Ey sipəhsalar, ey sədrəzəm, bu nə işdir?
Oğru evdədir, sən isə yataqda ulduz sayırsan.
Əmr et iranlılar kürdlərin damarın çıxartsın,
Mən istəmirəm nə kürdü, nə Kürdüstanı, nə də bağü bağatı.

Bəzmdə lafü kəzafı bu kəsin həddən keçər,
Rəzm vəqti qaçıban bir guşə içrə gizlənər,
Mərd adın gözləyib, namərdlər qarnın güdər,
Əhdü peyman sındıran Sufyansifət Mərvana bax!

Şeyx çün bir cəm ilən İrandan etdi fərar,
Ali-Osman dövlətinə, tutdular onda qərar,
Yenə bica fikri var kim, gözləyir fəsli-bahar,
Aləmi qovğaya salsın, şuri-bipayana bax!

Kürdü, Kürdüstanı tarac eylədi sərbazlar,
Qətlü qarət eyləyib, malını qismət etdilər,
Tiği-kin ilə o qövmün qanını axıtdılar,
Əhli-İslamın qanından bir axan ümmana bax!

Çəkdilər övrət-uşağı Təbrizin bazarına,
Şeyx bais oldu bu biçarələr azarına.
Görəsən heç bir gəlir əğva edənlər arına?
Əhli-Qur'an ortasında qoydular, bir qana bax!

Çün bu biinsaflıq çıxdı şeyxi-şabdan,
Xabi-qəflətdə yatan İran oyandı xabdan,
Xabdan yox, bəlkə bir girdabdan, qərqabdan,
Türkə bax, türkmana bax, əfqana bax, İrana bax!

Xövz qıl bu sözlərin ümqinə, ey alicənab,
Bir nəzər et, gör nə işlər eyləyirlər şeyxi-şab,
Zülm oduyla eyləyirlər aləmin qəlbin kabab.
Bunların zülmünü gör, yandırdığı neyrana bax!

Baxma zahir sözlərinə zahidin, olma dəlir,
Gör nə vaxşı sövləmiş bu misrəi bir mərdi-pir:
"Şeyxlər şəyyadü abidlər, əmusən qəmtərir,
Bunların qövlünə uyma,qıldığı nöqsana bax!"

Künci-pünhana çəkib Nəvvab özün zarü ğəmin,
Gör necə qafildi lran kim, çəkər şahlar qəmin,
Arı, namusu olan çəkməzmi qardaşlar qəmin?
Qevrət ilə baş verən, candan keçən mərdana bax!

Ey "Ziyai", zuini mümtədd qılsın girdigar,
Şə'nini, əclalını etsin cahanda intişar,
Şəmsı-iqbalın sənin gün-gündən olsun aşikar,
Çap qıl bu qissəni, lütf ilə bu dastana bax!

Vər. 330a

## 1300-CÜ İLDƏ (1882-83) İNGİLİSLƏR HİYLƏ VƏ KƏLƏKLƏ MİSİRƏ DAXİL OLDUĞU ZAMAN MEHDİ MƏHƏMMƏD ƏHMƏD SUDANİ ÜSYAN EDİB, İNGİLİS VƏ MİSİR PADŞAHI İLƏ MÜHARİBƏ EDİB, SUDANI, BƏRBƏRİSTANI VƏ XARTUMU TUTDUĞU MÜNASİBƏTLƏ DEYİLMİŞDİR

Ey əziza, diqqət ilə gərdişi-dövrana bax,
Sabitü səyyarədən hadis olan dastana bax,
Bir nəzər qıl Qirvanə, Bərbərə, Sudanə bax,
Gör xüruc etmiş necə ol Mehdiyi-dövrana bax!

İngilis dövləti bir məkr qıldı aşikar,
Padişahi-Rusa, həm Osmanlıya iblisvar,
Qırdırıb bir-birinə bunları, etdi tarümar,
Aləmi qovğaya saldı şuri-bipayana bax!

Sultanı aldatdı kim, “mən sənə imdad eylərəm,
Qorxma, gəldim, aləmi top ilə bərbad eylərəm,
Hindü Şindin ləşkərilə mən səni şad eylərəm,
Aləmi təsxir qıllam”, ləşkəri-Londana bax!

Eylə ki, bu iki sultan cəngə məşğul oldular,
Neçə kəşti suya saldı ingilisi-bihünər.
Qibris adlı bir cəzirə içinə çün girdilər,
Çıxmadılar daxi ondan, əhdə bax, peymana bax!

Eylə ki, Qibris içində tutdular onlar qərar,
Neçə mülkü neçə dövlət qəsb qıldı aşikar.
Hamısına bais oldu ingilisi-nabekar,
Hiyləsinə baxma, amma qıldığı nöqsana bax!

Neçə il mundan əzəl etdi yenə məkkarlıq,
Misr şahın aldadıb, etdi ona qəmxarlıq.
Ləşgərin Misr içrə doldurdu ketsin* yarlıq,
Sahib oldu mülki-Misrə, dərdə bax, dərmana bax!

Çün təsərrüf qıldı Misrin mülkünə ol hiyləgər,
Nöbiyə Sudanə saldı Bərbəristana şərar.
Cümlə aləm xəlqini bu hiylə etdi dağdar,
Mizbani-sadəlöhə, pürhiyəl mehmana bax!

* Ki, etsin

Bir belə naçar vəqtdə xaliqi-kövnü məkan,
Qüdrətini zahir etdi aləm içrə nagəhan,
Qirvandan zahir oldu bir müdəbbir pəhlivan,
Samü Zala baxma sən, bu Rüstəmi-dastana bax!

Eyləyib məğribzəminə neyyəri-ə'zəm tülu,
Bürci-qeyrətdən Süheyli-ənvərü əkrəm tülu,
Yəni bir Əhməd, Məhəmməd, Mehdiyi-əfxəm tülu,
Aləmi tutmuş ziyası bir məhi-tabana bax!

Böylə derlər kim, deyibdir Mehdiyi-alitəbar,
Yuxuma gəlmiş Məhəmməd Mustafayi-tacdar,
Əmr qıldı: Şər'i-qərranı sən eylə aşikar,
Xidmət et ixlas ilə, dindar ol, imana bax!

Cümlə Afrika çölün tutmuş ol salari-dəlir,
Əhlini ram eyləyib, bi'ət alıb bürnavü pir,
Qətlü qarət etməyə hər biri bir ğərrəndə şir,
Dəstələr, toplar düzülmüş Bərbərə, Sudana bax!

Bax Sühagim şəhrinə, gör necə etmiş tarümar,
Dəbbəni, Diqqarı alıb, etdi Xartuma güzar,
On bir aydan sonra bir gün sübh çün bərqi-bahar,
Özlərin şəhr içrə saldı, qətlə bax, talana bax!

Qətlü qarət eyləyib, öldürdülər sərdarını,
İngilisin qanı tutdu küçəni, bazarını,
Simü zərlə ləşgəri-ə'rab tutdu barını,
Diqqət ilə bir nəzər qıl, nüsrəti-Yəzdana bax!

İngilisin bir neçə salarını öldürdülər,
Paraxodların alıb, malların qismət etdilər,
Tiği-kin ilə o qövmün qanını axıtdılar,
Nilə qərq oldu qaçanlar, ləşgəri-üdvana bax!

Əllərinə saldılar atəşfəşan, topü tüfəng,
Yağdıdılar düşmənin başına odlar bidirəng,
Hər güzərdə, hər tərəfdə etdilər mərdanə cəng.
Leş-leş üstə tökdülər, axıtdılar al qana bax!

Ləşgəri-ə'rab hər bir yerdə tiplər bağladı,
Gecə-gündüz Nilin ətrafını yaxşı saxladı,

Tupi-atəşbar ilə düşmənləri pardaxladı,
Əhli-əşrarı qanından bir axan ümmana bax!

Bu vəqaye Londonun əhlinə saldı iztirab,
Parlamentin düşdü sancı qarnına, odlu kabab,
Gah təsdiq etdilər, bu qissəni, gahi də xab,
Ləşgəri ə'rabdən lərzan olan Ləndana bax!

Böylədir, məğlub olur, hər kimsə məğrur olsa gər,
Kibrdən çox padşəhlər dövləti tutmuş şərər,
Bir qarıncanın əlində aciz olmuş şiri-nər,
Davərin dadını gör, dad eylə, bir divana bax!

Ləşgəriylə Mehdi qalsın dəhr içində payidar,
Şərri-ə'dadan onu hifz evləsin pərvərdigar,
Demə Əflatun ona, Bismarkdan tərcihi var,
Asiyada yox hərifi, mərddir, meydana bax!

Osman adlı bir sipəhsaları var, mərdi-dəlir,
Səddi-İsgəndərdi, Ruintəndi, bir ğərrəndə şir,
Sam, şiri-Övjəndi, ya Bijəndi, ya Qudərzi-pir,
Qan tökən, tiplər sökən, düşmən fikən bəbrana bax!

Bu vəqaye'dən sonra ol Mehdiyi-aligühər,
Əzmini cəzm eyləyib ta düşmənə ursun şərər,
Misri alıb, eyləsin düşmənləri zirü zəbər,
Hiylələr nabud edən ol qadiri-sübhana bax!

Budu fikri ta ki, versin şər'i-qərraya rəvac,
Səbt versin məzhəbə, din əhlinə etsin əlac,
Ali-Osman ilə qardaş oluban, versin xərac,
Pəhləvani-kamranı qıldığı bünyana bax!

Öylə ki, Misri təsərrüf eylədi ol pəhləvan,
Ləşkəri-ə'da olurlar azimi-Hindusitan,
Nüsrəti-Yəzdan ilə aram olur islamiyan,
Misr şahı tutduğu kirdara bax, nöqsana bax!

İltifat etsə əgər bu Mehdiyə sahibzaman,
Aləmi təsxir eylər, cümləsini bigüman,
Hifz qıl bir böylə şəxsi, ey xudavəndi-cahan,
Cümlə afatü bəladan da'iyi-nalana bax!

Mehdinin mədhini, Nəvvab, etgilən sən intişar,
Qıl dua, ta ömrünü mümtədd qılsın girdigar.
Şə'nini, əclalını gün-gündən etsin aşikar,
Qeyrət et, bir baş verən, candan keçən mərdana bax!

## 1300-CÜ İLDƏ (1882-83) İRAN ƏSGƏRLƏRİNƏ YAZILIB, 23 ŞƏVVAL ƏL-MÜKƏRRƏM, 1309-da (21 may, 1892) TƏZKİRƏYƏ QEYD OLUNDU

Ey müsəlman yığıncağı, ey sultan köməkçiləri,
Dinin sultanı bütün İran əhlindən razılıq etsin.

Ey şir ürəkli cavanlar, ey şücaət mə'dəni,
Ürəkdən nərə çəkin, nərə çəkən şir təki.

Gərək öz şücaətli əlinizi qana bulayasınız,
O qan nə qan olsun? O qan düşmən qəlbinin qanı!

Gah şücaətlisən, gah da möhkəm,
Ey igid aslan, ey dövranın şücaətlisi.

Qarğa-quzğun şahin kimi qan tökə bilməz,
Gərək qızılquşun caynağı həmişə qanlı olsun.

Simurq meydanında qarışqa və milçək nə edə bilər?
Tülkü ürəklilər şir kişilərin döyüşünə necə dözə bilər?

Allahın əmridir: "Cihad yolunda",
Yəni, "ey cahidlər, volumda cihad edin."

Cihad vaxtıdır, dəniz kimi gərək coşasınız,
İgidlik vaxtıdır, ey igidlər, tələsin.

Əlində kin-kudurət qılıncı olanın alnı qırış-qırış olmalıdır,
İgidlərin döyüşü belə olmalıdır.

Aslan təki çalışın, (düşmən) dəstələrini dağıdın.
Bahar vaxtının ildırımı kimi gərək "ura" qışqırasınız.

Şər qüvvələr qan dənizində qərq olsun gərək,
İlan və qarışqa sürüsü özünü dağ selində zəif hiss edən təki
hiss etsinlər.

Atəş yağdıran toplarla düşmən dəstələrini biri-birinə qarışdırın,
Ey əjdaha simalı, atəş qüvvətli cavanlar.

Düşmənlərin canına bu gun gərək,
Bahar vaxtı çaxan ildırım kimi atəş vuraq.

Bu gün dava günüdür, ya namus, ya da biabırçılıq günü,
Gərək düşmən dəstələrini sıxışdıraq.

Ləşgərin cinahının ürəyini dağıdın,
Topların odlu atəşi ilə, yağış kimi yağan güllə ilə.

Bu gün sidq libası geyməyən şəxs,
Əlbəttə ki, matəm əbası geyinər.

Düşmənlərə zərbə (cəng) vuran hər şir ürəkli,
Şan-şöhrət günəşindən nişan aldı.

Qoşun başçıları gərək öz kəskin qılınclarını
Nərə çəkən şir təki düşmən qanına bulasınlar.

Ki, şaha yaxınlıq və ay kimi tac tapsın.
Başlarına izzət papağı, əyinlərinə əsilzadə paltarı tapsınlar.

Hər kəs ki, öz çövkanında düşmən başı gətirdi,
Yəqin ki, o kəs fələyin kuyunu öz çövkanına gətirdi.

Çün şan-şöhrət günəşi qələbədən doğdu,
Müsəlmanların iqbalı Keyvana – Saturna ucaldı.

Nəvvab həmişə özünə deyir ki, kaş,
Din yolunda öz qanıma qəltan olaydım.

**Bir neçə il bundan əvvəl Bakı şəhərində Həsən bəy Zərdabi öz qəzetində ki, adı "Əkinçi" idi, təziyədarlığı, yəni "ağ köynək" olmağı tənqid və məzəmmət etmişdi və əlavə, əmi qızını almağı pisləmişdi. Əvvəl mən ona nəsihət verib, məzəmmətlədimsə, qəbul etmədi... (ardı yazılmayıb).**

**Vər. 333a**

## SAVAB YOLUNDAN DÖNÜB, DİNDƏ YENİLİK YARADAN ZAHİDLƏR BARƏSİNDƏ NƏVVABIN BƏHRAM BƏY FƏDAİYƏ YAZDIĞI MƏKTUB (28 cəmadiyəl-əvvəl, 1310 – 18 dekabr, 1892)

Fədaican, nədir munca kəşakəş?
Bu vaizdir bir-birinə al edər,
Bəxil olur insan əgər bir saat,
Amma bu zahidlər mahü sal edər.

Aralıqda itib hökmi-şəriət,
Xahişlərin eyləyirlər təriqət,
Bi'dət salıb, oxuyurlar həqiqət,
Bu bid'əti zərbəft edər, şal edər.

Din rövnəqi pozulubdur bulardan,
Müşəxxəsdir, mübəyyəndir kəmakan,
O işlər ki, bular tutur bigüman,
Nə aqillər eylər, nə cühhal edər.

Hər həftədə birisi baş qalxızır,
“Ənəlhəq”lər deyib, bar-bar bağırır,
Avamları öz dininə çağırır,
Əlif qəddin şəriətin dal edər.

Bular salır aləmlərə qovğanı,
Təşrih edib, dağıdırlar dünyanı,
Pəst edərlər şəriəti-ğərranı,
Bu əf'alı, inanma, dəccal edər.

Bir-birinə büxl edərlər aşikar,
Müsəlmanı bir-birinə qırdırar,
Halva yeyib, bədöv atlar tək qızar,
Dizə çöküb “qalə və mən qal" edər.

Cilvələnib bəzmdə gərdən çəkir,
Müridlərin görən vəqtdə tellənir,
“Bura buyur, ağa”, deyib səslənir,
Olmayana dillərini lal edər.

Nəfsi-əmmarəyə olublar əsir,
Halva, dolma, pilovadır dəstgir,
Tox olanda çalar nəfirü səfir,
Ac olanda cəmdəyin kəssal edər.

Bular salar aləmə qovğa səsi,
Bir-birinə qarışdırı hər kəsi,
Aralıqda sınar kasıb nəstəsi,
Od yandırıb aləmi tonqal edər.

Yaxşı işə nə lazım çəkmək pərdə?
Əcəb məratib var bu pak dərdə,

Əla münasiblər olur bu yerdə,
Birin nəbbaş, birisin qəssal edər.

Müridlərin hər biri fəal olur,
Üçü, dördü dörd yüzə dəllal olur.
Biri aşpaz, birisi hammal olur,
Bir neçəsin dərində zəbbal edər.

Aləmi-rəbbani hanı yanına,
Gedib qurban edək canı canına?
Fəda olaq əhdinə, peymanına,
Bular yəqin dəf'i-qilü qal edər.

Nəvvab edər bu qövmdən əlhəzər,
Bu kəslərin kuyinə etməz güzər,
Aləmi-rəbbanini hər dəm gəzər,
Tapsa əgər, fəda canü mal edər.

## BƏHRAM BƏY FƏDAİNİN NƏVVABA CAVABI

### (1310-cu il – 1892)

Yenə nə şikvədir, Nəvvabi-vala,
Mollalardan bizə dalbadal edər?
Hal əhli yox, qıla şərhi-halını,
Bizi hesab edib əhli-hal, edər.

Mollalarda əzəldən var bu sifat,
Onlar adəm ola? Heyhat, heyhat.
Diqqət etsən mənim qövlümə isbat,
Hədisi – "mən qalə və mən qal" * edər.

Mollaların gərdəninə vəbalim,
Bu şəhrdə iman qalırmı salim?
Dürüst baxsan, "iza fəsədül-alim" **
Sənə bu barədə kəşfi-hal edər.

Ələlxüsus bizim filankəszada,
Şəriəti verib bilmərrə bada.
Onun etdikləri düşəndə yada,
Əf'alından adam infial edər.

* Hədislərin əvvəlində gələn sözdür: "O dedi:"
** Məşhur ibarədir: "Alim fəsad törətsə, dünyada da fəsad olar."

Yeridir burada düşsəm haşiyə,
Quzğun kimi təməh edər laşiyə,
Peşmandır adam dalın qaşiyə,
Atəşi-təməhi iştial edər.

Bir mollalar deyil şeytənət kanı,
Heç kəsdə yox müsəlmanlıq nişanı,
Hacıların bilmərrə yox imanı,
Əba-qəba ilə xəlqə al edər.

Övladını görsən molla Nəbinin,
Qövlün inkar edər şər'i-mübinin,
Heç zad üçün satar dünyaya dinin,
Nəfsi əqlin örtüb onu zal edər.

Bəylərimiz olub şürbi-müdama,
Təşxis verən yoxdur halal-harama,
Düşsə yolun hansı məclisi-ama,
Görərsən ki, qumarı işğal edər.

Əhli-bazara yox bilmərrə vüsuq,
Şüğlü karları fücurü füsuq,
"Kəlbəl-yəhud əfzəl min əhləl-suq",*
Sizə bu nüktəni istidlal edər.

## HAFİZ ŞİRAZİNİN ŞEİRİNİ DÖRDLÜK – MÜRƏBBE ŞƏKLİNDƏ TƏZMİN ETMƏK

Ey könül, bu fırıldaq xirqəsini nə vaxtadək geyinək,
Nə vaxtadək quşlar kimi hər il tük tökək?
Gəl gül saçaq, badəyə mey dolduraq,
Fələyin səqfini yaraq, başqa yol tapaq.

Taledən bizə bilirsənmi, ancaq dərd və bəla yağır,
Heykəlimizin (bədənimizin,vücudumuzun) tozunu.
fələk qəlbirlədi (ələklədi),
Əgər qəm aşiqlərin qanını tökməyə ləşgər çəksə,
Mən və saqi birləşib onu yıxarıq.

Bülbüli-şeyda kimi qaranlıq gecədə durub,
Nalə və fəqana başlayıb, heç nə ilə döyüşməyək.
Qırmızı şərabı gülab kimi qədəhə töküb,
Ətir gətirən şəkər nəsimi kimi qəndilə tökək.

---

* İbarədir: "Yəhudun iti bazar əhlindən üstündür".

Dün gecə bir şənlikdə rindlər deyirdi ki,
Ney və çəngdən başqa şadlıq məclisində yaxşı şey yoxdur,
Mütrüb, nə qədər ki, əlində yaxşı rud var, nəğmə çal ki,
Biz də qəzəl oxuyub, rəqs edək.

Dost məhləsində (kuyində) başını qapıya (top) kimi düz sal,
Sonsuz eşq dənizinə başını hübab kimi sal.
Ey səba, bizim vücudumuzun torpağını o alicənab tərəfə apar,
Ki, ola bilsin, o müqəddəs şəxsiyyət bizə nəzər salsın.

Şeyx, cavan və müfti təqvadan laf (dəm) vururlar.
Zahid və abid danışığından sinəyə zəhər saçılır.
Biri ağıldan dəm vurur, biri boş sözlər danışır,
Gəl hökmü hakimlərin öhdəsinə verək.

Abid və zahidə mərdanə sözlərlə belə de ki,
Nə vaxta qədər bayquş kimi özünü xarabalığa verəcəksən?
Cənnət istəyirsənsə, bizimlə meyxanəyə gəl,
Ki, kuzənin kənarından səni birbaşa kövsər hovuzuna salaq.

Nəvvab əgər Şuşada şeir deməyə başlayıbsa,
O, xacə (Hafiz) ilə həmraz olmaq istəyir.
Söz anlamağı və xoş oxumağı Şirazda bacarmırlar,
Di gəl, Hafiz, özümüzü başqa yerə salaq.

## HƏQİQİ DOSTLARDAN BİRİ ÜÇÜN

**(1310-cu ilin baharında – 1893-ün yazı)**

Neyləyim, oldu bahar, amma baharım gəlmədi,
Gül açıldı gülşən içrə, gülüzarım gəlmədi.

Qönçə tək qan oldu bağrım hicri-ruyində, nedim?
Lalə tək dağlandı sinəm, laləzarım gəlmədi.

Dağü bağa seyrə çıxmış cümlə ahuçeşmlər,
Rəm idi, yaran, nədən ahu tatarım gəlmədi?

Vədə verdi, sındıdı əhdini, oldu bivəfa,
Ərşi-ə'laya dayandı ahü zarım gəlmədi.

Bülbüli-şeyda kimi naləm tutubdur aləmi,
Sərvqədli məhcəbinim, nazlı yarım gəlmədi.

Müntəzir Nəvvabı qoymuş, leyk özü məstan gəzər,
Gözlərim yolda qoyub, çeşmi-xumarım gəlmədi.

* * *

Rəqiblər bina gər etsə zülmü qəsdi-həlak,
Sənin ki, lütfin ola etmənəm olardan bak.

Yüzindi qibləgəhim, xaki-dərgəhin Kə’bəm,
Dilimdə virdi-zəbanımdı nə’budü əyyak.

Olubdu nəqşi-rüxün qəlbim içrə çün mir’at,
Könüldə yoxdu dəxi ğeyrin səvak-səvak.

Gecə-gündüz çəkərəm eylə nalə hicrində,
Təzəlzül eyləyə ta mahü-mehrünə əflak.

Səba yetürməyə Nəvvabə ətri-rüxsarin,
Həzar canı ola, vardı cümlə bimi-həlak.

## ƏMMAMƏNİN VƏSFİ

Bilməyirəm, ey ağa, ey pak çalma (əmmamə),
Üzərindəki bu işıqlar hansı nurdandır.

Bəlkə sapını cənnət bağından,
Mələk çıxarmış və səni tanıtmışdır?

Bəlkə (məgər) sənin hər telini gözəllərin saçından,
Və ya usta zərgərlər zərdən toxumuşlar?

Sənin adın şərəfli, özün şərifsən,
O şəxs ki, səni başına qoydu, daha da şərəfli oldu.

Səni hər kəs ki, sarıb başına qoydu,
Elmdə və fəzldə adı bəlləndi.

Hər kəs ki, sənin sarğını gördü, müştaq oldu,
Can və dildən, dindən xiridarın oldu.

Səni hər kəs ki, başına qoydu,
Bütün sirlərə vaqif oldu.

Nə fələk şalını sənin təkin toxuyur,
Nə ulduzlar həmayili sənin tək olur.

Səni əgər təmbur başına qoysa,
Onu hamı axund tütək çağırar.

Səni gər qarğa öz başına qoysa,
Onu qaniçən şahinə oxşadarlar.

Dünya əhlinin sən eyblərinə pərdəsən,
Əgər sinədən zünnar assalar da.

O kamil şey ki, vücudundan,
Xalvar-xalvar xeyir gələr, sənsən.

Müridlər səf çəkib, sıraya durmuş,
Böyük qaniçən ordu kimi.

Sən taxt və tacsız şahənşahsan ki,
Müsəlman və kafirlərdən bac alırsan.

Sənin fərmanının hər yerdə nüfuzu vardır,
Rumluya, rusa, hindliyə, türkə, tatara.

Ərəstu və Əflatun kimi alimlərin elmi,
Səninlə müqayisədə saman çöpü qədər dəyərsizdir.

Sənin mə'nasız sözlərin belə mirvari kimidir,
Sənin idrakın qarşısında cümlə əş'ar boş sözlərdir.

Heyif ki, Nəvvabın əli boşdur,
Əmmaməni bu cür tərif etməkdən.

## SƏYYAH LƏQƏBLİ MOLLA MƏHƏMMƏD SALEH XORASANİ TƏRƏFİNDƏN MİR MÖHSÜN AĞANIN (NƏVVABIN) MƏDHİ

Ey könül, gəl biz hümmət edək,
Bircə dəfə bütün dünyaya ayaq basaq.

Həmişə ortada olmaq çağırışına qulaq asaq,
Yəni, qorxu və rica vadisinə qədəm basaq.

Təcrid məsləkinə mərdanə ayaq qoyaq,
Sonra əlimizi hərislik və istək sinəsinə basaq.

Allahın qəribə fəqr camından mey içək,
Fəqr və fəna yolunda məstanə kam alaq.

Kim aza qane olursa, əziz tutulur, tamahkar zəlil olur,
Biz də gərək bu iki yoldan düzünü seçək.

Özümüzü yarım zərrə ilə qənaətləndirək,
O dəm dövlətdən dövlətlilərə dəm vuraq.

Məhrumiyyət küncündə izzət üçün yer açaq,
Yemək qapısını bağlayıb, ona "yox" qıfılı vuraq.

Yarım çörək üçün ki, onunla aclığa sədd çəkə bilərik,
(aclığı dəf edə bilərik),
Yüz dəfə niyə alçaq adamların qapısını döyək?

Məhşər günündə Allah qarşısında üzümüz qara olmaz,
Aldadıcı nəfsin üzünə əgər sillə vursaq.

Ey könül, xoşbəxt (qüdrətli) Nəvvabın xidmətinə get,
Sidq ilə ali-əba qapısını döyə bilək.

Bu dünyada özü mir (seyid), rəhbər, səxavətli və fazildir,
Onun pak dərgahından başqa nə üçün ayrı bir qapını döyək?!

Şuşa şəhərində ona tay yoxdur,
Yaxşı olar ki, onu açıqcasına mədh edək.

Rəhbərin mədhinə əgər gecə-gündüz çalışsaq,
Onda öz dövlətimizdən dövlətlilərə dəm vurarıq

Onunla yaxınlıq səadət kimyası kimidir,
Bu kimyaya da ağıl və huş ilə əl vurmaq lazımdır.

Musayi-Kazım bizim pərəstiş etdiyimizdir,
Cəbrayıl kimi onun səfalı üzündən öpək.

Bilirəm ki, qəriblərin dərmanı onun əlindədir,
Lazımdır şəfa evinin qapısını döyək.

Sənin cəddin çıraqların şahı, sən isə məş'əlsən,
Bu nurdan riza (razılıq) meydanına məş'əl vuraq.

Şuşa şəhrində ürəyimin şüşəsini sındırırlar,
Şadlıq dəmi olar, əgər razılıq mülkündə xiymə quraq.

Onunla qonşuluq neməti bizə nəsib olduğuna görə,
Biz onun bizə yaxın olmasını səsləyək.

Ey könül, gəl səyyah hümmətli Saleh kimi,
Riza diyarı ola Kə'bə səfasından kam alaq.

Əfsus ki, o diyardan uzaq düşdüm,
Rus mülkündə səba bülbülü tək nalə çəkdim.

Sudan ayrı düşmüş balıq kimiyəm, lakin,
Əbədi yaşamaq üçün o biri dünyaya baş vuraq.

Ey Səyyah, elə fikir etmə ki, sənin dərdinə dərman tapılar,
Məhşər gününə qədər bu macəradan danışsan da.

Qalx və Nəvvabın xidmətinə get,
Məhşər günündək səfa ilə onu mədh et!

Sənin taclı əcdadın ehtiyaclıların qapısıdır,
Ehtiyacımızı sən ödəyə bilərsən, səndən başqa daha kimin yanına gedək?

Bütün qapıları üzümə bağlamışlar, qapını açan tək sənsən,
Hər yerdə ki, istər savab, istərsə də xəta danışmışam.

Sənin düşmənlərinə ruzigarda lənət olsun,
Hər dəm min dəfə açıq-aydın lənət oxuyaq.

Əgər müqəddəs yerə şadlıqla çatsam,
Kəklik kimi yüz nəva ilə qəhqəhə çəkərəm.

Əgər əlim onun müqəddəs məqamına çatsa,
Sənin tərəfindən də Rza (imam) qıfılına əl vuraram.

## MİRZƏ ƏLİ ƏSGƏR NÖVRƏS TƏRƏFİNDƏN NƏVVABIN MƏDHİ (1311-ci il – 1892-93)

Ey Nəvvab, müəzzəm seyid,
Sənə həqiqət nuru verilmişdir.
Sən incə nəfsli bir şəxssən ki,
Ürək ondan səfalanıb, zövq də açılır.

Sənsən yüz-yüz üçlük və dördlüklərin ustadı,
Hər təşkilatın tərəflərinin bilicisisən.

Xilqətin gözəl günündə doğulmuşsan,
Fələkin zici (cədvəli) səndən yaranıb.

Vücudun dualar məcmuəsidir,
Dünya əhlinin şəfası səndədir.

Sən Söhbandan daha bəlağətlisən,
Kəlamın isə "Mü'cəm tarixi"dir.

Lakin, əfsus ki, "Xamuşan" evində,
Səni başa düşən həmdəm zahir olmadı.

Xan Qarabağidən başqa,
Öz əhdində möhkəm heç kəs yoxdur.

Növrəsi qəm hasarı sözsüz əhatə etmişdir,
Ürəyi gah zil və gah bəmlə şura gəlir.

## SƏYYAH SALEH XORASANİ TƏZƏ MƏSCİDİN AÇILIŞI MÜNASİBƏTİLƏ DEMİŞDİR (1310-cu il – 1892-93)

Bu məscid və minarə cah-cəlalla tamam oldu,
Mələklərin və xalqın heyrətli nəzərinə səbəb oldu.

Bu behişt ayinli məscidin banisi,
Pənah xan nəslindən olan xoşbəxt Gövhər ağadır.

Zamanın fəxri və dünyanın böyüyü,
Ağ və qaranın göstəricisi peyğəmbər nəslindən olan.

Seyidlər sülaləsindən olan ali və şövkətli,
Uca və pak Mirzadə Nəvvabı vəkil etdi.

Cənab Mir Möhsün elə ki Şuşa şəhərində,
Məscidi tamam etdi, bu məscidi Allah qəbul etdi.

Bir nəfər şəxs Səyyaha tarixini dedi:
Get Allaha itaət et və başqasından heç nə istəmə!

Qeybdən gələn uca səs dedi ki, ey müəzzin,
Azan oxu: "Əşhədü ən la ilahə illallah". (1310 h. – 1892-93 m.)

**Vər. 339**

## FATMA XANIM KƏMİNƏNİN NƏVVABDAN XAHİŞİ

### (1311-ci il, 20 rəbiüs-sani – 1893-cü il, 31 oktyabr)

Ey Mir və pakrəftar Nəvvab,
Rəhbər, şərəfli, bilikli və dindarsan.

Sən alimlərin qürur tacısan,
Sən ariflər üçün günəş işığısan.

Fələyin zici səndən munəzzəm olmuşdur,
Şeir gülzarı səndən zinətlənibdir.

Sənin İsa nəfəsindən,
Cümlə müsəlman və kafir feyz alır.

("Məclisi-)Xamuşan"ın qütb nöqtəsi sənsən,
Şairlər sənin dövrəndə pərgar dairəsi kimidirlər.

Mən istərdim ki. Fənanın olum tarixini,
Mərhəmət edib, bizə xəbər verəsən.

Kəminənin bu cəsarətini bağışla ki,
Əfv etmək müqəddəs əcdadımızın şüarı olmuşdur.

## NƏVVAB HƏQİQƏT BARƏDƏ YAZDI

Vəhidül-əsrsən, ey mahmənzər,
Yüzin şəmsi-münəvvər, zülfin ənbər.

Qaşın taqi hilali-mahi-nodur,
Nə dəxli kim, deyirlər yayə bənzər.

Ziyayi-nuri-ruyin cilvə etsə,
Cahan vadiyi-iməndir sərasər.

Dəhanın sirrini hər kimsə bilməz,
Sözün şəkkər, ləbin qəndi-mükərrər.

Qədin tək rövzeyi-rizvan içində,
Nə Tubadır, nə sərv, nə sənubər.

Rüxün səthində aləmlər nümayan,
Necə ayinədə xurşidi-ənvər.

Nolur Nəvvabə gər etsən təcəlli,
O nuri-ruy ilə, ey şəmsi-əzhər.

## NƏVVAB ÖZ KƏDƏRLİ VƏZİYYƏTİ HAQQINDA DEMİŞDİR

Bir gün fikir dəryasında idim,
Qəlbim qəddar fələyin əlindən hüzn və ələmlə dolu idi.

Bülbüllər təki bağa getdim ki,
Qəmdən biraz yüngülləşim.

Güllər içərisində oturub çay içdim,
Qarşımda ay üzlü bir sərv vardı.

Gah gülə baxırdım, gah gülüzlüyə,
Gah qönçəyə, gah dilbər dodaqlara.

Gülü dərib, üzünə tutdum,
Yüz həmd ilə təbarük oxudum.

Gah gülü qoxuladım, gah gül camalını,
Arzu ağacım bar gətirdi.

Gül, gülüzlü və yeni açılmış qönçə,
Ürəyimi dərd və qüssədən azad etdi.

O dəm çox təəssüflər etdim,
Fikir dəryasında qərq oldum.

Öz dediyimdən peşiman oldum,
Niyə mən bu cür şeirləri yazdım?

Nə gül qalacaq, nə Nəvvab, nə də ki, gülüzlü,
Bu gülzar üzərində nə hasil olar?!

* * *

Bir gün kədərli halda bağa girdim,
Bəlkə ürək ağrısı bir az azala.

Şəqayiqləri gördüm sərxoş, gülümsər,
Qızıl gülün öz sifətini açıq və qıpqırmızı.

Bənövşə aşiqin eşqi ilə heyran olmuş,
Sənubər və sərvin ürəyi qəm ilə boşalmış.

Budaqlarda qönçələr gülümsəyib,
Bülbüllər meyvələrdən nalə salıb.

Mən biçarə, nigarın eşqindən,
Başımı dizlərimə söykəyib, gözləri yaş halda oturdum.

Gah bülbül nalə etdi, gah mən,
Mən gülüzlülər xatirinə, o, təzə gül xatirinə.

Mənim ürəyim və canım hicran odu ilə doludur,
O da Səməndər quşu kimi atəşlə doludur.

Ud və məcmər kimi eşqin oduna,
Hər ikimiz beləcə qiyamətə qədər yanarıq.

Mən alçaq rəqiblərin qorxusundan,
O da zülmkar tikanın yarasından,

O, öz yuvasında nalə edir,
Mən yazıq da gecə-gündüz yataqda.

Bülbül gül xatirinə özündən gedibsə,
Nəvvab ətirli zülfdən bihuş olub.

## BU QOŞMA DOSTLARDAN BİRİNİN XAHİŞİ İLƏ YAZILIB

Saət, səni qəsəm verrəm Xudaya,
Hali-zarım yara sən et nümayan.
Söylə, səndən ayrı düşəndən bəri,
Dərdü qəmim həddən olub firavan.

Yar qoynuna girəndə acizana,
Ərz etgilən dərdimi yana-yana.
Ayırdı çün məni səndən zamana,
Pərvanə tək yanar sənsiz cismü-can.

Çıxartma sən yaddan bu binəvanı,
Fəraqında ərşə çıxıb fəğanı,
Yetir, saat, yara salam-duanı,
Nə bir dua, bəlkə həddən bipavan.

Gecə-gündüz halım olubdur xarab.
Saət kimi qəlbim edər iztirab,
Nə təndə aramım, nə didəmdə xab,
Müntəzirəm vüsalına hər zaman.

Əğyarlar işini sən sayma nuş,
Rəqiblər sözlərini etmə guş,
Nəvvabını etməgilən fəramuş,
Odur sənə öz canından mehriban.

**Vər. 341a**

**Təzə məhəllə əhalisinin Qasım otağını və sair məhəllələri zorla tutması (hicri 1310-cu il – m. 1892-93 tarixində) və bu kədərli hadisənin "Kənzül-Mihən" əsərində yazdığım kimi, Nəvvaba etdiyi ağır təsir.**

Sən ey insanların və dostların ən yaxşısı,*
Həm xüsusi, həm ümumi şeylərdən agah olan!

Kərəm xatirinə bir gün baxın,
Bu qəmli hadisəyə qulaq asın.

Min üç yüz onuncu il tarixində,
İnadlı tayfanın zülmü aşkar oldu.

Bu vaxtadək heç kəs belə şey görməmişdi,
Simurğ quşunu milçəyə döndərdilər.

Təzə məhəllə əhalisinin mənə etdiyi,
Bu zülm və kin məgər rəvadırmı?

Bir nəfərin onları qızışdırması ilə,
Bütün dünyanı yandırdılar.

Özlərini müsəlman hesab edirlər,
Məzhəbdə özlərini tərifləyirlər.

* Məhəmməd peyğəmbərə (S.) işarədir

İblis kimi məni aldatdılar,
Böyüklü-kiçikli and içdilər.

Öz vədlərində yalançı çıxdılar,
Yalanları ilə ürəyimə yara vurdular.

Qara ürəklərində “Allah-Allah” deyirlər,
Allahın adından varlanmaq üçün istifadə edirlər.

Sinəmə atəş şöləsi vurur,
Alçaq ruzgarın əlindən nalə edirəm.

Bədənim əsir, rəngim saralır, gözümdən yaş tökülür,
Bu zülmdən, bu əziyyətdən gecə-gündüz.

Səbrimin libasın deşik-deşik edirəm,
Kədərdən başıma kül səpirəm.

Üzümü yerə, torpağa sürtürəm,
Deyirəm ki, ey hər şeyi görən Allah.

Onların yurdunu dağıt,
Onların qara ürəyini odda yandır.

Onların qəlbini cəhənnəm odunda yandır,
Layiqli bəndənin ürəyini işıqlandır.

* * *

Ey Allah, peyğəmbər xatirinə,
Onların üzü gülməsin.

Mənə elə zülm rəva gördülər ki,
Sanki Murtuzanın* haqqına qəsb etdilər.

Haqqımı zülmlə zorla əlimdən aldılar,
Zəhraya olan zülm kimi.

O adamlar ki, mənimlə dost idilər,
Sanki iki cüt badam içi kimi idik.

* Murtuza – İmam Əlinin epitetidir.

Şirin sözlərlə onlar mənə hiylə gəldilər,
Mənim varlığımı pozdular.

Mənə hiylə gələrək, əfsunladılar ki,
Sizin haqqınızı heç vaxt gizlətmək olmaz.

Özünü danladı, and içdi,
Ancaq sonra öz əhdinin hamısını dağıtdı.

Mənə elə zülmlər etdilər ki,
Baş verən hadisələr bütün dünyaya bir dərd oldu.

Əbu Musa Əş'əri misalı kimi,
Məni aldatdılar  ki, haqqımı əlimdən aldılar.

Elə ki, hamısı səvab yolundan kənara çıxdılar,
Ürəyimi iztirablarla doldurdular.

Mən indi sonsuz hüzn və qəm içərisində,
Amansız zülm əlindən nalə edirəm, ey pərvərdigar.

Ya Rəb, onların qəlbini atəşdə yandır,
Layiqli bəndənin ürəyini işıqlandır.

* * *

Onlar bilmirlər ki, yazıq Nəvvab,
Nalə edər və bahar bülbülü tək göz yaşını axıdar.

Allaha onlardan şikayət edər,
Onlar haqqında dünyada qalacaq bir dastan yaradar.

Bundan sonra həyatda deyərlər:
Bu zülm onlardan yadigar qalmışdır.

Onlara hər bir kəs nifrət edər,
Zalımlar daim nifrətə layiqdir.

Onlardan bir dastan yaratdım ki,
Axar su da onu məhv edə bilməz.

Gələcək nəsillər də onu qiyamətə qədər oxuyacaqlar,
Onlara həmişə nifrət edəcəklər.

Əgər sabah mən vəfat etsəm,
Pak Allaha şikayət aparıram.

O qeyrətsiz və dinsiz tayfanın əlindən,
Ədalət yaradanın rəhmi üçün nalə edərəm.

Ki, ey cah-cəlallı və qədim Allah,
Onlara elə bir əzab ver ki.

Hər iki dünyada zərər çəksinlər,
Onların dərd və bəlasından görənlər ibrət alsınlar.

Ey kəramət işlərinin hakimi,
Nəvvabın qələbəsi üçün kərəm xatirinə yol aç!

Çünki səndən başqa hər iki dünyada,
Onun dadına çatan, fəryadına yetən başqa birisi yoxdur.

Onların qəlbini cəhənnəm odunda yandır,
Layiqli bəndənin ürəyini işıqlandır.

* * *

Hər ləhzə qanım cuşa gəlir (qaynayır),
Ürəyim daralır, sinəm hiddətlə dolur.

Hər aydın gün, qaranlıq gecə,
İki qulağım, iki gözüm intizardadır.

Ki, nə vaxt dünya hakimlərinin hakimi,
Bu zalımlara cəza verəcəkdir?

Ki, bütün dünyada görənlərə ibrət olsun,
Qiyamət günü cəhənnəmin yeddinci qatındakılara ibrət olsun.

Onların qəbri cəhənnəm odu üçün istifadə olunacaq,
Ruhları cəhənnəm dustağı olacaqdır.

Ədalət yaradanın ədalətindən qafil deyiləm,
Onun ədalətini daha da artırıram mən.

Onlar ki, məni alçaltdılar, ağlar günə qoydular,
Böyük Allahdan və peyğəmbərdən utanmadılar.

Onların həyatını Allah əzablı edəcək,
Həmişə zəhərli şərab içsinlər.

Biz öz övladlarımıza bundan sonra,
Belə vəsiyyət edəcəyik ki,

Onların Nəvvaba etdikləri bu zülmü və kini,
Heç zaman yaddan çıxarmasınlar.

Onu hər ləhzə və hər zaman,
Bir dəfə yox, həmişə desinlər.

Ey qiyamət gününün adil hakimi,
Onların səvab yolundan üz döndərliklərinə görə,

Qəlblərini cəhənnəm oduna yandır,
Layiqli bəndənin ürəyini işıqlandır.

## NƏVVABIN TƏŞƏKKÜRÜ

Allaha şükür ki, o dörd nəfərin hər biri,
Allahın qəzəbinə düçar oldular.

Onlardan ancaq biri qalıb və bu səbəbdən,
Ürəyimdə yüz min əzab vardır.

Allahdan ümidim budur ki,
O da öz layiqli cəzasına çatsın.

## 17 YAŞINDA İKƏN DÜNYANIN VƏFASIZLIĞI BARƏDƏ DEYİLMİŞ TƏZMİNİ-MÜƏŞŞƏR (ONLUQ TƏZMİN)

Həmdi-bihədd sənə, ey dadgəri-hər dü səra,
Sanei-ləmyəzəlü heyyü qədimü ə’la.
Ki, nə nemətlər edibsən biz nadana əta,
Levk küfran edib kim, oluruq hərzədəra.
Hər zaman teyy edərik bədliklə rahi-xəta,
Rəhnüma eyləgilən lütfünü, ey bari-xuda.
Dəşti-heyrətdə qalıb, söylərəm əz ruyi-səfa,
Hər zaman sidq ilə key dadgəri-yövmi-cəza,
Tövbə, ya Rəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Nitq verdin ki, edim zikri-sifatını əyan,
Əql qədrincə haman qüdrəti-zatını bəyan.

Yol tutum şər'i-nəbini, olam ol raha rəvan,
Şəm' olan raha edim hübbi-Əliyyi-İmran.
On bir oğlilə edim sabiti-dinü iman,
Leyk biçarəyəm əz nəfsi-səgü bədbünyan,
Sən mədəd qıl bu cahan içrə mənə, ey sübhan,
Qoyma dəstgir qalam vadiyi-heyrətdə aman.
Tövbə, ya Rəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməvib etdiklərimə.

Ey diriğa ki, əbəs ömri-əziz oldu fəna,
Keçdi gün bədlik ilə dərdü ğəmü möhnətara.
Heyf, səd heyf, cavanlıq ki, olur badi-həva,
Qocalıq, vay əgər cəng giribana ura.
Bu hal ilə gələ gör kim, səfər üqbayə ola,
Dəst xali, yük ağır, mənzil uzaq, üzü qara.
Zərrəcən yox bir əməl ta duta əl ruzi-cəza,
Sən yetiş dadıma, ey dadgəri-hər dü səra.
Tövbə, ya Rəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Vay o gündən ki, yetə qürqürəyə can ze mühən,
Qövmü qardaş yığılıb, bağlayalar çeşmü dəhən,
Qoyalar taxta kimi taxta üstə quru bədən,
Verələr qüslümü, örtə bədəni-zarı kəfən.
Qoya tabuta məni, şivən edə kudəkü zən,
Ola bir tirə olan cay məni-zarə vətən.
Nə bir imdad edən ola, nə bir dada yetən,
Sən yet imdadıma, ey davəri-zilcudü mənən.
Tövbə, ya Rəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Bu betər halilə oldum da behökmi-Yəzdan,
Nagəhan zahir ola sövlətilən iki cavan.
Deyələr: "Key* əziz ömrünü verən bada, oyan,
Söylə sən rəbbini, peyğəmbərini eylə əyan,
Neylədin dünyada, söylə qəmusun yaxşı, yaman".
Onların heybətindən lal ola dil, titrəşə can.
Bir belə vəqtdə, ey qadirü qəyyumi-cahan,
Yetir imdadıma mövlalarımı, ahü aman,
Tövbə, ya Rəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

* Ki, ey

Gözü yolda olu lal badili-məcruhü fıkar,
Ol xətərnak məkan içrə besəd zariyi-zar,
Yolunu gözlərəm, ey dadrəsi-ruzi-şümar,
Sən özün dadıma yet qəbirdə, ey cəddi-fikar,
Çünki Nəvvab nəvaxandı sizə leylü nahar,
Eşqlə dərdkəşi-hübbi-Əliyyi-kərrar.
Çakərəm dərgahüvə əbdi-dəri-həşt çahar.
Əfv qıl cürmümü, ey heyyü kərimü qəffar,
Tövbə, ya Rəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

## RÜBAİ

Ey yolunun tozu xaqanın başının əfsəri olan,
Pak dərgahının süpürgəçisi qeysər olan.
O yerdə ki, şahənşah hesaba gəlmir,
Nəvvab daha ən alçaq qarışqadan da alçaq olar.

**Vər. 346a**

## AXUND MİRZƏ CƏLAL

**(Rəbiül-əvvəl, 1310 – oktyabr, 1892)**

**Cənab Axund Mirzə Cəlal rəhmətlik Axund Hacı Mirzə Ələkbər oğlu Qarabağ vilayətinin əhalisindəndir. 1277-ci ildə (1860-61) anadan olmuşdur. Hal hazırda 33 yaşı var. Xoşqamət, xoşxasiyyət, xoştəbiət bir cavandır. Özünəməxsus gözəl xasiyyəti var. Qarabağ üləmalarındandır. Kirmanda cənab Hacı Məhəmməd xan bin Hacı Kərim xan bin Zəhirəd-dövlə İbrahim xan Qacarın hüzurunda, təqribən on il elmləri təhsil etmişdir. Onun təxəllüsü Cəlaldır. Bəzən azərbaycanca və farsca şeir yazır, şeirləri pərakəndədir. Divanı yoxdur. Aşağıda yazılmış şeirlər o cənabın təbindəndir. 1310-cu ilin rəbiül-əvvəl ayında öz dəsti-xətti ilə yazmışdır.**

### TƏRKİBBƏND

Xanəndə, eşq hədisini ürək oxşar avazla,
Gizli oxu, çünki müddəilər pusquda oturmuşlar.
Saqi, badə üçün saxsı qədəh düzəlt,
Çünki bu odlu suyu şüşə cilvələşdirir.
Pak şəriət üçün gözəl və saqi halaldır,
Ancaq dindar öz həmkarları ilə gərək gizlində otursun.
Ariflərin diqqətli gözləri nə yaxşı seyirçidir:
Salehlərin vəziyyəti eşq hicabından yaxşıdır.
Əgər eşq yolundan və rəsmindən agah olmaq istəyirsənsə,
Xudavəndi-aləmin göndərdiyi“vəhy”ləri nümunə kimi qəbul et.
Gecə bütün canlılar yatanda sən fəal ol,
Elə ki sübh açıldı din müstəğfiri ol.
Pis danışanı etirazlardan uzaqlaşdırmaq olmaz,
Bədxahların ürəyindəki kin pasını çıxarmaq olmaz.
Dünən gecə şən halda eşq məclisinə getdim,
Gördüm ki, məclisin başçısı belə deyir:
“Bilirsən çənglə ud nə deyirlər?
Badəni gizli için ki. dinsiz deməsinlər”.

Ey könül, çəmənin gülməsilə qürrələnmə,
Ki, bu, əhdə vəfasız iş əhlinə məsxərə gətirir.
Hər yaşıl ot cana qətl etmək üçün bir xəncərdir,

Hər laləbədən üçün zəhər piyaləsidir.
Məclisdə biz gülün , lalənin rəngindən oxuyuruq,
Gül isə başqasının kinindən rəngin itirməkdən çəkinmir.
Çayın kənarında bitən nərgiz deyil,
Həsəd gözüdür ki, mənə dikilmişdir.
Bağlı sirri gecə qönçəyə verdim, saxlasın.
Yüz bağlı yarpağı sübh açılıb, onu aləmə faş etdi,
Danışmaqda süsənin yüz cür dili var.
Ürəyinin sirrini yoxlamaq üçün ona kim verər?!
Bahar vaxtı xəlvət guşəsi xoş bir gülşəndir.
Vəhdət vəziyyəti hər torpaq üçün xoş bir haldır.
Əgər eşqdən qulağını bursa aç.
Qapı-bacadan bu sözü eşidəcəksən:
“Bilirsən çənglə ud nə deyirlər?
Badəni gizli iç ki, dinsiz deməsinlər”.

O cəsədlər aləminin quruluşuna bax,
Ki, bu ibrət lövhəsi ariflər üçündür.
Cisimlərin növlərinə bax ki, bir-birindən xüsusi
şəkildə fərqlənirlər,
Bir-birindən nifrət edən şəxslərə bax.
Hər biri öz üsulu ilə başqasını dəf edir,
Hər biri öz vəziyyəti ilə gülünc bir haldadır,
Hər tərəfdən zərər gələcəyinə əmindirlər,
Ona görə də baxışlarında gövhərdən əsər belə yoxdur,
Cismdən və onun əlaqələrindən təmiz olan o həqqin,
Seyr zamanı hər fərdə gör nə yaxınlığı var,
Bəzi yerlər su oldu, bəzi yerlər - atəş və hava,
Fələyin dünyası toz-torpağa döndü.
Bu, həqiqət sirrinin açılmasından başqa bir şey deyil,
Yoxsa heç kəsin cismindən bir şey qalmaz.
Əgər çoxluq içərisində vəhdət əhlisənsə,
Öz halının vəsfini yüz pərdə ilə bildir!
“Bilirsən çənglə ud nə deyirlər?
Badəni gizli için ki, dinsiz deməsinlər”.

Böyük aləmin halının bəyanını eşitdinsə,
Fani dünyada bu sözün də şərhini eşit.
Allah əmri dünyada həmişə bir cür olar,
Gərək hamı onun böyük cəlalından bir-birinə oxşasın,
Çirkli paltara bürünmüş rüknlər,
Aylar, illər içərisində müvafiq ola bilməzlər.

Bu quru tərki-dünyalığın cansız bir əşyası,
O isə min qanadla asimanda dolanar.
Qaçqın tutulmaq istəyər, tutulmuş - xilas olmaq.
Divanəni dustaq et, ağıllıya imkan ver,
Bu iş, ilahi nəfsindən yaranmışdır.

O, zibil yerində xəttü xalı örtmüşdür,
Bəli, gözəllərin xasiyyətləri.
Daima xalq arasındadırlar, ancaq üzləri örtülü,
Yəni müddəiyə sirri faş etmək olmaz.
Çünki xəyal surəti gözün arxasından baxar:
"Bilirsən çənglə ud nə deyirlər?
Badəni gizli için ki, dinsiz deməsinlər".

Allah ayələrini səhifə-səhifə oxudum,
Əbədi işıq cilvəsinin vəziyyətini gördüm.
Həqiqətin xüsusiyyətlərini, zatın təmizliyini anladım,
Ki, dünyada o, öz təcəssümünü ən yaxşı işlərdə tapır.
Əgər öz gözəl üzündən niqabı götürsə,
Sina dağı bütün əzəmətinə baxmayaraq, sədd (maneə) ola bilməz.
O örtülü varlıq xalqa aydın oldu,
Xalqı təkmilləşdirmək üçün Məhəmmədi seçdi.
Ona görə gah rüşeym olur, gah cavan, gah da qoca,
Ki, ariflər ünsiyyət vasitəsilə düzgün yola düşsünlər.
Öz əsil-kökünə görə misli olmayan Allah nuru,
Xalqı işıqlandırmaq üçün əbədi bir bina tikmişdir.
Onu adamlara adam paltarında göndərdi,
Ki, onlar Allaha arxayın olsunlar.
Xalq arasında "Əli" sözünü dilinə gətirmə,
Gah ehtiyacdan danış, gah əbədiyyətdən.
"Bilirsən çənglə ud nə deyirlər?
Badəni gizli için ki, dinsiz deməsinlər".

**Vər. 350b**

## HACI ABBAS AGƏH

**Hacı Abbas rəhmətlik Hacı Məhərrəmin oğlu Qarabağın Şuşa əhalisindəndir, orada da anadan olub, yaşı təqribən 56-57 olar. Karvansara və dükanları var. "Məclisi-üns"ün üzvlərindən biridir. Çox vaxt farsca və azərbaycanca qəzəllər, qəsidələr, tərcibənd, məsnəvilər və s. yazır. Bəzi məsnəviləri mənim "Məclisi-üns"lə sual-cavabım əsasında vazılıb. Ancaq divanı yoxdur, şeirləri pərakəndədir. Təxəllüsü Agəhdir. İşlərində çox ləng və ağır tərpənəndir. Belə ki, kağız göndərmişdim ki, şeirlərindən seçib öz dəsti-xətti ilə bu təzkirəyə köçürsün. Məni bir il məəttəl qoydu. Mən təkrar və təkid eləməkdən yoruldum. Axır əlacsız qalıb aşağıdakı şeirləri yazdım.**

**1310-cu ilin rəbiül-əvvəl ayı (miladi 1892, oktyabr)**

## HACI ABBAS AGƏH

Ey ruhi-rəvan, afəti-can, gözümün bəbəyi,
Ey əhdi pozan, sustvəfa, məhəbbətin bizdən kəsmiş.

Ey sehrli məhvəş, əfsunla apardın,
Ürəyimdən aramımı, başımdan huşumu, gözümdən yuxumu.

Nə üçün pəri kimi ürəkdən, gözdən gizlənmisən?
Ey çöl ahusu, sən kimdən belə hürkmüsən?

Mənim ağ günüm sənin qara saçların kimi olub,
Sərvi-qəddim sənin qaşının tağı kimi əyilib.

Qara saçların altındakı xalın sanki,
Rüxsar gülşənində otlayan  qarğadır.

Sənin camalının dövrəsində qara bir toz vardır,
Ya göyərti var ki, rüxsar gülşənində bitmişdir.

Ürəyimə batan tikanların çoxluğundan,
Kipriklərimdən ciyərimin qanı üzümə damcılayır.

Səninlə görüşmək üçün ürəyimi, dinimi əldən verdim, amma,
Canım boğazıma yığıldı, səninlə görüşə bilmədim.

Ey əhdi sındıran, sənin zülfün arasında Agəh ürəyim
Zülmə mə'ruz qalan adam kimi bir küncə sıxılıb qalıb.

## QƏZƏL

Ey dost, sənin ayrılığından ömrüm qəmli keçsə də,
Dünyanın dərdü qəmindənsə, bu daha yaxşıdır.

Sənin gözəl sifətin ürəyim üçün şadlıq ramzidir,
Sənsiz eyş günləri belə mənim üçün matəm kimi keçir.

Əgər Nuh kimi ömrüm minə çatsa da, bundan nə xeyir?
Ömr odur ki, bir ləhzə olsa da, sənin vəslinlə keçsin.

Əgər sənin üzünü görməklə bir ləhzə şad olsam,
Bütün dünyanın möhnəti başıma yağsa belə, qəm etmərəm.

Dünyada son məqsədim yalnız sənin eşqindir,
Sənsiz könlüm Cəmşid tacından da vaz keçər.

Dərdlinin könlü qəmli-qüssəli olar,
Səhər nəsimi qıvrım saçlardan keçər.

Küyinin torpağı gözlərimə sürmədir,
Heyf, yüz heif ki, gözlərimə az keçər.

Kipriklərinin yarasının ləzzətini bilməz heç vaxt,
Kimin ki, xatirindən məlhəm fikri keçər.

Agəhin gözlərindən qanlı sel axar,
Vüsal gününü xatırlayanda qəlbi pərişan olar.

## QƏZƏL

Mən sənin üzünün eşqindən qəm dəryasına düşmüşəm,
Dərd-qəmindən olan fəryadımı sahilə kim çatdıracaq?

Eşq bəndəsi dinim-ürəyim olan gündən bəri,
Hər iki dünyanın köləlik qəmindən azadam.

Kiprik oxunun qəlbimdə yaratdığı bütün bu fəryad,
Məgər sənə, ey insafsız, çatmırmı?

Hicrinin atəşi məni yandırsa belə,
Vüsala çatmaq ümidilə mən yenə şadam.

Rəqiblər məni kuyindən uzaqlaşdırsalar da,
Zülfünün yadıma saldığı ətrindən şadam.

Sən kimi bir şaha kimin əli çatar?
Bu üzlə sən Şirinsən, mənsə Fərhadam.

Sənin qəminin zülmlərindən kimə şikayət edim?
Müdafiəçim sənsən, ey yar, mənə sən kömək et!

Eşqinin hərarəti tə’nə ilə qəlbimdən çıxmaz,
Əvvəldən ustadım qəlbimi eşq ilə yoğurubdur.

Xalqın danlağından Agəhə nə olsa, nə qəm,
Ki, ürəyimi bir gözəlin eşqinə bağlamışam.

## QƏZƏL

Bir gözəlin hicrindən dərdim, əzabım vardır,
Lalə kimi gül üzündən qəlbimdə köhnə dağım vardır.

Bir ayüzlünün eşqindən qəlbimə od düşübdür,
Qara saçlarının telindən ayağımda zəncir vardır.

Hicrindən gözlərim qanlı yaş ilə dopdoludur,
Gül üzünü görmək istəyəndə ətrafim səmənlə örtülür.

Qəlbim qıvrım saçların əlindən daim narahatdır.
Yazıq heç olmadı aram, bu məhəbbətdən ki, məndə vardır.

İkinci Yusifin hicrindən aramım, yuxum yoxdur mənim.
Yəqub kimi qəlb evimdə qəmlər yurdum vardır.

Qarabəxtəm, qaragünəm bu dünyada o gündən ki,
O saçların zəncirinə vurğun olmuşam.

Çəmən gülzarını seyr etməyə qəlbimdə arzu yoxdur,
Mənim qanlı göz yaşlarından nəstərənlə – ağ qızıl güllə dolu
ətəyim vardır.

Lalə dodağının yadı ilə ürək qanımı içirəm,
Çünki həmişə o şirin ağızdan öpüş arzulayıram.

Agəh dünyada özün bəla burulğanına atdı,
Özüm-özümə etdiyim zülmü heç kəs mənə etmədi.

**Vər. 356b**

## AĞA MƏŞƏDİ NƏSİR QARABAĞİ

**Cənab Məşədi Nəsir bin mərhum Hacı Sadıq bin Hacı Ocaqqulu Qarabağın Şuşa əhalisindəndir. Şuşada da anadan olub. Qırxa yaxın yaşı var. Cavanlığının əvvəllərində ticarət məqsədilə Şiraza təşrif aparmışdılar və oranı bəyəndiyindən evlənib, o şəhərdə sakin oldu. İndi Şirazda kök salıb. Şuşada çoxlu mülkləri var. Buna baxmayaraq, buranı sevmir. Şirazda fars dilini necə ki, lazımdır, öyrənib. Çox ağıllı, xoşagəlim, xoşrəftar və vüqarlı, təmkinli bir cavandır. Mətin şeirlər, duzlu qəzəllər söyləyir. Sonrakı səhifələrdə yazılmış şeirlər o cənabındır, öz dəsti-xətti ilə yazılmışdır. Təxəllüsü Lövhidir.**
**Rəbiül-əvvəl, 1309-cu il – oktyabr, 1891**

### RÜBAİLƏR

Sənətkar adamdan sənəti az etmə,
Əgər az etməsən, sənətə zülm etməzsən.
Tər şeirimi hər gövhərdən üstün tut,
Ayıq ol ki, gövhəri muncuğa qatmayasan.

* * *

**Aşağıdakı rübai Şirazda vətən arzusu ilə yazılıb.**

Nə vaxtadək zamanın qəmindən fikir çəkim,
Nə qədər qəm-qüssə içrə qəlbimi yaralayım?
Qəmdən üzüm təki xümdə qərar tutmuşam,
Ya Rəb, üzüm Şuşanı bir də haçan görəcək?

* * *

Gözlərimdə işıqlı dünya qaranlıqdır,
Qaranlıq olanda gözlərdə də qaranlıq olar.
Belə gözlə necə mən ayıra billəm,
İncə beli, ya da ki, qara teli?

* * *

Ey çərx, çox köhnə, çox qədim, çox da qocasan,
Heç kəsə məlum olmadı ki, sən necəsən.
Məndən bu dünya xalqının halını soruşsan.
Bildiyim söz budur ki, heç nə bilmirəm.

* * *

Dünyada heç kəsdən əsla qorxum yoxdur mənim,
Qorxu olsa, min cür tə’zim olar.
Özgələrin sərvəti qızıl-gümüşdürsə,
Bizim də sərvətimiz razılıq və itaətdir.

* * *

Ürəyin sərvəti qəm olar, qüssə olar,
Bədənə qondarma bəzək qəm olar, qüssə olar.
Allah dağa etibar etdi, gördü ki,
“Mənəm-mənəm" deyir dağ da.

* * *

Dilimdə sənə şükr etməyə taqətim yoxdur,
Kaş çıxaydı canım, taqətim yoxdur.
Ey Allah, nə üzlə əfvimdən söhbət açım?
Hər günahdan utanmaq üçün taqətim yoxdur.

* * *

Sən məndən öyrən ədəb elmini,
Günəşin minnətindən gecənin qaranlığı yaxşıdır.
Heç vaxt alçaq adamdan mətləb istəmə,
Nə dəvə südü istə, nə də ərəbi görmək.

* * *

Ey könül, namərd qapısına getmə,
Yəni toz kimi külək ardınca getmə.
Sənə can versə də bədəsil təbib,
Söz eşit, ölsən də, yanına getmə.

* * *

Saqi, saf şərabı əlindən qoyma,
Bədbəxt sərxoş, mənə minnət qoyma.
Sənin varlığın varlıq üçün lazımdır,
Yəni varkən, ye-iç, qalmağa qoyma.

* * *

Meyxanada bir məst gördüm,
Yoxsulluğuna yüz şükür edirdi.
Deyirdi: Varlığın varlıq üçündür,
Axır ki, yox olacaqsan, neynirsən varlığı?

* * *

Mey içənlər şərabı qorxusuz içərlər,
Qədəhdə qoymazlar mey, axıradək içərlər.
Mey ne'mətdir ki, torpağın ürək sirrin içər,
Tezliklə sənin özünü də torpaq yeyər.

* * *

Bilirsən, bizə bu gərdişi-dövran nə edər?
Hər nə etsə, çox tez edər, cəld edər.
Dəyirman təki dövrəmizdə fırlanar ki,
Bütün üzvümüzü torpaq kimi nərm etsin.

* * *

Saqi, mey və meyxanə istəmirəm ondan,
İki günlük məstlik istəmirəm ondan.
İnsanın tərkibində həm cənnət var, həm də qəm-kədər,
Nə özün, nə qəmxanə istəmirəm ondan.

* * *

Ey çərx, bir an ləngimək olmaz, dövr et,
Dövrandan həmişə aram olmazsan, dövr et.
Kaş ki, birilə ikiüzlülük edəydin,
Bununla nə edim, minüzlüsən, dövr et!

* * *

Dedin al dodaqlarım duzludur, öpməzsən,
Qüssədən duzlu göz yaşımdan dərya yaranıb.
Heç kəs eşitməyib ki, halvada duz var,
Halva kimi şirinsən, həm də çox duzlu.

* * *

Qədəh sənə naz edər, şəkər sənə naz edər,
Gövhər sənə naz edər, zivər sənə naz edər.
Bəzisi səməd deyər, bəzisi büt deyər,
Müsəlman Allaha nazü niyaz edər, kafir sənə.

* * *

Bir büt belə səcdə və itaət etməmiş, ey sənəm,
Sənin itaətindən mən heyrətdəyəm, ey sənəm.
Cənnətin özü, hurinin özü, qılmanın özü sənsən,
Nə zəhmət çəkirsən cənnət üçün, ey sənəm?!

* * *

Saçının ətrindən xoş ətir olmaz,
Üzünün bağından xoş cənnət olmaz.
Deyirsən ki, camalımdan xoşsan,
Deyirəm: Ondan daha xoş, xasiyyətindir.

* * *

Lütf gündoğanından nə vaxt çıxasan, ey can?
Nə qədər mən dözüm ayrılığa, ey can?
Sanki kəhrüba xislətin vardır,
Yaqut dodağın dilrubadır, ey can.

* * *

Əyyub, nə üçün qəlbin daş kimidir?
Sənin susmağının min mənası var.
Sənin əksinə sənə qəlbimdə yer vermişəm,
Qəlbim gözlərin tək dar olsa belə.

**Vər. 358b**

**Yuxarıdakı rübaini Şirazdan əzizi Əyyuba yazıbdır ki, bunun da səbəbi vardır. Biri onun gözlərinin dar olması, biri isə, xəbər-əhval tutmamasıdır.**

## QİTƏLƏR

İncə söz danışan, söz bilən şəxs,
Bilik sahibindən soruşdu bir gün:
Nədir bu dünyada qısa və uca?
Bilik sahibi öz-özünə çəkdi ürəkdən ah.
Ümid tək ucalıq yoxdur, - dedi o,
Hər qısadan daha qısadır ömür.

* * *

Köhnəyə bükülmüş bir gövhər gördüm,
Dedim ki, ona, şan-şöhrətin böyükdür.

Nə üçün özünü bürüyübsən köhnəyə,
Bunun sənə hədsiz ziyanı vardır?

Gülüb cavabımda dedi o gövhər:
Çox ağıllı olanlar qanarlar, əlbət.

Dünyada ən alçaq şey dünya malıdır,
Harda alçaq varsa, orda alçaqsevən var.

* * *

Soruş məndən dünyanın pisini, yaxşısını,
Yaxşısından, pisindən çoxlu dadmışam.

Yaxşısından yaxşı şey anlamamışam,
Pisliyindən pislik də mən görməmişəm.

Çünki mənə görünüb hamısı yuxu kimi,
Ya da ki, əsmişəm soyuq küləklər kimi.

* * *

Ey fələk, sənin bihəyalığından,
Sinəm yaralıdır buğdalar kimi.

Böyüklər papağın baş-ayaq qoyar,
Tac qoyarlar, quyruq bulayarlar.

Harda adam varsa, yoxsulluğu vardır,
Harda gövhər varsa, zəhər də vardır.

Şirlərin qisməri həsir-qamışdır,
Tülkü və sincablarm qismətisə xəz olar.

Harda büllur qədəh olsa, yenə də,
Ehtiyacı daima xümlərə olar.

Bir göz bəbəyi qədər insanlıq eylə,
İnsanlara qarşı az zalımlıq eylə.

* * *

Yerin zəhmət-əzabı özündəndir,
Hər şeyin özüylə özünə nisbəti var.

Lənətlər edirlər ki, varlılar vardır,
Tənələr edirlər ki, yoxsullar vardır.

* * *

Düşmən sənin özününkülər arasındadır,
Bu nəsihət özü də o düşmən üçündür.

Yuxarı tüpürsən, bığdır orda,
Aşağı tüpürsən, saqqaldır orda.

## QƏZƏLLƏR

Ey saqi, hələ qış mövsümüdür,
Xumarlardan gen düşməyin nədəndir?

Bu hərarətli şərab çox xoşagələndir,
Bostanda gül yarpağından da çox xoşagələndir.

Meydən şadlıq-sevinc quşu göylərə uçar,
Harda mey olarsa, gülüstan olar.

Bostanda bülbülün cəh-cəhi olmasa əgər,
Şuşanın səs-küyü bir dastan olar.

Nə qəm, qamışdan bir evim vardır,
Şirin yataq yeri qamışlıq olar.

Zahid bizdən uzaq düşdü, uzaq qaçdı,
Uşağın nifrəti məktəbdən olar.

Yenidən canlanaram iki döşün xətrinə,
Uşağın həyatı döşlərdən olar.

Şuşa Lövhinin hesabına ad-san çıxardı,
Rüstəmsə Sistan diyarından idi.

* * *

Mən ol rindi-xərabati-neşadəm,
Ki, rindani-cəhanə ustadəm.

Mən ol dərvişi-laqeydi-cəhanəm,
Ki, dünyanı ayaq alta salmışam.

Qənaət guşəsi etdim ixtiyar,
Minlərlə şahların mən də rindiyəm.

Nə cami-Cəmdir o, camımdı mənim,
Ki, söylər içdikdə olsun nuşim.

Fənavü fərqimi çapıb soysalar,
Sanaram anadan heç olmamışam.

Bəxtimdir tacü səbri təslim etmək,
Ki, bundan yaxşı tacü təxt istəməm.

Cahanda çün səbati-eyşü qəm yox,
Nə qəmdən qəmli, nə eyşdən şadəm.

Ey çalğıçı, neyə nəfəs ver,
Ki, əcəl həyatımı bada verəcək.

Qocaman ariflər izin vermədi,
Ki, deyilməli sirləri aşkar eyləyəm.

Yoxsa çox sirlərin pərdəsini qaldırardım,
Minlərlə müşkülat həll edərdim.

Sözü, Lövhi, gizlində de,
Ki, hər sözün öz yeri var.

## QƏZƏL

Şəbi-hicranın sənin, cana, yetişdi, heyhat,
Böylə bir qatı qaranlıqda çıxıbdır ol günəş heyhat.

O şahlar ki, dərgahında gədasıydı o nigarın,
Nagəhan bu qapısından çıxdı birdən, heyhat!

O Xosrov ki, əmibdır o ləbi-Şirini,
Onun nəzərinə cilvəgər kimi gələr, heyhat.

Getmə iksir arxasınca, ağlın sənin xoş iksirdir,
O səbəbdən ki, işin özü qızıl-gümüşdən yaranır, heyhat.

Pəndi-piranə, oğul, öz qoca atandan eşit.
Atadan sonra bil, yenə bir ata gələr, heyhat!

Qənimət bil bu gününü, oturma gəl sən qəflətdə,
Kaşandan uçan yenə bir də qayıdar, heyhat!

Lövhiya, xoş nəsihətin gərçi çox dilpəsənddir,
Leyk qanmazların karına gəlməz, heyhat!

## CƏNAB LÖVHİNİN 15 ŞƏVVAL 1309-cu ildə (13 may, 1892) "MƏCLİSİ- ÜNS"LƏ ETDİYİ MÜŞAİRƏ. NÖVRƏS VƏ NƏVVAB DA ONA NƏZİRƏ YAZMIŞLAR

Geniş qəlbim var, xərabat rindiyəm,
Baxmayaraq ki, yerdə qərar tutmuşam, lakin özümü
göylərdə bilirəm.

Gah ay çıxır, gah da dünyanı bəzəyən günəş,
Bu fiqurları kim hərəkət etdirir, mən mat oluram.

Hansı yolla gedirəm Səni (Allahı) axtarıram,
Əgər qareyi-Qur'anam, ya hafizi-Tövratəm.

Ayəni özündən xəbəri olmayan adam üçün oxuyarlar,
Get, ey zahid, dəm vurma, çünki elə özüm ayəyəm.

Qaragözlülərin gözündə yüzlərlə qəmzə yatıb,
Onların cadugərliyi mənim üçün möcüzədən də xoşdur.

Onun qıvrım saçlarını yədi-beyzada gör,
Musanın möcüzəsi bunu dəfələrlə göstəribdir.

Ölüdən üz gizlətməzlər, üzünü örtmə,
Gör ki, hicrindən mən dirikən ölüyə oxşayıram.

Bu göz üzünü görməsə, heç bir qəmi (eybi) yoxdur,
Başqa gözlə səni qəlbimdə güzgü kimi görürəm.

Lövhi behişt yanağına mədh deyər,
Yaxşı duruşun var, duruşuna heyranam.

**Vər. 360b**

## MƏŞƏDİ ƏYYUB BAKİ

**Məşədi Əyyub bin mərhum Hacı Sadıq bin Hacı Ocaqqulu Qarabağın Şuşa əhalisindəndir. Cənab Məşədi Nəsir Lövhinin ən kiçik qardaşıdır. Şuşa şəhərində anadan olub. 25 yaşı var. Zəif bədənli, xoşsurət, saf əhvallı, şən, zarafatcıl, xoşsöhbət bir cavandır. Bütün söz-söhbəti zarafatla doludur, azyaşlı olmasına baxmayaraq, ardıcıl xoş nitqi, mətin və duzlu şeirləri, müxtəlif qəzəlləri var. Təxəllüsü Bakidir. Bizim "Məclisi-fəramuşan"ın üzvülərindən biridir. Aşağıdakı şeirləri öz dəsti-xətti ilə yazmışdır. Rəbiül-əvvəl 1309-cu il – 1891-92**

**(Bakinin öz xətti ilə)**

**Əzizimiz, şuşalı Nəvvab Mir Möhsün Ağamirzadənin xahişi ilə mən-Məşədi Əyyub mərhum Qarabağ taciri Hacı Sadıq oğlu, Baki təxəllüs — dostlarıma vadigar məqsədilə sözlərimi öz dəsti-xəttimlə bu nüsxəyə yazıram. Baxmayaraq ki, bəndəniz öz ömrünü başa vurmaq üzrədir, lazım bilir ki, nə qədər ki, canında su var, alimlərimiz astanasına baş əysin... On yeddi yaşında evlənmişəm. Hal hazırda 25 yaşım vardır.**

**Ərəb torpağından uzaq düşmüşəm, fars küləyinə də məruz qalmamışam. Qorxum yoxdur. Yeddi il Qarabağın beytül-ədəbində (məktəbində) Hacı Məhəmməd bəy Qarabağinin oğlu Mirzə Kərimdən dərs almışam. Yeniyetmə cavan olsam da, həqiqətdə qoxsan yaşlı qoca kimi zəifəm.**
**Öz əhvalımı öz şeirimlə belə söyləyə bilərəm:**

Məhəbbət gülüstanında nə günəş, nə torpaq,
Eşq məhəlləsində nə bulanmış, nə ətəyi təmiz olmaq?!

**Xülasə, şairlik məsələsində də ixtilaf mövcuddur, bəziləri zövqə, bəziləri isə təb'ə malik olmağı üstün tutur. Lakin bu sətirlərin müəllifi deyir ki, zövq və təb'in yuxarıdakı məsələyə dəxli yoxdur. Çünki bütün bəşər övladı zövq və təb'ə malikdirlər, belə olduqda nə üçün hamı şair olmasın?**

**Əgər Allah əta edəndirsə (fıtridirsə), zülm və əziyyətə düçardırlar. Hər kəsin gözü varsa, dərk edib ki, həqiqətən şeirin badəsi məhəbbətdir, belə ki, görkəmli (itaəti vacib olan) şairlər bu həqirin sözünün şahididir. Ah, bisavadlıq!**

**1309-cu il, rəbiüs-sani ayında (noyabr, 1891) Qarabağın məşhur Şuşa qalasında yazıldı.**

## BAKİNİN QƏZƏLİ

Vəsfi (tərifi) müqayisə olunmayan Allaha,
İki yüz şükr və minlərlə təşəkkürüm var.

O Allaha ki, natəmizi təmiz elədi,
Torpaqdan insan yaratdı və yenə torpağa döndərdi.

Bir daha torpaqdan insan varadar,
Bu dünyadan o daha yaxşı dünya qurar.

Əgər gözün varsa, özünə tamaşa elə,
Özünü tanıyan Allahı da tanıyar.

Bizdən Məhəmmədə minlərlə salam olsun,
Onun sayəsində dünya nizama düşmüşdür.

Əgər Məhəmməd olmasaydı,
Heç vaxt bəndə Allaha səcdə etməzdi.

Bəli, bütün yaranmışların baisi odur,
Lakin onun xilqəti deyilməməli sirdir.

Məhəmmədin mövcud olması Allahı tanıtdı,
Məhəmməd olmasaydı, Allahı tanıyan da olmazdı.

Ey təb'im, ayaq saxla, iti getmə,
Bir neçə beyt səkkiz və dörddən söylə.

Yaradılışda bir nurdan 12 nəfər var,
Lakin bir-birlərindən çox uzaqdırlar.

Demirəm ki, Əli Allahın özüdür,
Lakin Allahın gözüdür.

Zülfüqarın sahibinə küfr deyil,
Xudavənd və ya pərvərdigar desəm.

Əli olmasaydı hamı bütpərəst olardı.
Əlinin nurundan zülmət parçalandı,

İradə hara, Allahın zatı hara?
Əlinin işi Xudanın işidir.

Münkirə nə deyim ki, daşqəlblidir,
İnsanlıqdan uzaq, yenə də su və palçıqdır.

Bakiya, dəmbədəm "ya Əli" de,
Məhəbbət bağından bir gül dər.

## BAKİNİN TƏXMİSİ

Gül üzlü saqi, gülgün mey gətir,
Yarın xatirinə, bir piyalə doldur, ver.
Meypərəst və sərxoşam, xumarımı dağıt.
Dünən xarabata yolum düşmüşdü,
Zar-zar ağlayan çəng və ney gördüm.

Ney, hey yanıqlı-yanıqlı ağlayırdı,
Tarın simi “ya sənəm” deyə, çalırdı.
Hər ikisi yarın hicrindən səs-səsə vermişdilər,
Hər iki yarın naləsini eşitcək,
İxtiyarsız olaraq ağladım.

Neyin fəğanından bəzən özümü bilmirdim,
Gah da onun halına ağlayırdım.
Öz-özümə dedim ki. Baki, nə vaxtadək,
Xirqə və səccadəni meyə verim?
Xərabatdan xumar qayıtdım.

Hər günahı ki, hicab yırtır,
Xirqəni eşşəyə verən vaiz arpa alır.
Ariflər mey içir, zahid isə adam yeyir,
Zahidlər deyir, arif mey içir,
Bəli, bəli, qalx, mey camını gətir.

Xudbin zahid, bir an haldan danış,
Arif meylə dəstəmaz alır.
Öz Allahı ilə söhbət edir,
Mey gətir, ney gətir və yenə danış,
Gizli şeyi aşkar etdim.

Ev sirr saxlayan, mənə cəhənnəmdən az danış,
Hanı müsəlman, hanı küfr, de görək, yar necədir?
Mey yorğunluğu aparır, saqi isə xumarı,
O nigar mənə gümuş sağər verdi,
Mən taleyin sağlığına nuş elədim.

Qulaq as, ey zahid, bir hədis eşit,
Bəşər eşqindən yadigarım var.
Məhəbbətdən danış, ibadəti kənar elə,
Hər kəsin başında yar eşqi olmazsa,
Onun üçün noxta-palan gətir.

Yoxluqdan o var oldu və mən də özümü dərk elədim,
Özüm dərk elədiyim üçün özümü tanıdım.
Səbəbsiz olmadan özümü tanıdım,
Mey içdim və özümü unutdum,
Xalq mənim halıma zar-zar ağlayırdı.

Ey səba, mənim halımı ona danış,
Çünki ona danışmağa mənim taqətim yoxdur.
Ey xuda, mənim kimi üç yüz minlərin,
Əlimi atdım ki, yaxasını tutum,
Ta ki, onlardan bir dəstə gül dərdim.

Ey ay üzlü, nərgisin can alır,
Saçın və tükün dinimi qarət edir.
Qəlbsizəm, dilbər, qəlbimdən soraq ver.
Üstümə qışqırdı ki, ey, ey, uzaq ol,
Tikan yarası görməsən, gül dərə bilməzsən!

Qönçə olsun, pərdəsi olan qönçə,
Elə ki açılır, gül olur.
Gecə-gündüz mənə belə xitab elədilər:
Gülü gün çıxmamış dərmək lazımdır,
Əgər dərməsən, özü yerə tökülər.

Gül həmişə güldən ətir götürər,
Xoşxasiyyətli ol, xoşxasiyyət axtar,
Can-başla bu mənanı dərk et!
Yaxşılarla yaxşı, pislərlə pis ol.
Gül yanında gül, tikan yanında tikan ol.

Xoş o məstlərin halına ki, əzəldən məstdirlər,
Məst gərək əsil məst olsun, qarışıq yox.
Mövləvi eşqdən, Baki isə əməlindən,
Şəms Təbrizi isə elə əzəldən məst idi,
Qiyamətə qədər də elə məst olacaq.

## BAKİNİN QƏZƏLİ

Ey qəmə, bəlaya, məhəbbətə qurban olan qəlbim,
Şeyda qəlbim, sınıq qəlbim, binəva qəlbim.

Saçının hər qıvrımı min qiyamət eyləyir,
Halın necədir, nə macəra gəldi başına, a qəlbim?

Baxmayaraq ki, saçın cövründən torpağa düşmüşdür,
Allah eləsin, qəlbim Kərbəladan gəlsin.

Eşqin xoş sözlü bülbülü vardı, xar oldu,
Əfsus ki, ey səba, qəlbim bir gülü iyləmədi.

Sinədən başqa bir yer, ahdan başqa həmdəmim yoxdur,
Qəlbim ya qəm dəstəsi, ya da bəladır, ey fələk.

Həsrətdəyəm, ölüm piyaləsini mənə ver,
Bilirsən gözəllərdən qəlbim nələr çəkir, ey fələk.

Ey eşq, öldüm, salamat qal, yaxşı saxla,
Qəlbim sənə əmanət olaraq yarımı tapşırır.

Baki hara, ayrılıq hara, qəm hara,
Bəla oxuna təsadüfən qəlbim hədəf oldu.

## QƏZƏL

Dünən saçının sevdası başıma düşmüşdü,
Qəlbim rüsvay olaraq avarə olmuşdu.

Dünən zülfün zülmətində, Allah, Allah, bir günəş vardı,
Sanki Əqrəbin pəncəsi altına ay düşmüşdü.

Hər millətin qibləsi, doğru desəm, əyri olur,
Nigarımın qaşının tağı isə yaxşı düşmüşdür.

Cananın eşq şərabından məst olan tək mən deyiləm,
O qədər aşiqlər gördüm ki, məstlikdən bixəbər düşmüşlər.

Səməndər (quşundan), ey səba, pərvanəyə salam söylə,
Şamın ciyərinə atəş gecə vaxtı düşmüşdü.

Fərhadı, əcəb, eşqdən kam almayan deyirlər,
Başına Şirinü Şəkərin sevdası düşmüşdü.

Vaiz badə içməkdən axşam adamlara tövbə verirdi,
Meyxanə qapısında səhər onun özünü yıxılmış gördüm.

Əfsus, Baki bu varlıqdan tamam üz döndərdi,
Onun yanında gözəllər nəzərdən düşmüşdür.

## QƏZƏL

Sənə deyim ki, aysan, ya ulduzsan, yox, sən mənim yarımsan,
Gecə-gündüz mənim yanımdasan günəş kimi.

Əgər mən səni pərizad adlandırsam, bu, ağla sığmaz,
Ona görə ki, pəri adamlardan uzaqdır,amma sən
mənim yanımdasan.

Mən bənövşəni neyləyirəm ki, gülüstan sənə həsəd aparır?
Sənubərsən, mənim təzə bahar sərvimsən.

Şərab içməkdən məst deyiləm, halım ondan da pisdir,
Sən ədalı saqisən, həm də mənim gözəlimsən.

Sən hər nəfəsdə insana həyat bəxş edirsən,
Belə Allah sifəti ki, səndə var, mənim yaradanımsan.

Eşqin hədisin söylə, vaiz, behiştdən danışma,
Əgər sən mənim ağlar qəlbimin sirlərinə vaqifsənsə.

Yar Bakiyə dedi: Eşq qədər ömrün olsun,
Nigarpərəstlikdə sən mənim yadigarımsan.

## QƏZƏL

Cana, mən şadlıq məclisindən özüm çıxmamışam,
Məni alçaq çərxi-fələk alt-üst eləyib.

Ah-nalədən surətim tamam pisləşdiyindən,
Şam aşiqi olan pərvanə kimi üzə çıxdım.

Şəkər-Şirin yolunda canımı əritdim,
Fərhad kimi dağ-daşa valeh olmamışam.

Mənim ömür gəmim hicr dənizində qərq oldu,
Ey vüsala çatdıran, gəl çat, mən əldən düşmüşəm.

Sənin dodaqların xatirəsinə ciyərimin qanını içsən rəvadır,
Məni xilas eylə, ey nigar, indi qan məsti olmuşam.

Yarın qaşı dinin qibləsidir, ona səcdə eylədim,
“Əlif” kimi qamətim əyilib “nun”a döndü.

Aşiqlik sevdası başqadır, eşq isə tamam başqa,
Mən bunu başa düşməmiş, tamamilə cünun oldum.

Bakinin ürəyi həyəcanlı olduğu üçün tar çaldı,
Mən arqana və hisara mail oldum.

## QƏZƏL

Az naz eylə aya və günəşə, ey qoca fələk,
Sənin bədr ayının az işıq verməsinə onun hilalı sübutdur.

Ey fələk, sən öz günəşinə səcdə edərək de ki,
Mənim ayımın qaşı Allahın dərgahının qibləsidir.

Bihudə fəxr niyə edirsən, ey köhnə çarx?
Mənim ayımın işığından sənin ayın aydan-aya işıqlanır.

Ay üzünü göstər, söylə, nəyə görə naz edirsən?
Yaxşı adəti olan o gözəl nazını çəkirəm ki, hədsiz naz eyləsin.

Gecə əgər ayım varsa, o, damımın kənarına gələcək,
Yerin ayı fələklərdən günahıyçün üzr istər.

Allah, əgər ayımın narazılığı, şikayəti varsa,
Mənim üçün tir və kaman çəkər, qəlbim üçün isə qara zülfünü.

Üzünün qara xalı və qara saçının hörükləri xəta üzündən,
Şama, Həbəşə və Çinə qoşun çəkiblər.

Sənin şeir təbin məlahətli və vəznlidir, ey Baki,
ancaq nə xeyir?
Tezliklə fələk ömrünü axıra çatdırar.

## QƏZƏL

Ey gözəl, sənin saçlarının qıvrımlarında yerləşən ürək,
Zülmətdən haqqa çatıb, haqqın nuru var onda.

Sənin surətinin valehi olmayan kəs adam deyil,
Sənin qaynar, şəkər dodağından ona pay çatmaz.

Sənin ay üzünün ay ayın qaranlıq gecəsində olanda,
Allah eləməsin, fələyin doqquz təbəqəsi olsun.

Necə aydır, bilmirəm, necə günəşdir
Ki, nurlu üzündə iki zülfü var?

Bir tərsa gözəlinin hicrində dinim, ürəyim getdi,
Şeyxi necə inkar edim ki, haqqı var?

Bakinin məqamı ya kilsədir, ya da ki, gözəlin yanı,
Nə qədər nəfəsi var, belə olacaq.

**QƏZƏL**

Keçdi o günlər ki, mən və ürək qəm əsiri idik,
Ürək ahımın tüstüsündən hər ikimiz gözü yaşlı idik.

Keçdi o günlər ki, qaranlıq hicran gecələrində,
İki pərvanənin şamı fikrində əlacsız idik.

Keçdi o günlər ki, iki Məcnun və Leyla dərdiylə,
Məlamət yükü altında bir-birinə şərik idik.

Keçdi o günlər ki, daraq kimi tükdən-tükə,
Qıvrım, pərişan zülfün əsiri idik.

Keçdi o günlər ki, bir zərbə ilə iki cəfa qılıncı,
Yaralanmamış iki qələm ucu kimi bölünmüşdük.

Keçdi o günlər ki, nazlı gözəl işarə etməmiş,
Əzablı kipriklərinin oxunun fədası idik.

Keçdi o günlər ki, ağlamaqla bəzən,
Miskin Bakinin dodaqları görüşə nəsib olurdu.

**QƏZƏL**

Elə bir canlı cisim yoxdur ki, cananın olmasın,
Dənəsi olmayan nara bənzər.

Dəli ürəklərinin sirrini aqil bilərmi?
Bu can yandıran nüktənin divanəyə dəxli yoxdur.

Qana bulaşmış ürəyimdən  bir parçanı nigara verdim,
Elə bir xəyal ilə ki, saçlar qarışıb, darağı yoxdur.

Gecədən səhərə qədər şam kimi yanıram,
Pərvanə mənim qəlbim kimi yanmaz.

Eşqbazlıq nə ağla baxır, nə də qızıl-gümüşə,
Aşiq odur ki, bir guşədən başqa viranəsi yoxdur.

Ey əcəb, bu vəfadə elə bir gizli sirr vardır ki,
Mənim dəli könlümün ev həvəsi yoxdur.

Saqi, Bakiyə boş bir piyalə ver,
Bəzən boş piyalənin də təsiri peymanədən artıq olar.

## QƏZƏL

Gözəllik mülkündə sənin kimi sultanım olaydı,
Öz qətlim üçün sənin formanın arzusundayam.

Ey məhəbbətimin xaliqi və eşqin Allahı,
Qana, torpağa bulaşmışam, qurban olmaq istərəm.

Ağrıdan zümzümə etmək canı sevməkdən yaxşıdır,
Mən xəstəyəm, sən təbib, dərman istərəm.

Əgər həşr günü məndən iki yüz macəra istəsələr.
Min dəfə söylərəm - cananımı istəyirəm.

Zaman və məkan münkiri deyiləm, məhəbbəti
ürəkdən soruş,
Arzum budur, imkanım öz daxilimdə olsun.

Mən kafirəm, müsəlman kitabı oxumamışam,
Sane ayələrini görmüşəm, Quran arzusundayam.

Şamın ağlamasından pərvanəyə xeyir yoxdur,
Bir açılmış gül istərəm mən də bülbül kimi.

Başı, gözü, bədəni vermişəm bəlaya,
Ürəyi sınmış Bakiyəm, can arzusundayam.

## QƏZƏL

Nə olar ki, yar bu binəvadan bir yad edəydi,
Min dərdim var, birinə çarə edəydi.

Yar kamımı verməyib, ona necə yar deyim?
Öz yarıyla Kərbəla müamiləsi edir.

Vüsala biganə olsam belə, yenə də xoşdur,
Hər dəfə məni öz cənnətimlə görüşdürür.

Ey könül, gülməkdənsə göz yaşı yaxşıdır,
Bir ay (üzlünün) oxu min bəlanı dəf' edər.

Gah hicran dərdini çək, gah naz eylə,
O gün olmasın ki, Allah bundan da pis etsin məni.

Ya Rəbb, mənim ömür kəndirimi kəs ki, bəlkə
onda yar,
Mənim vücudumun torpağından olan pambıqdan
paltar geysin.

Qeys buyurmuşdur ki, dünyanı yaradan məhəbbətdir,
Əhsən o peyğəmbərə, necə yaxşı söyləyib.

Surəti günəşdir, könül, ona ay demə,
Qorxuram ki, zülfünün qıvrımları (əqrəbi)
yenə xəta etsin.

Sabah Baki cənnət fikrinə düşəcək,
Bu gün isə kafirdir,əgər bu gün könül yarının yanında
özünə yer etsə.

## MÜXƏMMƏS

Könlüm əsiri-türreyi-ənbərfəşan idi,
Zülmat içində nuri-həqiqətnişan idi.
Bu rütbə ilə məhrəmi-razi-nihan idi,
Xoş ol zaman ki, yar mənə mehriban idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Aşiqlər içrə sevmiş idi yar tək məni,
Almışdı gül kənarına həm, xar tək məni.
Mən yarı tək qucaqlar idim, yar tək məni,
Yüz min dil ilə könlüm alıb, həmzəban idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Nazın çəkərdi könlüm o çeşmi-xumarımın,
Mən yüz məzaq edəndə edərdi o yar min.
Saqi özüydü, badə - dodağı nigarımın,
Süzgün baxanda qəmzələri quti-can idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Zünnar zülfü tutmuş idim əldə şeyx tək,
Bütxanə içrə virdim idi "ya sənəm" demək.
Olmuşdu adətim ona həm səcdə eyləmək,
Həmvarəsinə bir bütə xəlvət məkan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Gülzari-vəslə dəymədi hərgiz xəzan əli,
Şaxi-gül üstə eyləmədi tar bülbüli,
Bu rəmzi bir murada yetən əhli-dil bili,
Billah, vəfası düz, özü yarımın haman idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Düşməzdi ğəm xəyalıma yadi-fərağilə,
Bir ləhzə ömür keçmədi həm iştiyaqilə,
Həmzar idi həmişə dodağım dodağilə,
Könlüm o yerdə vaqifi-sirri-dəhan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Gözdən salıbdı indi nədir yar yarını,
Qəm guşəsində həm qoyub ağlar yarını,
Əğyara yar olub, sanır əğyar yarını?
Namehriban deyildi belə, mehriban idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Noldu, nigar, tafşıdı* dərdü bəla bizə,
Çəkdikcə ah, cari olur xuni-dil üzə,
Yüz naz ilə qoyardıq, o gün keçdi, üz-üzə,
Biçarə Baki şamü səhər şadman idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

* * *

Əfsus, heyf, məndən o cananım ayrılır,
Can mülkünü xaraba qoyub, canım ayrılır.

---

* Tapşırdı

Müştaqi-qəm görübdü məni kuhkən kimi,
Şirindilü şəkkərləbü xəndanım ayrılır.

Bağİ-məhəbbət içrə mənə qüssə tapşırıb,
Bir ala gözlü sərvi-xuramanım ayrılır.

Geysuyi-yara tafşı,* səba, şanə dəyməsin,
Tel-tel düşəndə gül üzə yüz canım ayrılır.

Xoş niyyət ilə "Rəbb" deyib kafər olmuşam,
Kafər bilib o yari-müsəlmanım ayrılır.

Ey heyf, tazə dinə gəlib, "ya sənəm" dedim,
Mehrabi-din xarab olub, imanım ayrılır.

Qan ağlasın həmişə gərək qan olan könül,
Baki bəla əsiridi, sultanım ayrılır.

* * *

Ey eşq, qoyma, yar yenə öldürür məni,
Üz qibləyə dönəndə gəlib güldürür məni.

Gözdən salıbdı yar, əcəb mehriban olub,
Qəm guşəsində dərdü bəla dindirir məni.

Can qəsdi var, buyursun ölüm, bəlkə qurtarım,
Hərdəm dönüb baxanda yenə öldürür məni.

Gizlin qəmin çəkərdim, əgər olmasaydı göz,
Göz yaşım aləmə nə yaman bildirir məni!

Yar yara, Baki, munca sitəm eyləməz, məgər,
Əğyardır o yar, belə öldürür məni?!

* * *

Eyni-surət görünür, surətin olmaz canı,
Hər kimin yoxdu sənin tək, gözəlim, cananı.

Görsə zahid üzünü, dini-Məsihaya gələr,
Tərki-taət eləyib bəlkə qana Quranı.

---

* Tapşır

Səcd[*] edərmi gər ola Kə’bə kimi yüz xanə,
Sənəma, guşeyi-əbrudə tapan imanı?

Hər baxanda min ölür, min biri dünyaya gəlir,
Gözlərin bərhəm edib möcüzeyi-Musanı.

Qüdrətullah ilə İsa edib əmvat əhya,
Ləb ləb üstən götürüb, zində elə İsanı.

Kafər olmaz, gərək eşq əhli müsəlman olsun,
Katərəm, kafər əgər bir də biləm Sən’anı.

Dolanıb başına pərvanə kimi şamü-səhər,
Yazılıb Bakiyə, ey şux, fəda fərmanı.

* * *

Nə xoşdu, yara deyin, böylə ruzigarım ola,
Ki, parə-parə ciyərlə dolu kənarım ola.

Məni salıbdı gözündən, rəqibə naz eylər,
Nə mən olum belə, yarəb, nə belə yarım ola.

Əzəl vəfalı bilib, sonra bivəfa gördüm,
Dönərmi üz o nigara, əgərçi tarım ola?

Bəlasız aşiq olarmı, olum bəlaya fəda?
Bəla ola, mən olam, qəm şəriki yarım ola.

Dolandı[**] başına barı, təsəddiq eylə məni,
Fəda o canına min can bədəndə varım ola.

Əzizlər, qəm evində nə xoşdu can vermək,
Öləndə başımın üstə əgər nigarım ola.

Yenə bu həsrət ilə Baki ölsə, minnətdir
Ki, asitaneyi-cananidə məzarım ola.

* * *

Deyin o yara, edir aşiqin səfər, gəlsin,
Şikənci-əqrəbara gizlənir qəmər, gəlsin.

---

[*] Səcdə
[**] Dolandır

Ölüm yetibdi, səba, az qalıb fədası olam,
Söylə ki, başımın üstə o didətər gəlsin.

Gül üzlülər nə ki var, dövrəmə vurub halə,
Gözəllər içrə o yarı gözüm gəzər, gəlsin.

Nə Kə’bə, qiblə bilib, döndəribdilər üzümü,
O taği-qaşına, billah, üzüm dönər, gəlsin.

Şəhadətin yerinə adın əzbər eyləmişəm,
Təğafül eyləməsin vəqt kim, keçər, gəlsin.

Bu həsrət ölməyimə olmasın, deyin, razı,
Görüm üzünü, verim can, yenə kədər, gəlsin.

Gərək məni öz əlilə bu gün məzara qoya,
Şikəstə Baki ölür, eyləyin xəbər, gəlsin.

* * *

Könül, bir ahi-cigərsuz çək, yanaq, getsin,
Ki, gözdən əşk kimi yarı həm salaq, getsin.

Məni bu halilə ağlar qoyub, vəfasına bax,
Rəqibə yar gedib dün gecə qonaq, getsin.

Rəvadı lalə kimi dağı mən qucum hər dəm,
O gül dodağa qoya özgəsi dodaq, getsin?!

Əsiri-qəm biz olaq, kama özgələr yetsin,
Ələ salıbdı bizi, alladır uşaq, getsin.

Nə yar, yüz könlü bağlıyıbdı bir muyə,
Götür məhəbbəti birdən ki, qurtaraq, getsin.

O Qeysü kuhkənin hasili nə oldu, könül,
Nə eşq? Dərdü-bəladır ki, qoy uzaq getsin.

Düşübdü dillərə Baki, dönübdü, kafər olub,
Bu dinü məzhəbü imanı gəl sataq, getsin.

* * *

Nə yar, yar nədir, cismim içrə canımdı,
Ki, rükni-məzhəbü dinimdi, həm imanımdı.

Nə Kə'bəvü qiblə, əbrusuna sücud edərəm,
Məhəbbət ayəsi üzrə mənim Qur'anımdı.

Nə İsavü nə Məhəmməd, nə məscid, nə kəlisa,
Şəriətimdi məhəbbət, vəfa imanımdı.

Nə cənnətü nədi tuba, nə huri, ey vaiz?
Cəhənnəm içrə yanam yar ilə, cinanımdı.

Nə vird, həm nə ibadət, o zahid adət edib,
Riyazətimdi bəla, taətim fəğanımdı.

Nə küfr, din nədir ki, deyir mənə kafər,
Xudapərəstliyimə yar özü nişanımdı.

Nə eşq, yar nədir, Baki yüz xəyala düşüb,
Yazıbdı eşqi həqiqət nigar canımdı.

* * *

Deyin nigara, baharım xəzandı, tez gəlsin,
Yaralanıb ciyərim, laxta qandı, tez gəlsin.

Qaşın xəmıdə edib süzməsin gözün yarım,
Qəmində tir qədim çun kamandı, tez gəlsin.

Der kim, indi ölər, kim der, yenə dirilər,
Təbiblər cəm olub bədgümandı, tez gəlsin.

Deyin qəm ilə keçib ömrü, gülməyibdi üzü,
Yetişməyibdi murada, cavandı, tez gəlsin.

Vəsiyyətim var ona, ayrılıq zamanı yetib,
Vəfası var, əgər o mehribandı, tez gəlsin.

Dodaq dodağa qoyub, bir məzar evində yataq,
Mən öldüm, ölsün o yarım, amandı, tez gəlsin.

Yəqindi Baki gər ölsə dübarə cana gələr,
Kim, əbdi-mehrü məhəbbət hamandı, tez gəlsin.

* * *

Əzizim, gözlərim, canım, üzin göstərgilən ayə,
Od düşsün torpağa, məvac eyləsin ərşi-ə’layə.

Toxunsa gər səba bir muyə, yüz min qana baisdir,
Həyati-yüz peyəmbər bağlıdır zülfi-cəlipayə.

Nigara, "rəbbi-ərni" * seyrini mən səndə seyr etdim,
Səni görmüb kəlimüllah gedərmiş Turi-Sinayə.

Deyin İsaya: Fəxr etmə diriltmiş bir ölü ömründə,
Mənim İsam dirildir, öldürür, gəlsin tamaşayə.

Deyil adəm o, adəm surətadəmdi, billahi,
Sənin qəddin görən fəxr eyləməz cənnətdə tubayə.

Məni mən’ etməyin Quranı dansam, yol qoyub Sən’an,
Tapıb həqqi sənəmlərdə, girib kafər kəlisayə.

Deyə hər kimsə, Baki kafərü tafərtəriqətdir,
Buna şahid, müsəlman, gəl oxu Quranda min ayə.

* * *

Gəl, ey Məsihdəmü xoşnəfəs nigar, ölürəm,
Bəlalı başımara bilmirəm nə var, ölürəm.

Güli-vüsalını könlüm dərincə qan oldu,
Xəzan bülbülü tək görməyib bahar, ölürəm.

Salıbdı silsileyi-ömrə piçü tab fələk,
Yavuxdu canım ola cismidən kənar, ölürəm.

Təbiblər çəkib əl, yox mərizi-eşqə dəva,
Gəl, ey əlac, məni-xəstəvü fikar, ölürəm.

Mürüvvət eylə gəhbəgah ahü zara görə,
Tutubdu ayineyi-qəlbimi qübar, ölürəm.

Qan ağlayır mənə eşqin, məhəbbətin baş açıb,
Bəlavü dərdin əzizi olubdu xar, ölürəm.

---

* "Ey Allahım, özünü mənə göstər" – Quran, Ə’raf surəsi, 143-cü ayə.

Təsəddiqin gəl, əzizim, əziz canım olur.
Gözüm yolunda qalıb, gözlər intizar, ölürəm.

Öləndə Baki, nigarım, gözun de, kim bağlar?
Kəfən ki, para edib, kim qazar məzar, ölürəm.

* * *

Əzzəl sənə bir səcdə edən, ey mah, mən oldum,
“Ya Rəbb” deyib, bəndeyi-dərgah mən oldum.

Mehrab qaşın tağına yüz döndərib axır,
Torpağa düşən icz ilə, billah, mən oldum.

Süzgün gözünə din ilə imanımı verdim,
Sərsilsileyi-zülfidə gümrah mən oldum.

Basdım qəmini bağrıma can tək gecə-gündüz,
Gəh oldu könül naz çəkən, gah mən oldum.

Eşq əhli vəfa şəm’inə tək yanmaz, əzizim.
Hər verdə o pərvanəyə həmrah mən oldum.

Bilməzdi məhəbbət nədi Fərhad ilə Məcnun,
Billahi, onun sirrinə agah mən oldum.

Hər aşiq əli daməni-canana yetişdi,
Baki, hamıdan bəs niyə kutah mən oldum?!

* * *

Düz bax, gözüm, o gözlərini süzmə, qan olar,
Billahi, kama yetməyib ölmək yaman olar.

Döndər hilala, göz dedi qaşa, xəm et qədin,
Tiri-qəmü bəlayə ki, möhkəm kaman olar.

İncitməsin de zülfünə divanə könlümü,
Hər verdə karvani-ğəmə sarban olar.

Dindir məni-fələkzədəni, qəlbi qarələr,
Rəsmi-məhəbbəti nə bilir, bədgüman olar.

Canım fəda həm eşqə, həm eşqin fədasına,
Qurbani-eşq hər kim ola, əhli-can olar.

Yalqız qalanda qəm məni, həm nalə könlümü,
Həsrət evində yada salıb, mehriban olar.

Səbr eylə, Baki, günbəgün artır məhəbbətin,
Əyyami-qəm tamam olub, ayrı zaman olar.

* * *

İlahi, dərdü qəmi-yarı artur, yar ölsün!
Ölüm rəqibə yaraşmır, rəvadı yar ölsün!

Gözü yolunda qalıb, görməyə öləndə üzün,
Nə xoşdu yara verib canın, intizar ölsün!

Tapılmasın ona həmdəm vəsiyyət eyləməyə,
Məzara aparsın ürəkdə nə dərdi var, ölsün!

Quru yer üstə kəfənsiz görüm nə’şi qala,
Gözünü bağlamasınlar, bu növ yar ölsün!

Ölümdü ayrılığın dərdinə dəva, billah,
Qəmi-fərağı verib eşqə yadigar, ölsün!

Gər ölsə yar rəhgüzari-yara qoyun,
Gələndə yar dirilsin, gedəndə yar ölsün!

Səba, salam yetir əndəlibə, ərz eylə,
Qucaqlaşıbdı çəməndə gül ilə xar, ölsün!

Mənimlə məhşərə Fərhad qol-boyun gəlməz,
Məhəbbət əhlidi Baki, gərək fıkar ölsün!

* * *

Xərabə könlüm olub tazədən xərab, balam,
Nə var başında görən, eylər iztirab, balam?

Könül, günün necə keçdi kəməndi-geysudə,
Dedim nə qədr ona, vermədi cavab, balam.

Dilim tutarmı sayam birbəbir könül dərdin?
De zülfə, yaxşı bilir, eyləsin hesab, balam.

Çəməndə gül başına çox dolandı bülbül tək,
Nə bir gül iylədi könlüm, nə mən gülab, balam.

Əmib dodaqlarını məni-şikəstə keflənib,
Haram edib özümə, içmərəm şərab, balam.

Mənə xudasan özün, Kə'bə asitanındı,
Məhəbbətindi peyəmbər, qəmin kitab, balam.

Nə kafərəm. nə müsəlman, əlimdə məhşər üçün,
Nə bir günah varımdı, nə bir savab, balam.

Behişt – vəslin, cəhənnəm – fəraqi-ruyindi,
Həmişə həsrətə Baki deyər əzab, balam.

## AZƏRBAYCANCA-FARSCA QARIŞIQ QƏZƏL (MÜLƏMMƏ)

Biya ke, bi to nəgirəd deləm qərar, ey dust,
Gecə sabaha kimi evlər ahü zar, ey dust.

Ze zolmət çe qəm del nədarəd azadi,
Məgər o silsileyi-zülf edə kənar, ey dust.

Biya, biya ke, ze seyle-sereşke-xuninəm,
Həsari-qəleyi-ömrümdü tarmar, ey dust.

Xoş əst mərg ze həsrət, əgər be dəst ayəd,
Dəvayi-hicri-məhəbbət ölüm yazar, ey dust.

Be peyke-yade-vosalət həzar can dadəm,
Gözlərinin eylə bildim vəfası var, ey dust.

Rəqib məhrəme-raz əst, yar bigane,
Pərilər içrə məgər belədir qərar, ey dust?!

Əgər ze ahe-deləm bər delət qobar rəsəd.
Həvalə et qaşına vardı zülfüqar, ey dust.

Ze  hecr Baki benaləd, vəli be didarət,
Ölüncə gözlərimin intizarı var, ey dust.

* * *

Qəza salıbdı, ilahi, yaman məlalə məni,
Yazıbdı dərdü bəla mülkünə qəbalə məni.

Qədr nə yar, nə həmdəm, nə həmzəban qoydu,
Məgər bir ah salır yada, bir də nalə məni?

Yenə xəyali-kəcə çərxi-kəcmədar düşüb,
Əyibdi əlif qədim, döndəribdi dalə məni.

Nişani-tiri-bəla eyləyir fələk gahi,
Gəhi kaman eləyib, oxşadır hilalə məni.

Belə günüm, belə dərdim kimə şikayət edim?
İlahi, barı özün sal yenə xəyalə məni.

Ya bir gül üstə, İlahi, həmişə xar eylə,
Sağaltma dağımı, ya döndər elə lalə məni.

Nə dövri-çərxi-fələkdir səbəb, nə əmri-qəza,
Fəraqi-yar salıb, Bakiya, bu halə məni.

* * *

Gözüm göz alə sənin tək gözüm gözalə görə,
Nə gözdü kor ola, göz alə göz alə görə.

Gözün tək alə gözüm göz gözə göz alələri,
Görünməz alə gözə göz, əgər göz alə görə.

Göz, alə gözdən uzaq olma göz göz ilə səni,
Gözündə gözləməsin, gözdə göz göz alə görə.

Gözünü görməsə göz, gözlərim, gözüm, görməz,
Gözüm kor olsa, özüm, gözləmə, göz alə görə.

Gözün göz alə, gözüm, göz-göz eylədi gözümü,
Gözüm, gözüm gözümü gözləyir, göz alə görə.

İki gözüm görü bir, gözlərimin fədası gözüm,
Veribdi bir gözə Baki, birin göz alə görə.

* * *

Görüm pozulsun o taq, o nöhnövraq, fələk,
Ki, ittifaqımı etdin mənim nifaq, fələk.

Ənis ahü nəva, munisimdi göz yaşı,
Qəm ilə xəstə könül eyləyir məzaq, fələk.

Niyə bəlavü qəmə görməmiş nigar üzünü,
Xaraba könlüm evin eylədin yataq, fələk?!

Ölüm-zülm yetişəndə o yara həsrət əlim,
Büsati-vəslimi tez eylədin fəraq, fələk.

Görəndə cana gəlib, görməyəndə can verrəm,
Məni nə öldürmədin, etmədin nə sağ, fələk.

Vüsalə yetməmişəm, mən hara, fəraq hara?
Əzəl muradımı ver, ondan iştiyaq, fələk.

Rəqiblər mənə qəm, dərdi aşina eylə,
Kim, asitaneyi-yarı tutum soraq, fələk.

Səni xarab olasan, Baki öldü həsrət ilə,
Dodaq yarına bir qoymadı dodaq, fələk.

* * *

Fələk, xarabadı könlüm qübari-qəmlərdən.
Kimə şikayətə getsin vəfası kəmlərdən?

Gecə sabaha kimi od tutub yanar, billah,
Bu nuru zəhmət ilə kəsb edibdi şəm'lərdən.

Xəyali-zülflə olub şərhə-şərhə şanə kimi,
Bu dərsi məşq eləyib başı yox qələmlərdən.

Müridi-şeyx olub, mən də bütpərəst oldum,
Cəfadan özgə səmər görmədim sənəmlərdən.

Qədim hilal kimi, qamətim kamana dönüb,
Düşəndə səcdəyə çox öppüşəm[*] qədəmlərdən.

[*] Öpmüşəm

Yetişdi yara hamı, bir bəlalı mən qaldım,
Dilim der, gözüm ağlar yetən sitəmlərdən.

Deyə-deyə nə edim, neyləyim muradə yetim?
Tükəndi, Baki, əziz ömr, gör, ələmlərdən.

* * *

İlahi, yandı canım, yandı canım,
Niyə  namehribandı mehribanım?

İlahi, gül gözündən düşdü bulbul,
Murad üstə pozuldu aşiyanım.

Bəlalı başımın çoxdur bəlası,
Könül bağında qəmdir bağbanım.

Gözüm yaşı gərək dünyanı pozsun,
Qoy ərşi yaydısın* ahü fəğanım.

İlahi, gündə yüz dəf’ə mən ölləm,
Yerə düşməz vəli bir qətrə qanım.

Hər aşiq yara bir qurban veribdir,
Mənim bir cüt gözüm var, bir də canım.

İlahi, eyləyir Baki şikayət,
Niyə namehribandı mehribanım?

* * *

Xarab oldu yenə abad könlüm,
Olarmı bir də, ya rəbb, şad könlüm?

Bəlalar aşiqi, dərd aşinası,
Qəmə Şirin deyər Fərhad könlüm.

Yanar pərvanə tək, ney tək sızıldar,
Bəlakanü bəlabünyad könlüm.

---

* Yandırsın

Həmişə fəxr edər üşşaq içində,
Dönüb qana, qoyub bir ad könlüm.

Əzəl gün madəri-eşqə tapşırıbdı,
Məhəbbət adlı bir övlad könlüm.

Tutubdur əqrəbi-zülf ilə ülfət,
Ki, hərgiz məndən etməz yad könlüm.

Hanı Məcnun, hanı Fərhad, Baki?
Tutur eşq əhlinə irad könlüm.

* * *

Nədir eşq, ey məhəbbət - bir bəladır,
Soruş pərvanədən, çox aşinadır.

Məhəbbət eşqə daim səcdə eylər,
Bu, peyğəmbər, əzizim, o, xudadır.

Sənəmlər asitanın şeyx yazmış,
Şəhidi-eşq üçün Kərbübəladır.

Vücudu var, gözə hərgiz görünməz,
Danan eşqi məgər qəlbi qaradır?

Səməndər tək gərək eşq əhli yansın,
Bəli, aşiq yeri kuyi-fənadır.

Qoyar eşq aşiqə hər ləhzə bir ad,
Özüm də aşiqəm, adım fədadır.

Odur, eşq Əyyub adın Baki qoymuş,
Həmişə can evi matəmsəradır.

* * *

Məhəbbət əhli, könül, belə bidamaq olmaz,
Vüsal talibi azürdeyi-fəraq olmaz.

Olan sənubəri-bağı-məhəbbət, ey qafil,
Nəsimi-ah dəgəndə ki, şax budaq olmaz.

Şikayət eyləmə, qəm çək, könül, bəla bəslə,
Deyilə[*] eşqpərəstlərdə dil, dodaq olmaz.

Xəyali-surəti-canan, a bəxtəvər başına,
Ölüncə həmdəmin olmuş, dəxi uzaq olmaz.

Sənin bir ahın olub min bəlaya çarə, nedim,
Ciyər dönəndə qana, qan töküb boyaq olmaz.

Çox arizu edərəm mən olum sənin yerinə,
Nə faidə, könül, ev sahibi qonaq olmaz.

Dedim ki, canımı al, tafşı[**]zülfə bir dəfəlik.
Dedi ki, paralanıb dörd yerə daraq, olmaz.

Bəlavü dərdi-nigarı çox istə, çox bəslə,
O vəsl olmasa, Baki, bu iştiyaq olmaz.

* * *

O gündən könlümü zənciri-eşqə mübtəla gördüm,
Günüm dərd ilə keçdi, bəxtimi daim qəra gördüm.

Əbəs tutdu məhəbbət damənin viran olan könlüm,
O döndü qana, hər dəm mən də yüz dərdü bəla gördüm.

Pozulsun günəşi, solsun gülü, ölsün, görüm, xarı,
Həmişə bülbülün virdi-zəbanın mən nəva gördüm.

Deyillər qibleyi-taat, billah, qaşı Leyladır,
Hilali-çərx tək Məcnun qədin mən həm düta gördüm.

Yetişməz yar əli dildara, hərgiz imtahan etdim,
Keçən aşiqlərin qəbrin açıb, matəmsəra gördüm.

Bəla istər məni hər dəm, bəlanı istərəm mən həm,
Mənim yarım bəladır, çün bəladan çox vəfa gördüm.

Nikir-Minkirə qəbr içrə Baki ərzi-hal eylər,
Günüm dərd ilə keçdi, bəxtimi daim qəra gördüm.

---

[*] Deyirlər
[**] Tapşır

Səni hər kim bilə tari, o, peyəmbəri-el olar,
Odu hər dəm mənə Cəbriyli-bəla nazil olar.

Yetsə İsanın əli gər sənə, Allaha yetib,
Adəm ər görsə səni, tazədən abi-gil olar.

Sən yıqıb dəstə tutar* gülləri hər kim yığsa,
Həm mənə, həm gülə, həm bülbülə çox niskil olar.

And olsun eşqə, əzizim ki, vəfa bağında,
Nə sənin tək gül olar, mənim kimi nə bülbül olar.

Heçsə gər ömür belə həsrətilə, billahi,
Hər dəqiqəm gün olar, hər gün, əzizim, il olar.

Dönmə qana, səni tarı, çəkib ah incinmə,
Aşiq, əlbəttə, könül, dərdü qəmə mail olar.

Bakiya, ahi-ciyərsuz ilə yandırma məni,
Belə qan ağlama, eşq əhli ki, dəryadil olar.

* * *

Ey əhli-dərdi-tarı, könlüm xərabdır,
Abad hər xərabəni etmək səvabdır.

Çəkdikcə ah, şanə kimi paralandı dil,
Zülfün misal paraları bihesabdır.

Hər dərdü hər bəlavü-qəmin bir dəvası var,
Həsrət əlacı yenə məzar içrə xabdır.

Gülzari-canım içrə bitibdir bəla gülü,
Gözdən axan könüldə çəkilmiş gülabdır.

Kağız, qələm tapılmaz əgər şərhi-qəm yazam,
Hər dərdimin müqəddiməsi bir kitabdır.

İçdikcə yar qanımı gəh gözlərin süzər,
Gahi güman edər kim, on illik şərabdır.

Canana səcdə edib deyərəm, tarı, qorxuram,
Əğyari-qəlbiqara deyə, Baki babdır.**

---

* Tutan
** Babidir

**Vər. 375b**

## RÜBAİLƏR

Qayğımızın üstünə hər dəm bir qayğı da gəlir,
Lalənin ürəyinin dağı bizim dağımızın yanında
bir şey deyil.
Şüşə daşdan çıxır, adam torpaqdan,
Ey fələk, bizim şüşəmizdə yüz Hüseyni var.

Adəm bir buğdaya cənnəti satdı,
Can əridən ahıyla ürəyi illərlə yandı.
Özü qayıdıb, azadlıq tapanların sırasında oturdu,
Cəhənnəm odundan bizim üçün yüz köynək tikdi.

Sənin aşiqin mənəm, sən isə başqasına bənd olmusan,
Mən sənə qurban olmuşam, sən isə başqa birisinə.
Dörd kitabda da belə bir məsələyə rast gəlməmişəm,
Mən sənə bəndəlik edirəm, sən isə başqasına allahlıq.

Məst gəlmişəm, nə xoşdur ki, məst də gedirəm,
Varlıq və yoxluq piyaləsindən məst olub gedirəm.
Çox təəccüb edirəm ki, heçdən mən yarandım,
Bu varlıqdan da əliboş gedirəm.

Saqi, gecə keçdi, qayıtmadı, vaxt gec oldu,
Gül piyalənin dodaqlarından öpürkən tutuldu.
Birinin intizarıyla və başqa birisinin öpüşündən,
Mən biçarənin ürəyi qara oldu, gözləri nurdan düşdü.

Ürəyimin qanını yemək həmişə mənim adətimdir,
Mən çox xoşam ki, yarın dodağının həsrətiylə qan içirəm.
Ey saqi, məndən xarabat pirinə söylə ki,
Ürək qanıyla məst olduğum halda şəraba ehtiyacım yoxdur.

Şərabı küp-küp gətir, tez-tez mənə badə ver,
Qəmi zahidin nazına və ibadətinə həvalə ver.
Məst öz nəfsinin şərabıyla xəcalət çəkər,
Sözlə məst olanlara cəhənnəm qəbaləsi ver.

Papağımı gülgün mey piyaləsinə verdim,
Günahımçün hər dəm bir nəğməylə üzr istəyirəm.
Bəndələr həmişə xəta edər, şahlarsa onu bağışlar,
Rüsvay etmə, sən Allah, sən bu üzüqaranı.

Dinimin mayası badəylə getdi, ey Allah,
Öz ahımla sənin qapında xəcalətəm.
Məni əlim günah dolu məhşərdə qapına gətirsələr,
Ya Rəbb, elə et ki, mən üzüqara olmayım.

Ya Rəbb, yerdən göyə qədər hər şey sənin
ehsanının dairəsindədir,
Hər canlı sənin yolunda oxuyur və susur.
Əgər ki, sənin qulluğundan qədəm kənar qoymuşam,
Sənin bağışlamağının ümidiylə belə günah edirəm.

**Məşədi Əyyub Bakinin şeirləri burada bitir. Hicri 1349 – miladi 1891-92**

**Vər. 378a**

## HÜSEYN AĞA CAVANŞİR

**Hüseyn ağa mərhum Cəfərqulu xan Cavanşirin oğlu Hidayət ağanın oğludur. Qarabağ əhalisindən və nəciblərindəndir. Uca boylu, xoşsima bir cavandır. Yaşı otuz beşə çatar. Çox bacarıqlı əlləri var. Xoştəbiət və olduqca xoşəhvaldır. Şuşa şəhərində yaşayır. Qış vaxtı, soyuqlarda öz kəndlərində olub, rəiyyəti idarə edir. Bəzən şeir də yazır. Rus həbsxanasından "Məclisi-ün"un şairlərinə yazdığı şeir də bu qəbildəndir. Onlar da ona cavab yazmışlar.**

### HÜSEYN AĞA CAVANŞİRİN HƏBSXANADAN YAZDIĞI QƏZƏL

Zindani-eşqdə yenə ol qarə tellərin,
Etdi günümü qarə üzüqarə tellərin.

Var səbr, tabü-taqəti biçarə aşiqin,
Ursa bu sinə içrə dilə yarə, tellərin.

Hər dəm edəndə zülfünü rüxsarına niqab,
Bənzər o gənc üstə yatan marə tellərin.

Vay ol zaman ki, şanə dəyə, zülf titrəşə,
Ol vəqt edər bu könlümü sədparə tellərin.

Divanəvar düşdü könül bəndi-zülfünə,
Lazımdır eyləsin ona bir çarə tellərin.

Fəryadü ahü dadü aman, zülfdən, həray,
Bir görməgilə saldı məni tarə tellərin.

Bir tar içrə şurü nəvayi-Hüseyni gör,
Saldı bu həbsi-zülfdə min zarə tellərin.

### YENƏ HÜSEYN AĞANIN HƏBSXANADA YAZDIĞI QƏZƏL

Zindani-eşqdə mənə qıl bir nəzarə sən,
Divanəvar qeyd eləmə zülfi-tarə sən.

Zəncirü qeydü silsilə hacib deyil mənə,
Etdin əsir nərgisi-çeşmi-xumarə sən.

Hüsnün, yəqindi, Yusifi təhtüş-şüa edər,
Gər bürqəini eyləyəsən bir kənarə sən.

Qiblə hesab eyləyibən səcdə eylərəm,
Etsən işarə hər tərəfə, hər güzarə sən.

Eşqin hasara saldı Hüseyni əsir tək,
Dərdin yetirmə həbsara səd həzarə sən.

**Vər. 380a**

## ABDULLA BƏY

**Rəbiül-əvvəl, 1309-cu il – oktyabr, 1891**

**Cənab Abdulla bəy mərhum Məşədi Əsədulla bəy oğlu Qarabağın Şuşa şəhərindəndir. Zəif cüssəli bir cavandır. Əlli iki yaşı var. Mirzə Vəli Vidadi Baharlının nəvəsi və rəhmətlik Məhəmmədəli bəy Məxfinin qardaşıdır. Bəzən şeir de yazır. Aşağıda qeyd olunmuş şeirlər o cənabın xəyalındandır. Şeirləri öz adıvla yazır, təxəllüsü yoxdur.[*] Şerlərinin sayı üç yüzə çatır. Mərhum Qasım bəy Zakir onun təvəllüdü barədə demişdir:**

**Be tarixe-Əbdollahe-qolozar,**
**Səre-morğ bərdaro dom beyar. – 1257[**] (1841-42)**

## ABDULLA BƏY VƏLİZADƏNİN QƏZƏLİ

**(1310-cu il – 1892-93)**

Könlüm necə xürsənd olu meyxanədən özgə?
Dəf'i-qəm edən olmaz o viranədən özgə.

Rahi-həqi tut, məscidə, könlüm, həvəs etmə.
Verməz sənə zahid səmər əfsanədən özgə.

Dərdü qəmi yüz şərh qılam piri-muğana.
Çarə edən olmaz mənə pevmanədən özgə.

Pabəst könül oldu əcəb həlqeyi-zülfə,
Yox dami-bəlalar mənə cananədən özgə.

Çəksəm sitəmü cövrü cəfa badi-səbadan,
Aşüftəliyin baisi yox şanədən özgə.

Ol şöleyi-ruxsarını görcək verirəm can,
Yanmağıma nisbət hanı pərvanədən özgə?

Abış, demə Nəvvaba ki, bimehrü vəfadır,
Yox munisin əz bəs ki, o dürdanədən özgə.

---

[*] Lakin təzkirənin həm avtoqraf, həm də çap nüsxələrindəki qəzəllərinin məqtəindən görünür ki, o həm Abdulla, həm də Abış adıyla yazmışdır.

[**] Gül üzlü Abdullahın tarixi üçün, quşun başını götür, quyruğunu gətir.

* * *

Verdim əgərçi türreyi-tərrarə könlümü,
Etdim düçar, gör neçə şəhmarə könlümü.

Xalü xətin xəyalı günüm tirə eylədi,
Qəmzən xəyalidə yenə sədparə könlümü.

Ey şanə, mubəmu ara bir tari-zülfünü,
Gör kim, çəkibdi harda mənim darə könlümü?

Naseh, demə ki, yara könül verməyin dəxi,
Ruzi-əzəldə verdim o bir tarə könlümü.

Zahid, məlamət etmə sən Abdullahı görüb,
Məzur tut, alıbdı o məhparə könlümü.

* * *

Eylə ki, zülfi-siyəh arizi-cananə düşər,
Piçü tab içrə o dəm bu dili-viranə düşər.

Gecələr sübhə kimi fikr səri-zülfündə,
Çalar əf'i bu qara bəxti ki, suzanə düşər.

Çeşmi-xümmarına baxdıqca könül yaralanır,
Yadi-ləli-ləb ilə yadıma peymanə düşər.

Oldu şan-şan bu könül xaneyi-zənbur kimi,
Hiç gör, dəsti-nigarımdan axır şanə düşər?

Düşsən Abdullahdan sən də cüda, inciməz,
Talibi-vəsl olan rəsmdi, hicranə düşər.

* * *

Nigarım, mahruxsarım salıb üzdən niqab, oynar,
Sanasan, çərxdə rəqsə gəlibdir aftab, oynar.

Dolanır həlqeyi-zülfün, nigara, dövri-ruyində,
Gün ətrafin alıb guya ki, bir mişkin səhab oynar.

Təəccüb eyləmə hər an üzündə qıvrılır zülfün,
Düşəndə atəşə əf'i edər yüz piçü tab, oynar.

Şəbi-hicran hərarətdən könül, ey qibleyi-üşşaq,
Rəgi-bimar tək hər dəm edər yüz iztirab, oynar.

Ümidi-vəslə, Abdulla, nigarım öylə xürrəmdir,
Görüb guya biyabanda ki, bir təşnə sərab oynar.

**Tamam oldu rəbiül-əvvəl, 1309 – oktyabr, 1891**

**Vər. 381a**

## MƏŞƏDİ MAHMUD BƏY

**(Rəbiül-əvvəl 1309 – oktyabr, 1891)**

**Mahmud bəy Məhəmmədxan bəyin oğlu, o da Kazım bəyin oğludur. Qarabağ əhalisindəndir, yaşı təqribən əlli beş olar. Peşəsi tacirlikdir. Qaməti düz, bir qədər yoğun, burnu yekə, gözləri zəif, özü deyib, özü güləndir. İndi ki, 1309-cu ildir, Xorasan və Aşqabadda alver edir. Bəzən şeir də deyir. Şair və dərvişlərlə ünsiyyəti var. Aşağıdakı şeirlər onundur. Təxəllüsü yoxdur. Şeirləri öz adıyla deyir. Divanı yoxdur.**

**Mahmud bəyin vəfat tarixi 15 səfər 1320/1902-ci ildir.*** **(24 may, 1902)**

## MAHMUD BƏYİN QƏZƏLİ

Ey sərv, heç kim sənin qəddin kimi qamət görməyib,
Qiyamətdən (yeni bir) qiyamət bərpa olub bu cahanda.

Cənnətdən söhbət açan vaizin söhbəti, hekayəti,
Sənin saçlarından, sənin üzündəndir.

Yara, vəsl (yolunda) ahü zar oldu işim,
Nə vaxt ayrılığın sonu çatacaq?

Hər yaranmışın bir sonu var, bəs,
Bircə ürəyimin dərdindən başqa, (onun) sonu yoxdur.

Ayrılıq qəmindən axıtdığım göz yaşı tufanı başdan aşdı,
Ey odlu ahlarım, Allah xatirinə, himayə edin!

Əgər o vəfalı yar ona yol göstərsə,
Düşmənin məlaməti Mahmudu hara apara hilər?

* * *

Bütün güllər yaşıllıqdan boylanar,
Gör nə qeyri-adidir ki, yaşıllıq güllərdən boylanır.

Onun üzündəki saçlardır, yoxsa qara zülfiin kölgəsi,
Ya təzə müşkdür ki, ahunun göbəyindən tər otların
üstünə düşüb?

---

* Nəvvab Mahmud bəyin tərcümeyi-halını təzkirəyə 1309-cu ildə yazsa da, onun ölümü haqqında qeydi şair vəfat edən zaman əlavə etmişdir.

(Onun) saçları yarın üzünün xəzinadarıdır, katib səhvən,
Ora bir xət çəkdi, keşikçi onu hiss etdi.

Səhər saçları yarın üzünə kölgə salmışdı.
Mənim ümidimin gözləri o kölgədən işıqlandı.

Onun gül üzündən qopan hər bir tük,
Tikan olub, mənim ürək quşumun sinəsinə sancıldı.

Mahmud, yarın xəttindən az şikayət et,
Tikan ağrısı hər bir gülşəndə var, gərək dözəsən.

* * *

Araz kənarında sənin qəddin timsalı,
Dostlara layiq bir sənubər (ağacı) bəsləndi.

Gözəlliyin duruşu sənin qəddinlə ölçülür,
Sənin qamətinin qiyaməti çoxdur.

Sənin zülfünü əlimə ala bilsəm,
Ey nigar, bundan sonra getdiyim qıl körpüdən
daha nə qorxum?

Behişt gözəllərinə yaxın da durmaram,
Əgər sənin vəslinə əlim çatsa.

Eşqdən məst olan hər bir kəsin,
Tutulmaqdan nə qorxusu ola bilər?

Şəkər həsrətiylə başına dəyən milçəyin,
Sənin dodaqlarındakı baldan xəbəri yoxdur.

Sənin zülfünün sevdasıyla,
Mahmud öz canını əlində sənə hədiyyə gətirib.

* * *

Bu nə dərddir ki, dərmanı yoxdur?
Bu nə hicrdir ki, sonu yoxdur?

Zülfünün verdiyi əzabdan gecələr ağladığım bəsdir,
Göz yaşım bədənimi bürüyüb, canım qalmayıb.

Hicrdə qaldım, necə ağlamayım ki,
Bülbülün gülsüz səsi çıxmaz.

Sənin üzün və zülfünün eşqi ilə,
Yarın gecə-gündüz qərarı yoxdur.

Ey pəri üzlü, sənin pərişan zülfünün üzündən,
Onun nə ürəyi qalmış, nə də pərişanlığı.

Qəm ürək mülkünü viran etdi,
Elə bil ki, (bu ürəyin) bir sultanı yoxdur.

Mahmud sənin canına can qurban verər,
Bilirsən ki, onun başqa bir şeyi yoxdur.

* * *

Əgər zahid bir dəm o sərvin qəddini görsə,
Məhşərə qədər tuba eşqini dilinə gətirməz.

Ürəyim burulmuş zülfün həlqəsində tutulub qalıb,
Leylanın Məcnunu kimi bu zəncirdən mən
qurtara bilməyəcəyəm.

O dilbərdən təəccüb edirəm ki, həm pünhandır,
həm də peyda,
Gizlindən də gizlindir, aşkardan da aşkar.

Eşqin aləmində elə heyran və sərgərdan olmuşam ki,
Heyrətdən nə bu dünyanı, nə də o dünyanı görə bilmirəm.

Bu aləmdə hamının nəzəri səndədir, sənin də
nəzərin onlarda,
Mahmud özü sənə heç bir şey demir, sən bilirsən
onun istəyini.

* * *

Sənin zülfünün küfründən ürək qarışıb, pərişandır,
Onun dadına heç kəs çatmaz, bu nə kafıristandır?

Ürəyim sənin zülfündən bir tük xəyala gətirdi,
Ona görə də göz yaşı tökərək nalə edib yanmaqdadır.

Ürək əgər o zülfün və xalın toruna düşübsə, nə olar?
Xal ürəyin qəmi, zülf isə canın ipidir.

Qaranlıq gecələrdə ürək nəğməsiz olaraq,
Sənin işıqlı üzünün eşqiylə səhərə qədər nalə edir.

O gülşənin ki, şux dilbəri sənsən,
Orada başqa cənnət, gül, huri-qılman nəyə lazım?

Ayazın zülfünə hər kim Mahmud kimi əsir olsa,
Qulağı halqalı bir quldur, sultan da olsa.

* * *

Dilarama, dili-ramənəm qılıb, rəm, hiç ram olmaz,
Ki, sübhi-vəslin açılmaz, şəbi-hicrin tamam olmaz.

Ümidi-vəsli-yar olsa gər, aşiq təlxkam olmaz,
Ola ümmid ilə hicran, cahanda öylə kam olmaz.

Kəmun zülfündə məknundur, şəbi-qədr olduğun bilməz,
Dilər dil yetməyi, leykən müyəssər ol məqam olmaz.

Ləbi-meyguniyin məsti meyə meyl eyləməz hərgiz,
Ki, onda nəş’ə daimdir, vəli meydə müdam olmaz.

Gözün ta məstdir, mərdüm ola xunxar, eyb etməz,
Ki, bəzmi-məstdə daim olur fitnə, nizam olmaz.

Könül “Beyti-səfa" dan, vaiza, beyti-səfa olmuş,
Səfa yadilə nuş etmək meyi-safi həram olmaz.

Məlamət voxdu Məhmudə, qulamə gər qulam oldu,
Fəzavi-eşqdə hərgiz vücudi-nəngü nam olmaz.

**Mahmud bəyin qəzəlləri tamam oldu.**
**Rəbiüs-sani ayı, 1309 – oktyabr, 1309**

**Vər. 383a**

## MİRZƏ SADIQ İMANXAN OĞLU

**Mirzə Sadıq İmanxan oğlu Qarabağın Şuşa şəhərindəndir. Farsca savadı var. İndi təqribən 80-ə yaxın yaşı var. Cavanlığının əvvəllərində xanəndə olub. İndi mərhum Mehdiqulu xanın qızı Xurşidbanu bəyimin dərgahında, onun səxavəti sayəsində güzəran keçirir. Bəzən şeir də deyir. Aşağıda qeyd olunanlar onun şeirlərindəndir.**

**(4 cəmadiəs-sani, 1309 – 5 yanvar, 1892)**

**Mirzə Sadıq 1310-cu ilin cəmadiəs-sani ayında vəfat etdi[*] (yanvar, 1893)**

Qəmi-deydən oldu fariq, yenə çıxdı yaza zülfün,
Salacaqdı mən həzini qəmü dərdi-naza zülfün.

Ona tövri-ruyin, ey məh, yenə dəşti-Yəmən olmuş,
Kim ilən təkəllüm eylər ki, gəlib niyaza zülfün?

Alıb əldən ixtiyarım, dəxi qalmayıb qərarım,
Nə səbəb görəndə könlüm salır ehtizaza zülfün?

Hanı, sağ olaydı Mahmud, eşidib görəydi bir dəm,
Ki, necə şikəst vermiş sənin ol Ayaza zülfün.

Nə səbəb qara bulud tək geyinib qara libasa,
Nədən eyləməz tərəhhüm məni-dilnəvaza zülfün?

Niyə tərki-mehr qılmış, dəxi axtarıb aramır,
Ki, həqiqət əhlin atmış, qoşulub məcaza zülfün.

Ləbin abi-çahi-Zəm-Zəm, ruyin oldu Kə’beyi-dil,
Ki, siyahgun ərəb tək yol açıb Hicaza zülfün.

Dəxi tiri-qəmzən atma, saqın, eylə bir tərəhhüm,
Nə qədr cəfalar etdi məni-pakibaza zülfün!

Niyə bir tərəhhüm etməz Sadığa o xəttü-xalın?
Vəli çox sitəmlər eylər ona taza-taza zülfün.

---

[*] Nəvvab bu qeydi təzkirənin 383 “b” vərəqinin sonunda, Mirzə Sadığın “Qəmi-deydən oldu fariq, yenə çıxdı yazə zülfün” misrasi ilə başlanan qəzəlindən sonra vermişdir.

* * *

Edir hər qəmzədə məqtul yüz canı qara gözlər,
Salıbdır mərdum icrə, gör nə qovğanı qara gözlər.

Sanasan şahi-hindudur, girib yayə kəmin etmiş,
Atar üşşaqə bir-bir tiri-müjganı qara gözlər.

Edən dəm qəsdi-can ol iki türki-şuxü sərməstin,
Biri xəncər çəkər, ol biri pünhanı qara gözlər.

Kəməndi-zülfünü həm tiği-əbrusun çəkib hər dəm,
Salır hər ləhzə dil mülkünə talanı qara gözlər.

İki kafərdi, ya kim, hər biri bir tiği-xunəfşan,
Çəkib, qətl eyləyirlər bir müsəlmanı qara gözlər.

Sənin eşqində, ey şux, eyləyir virdi-zəban Sadiq,
Olum ol qəmzeyi-xunriz qurbanı, qara gözlər!

* * *

Könül, dil vermə kim, dilbər bəladır,
İşi daim qəmü rəncü ənadır.

Təcəlla eylədikcə hüsni-mə’şuq,
Vücudi-aşiqi-miskin fənadır.

Deyil baziçə, rahi-eşqdir bu,
Nə rahi-işrətü eyşü səfadır.

Bu işdə dövləti-Qarun gərəkdir,
Təhidəstə bu iş bəs narəvadır.

Vəzifə əhli-fəqrə eşq bulmaz,
Bu yerdə şahlar miskin gədadır.

Əgər Cəmşiddir, ya kim, Sekəndər,
Şəhi-eşqin əlində binəvadır.

Gözəllər əhdinə çox etmə bavər,
Oların işləri daim cəfadır.

Bu yolda mən də çox yortdum, yügürdüm,
Ki, gördüm axırı bimüntəhadır.

Bəli, gər aşiqi-Sadiq tanılsa,
Ona, əlbəttə, aşiqlik səzadır.

* * *

Dünən gecə qəm içərisində,
Yolum dağlığa düşdü.

Hərislik,mal və dövlət tələsindən,
Bazar adamlarından qurtarıb,

Dostların məhəbbətində qərq oldum,
Şübhədən, təəccübdən azad.

Xəyalımda dost təsvirindən başqa,
Bir kəs yox idi.

Dost deyib hər tərəfi axtardım,
Ağlaya-ağlaya axtardım.

Nagəhan qeybdən,
Ayıqlıq qulağıma belə bir səs gəldi:

Yar axtarırsan, dağa-daşa niyə düşmüsən?
Nə vaxta qədər arsızlıqla yol kəsəcəksən?

Dinini, ürəyini müftə verdin,
Ömrün həmişə istəkdə keçdi.

Get, xəlvətdə öz itmişini axtar,
Boş bir otaqda, divar küncündə.

Yar pərdəsiz qapı-divardan görünür.
Əgər sənin gözün varsa, onları gör!

Alçaqlığın mayası iki şeydir:
Alçaqlarla söhbət və bulvarda avara gəzmək.

* * *

Səri-zülfun tutub yeksər, mənə dil mürği ram olmaz,
Yüz il şərh eyləsəm bu qissəni, axır tamam olmaz.

Təriqi-eşqə ta girdim, bulub keyfiyyəti-halın,
Fənadan qeyri üşşaqa bu yolda hiç kam olmaz.

Vətən tutdun səri-kuyində, yarın itləri içrə,
Təfaxür qıl, könül kim, bundan ali bir məqam olmaz.

Gətir, saqi, qədəh kim,xassə fəsli-gülsitan yetmiş,
Təğaful etmə, əhdi-gül keçər, əldə müdam olmaz.

Halal etdim, tökülsə qanım, ol sərvi-rəvan töksün,
Bəli, hər qan kim, ol sərvi-rəvan töksə, haram olmaz.

Ayaq çək, ey könül, əğyar bəzmindən kənar olgil,
Ki, dildar olmayan məhfildə hərgiz bir nizam olmaz.

Məni rüsvayi-aləm etdi sövdayi-səri-zülfün,
Zəhi rüsvalığı kim, onda nə nəngü nə nam olmaz.

**Vər. 385b**

## MUSTAFA BƏY BEHBUDOV

**(1309-cu il – 1891-92)**

**Cənab Mustafa bəy mərhum Qasım bəy Zakirin qardaşı Əli bəyin oğlu Şahverən bəyin oğludur. Bu iki qardaş da (Əli bəylə Qasım bəy) cənab Pənah xan Sarıcalı Cavanşirin qardaşı Hüseyn Əli ağanın oğlu Kazım ağanın övladı Şahverən bəyin oğlanlarıdır. Onların əsli Qarabağın Şuşa şəhərinə tabe olan Xızrıstan kəndindəndir. Mustafa bəy ana tərəfdən Baba bəy Cavanşirin nəvəsidir - o da şair idi. Mustafa bəy uşaqlıqda çox əziyyətlər çəkib. Belə ki, böyük qardaşı Behbud bəy rus dövləti qarşısında müttəhim olub, kazak və yolkəsənlər zümrəsinə daxil olmuşdu. Nəhayət, onu öldürüb nəşini qalanın kənarına qoymuşdular. Mən də onun nəşini gördüm. Yaxşı bir cavan idi. Onun qətlindən sonra rus dövləti onun bütün qohum-qardaşını ailəsilə birlikdə əsir edib, Şuşaya gətirdilər. Bəzilərini həbsxanaya atdılar, bəzilərini də Sibirə göndərdilər. Əsirlərin içində Mustafa bəy də var idi. O vaxt on yaşında idi. Onu da əsir kimi çılpaq, bircə arxalıqda və alt paltarda rus məktəbxanasına gətirdilər. Mən də o vaxt o məktəbxanada təhsil alırdım. Onunla dostlaşdım. Vilayət hakimi Tərxanov sonradan onun hamisi olub, xərcini verirdi. Nəhayət, rus və müsəlman elmlərində kamilləşdi. Hal-hazırda Şuşanın bir fərsəxliyində (6 km) olan ştabda yaşayır. Yaşı əlliyə çatar. Görkəmi eyibsiz, özü zəif, göygöz, ürəyəyatan və zarafatcıldır. Bəzən şeir də deyir. Həcv deməyə maildir. Şeirləri Mustafa adıyla deyir. Aşağıdakı şeirlər onun təbinin nəticəsidir. Əlimə keçdi və buraya yazıldı. Rəbiəs-sani, 1309**

### MUSTAFA BƏY BEHBUDOV XIZRISTANİ (Xındırıstani)

Qoymaz bu gündə zar məni yar, yar ola,
Hicri-rüxündə didələrim əşkbar ola.

Etdi rəqib bəzmi-hüzuru mənə haram,
Tiri-bəlaya sinəsi, ya Rəbb, düçar ola.

Ya Rəbb, özün xilas elə bu dərdü qüssədən,
Görmə rəva ki, bunca könül biqərar ola.

Qəbrə girincə çəkmənəm əl tari-zülfdən,
Hər tarı boynuma dolanıb şahmar ola.

Qətli-am üçün əgər ki, çəkə tiğ qaşların,
Sən kimi tiğzən, nə belə zülfiqar ola.

Qurban olum o gül üzə, meygun ləblərə,
Qurban olum o gözlərə, meysiz xumar ola.

Sənsiz behiştə meyl edən adəm deyil yəqin,
Sənsiz cahanda, heyifdi, leylü nahar ola.

Sənsiz nişati-eyş məhərrəm nişanıdı,
Sənsiz haramdır gül aça, növbahar ola.

Səd heyf, dilbəra, biləsən qədrim ol zaman,
Nə mən tək aşiqin, nə belə rüzgar ola.

Cövri-zəmanə gətdi səni təngə, Müstəfa,
Bir nalə çək, bu çərxi-fələk tarü mar ola.

**Vər. 388a**

## AĞA MİR MEHDİ XƏZANİ

**Cəmadiül-əvvəl, 1309 – dekabr, 1891**

**Ağa Mir Mehdi Ağa Mir Haşım oğlu Qarabağ əhalisindəndir, kənddən - Bərgüşad mahalının Mamırlı kəndindən - Tuğ sakinidir. Hal-hazırda yaşı həştada çatar. Musəvi nəsəbdir. Zirək bir kişidir. Ərəb, fars və türk dillərində savadı vardır, gözəl xətti var. Həkkaklığı da bacarır. 1300-cü ildə (1882-83) dini ehkam və məsələlərə aid ibtidai məktəb uşaqları üçün bir risalə tərtib edib, nəzmə çəkmişdir. O risalənin adı "Şəraitül-islam"dır. 1302-ci ildə (1884-85) risalə mənim çapxanamda iki yüz tirajla nəşr edildi. Şeir deməyə də həvəsi var. Aşağıdakı şeirlər o seyyidin xəyalatındandır. O cənabın təxəllüsü Xəzanidir.**

### O RİSALƏDƏN BİR NEÇƏ BEYT

Betürki mənzumədir bu türfə kəlam,
İsmidir həm "Şəraitül-İslam".

İbtidadır benami-həqqi-qədim,
Saneü qadirü həkimü əlim.

Həmdü şükr olsun ol xudavəndə,
Kim, o Allahdır, bizik bəndə.

O yaratmış tamam dünyanı,
İnsi, cinni, nəbatü heyvanı.

Atəşü abı, badi, həm xaki,
Günü, ayı, nücumu, əflakı.

Asimanü zəmini var etmiş,
Bisütun göyləri qərar etmiş.

Həm sələvatü salami-bite'dad,
Bər Məhəmməd və alihül-əmcad.

### MİR MEHDİ XƏZANİNİN HƏSƏNƏLİ AĞA XAN QARADAĞİYƏ YAZDIĞI CAVAB

Ey mənim gülzarımın növrəstə gülü,
Xoş iyli nihalım, ağacım mənim.

Bir neçə misra ilə dürr səpirəm ki,
Mənim şeirim sənə məlum olsun.

Mən də hərdən şeir deyirəm,
Ancaq belə bir şeir mənim işim ola bilməz.

Hər bir sözü ülfətli, iltifatlı,
Hər nöqtəsi canlıdır.

Gileylənməkdən mənim heç bir xəbərim yoxdur,
Və heç bir kəslə də mən söhbət etməmişəm.

Mən sizin çoxdankı duaçınızam,
Dərvişlik və gədalıq mənim üçün ar deyil.

Sənin canının qurbanı mənim ürəyimdir,
Ondan artıq bu bazarda mənim mayam yoxdur.

Ey mənim sahibim, pərəstiş etdiyim, ruhum,
Mənim xəstə ürəyim nə vaxt şəfa tapacaq?

Hərdən öz halından mənə yaz,
Ki, mənim qanlı ürəyim xəbərdar olsun.

## YENƏ MİRZƏ MEHDİ XAN QARADAĞİYƏ YAZIB

Yetişsə hər zaman, Xana, bizə əş’arın olmazmı?
Misali-bülbüli-şeyda şəkər küftarın olmazmı?

Mənim piranədil cağım, xəzanvəşdir gülüstanım.
Sənin bürnalıq əyyamın, sərində barın olmazmı?

Çəmən sün’i-təravətdə, ənadil eyşü işrətdə,
Ozün yar ilə söhbətdə, dəxi bir karın olmazmı?

Təmamən təng ovqatəm, mənim qəmxanədir könlüm,
Dəxi bir qeydü qəm məndən görən sərkarın olmazmı?

Qəmü dərdü məlamətdən xəbər verdi bu əş’arın,
Təvəkkül eylə sən, Xana, xuda həm yarın olmazmı?

* * *

Övzai-dəhr, kari-cahan, dövri-ruzigar,
Daim təğəyyür ilə təbəddül qılıb şüar.

Bundan qiyas eylə ki, gör gah yay olur,
Gahi xəzanü gahi zimistan, gəhi bahar.

Güldən gedər o ətrü səfa gördüyün tamam,
Biçarə əndəlib olur bağdan kənar.

Gəh bir zəlili qaldırıban dəhr edər əziz,
Eylər cahana xosrovü sultani-kamkar.

Gəh bir əzizi sərvərü sultan, xan ikən,
Eylər bu ruzigar cahanda zəlilü xar.

Ari, Xəzani, dəhrdə bu rəsmdir qədim,
Əbəttə, bu fənaya könül vermə, zinhar.

**Vər. 391a**

## ƏBDÜSSƏMƏD BƏY

**Cəmadiyəl-əvvəl, 1309 – dekabr, 1891**

**Əbdüssəməd bəy Behbud bəy Zəngilaninin oğlu Məhəmməd bəyin oğludur. Məhəmməd bəyin əhvalı əvvəldə qcyd olunub. Əbdüssəməd bəy 35 yaşlı cavandır, farsca savadı var. Bəzən şeir də yazır. Aşağıdakı şeirlər onundur. Təxəllüsü Aşiqdir.**

Əla, ey dildə sakin, didədən məstur olan yarım,
Xəyalı munisi-can, vəsli naməqdur olan yarım.

Fələk gərçi məni məhcur qılmış gül üzarından,
Könüldən dişrə bir ləhzə deyilsən dur olan, yarım.

Çıxarmaq eşqini müşküldü candan, ey məlahətgu,
Çıxarda canı xüd təndən məgər məzkur olan yarım.*

Məni-mədhuş, ey huş əhli, tut mə’zur kim, badə,
Veribdir nuşi-lə’lindən mənə məxmur olan varım.

Sənə qilmanü hurivü behiştin qalsın, ey zahid,
Mənə huridən artıqdır bu dəm mənzur olan yarım.

Tərəhhüm evləməz viranə könlümdən gələn yaşa,
Binayi-eşqi daim əşk ilə məmur olan yarım.

Deyil bimehrlikdən Aşiqin tərk eyləmək, haşa,
Səni el tə’ni məcbur eyləmiş, məzur olan yarım.

* * *

Salmazdı ol pərivəş hərgiz məni nəzərdən,
Saldı məni kənara bədgulər ol həzərdən.

Nəqşi-rüxün gözümdən məhv etsə abi-didə,
Sevdayi-zülfü xəttin çıxmaz ölüncə sərdən.

Urma bu cismi-zarə bica bu qədri yarə,
Nuki-müjən keçibdir, xatircəm ol, ciyərdən.

---

* Bu beyt təzkirənin çap nüsxəsində yoxdur.

Bu kim, gəlir gözümdən gülgün sirişk daim,
Xuni-ciyərdi cümlə cari bu rəhgüzərdən.

Cövrün nə qədr olsa, minnətdi cana, amma,
Billah, cəfa yaraşmaz sən kimi simbərdən.

Hicrində cismi-zarım dönmüş quru nihalə,
Gərçi alır dəmadəm suyun bu çeşmi-tərdən.

Yüz cövr qılsan Aşiq tərk etməz asitanın,
Olsa qulun vəfası, getməz ölüncə dərdən.

* * *

Hər zaman yüz min pərişanlıq qılır izhar zülf,
Bir könül oldur ki, cəm olmaz nə qədr var zülf.

Küfr ilə zülfü qələti-məşhur olub dildarımın,
Bəs ki, iman əhlinə məşhurdur əsrar-zülf.

Bir telin gər tərpədə badi-səba, yüz min könül,
Yüz qoyar pabusuna, guya qılıb əhzar zülf.

Kəbədən üz döndərib, qiblə deməzdim qaşına,
Tərki-dinü millətə vadar edir naçar zülf.

Var idi əqlim, vəli uydum əbəs geysulərə,
Aqibət çəkdi məni bazarə Məcnunvar zülf.

Aşiqə aşiq demin kim, eşqdə avarədir,
Ol zamandan kim, düşüb ortaya bu küffar zülf.

**Vər. 392b**

## İSMAYIL BƏY DARUĞƏ

**Cənab İsmayıl bəy mərhum Mirzə Allahqulu bəyin oğludur. Qarabağın Şuşa əhalisindəndir. O şəhərdə anadan olub. İndi yaşı əlli beşə çatar. Təxəllüsü Daruğədir. Şəhərin darğalığı da onun əlindədir. “Məclisi- üns”ün şairlərindən biridir. Hərdən farsca və azərbaycanca şeirlər də deyir. Divanı voxdur. Şeirlərindən ancaq aşağıda yazılanlar əlimə düşdü. “Məclisi-üns”lə sual-cavab etdiyimiz məsnəvilərdə adını çəkmişik. Rəbiül-əvvəl, 1310-cu il hicriyyə və 1892-ci il rusiyyə (oktyabr).**

Heç kəsin mənim kimi şirindil yarı yoxdur,
Onun qaşlarının ürəyimə verdiyi əzab yüz dağyaranın qəmi qədərdir.

O dünya gözəlinin zülfünün işi pərişanlıqdır, lakin,
Mən onu dağıtmaq istəmirəm, çünki onun qıvrımları mənə vətəndir.

Onun küçəsinin məcnunu olmuşam, məni daim özünə tərəf  çəkir.
Onun saçının hər bir tükü boynumda yüz kəndir kimidir.

Təbiblər mənə dərman verdilər, ancaq bilmədilər ki,
Ürəvimdəki köhnə yara onun kirpiklərinin oxundandır.

Başımda ancaq onun sevdasıdır, özümü düşünmürəm,
Onun küçəsinin şəhidiyəm, əynimdəki kəfənimdir.

Yardan şikayət etmirəm, sakitliyimi də verirəm,
Onun eşqinin qəm yükünü çəkərəm, o vaxta qədər ki,
bədənimdə can var.

O qönçə üzdən Daruğəyə şikayət apardım,
Bu dərdə görə onu özümdən də qəmli gördüm.

* * *

Sənin üzünə tökülmüş o kəkil,
Aşiqlərin ürəyinə çox cəfa dağı çəkib.

Ürəyimdə yüz sözüm var, yüz də qəmim,
Sənin üzünə çəkilmiş o xaldan.

Mənim gündüzüm gecəyə dönür,
Sənin gülüstan üzündə o xətlər görünəndə.

Miskin aşiqin yolunda sənin qara zülfün,
(Elə bir) tələdir ki, üzünün ovçusu onu möhkəm toxuyub.

O kəs ki, sənə olan eşqimi tənqid edir,
Bilirəm ki, səni göz-gözə görməyib.

Sənin eşqindən dünyada rüsvay olan təkcə mən deyiləm,
Sənin eşqin hamının namus pərdəsini parçalayıb.

Divanəliyimin artıq bir əlacı yoxdur,
Uşaqların əlindən qurtarıb, Daruğənin əlinə keçmişdir.

**Vər. 394b**

## AXUND MİRZƏ NƏCƏFQULU

**(Cəmadiəl-əvvəl, 1310 – dekabr, 1892)**

**Cənab Axund Mirzə Nəcəfqulu Hacı Ağacanın oğlu, o da mərhum Məşədi Ağakişinin oğludur. Qarabağ vilayətinin əhalisindəndir və Şuşada anadan olub. Bir neçə il əvvəl bütün koç-külfətiylə bərabər Təbrizə köçübdür. Orada evlənib, oğul-uşaq sahibi olub. Sonradan - səkkiz il olar ki, yenidən Qarabağa köçüb gəlibdir. İndi Şuşadadır. Yaşı həştad, bəlkə də bir-iki il artıq olar. Peşəsi rövzəxanlıqdır. Ərəbcə, farsca savadı var. Hərdən şeir də deyir. Heyif ki, şeirləri pərakəndədir, divanı yoxdur. Aşağıdakı qeyd olunmuş şeirləri o özü gətirib (Məclisi-) "Fəramuşan" da mənə təhvil verdi ki, təzkirəyə yazılsın, onlar da yazıldı. Təxəllüsü Şəms Zakirdir.**

### ŞƏMS ZAKİRİN ŞİKAYƏT VƏ NƏSİHƏT ÜSULU İLƏ (YAZDIĞI) MƏSNƏVİSİ

Qulaq as, ey bu dünyadan razı olan,
Gör bu qoca sənə nə deyir.
Gözünü aç. ürəyimin gözünə bax,
Həqiqətlər (o vaxt) hamısı sənə kəşf olunar.
Keçmişi, gələcəyi, indini bil,
Bu dünyanın qilü qal dərslərini oxu.
Bax, onlar ki, dünyanın əzizləridir,
Xalq arasında necə fəqir və möhtac olur.
Yüksək mövqe tutmuş bir neçə gədaya bax,
Əlləri onun-bunun qanına batıb.
Əynində parlayan atlasın qırmızılığı,
Ciyər qanından rəng alıb.
Onların çörəyi müflislərin gileyinə qarışdığından,
Əlləri çopur-çopur olmuşdur.
Onların zahirən şərbəti qənd ilə sudan,
Geyimləri qu tükü, xəz və ipəkdən olsa da,
Binəva və qəriblərin göz yaşından,
Miskin, yetim və köməksizlərin malı (hesabınadır).
Dul arvadlar döyülər,
Xoşbəxtlər isə zər balışa dirsəklənər.
Ey binəvaların zülmünə adət etmiş,
Bir dəfə qəbiristan tərəfə get, (gör),
Al yanaqlılar məzarda yatır,
Gül üzlülər torpaq altında.

Dilrübalar qəmdən növhə deyirlər,
Sinələrinə daş-kəsək vura-vura.
Məzarda yatanların hər birinin baş daşı,
Ay üzlülərdən sənə xəbər verir,
Hamısı "Fətəbək şeytü ülül-əbsar" * ayəsini
oxuya-oxuya gedirlər.
İlahi, nəsihətlərimin təsiri olsun,
Sənin dərgahından başqa bir nicat yeri yoxdur.
Şəms Zakiri hifz elə, ey Xuda!
Peyğəmbər, zülm edənlərə cəza ver!

## MƏSNƏVİ

Var əlimdə atəşinü xunin qələm,
İstərəm atəşkədə eylim rəqəm.

Bəs ki, sinəm od tutub, suzan olub,
Əşki-çeşmim qətrə-qətrə qan olub.

Çün olur sinəmdə atəş şö'ləvər,
Şöləsindən xaməyə eylər nəzər.

Sinədən şölə düşəndə xaməyə,
Xamədən eylər sirayət naməyə.

Atəşinxamə, ciyərxun olmuşam,
Dustan, çarə ki, Məcnun olmuşam.

Qoymayın viranə bu viranəni,
Bağlayın zəncirə bu divanəni.

Bağlayın divanəni tədbir ilən,
Bağlasaz yüz min əgər zəncir ilən,

Qırram ol zənciri, ollam biqərar,
Eylərəm kuhü biyabana fərar.

Bağlayın bir tari-zülfi-yar ilən.
Ol kəməndi-türreyi-tərrar ilən.

---

* Quran. Nəsr surəsi, 2-ci ayə:
"...Ey bəsirət sahibləri, ibrət alın".

Yoxsa ki, zənciri para eylərəm.
Üz qoyub səhraya, "yahu" söylərəm.

Ollam, ey yaran, yenə mən sərzədə.
Eşq odu bir oddu nari-mövsədə.

Şəmsi-biçarə, yetib vəqti-küsuf,
İncila, istə ze Yəzdan ətuf.

## ŞƏMS ZAKİR MİR MÖHSÜN NƏVVABA YAZIB 1310-CU İLDƏ (1892-93)

Ey Nəvvab, ehsan və səxavətdən doğulmusan,
Xilqətdə ali-Heydərsən, reyhanın ruhusan, canın munisisən.

Əhməd nəslindənsən, özün də Əhmədi-Muxtar,
Zəhra mədəninin cəvahirisən, yaxud mirvarisi,
ya mərcanı sənsən.

Sənin yarandığın günə xoş olsun, ey kərəm sahibi,
Ki, sənin yaradılışın iman nurundan və dörd ünsürdən ibarətdir.

Övlad həmişə həqiqi valideyn sirrini qoruyar,
Sən Məhəmməd peyğəmbərin nurunu, həqiqəti kəşf eliyən
və imanın əsasısan.

Səni gah gül kimi açılmış, gah da solmuş görürəm.
Səni bəzən bülbüllər kimi gah nalə edən, gah gülən görürəm.

Hər kəs ki, mən yazığın ruzisini kəsərsə.
Qiyamət günündə onun əlinin qırılmasını istərəm.

Şəms olub, İrandan uzaq düşmüşəm,
Məni qanmaz və biiman ayrı salıb.

**Vər. 396a**

## HƏSƏN QARA QARABAĞİ

**(1309-cu il)**

**Ağa Həsən bəy Rzaqulu bəy oğlu Qarabağın Şuşa əhalisindən, Hacı Yusifli məhəlləsindəndir. Şuşada da anadan olub. Özünün dediyinə görə, indi 65 yaşı var. Düz əxlaqlı, qarasifət, qaragöz bir kişidir. Təxəllüsü Hadidir. Ticarətlə məşğuldur. Həcvlər, satiralar, qəzəllər və s. pərakəndə şeirləri var. Aşağıda qeyd olunmuş qəzəllər onun təbindəndir və öz dəsti-xəttiylə yazılıb.**

**(Rəcəbəl-mürəccəb ayı, 1309–1892-ci il Rusiyyə, fevral ayı)**

Şəbi-zülmati-zülfündə fəğanü ahü zarım var,
Vüsali-sübhi-ruyin feyzinə çox intizarım var.

Kəsilmiş taqətü tabü təvanım, tarı şahiddir,
Nə yol bullam vüsalə, hicrə nə səbrü-qərarım var.

Nigara, məhcəbina, qəddi-sərvin iştiyaqında,
Edən hər ləhzə cari çeşmə çeşmi-əşkbarım var.

Sənə birəhmlik bunca nədəndir, bilməzəm, zalım,
Gətirməzsən xəyala kim, mənim bir dilfikarım var.

Hüzurunda, əzizim, zərrəcən hərçənd qədrim yox,
Vəli qəmlər yanında şaxəsəm, çox etibarım var.

Ləbin zikri füsun tək dəmbədəm virdi-zəbanımdır,
Ney qəm, zülfün kimi hərçənd yüz min şahmarım var.

Sənin Əqdi-Sürəyya tək cəbinində ərəq mənzum,
Mənim də xab görməz dideyi-əncümşümarım var.

Görüb əhqər məni, çəkmə ayaq möhnətsarayımdan,
Əlimdə nəqdi-can tək xaki-payinçün nisarım var.

Açar müjgan oxu, Hadi, xəyalımdan neçə rövzən.
Xəyali görməyə vəh-vəh, nə bəxti-huşiyarım var!

* * *

Bəli, təsvirim ol gün kim, fələk nəqqaşı çəkmişlər,
Bəlavü möhnətü dərdü qəmin yoldaşı çəkmişlər.

Nə divanxanədir hüsnün kim, ol dari-hükumətdə,
Gözü hökm eyləyən hakim, müjə fərraşə çəkmişlər.

Çəkəndə qəmzənin nəqşin qəza surətgəri, billah,
Təmamən məkrü təzvirü fünunun başı çəkmişlər.

Yazanda qətli-üşşaqa rəqəm divani-fitrətdən,
Mənim fərmani-qədimdə qılıc tək qaşı çəkmişlər.

Yüzün çünki hərami məskənidir dilrübalıqda,
Budur vəchi, ona həmdəm neçə övbaşı çəkmişlər.

Gözü qaş, müjə, qəmzə, o xalü xət məazallah!
Olub həmsirr bir yerdə, onun sirdaşı çəkmişlər.

Rəqibi çəkdilər üstadi-bəzmi-vəsl üçün məhrəm,
Məni hər bir qəmə ustad, vəslə naşı çəkmişlər.

Olanda qisməti-Fərhad kuyi-Kə’beyi-Şirin,
O gün Məcnunü Leylaya vətən dağ-daşı çəkmişlər.

Çəkiblər əhsəni-təqvimidə əfradi-insanı,
Nədən bədməst, kəmtale məni-külbaşı çəkmişlər?!

Zənəxdanü ləbə həsrət qalan Hadi, sənə ancaq,
Ciyər qanı qəza olmuş, səmər göz yaşı çəkmişlər.

* * *

Sevdayi-zülfə ruzi-əzəl intihab ilə,
Düşdü könül, əlaqəsi yox xurdü xab ilə.

Çox pənd verdim, üzmədi əl tari-zülfdən,
Çəksin cəzanı həşrə kimi piçü tab ilə.

Qəmzən olur həramilərə hər zaman yataq,
Aqil gəzər bu mərhələdə ictinab ilə.

Qaşın kaman, qövsi-quzeh, ya hilaldır?
Peyvəst olubdur bir-birə yüz inqilab ilə.

Bildim səbəb nədir ki, ciyərxab olub gözün,
Sərməstlər həris bulurmuş kabab ilə.

Gördüm üzündə zülfü, olub heyrətim füzun,
Yelda düşübdü bir yerə çün aftab ilə.

Yadi-ləbinlə xəlq çəkər başa bədəni,
Yoxsa kimin olurdu rücui şərab ilə?

Göstər qıyami-qaməti, həşri-qiyaməti,
Eylə bəyan xəlqə sualü cavab ilə.

Biçarələr bulub o zaman kami-vəslini,
Nakamlar bərabər ola kamyab ilə.

Hadi, qaraya batsın onun qarə gözləri,
Öldürübdü quli-bədməsti bu əzab ilə.

* * *

Sən kimi xosrovi-şirinləbi-xuban olmaz,
Dəhənin şəkkəri tək çeşmeyi-heyvan olmaz.

Hüsni-Misrində Züleyxa sənə tuş olsa, deyər:
"Bu məlahətdə, əzizim, məhi-Kən'an olmaz".

Rəvişi qəddini əzbəs ki, görüb sərvi-çəmən,
Oldu pabəstə, budur vəchi, xuraman olmaz.

Görsə gülşəndə, təbəssüm eləyər qönçə ləbin,
Həşrədək lal qalır, xürrəmü xəndan olmaz.

Arizində nə əcəb güllər açılmış bu zaman?
Gəzəsən yer üzünü, böylə gülüstan olmaz.

Çeşmi-cəlladına kafər desələr, qeyz eləmə,
Rəhmsiz kimsənə, adətdi, müsəlman olmaz.

Daneyi-xalına meyl eyləyən ol qafillər,
Belə, fikr eylədilər, çahi-zənəxdan olmaz.

Düşdü başıma mənim zülfün uzun sevdası,
O, başımdan çıxa, haşa, ona dərman olmaz.

Gördü bazarda, könül oldu bu sevdayə düçar,
Belə sevdada necə sud olu, nöqsan olmaz?

Hicri-lə'lində gözümdən tökülən qan-yaşa,
Rəhm qılmaq, gözəlim, küfr deyil, qan olmaz.

Hər təbibə yetişib, dərdimi qıldım izhar,
Dedi: "Biçarə, sənin dərdinə dərman olmaz".

Hadiya, muri-mühəqqər kimi ərz et halın,
Yer üzündə belə şövkətli Süleyman olmaz.

* * *

Könül nə zülfünə bel bağlayaydı, xürrəm olaydı,
Nə cövri-şanə çəkəydi, nə zarü dərhəm olaydı.

Nə hərgiz elmi-müəmma olaydı aləmdə,
Nə nöqteyi-dəhənin böylə sirri-mübhəm olaydı.

Nə gözlərinə olaydı qəza ciyər qanı,
Nə kirpiyin ona xəncərmisal həmdəm olaydı.

Nə tiri-qəmzəyə talib olaydı suzan dil,
Nə ah şölə çəkəydi, nə didə pürnəm olaydı.

Nə arizini ərəq bus edəydi mərhəm tək,
Nə gül üzündə, görüm, həşr olunca şəbnəm olaydı.

Nə əmrü nəhydən e'raz edəydi bir aşiq,
Nə rövzə içrə o bie'tibar Adəm olaydı.

Nə xubrulər adı bivəfalıqda məşhur,
Nə əhli-eşq məcazi hərimə məhrəm olaydı.

Olaydı xəlqi-cahan cümlə qüssədən azad,
Tamam dərdi-zəmanə mənə müsəlləm olaydı.

Nə, Hadi, vəsl sənə üz verəydi aləmdə,
Nə ol rəqibi-siyəhdil hərifi-aləm olaydı.

* * *

Hər bir könüldə üns ola zülfi-siyah ilə,
Dövran ona həmişə gərək keçməsin ah ilə.

Zənciri-zülfə bənd olan üşşaqi-zar üçün,
Aşüftəlik müdam keçər salü mah ilə.

Saldım xəyala zülfü könüldə, bu türfə kim,
Şahmarı bağrıma basaram intibah ilə.

Sübhü məsada zülfü rüxün zikri əzbərim,
Yox qeyr işim cahanda səvabü günah ilə.

Sultani-eşqi gör kim, ona qeydi-zülfdə,
Kəmtər gəda bərabər olur padşah ilə.

Qəmzən səbəbdi qətlimə, ya şahmar zülf ?
Qaldım bu əmri-müşkülara iştibah ilə.

Bədnam qədimə zülfün adın, gözdən et həzər,
Çox evləri xarab eləyib kəc nigah ilə.

Tapdın kəməndi-zülfdə, Hadi, səadəti,
Ol həbsdə keçir gününü izzü cah ilə.

## XURŞİDBANU BƏYİMİN ÖZ YANINDA ONUN QƏZƏLİNƏ DEYİLMİŞ NƏZİRƏ

Səriri-səltənətxaneyi-hökmran, ölmə,
Şükuhi-əhli-hərəm, izzi-xanədan, ölmə.

Neçə sənubərü sərvin başın kəsib getmə,
Olan behişti-cahan içrə bağban, ölmə.

Məhəbbət aləmini seyr edər də mürği-dili,
Vəfa nihalın edən yengi aşiyan, ölmə.

Əzizə, möhtərəmə, kamilə, həmidəsifat,
Rümuzi-nəzmdə bimislü nüktədan, ölmə.

Həqiqət əhlinə sənsən ziyayi-bədri-cahan,
Düri-yeganəvü xurşidi-banuvan, ölmə.

Behişt əhlinə yetməz zavali-dəhri-dəni,
Güli-riyazi-irəm, huriyi-cinan, ölmə.

Sədayi-şövkətü şə’nin tutubdur afaqı,
Xəzinə gövhərisən, rəşki-xosrovan, ölmə.

Xəlil zurriyyəsi cümlə xasü amə pənah,
Məlazü mülcai-ə’yanü əşrəfan, ölmə.

Ölüm məqamı deyil, rəhm qıl cavanlığına,
Cavandılar, gözü yaşlı qoyub, cavan, ölmə.

Xəzan yetəndə gülə dəmbədəm ziyadələnir,
Fəğani-zümzümeyi-şuri-bülbülan, ölmə.

Şikəstəxatirü bitablar təvanası,
Şikəstəxatir olub indi Natəvan, ölmə.

Hüzuri-feyzini dərk etməyən həzin Hadi,
Bu qeybət içrə deyir heyfsən, aman, ölmə!

* * *

Dolanır qatilim məxfi göz ilə qaş arasında,
Olur qan, şübhəsiz, şəksiz, buların faş arasında.

İşarə eyləyir qəmzən səfı-müjganına hər dəm:
Tökün qanın, edin pünhan iki yoldaş arasında.

Urarlar zəxmi zəxm üstən mənə navəklərin hər yan,
Belə kafərlərin qaldım məni-külbaş arasında.

Xəyali-xalilə rüxsarda nərd oynayan könlüm,
Uduzdu mayeyi-səbrin əcəb qəllaş arasında.

Hesab etdi məqami-əmn bu könlüm, könlünə girdi,
Çıxa bilməz o kəslər tək  ki, qaldı daş arasında.

Çəkə bilməz müsəvvirlər uzun illər qaşın tərhin,
Nə müddətdi kəşakəşdi neçə nəqqaş arasında.

Gülüm gülrüxlər ilə əzmi-seyri-gülsitan etmiş,
Məni-biçarə onlarin olaydım kaş arasında.

Şüai-mehri-ruyin tabına tab etməyən Hadi,
Qalıb viranələr küncündəki xəffaş arasında.

* * *

Qədi-mövzunun edər sərvi-xuramanı xəcil,
Pərtövi-mehri-rüxün mehri-dirəxşanı xəcil.

Zülfi-mişkini-müsəlsəl girəhin açsa səba,
Nikhəti eylər onun ənbəri-saranı xəcil.

Nərgisin nərgisini nərgisin etmiş bimar,
Nuki-xunriz müjən xəncəri-bürranı xəcil.

Dəhənin həsrəti susən tək edib qönçəni lal,
Şərbəti-lə'li-ləbin şəhdi-müsəffanı xəcil.

Hər təkəllümdə edərsən neçə əmvat əhya,
Belə e'caz edər, əlbəttə, Məsihanı xəcil.

Xəlq, derlər ki, təfaxür çox edər Yusifinə,
Bas qədəm Misrə bu dəm, eylə Züleyxanı xəcil.

Gəzmə əğyar ilə, insaf qıl, ey mayeyi-naz,
Etmə bədgulərara Hadiyi-nalanı xəcil.

* * *

Bir sərvqədü qönçələbü xubru məni,
Heyran edib camalına bigüftgu məni.

Əbruvü çeşmü qəmzə sərasər edib hücum,
Xunrizlər salıbdı araya qəmu məni.

Divanə etdi ol pəri səhranəvərd ikən,
Zənciri-zülfə çəkdi, çəkə kubəku məni.

Pabəndiyəm, fərar edə bilməm o zülfdən,
Şahmarvar çalsa əgər mubəmu məni.

Cəhd eylədim ki, eşq qəmin eyləyim nihan,
Əşki-rəvanım eylədi biabru məni.

Bir mumiyan vəslini çox etdim arizu,
Incəltdi mu təki bu məhal arizu məni.

Məhv olmuşam xəyali-dəhaniylə, öylə kim,
Min nüktədan tapmaz, edə cüsticu məni.

Müjgan sanı yaramı ona eylərəm sübut,
Çeşmi-xumar ilə edələr rubəru məni.

Qoymaz hərimi-vəslə tapan bəlkə bir təriq,
Hadi, rəqibi-səngdilü ziştxu məni.

* * *

Hər kəs ki, məst gözlərə bir dəm nigah edər,
Başın salır bəlalara, ömrün təbah edər.

Zənciri-zülfə bənd olu xal istəyən könül,
Mən tək üzünü tirə onun dudi-ah edər.

Tutmaz əli qubar kimi vəsl damənin,
Hərçənd özün ayağa salıb, xaki-rah edər.

Peyvəstə aşiqə budur eşqin nəticəsi,
Rəngini kəhrüba, bədənin misli-kah edər.

Etməz əzab kimsəyə bir kimsə cürmsüz,
Kafər gözündü, qəsdi-dili-bigünah edər.

Sultani-eşq olmuş əcəb ixtiyari-küll,
Şahi gədavü gədanı əgər etsə, şah edər.

* * *

Cəfayi-xar ilə bülbül  gülü gülzardan keçməz,
Urar hərçənd yara yar, yara yardan keçməz.

Tökər əbrulərin gərçi görəndə xuni-üşşaqı,
Təvəhhüm eyləməz bir kimsəyə, ol didardan keçməz.

Gözün hər əmrə iqdam eyləsə, bir kəs deyil mane,
Görən nazik məzacın xatiri-bimardan keçməz.

Bəlayə çün deyib aşiq bəla, ruzi-əzəl, axir,
Yetə yüz min bəla hərgiz keçən iqrardan keçməz.

Çəmən sərvindən əl çəkmiş, deyil pabənd ona könlüm,
Ləbin zikrin edər əfsun, dəmi-şahmardan keçməz.

Görə əbrulərin taqın müsəlsəl zülf ilə zahid,
Sücud eylər kəlisa tağına, zünnardan keçməz.

Düşə hər aşiqin başına sevdayi-səri-zülfün,
Əgər başı cidaya keçsə, ol bazardan keçməz.

Vəfa rəsmin unutma, Hadiya, gör kim, necə Mənsur,
"Ənəlhəq" kəlməsin yaddan çıxarmaz, dardan keçməz.

**Vər. 403a**

## MİR İBRAHİM

**(Şəvval, 1309-cu il – may, 1892)**

**Mir İbrahim Mir Möhsün Nəvvabın oğludur. Qarabağın Şuşa şəhərində 28 rəbiüs-sani, 1288-ci ildə, gün çıxandan 3 saat 52 dəqiqə keçmiş, Sünbülə bürcünün 9-cu dərəcəsində anadan olmuşdur. Yuxarıda qeyd olunmuş tarixdə yaşı 21-ə çatır. Elmdə, təhsildə və şeirdə təzədir. Farsca, ərəbcə, rusca və fransızca oxuyur. Həvəsləndirmək və maraqlandırmaq məqsədiylə onun bir neçə şeirini bu təzkirəyə qeyd etdim. Şeirlərini Miriş ləqəbiylə yazır. Aşağıda yazılan şeirlər onundur.**

Nədən ol mahü mehr üzlüm mənə bir ləhzə ram olmaz?
Neçün dərdü qəmi hicrində bəs ömrüm tamam olmaz?

Gülə mail olan könlüm gəzər şeydasifət hər yan,
Şikəstə bülbüli-zarə gülüstanda künam olmaz.

Keçər hər bir günüm hicranda yüz il ahü zar ilə,
Məgər firqət gününə, ey xudaya, sübhü şam olmaz?

Mənim yarım, nigarım, növbaharım kimi yar olmaz,
Mənim şahım, şahənşahım kimi aliməqam olmaz.

Günüzlər biqəraram, intizaram, sövgüvaram mən,
Gecə əncümşümaram, gözlərimdə həm mənam olmaz.

Ləbi ləli-Bədəxşandır, rüxü bir mehri-tabandır,
Rəisi-cümlə xubandır, belə sərvi-xuram olmaz.

Pərişan etmə dami-zülfünü ol daneyi-xala,
Qəfəs içrə müqəyyəd mürği-dəstamuza dam olmaz.

Mirişin mürği-ruhu ol nihali-sərvinə qonmuş,
Mənim könlüm kimi "gu-gu" deyən hərgiz hümam olmaz.

* * *

Getdi əğyara qonaq dün gecə, cananıma bax!
Qətlimə hökm yazıb, əldəki fərmanıma bax!

Hicrinə saldı nigarım nə yaman yerdə məni.
Rəhmsiz həsrəti-yar ilə çıxan canıma bax!

Qaldı şirin ləbinə həsrəti-didar gözüm,
Müntəzir gözlərimə, sincyi-suzanıma bax.

Adət olmuş Mirişə hər gecə “ya dost” deyib.
Gözlərimdən bu axan əşki-dürəfşanıma bax.

* * *

Qoyubdu məni bu hal ilə dildarım, ağlaram,
Soldu xəzani-hicrdə gülzarım, ağlaram.

Bülbülsifət nəvaya gəlib, evlərəm fəğan,
Pəjmürdə çün qoyubdu məni yarım, ağlaram.

Qərq eylərəm bu aləmi mən əşki-çeşmimə,
Dərdi-fəraqa yoxdu mədədkarım, ağlaram.

Neylim, nedim, nə çarə qılım, yoxdu taqətim,
Gözdən məni salıbdı o sərdarım, ağlaram.

Miriş əlinə gəlməyə gər daməni-vüsal,
Ta həşr olunca ərşə çıxar zarım, ağlaram.

* * *

Əya Baki, nedim çarə, mənə rəhm eyləməz yarım,
Fəraqında olub nalə gecə-gündüz mənim karım.

Buyursun, eyləyim səcdə həmişə taqi-əbruyə,
Olub taət üçün qiblə iki əbruyi-dildarım.

Gecə əncümşümarəm, biqərarəm hicri-ruyində,
Vəli rəhm eyləməz bir dəm yetə ərşə əgər zarım.

Dəvəndə zülfünə badi-səba bəhrəm olur könlüm,
Olur aləm münəvvər, çıxsa gər ol mahruxsarım.

Çəməndə bülbülə yer yox, qucubdur xar çox güllər,
Mənim qəlbim gülü solmuş gülüstan içrə gülzarım.

Sınıbdır şişeyi-qəlbim bu məhvəşlər cəfasından,
İlahi, sən yet imdadə ki, rəhm etsin cəfakarım.

Gətirməz yadına Mirişi bir oğrun nigah ilə,
Kimə eylim şikayət, böylə keçsin bəs mənim karım?

* * *

Hər gecə nalə edirəm, sənə təsir etmir,
Ah, dərdim çoxdur, heç xəbərin yoxdur.

Gülşən meyli etmirəm, dildara tərəf gedirəm,
Bəlkə mən miskinə bir nəzər saldı.

Nigarın ayrılığından canım boğaza gəlib,
Elə bil ki, oradan qığılcım çıxır.

Haradan soruşum, axtarım yarı,
Heç kəs mənim kimi didərgin, ağlar görməyib.

Hər iki dünyanı onun gülüşünə verərəm,
Çünki bu dünyaya onun kimi nazənin gəlməyib.

Dünən gecə piri-muğan mənim qulağıma belə dedi:
Yar sənin qarşındadır, ancaq sənin xəbərin yoxdur.

Yerdən göyə qədər hər şey onun cilvəsidir,
Əvvəldən axıra qədər, həm fikrində, həm də həqiqətdə.

Kə’bəni də, kilsəni də, xarabatı da gəzdim, gördüm ki,
Onun nuru günəş kimi hər yerə çatıb.

Nə yaxşı olar ki, səba yeli Mirin köməyinə gəlsin,
Bu gözü yaşlıya onun qapısından bir toz hədiyyə etsin.

**Vər. 409a**

## MƏŞƏDİ CƏFƏR

**Aşağıdakı şeirləri Məşədi Cəfər bin Hacı Səid Qasim Qarabaği 1309-cu ilin cəmadiəs-sani ayında (yanvar, 1892) öz dəst-xətti ilə yazıb.**

### QAFQAZ MƏMLƏKƏTLƏRİNİN ŞEYXÜL-İSLAMI CƏNAB MİRZƏ HƏSƏN TAHİROVUN MƏDHİNƏ YAZILMIŞ QƏSİDƏ – 1303 (1885-86)

Bir neçə it sənin ardınca hürdü,
Hamısı da havaya getdi, əldə bir şey qalmadı.

Palanın altından min səs çıxartdılar,
Ac eşşəklər ot üçün səs çıxaran kimi.

Sənin cəlalının barigahına ox atdılar,
Biri də Firoun kimi hədəfə çatmadı.

Düşmənlərin ürəklərinin sapı Şişədə qırıldı,
Kələf sorağında itmiş ipin ucunu axtardılar.

Allaha şükür ki, düşmənin əlləri boşa çıxdı,
Qəzəl oxumur, ancaq səsi dəl səsi kimi gəlir.

Mədən və elm, qızıl və gümüş qarşısında,
Nə qədər saxsı qabı cinas gətirmək olar?

Mənə qismət olsa, Kə'bəyə getmərəm,
Kə'bədən hacı oluram, ancaq iki yüz dəfə bağışlanmağımı istərəm.

Ey mənim ay üzlüm, heç vaxt qəmli olma,
Əgər ay, günəş tutulsa belə.

Xalqın şərəfli olması onun öz əlində deyil,
Allah özü şərafətə çatdırır.

Bütün dünya sənin xilafətinin paxıllığını çəkir,
Dövrən doludur, onlardan xəbərin yoxdur.

Ürəyim sənin ruhani taxtının tərifi ilə doludur,
Onun vəsfində mənim başım boşluğa düşməsin.

Sənin bəxtinin şeypuru sıraya durmaq üçün səs çıxaranda,
Sıraya düzülənlərdən birincisi mənəm.

O adamın ki, sənin dəftərində adı yoxdur,
Özü gəlib axırda özünü təqdim edəcək.

O adam ki, sənin qəlbinə tikan vurur,
Əbədi olan Allah tezliklə onu məhv eləsin!

Dürr Şüşədən çıxdı, dənizdən yox,
Min ilə Şüşədən dürr-sədəf çıxmaz.

Sənin pak nəslin Tahirin nütfəsindən yaranmışdır,
Övlad həqiqətən öz nəslinin yolundan çıxmaz.

Cə'fərin and içməsi əgər sənin üçün artıq görünürsə,
Nəcəfdə olan qəbrə and olsun ki, onun sənə sədaqətindəndir.

## MİRZƏ HƏSƏN TAHİROVUN MƏDHİNƏ YAZILMIŞ İKİNCİ QƏSİDƏ (Tiflisə təşrif aparandan sonra) 1303 (1885-86)

Sənin ardınca bir neçə it fəryad etdi,
Hamısı da boş verə küləyə getdi.

Ürəyi yananlar kimi dillərini uzatdılar,
Elə bil ki, ov və ovçu dalıyca gedirdilər.

O kəs ki, yersiz özünü bədnam edir,
Bütün şəhər əhli ona gülür.

Yadında qalsın, sənə açıq bir hədis deyim,
Mənim ürəyimə "ləb-il-mirsad"* ayəsi düşdü.

Ayədən aydındır ki, Ad və Səmuddan sonra,
İki qardaş qaldı, biri Şədid, o biri Şəddad.

Allahın yaratdığından fərqli bir behişt yaratdı,
İrəmin adını "Zatül-imad" qoydu.

Bu iki qardaşın misalı bizim xalqa bənzər,
Addan behiştliklər oldu, bizim xalqdan fitnə-fəsad.

Şəxsən min səy və təlaşla çalışdısa,
Həqiqətdə ortaya yaxşı bir şey qoya bilmədi.

* "...baxıb görür" Quran, əl-Fəcr, 14-cü ayə.

Öz təkliflərini bilməyən bir neçə adam,
Ki, onların yaşı həştad-yüz olar.

Ürəyin sınmış şüşəsini birləşdirmək olmaz,
Ürəyin sınmış şüşəsini birləşdirən ustad hələ yaranmayıb.

Sənə aydın və mənalı şeirlər deyərdim,
Min heyf ki, avam və az savadlıyam.

Ərəb dilində olan bir kitab var, oxumamışam,
Ustadım mənə qrammatikanı öyrətməyib.

Mənim böyüyüm, sənin mədhindən necə əl çəkim?
Sənə baş əyərəm, cəllad başımı üzsə də.

Qafqazda sən möhkəm bir dağsan,
Sən yumşaq dağ deyilsən ki, Fərhad səni parçalaya bilsin.

Cəfər daim sənə səcdəylə səni mədh edir,
Bu sözlər onun dilinin əzbəridir:

Bir neçə it sənin ardınca fəryad etdi,
Hamısı da boş yerə havaya getdi.

## MOLLA ƏBDÜRRƏZZAQ LAHİCANİNİN DEDİYİ QARŞISINDA, HACI ABBASIN MƏNZİLİNDƏ, YƏNİ "ÜNS" MƏCLİSİNDƏ DEYİLMİŞ MÜŞAİRƏ

Cananım məni xoş nəzərlə qarşılasın,
Ahlı ürəyimi ahlı səhərlə qarşılasın.

Pis gözlülərdən öz üzünü bağlasın,
Surətini aya, günəşə göstərsin.

Mənim cananım aşiqlərdən həmişə qaçır,
Ancaq öz kəmərini rəqibə etibar edir.

Öz ləblərindən düşmənlərimizə şəkər verir,
Ciyərimi almaz tozuyla deşir.

Ürəyimin qanından aşiqin gözlərinə qan sızıb,
Ürək qanını gözlərindən çıxarır.

Ey can, gəl ki, mənim dediyim söyüd ağacının,
Çay kənarında yaxşı meyvəsi ola bilər.

Qeybdən gələn bir səs yenə də yarın səsini qulağıma çatdırır:
Aşiqləri xeyir xəbərlə qarşılayır.

O yar ki, könlümün vadisi onun üçün qorxusuz bir yerdi,
Necə ki, Musa peyğəmbər ağacla aşina oldu.

Bu qiymətli şeirləri yazmaqda Cəfərin məqsədi,
Geniş ürəklilərə dürr və gövhəri göstərməkdir.

## LÖVHİ TƏXƏLLÜSLÜ MƏŞƏDİ NƏSİRİN ŞEİRİNƏ NƏZİRƏ

Yarandığım gündən başımda bir sevda var,
Bunu ürəyimdə çoxdan gizli saxlamışam.

Böyük adamların sözündən yadıma düşür ki,
Onların bildiklərindən mənim xəbərim var.

Ki, gözə görünməyən bir Allah var,
Onun təsiri olduğunu bilirəm.

Biyabanın içində bir gövhər itirmişəm,
Əzəl gündən baxıram, tapa bilmirəm.

Hər nə görsəm, ondan nişanə görürəm,
Baxıram, (ancaq onu) görə bilmirəm.

O təmiz (qəlbli) üçün, onu görmək üçün,
Allaha şükür, əvvəldən yüngül yüklüyəm.

İsa deyiləm ki, məni dara çəksinlər,
Çünki əvvəldən atam Adəm olub.

Dərin bir dəryaya ayaq basdım,
Dalğası əvvəldən mənim üçün qorxuludur.

Məndə o güc yoxdur ki, onun zatının mənasını dərk edim,
Mənim yüküm əvvəldən ağır olmadı.

Nigəhban üçün yüz şukr eyləsəm, layiqdir,
Əvvəldən onun şükrü ürəyimdədir.

Nə tikan deyiləm hər gülə batam,
Gül üzlülərin ayağına batan xaram əvvəldən.

Mənə deyirlər, Cəfər, gözünü bağla,
Əvvəldən ayüzlülərə baxıram.

## MİRZƏ CƏFƏRİNDİR

Aşiq əgər ah çəksə, ona nəfəsin gücü çatmaz,
Onun yüksək naləsi zəngin səsinə üstün gələr.

Hörümçək qida üçün tor qursa,
Onu parçalamaq milçək üçün çətin olar.

Bülbül əgər səhvən qəfəsə düşsə,
Qəfəsdən çəmənə tərəf çətin ki, bir də gedər.

Könül quşu qəfəsdən danə dalıyca uçsa,
Həvəssiz qəfəsin küncünə qayıtması çətindir.

Cəfər, sənin sözlərin bizim zahidə xeyir eləmədi,
Sənin boş sözlərin gecə gözətçisinə də çətin gəlir.

## YENƏ

İki qaşın sənin qətlin üçün elə xunxara dönüb,
Ki, elə bil kafir dindar dalıyca gəzir.

Dünənki gecənin zövqü yadıma düşür, ondan bilirəm ki,
Piyalə saqinin əlində necə də dolu gəzirdi.

Sənin ürək açan qəddini görmək üçün səba kimi gəzirəm,
Elə bil ki, sağlamlar xəstənin ətrafına dolanırlar.

İki gözün hər tərəfə elə məst-məstanə baxırlar ki,
Elə bil ki, ağılsız sərxoş bazar başına dolanır.

Aşiqlərdən canfəşanlıqdan başqa nə gördün?
Nə üçün sizin küçədə həmişə çoxlu əğyar dolanır?

Kafir eşqinə düşmüş Sən’andan yüz xəbərim var,
Daim onun arxasınca düşüb, əlində zünnar dolanır.

Cəfər sənin qarşında can verməkdən daim xəcalət çəkir,
Can oynatmaqdan başqa bir şey bilmir, ürəyi fikirli dolanır.

Şeirindən heç vaxt qəm çəkmə, günəş sənin müştaqındır,
Sənin şeirinin ardınca kölgə kimi hər yeri dolanır.

## 1309-cu İLDƏ (1891-92) ŞUŞA ŞƏHƏRİNDƏ YAYILMIŞ EPİDEMİYA HAQQINDA

Hər yerdə oldumsa, evlərdə xəstələrin çoxluğundan,
Çarə axtardımsa da, ancaq onu edə bildim ki, şeir yazım.

Sənin üzünün surətini Mani də ürəyə belə köçürə bilməz,
Sənin qıvrım saçların arasında yüz dəfə yolunu itirər.

Sənin ayrılığından mənim könül evim yenidən şikəst olur,
Bütün memarlar belə gəlsə, bir də nə vaxt abad olar?

Ey ay üzlü, göstər surətini, səndən başqa bəyəndiyim yoxdur,
Mənim gözümdə başqaları divardakı şəkil kimidir.

Ey iman və könül qarətçisi, ey hurimisal dilbər,
Sənin vücudun qarşısında yüz mahir dilbər sıxılır.

Eşq yolunda Məcnun olmaq aşiqin cah-cəlalıdır,
Leyli öz Qeysinə bu işləri rəva bilməz.

Cəfər, yaşın əlli oldu, daha nadan olma,
Sən daha bilikli olduğundan nakəslərdən azar görürsən.

İstəyirsənsə eşşəkdən də pis olasan, Şuşa vadisində gəz,
Asudəlik taparsan, ancaq yükü yaddan çıxarma.

* * *

Bir neçə mütrib və rindanənin xatirəsinə,
Saqi, mənə bir neçə peymanə ver.

Təriqət uşaqlarını,
Köhnə qocaların bir neçə alimini yad edirəm.

Küpün yanında mənə yer göstər,
Orada bir neçə məstanə də olsun.

Zahidlər məni məsciddən uzaqlaşdırdılar,
Məni bir neçə meyxanəyə tapşırdılar.

Allaha şükür ki, iş başındayam,
Bir neçə viranəni bərpa edə bilərəm.

Mən o zəif, çin-çin xalı olan quşam,
Bir neçə danəylə bolluq taparam.

Məcnunluğa həris Cəfər mənəm,
Məndən bir neçə divanə ağıllanar.

* * *

Niyə zahid mənə mane olur?
Niyə nasih mənim üçün çalışmır?

Biri qulağımı tikir, biri huşumu aparır,
Düşmənə bax, hər tərəfdən "ey" edir mənə.

Mən təmizəm, nə şəraba, nə çalğıya meylim var,
Düşmən nə üçün dəvəm kimi məni yıxmaq istəyir?

Dostlar, Hatəmi-Tayi hardadır ki, öz xeyri üçün,
Şeir məqsədiylə ardımca düşüb, məni təqib edir?

Əziz yarımın ürək soyuqluğu yüz məqsədlə,
Bahar fəslini mənim üçün qışa çevirdi.

Cəmşidin camı Keyqubad dövründən bəri məni məst etmədi,
Mən Keykavusam, Kəyan şərabı mənə yaramaz.

Məcnunam, dünyanın səsinə cavab verə bilərəm,
Əgər Leyli öz yurdundan mənə "hey" etsə (kömək etsə).

Mən Cəfərəm, ölümdən yüz cürə qaça bilərəm,
Əcəl qurdu arxadan mənə "hey" edirsə də.

* * *

Yar mənimlə çəmənə tərəf getmir, nə üçün?
Gedir, ya getmir, mənə nə xeyri var?

Kişi odur ki, qəşəng dilbərin ardınca getsin,
Dəlicəsinə vurulan aşiq üçün vətən eşqi nə ola bilər?

Aşiq odur ki, mə'şuqun cəfasından inciməsin,
Sadiqlərin bu dünyada vətən dərdi nə ola bilər?

Yarın dodağının ətrafında qara bir xalı vardır,
Onun da dövrəsində qara qarğa nə deməkdir?

Ürəyinin yarasını bağlamaq üçün yarın zülfü bəsdir,
Ağır yaranı bağlamaq üçün müşki-Xütən nəyə lazımdır?

Uşaq kimi sənin dodaqlarından süd əmən,
Doyar, cəza günü ona süd gölü nəyə lazımdır?

Ey Cə’fər, əziz ömrünü bütünlüklə bərbad etdin,
Eşq yolunda bədəni qorumaq nəyə lazımdır?

* * *

Sənin lə’l (dodaqlarını) sormaqdan dişlərim qan oldu.
Ya Rəb, həmişəki kimi xam tamah heç oldu.

Üfüqün ürəyi həmişə bir qətrədən qana boyanır,
Elə bil ki, yüz şəhidin qanı tökülüb.

Lə’lin şirini Fərhada qismət olmadı,
Ona görə də onun yeri Bisütun dağı oldu.

Ürəyimin qanı sənin dodaqlarının qanından artdı,
Bu da təəccüblüdür ki, sənin qanın mənim qanımdan artır?!

Ey xam, öpüş xəyalını başından çıxart,
Onun ay üzünü uçuqlar qaraldıb.

Xal sənin üzünün ortasına qoyulub,
Necə ki, “nun” hərfinin üstünə nöqtə qoyulub.

Üzünün xalına baxmaq təəccüblü deyildir,
O təəccüblüdür ki, hindu cənnətə necə düşüb?

Ey Allah, kimsəsiz aşiqə əta et,
Daha rəva bilmə ki, işi dala düşsün.

Cə’fər ürəyini açmaq üçün ürək əhli tapmadı,
Heyf ondan ki, cilovu yüz cünunun əlinə düşdü.

* * *

Arxdan ayrılan suyun yenidən arxa qovuşmaq ümidi var,
Ümidi həyata keçirməyin yüz xeyri var.

Sənin gül üzündə mən ayələr görürəm,
Aşiqlərin, dəstəmaz aldıqlarına görə, ürəkləri pakdır.

Təkcə Məcnunun özü Leyliyə mayil deyildi,
Bütün kuzələri daim Leyli özü sındırdı.

Mənim dediyim bütün bunlar çox müşkül bir işdir,
Həmçinin kiçik ağızın yüz gizli sirri vardır.

Bunu bilirəm ki, hər iki aləmə biganəyik,
Bütün aşiqlərin maneəsi bir tük qədərdir.

Ey ürək, sən pis fikirli yardan şikayət etmə,
Bu daşürəklilər daim düşmənə meyl edirlər.

Bir gül gördüm, bu gül elə tikanlı idi ki, ancaq,
Naziklikdə mənim kimi idi, yüz cür yaxşı iyi var idi.

Nəzmim xoşa gəlmədi, əslən islah olmadı,
Ona görə də Cəfərin sözünün nə rəngi var, nə iyi.

* * *

Mən danələr yeyən zəif bir quşam,
Danə hardan düşsə, onu görürəm.

Əgər ovçu bir dam qursa və mən,
Onun damına düşsəm, orada qalaram.

Qiyamət günü mən ondan qorxuram ki,
Yenə bu dünya camaatının üzünü görəcəyəm.

Mənim qəmim bundan da artıq olar,
Əgər bu dünyada həriflərlə otursam.

Mən qanmaz adamları görəndə,
Xəcalətdən alnıma tər gəlir.

Əgər ağıllı adam mənə zəhər içirsə,
Mənim üçün baldan da xoş olar.

Əlacsızlıqdan nadanın əlindən içsəm,
Ölənə qədər ayılmaram.

Xəlvətdə dünən gecə bir zahid,
Elə bir büsat qurdu ki, məni dinimdən ayırsın.

Əgər sən məni meypərəstlərin içinə salsan,
Mən səni məscidə aparıb, orada şaxlaram.

Dedi: Bu gizli sirri sənə deyirəm,
Əgər inansan, dostum olarsan.

Sənə deyirəm, mənim nicatım,
Meyxanadan ancaq bu olar.

Mənim öz meyimin ətri mənə bəsdir,
Zahidin gülşənindən bir gül də dərmərəm,

Cəfər mənəm, xalqa və'z oxuyuram,
Ürək əhli mənim dinimə gələcək.

* * *

Dünən gecə çox aqil bir qocadan mənə xəbər çatdı:
Şeir yazanda öz sağlam təbinə kədər gətirmə,

Kamal sahibi kimi şeir deyə bilmirsənsə,
Sus, şeir yazmaqdan əl çək.

Sənin şeirində fəsahət duzu görmək olmur,
Çünki o çox mübaliğəlidir.

Sənin şeirində məcazlar ya qısalmış, ya da uzanmış olur,
Günü ay kimi, ayı il kimi verirsən.

"Üns" məclisinin üzvlərinə qışqırıb deyirəm:
Ehtimal var ki, arxa axar su gələcək.

Sakit ol, gözlərini bağla, danışma,
Zirək ol, gör qiylü qal kimdən gəlir.

Sənin şeirin qarşısında hər şey qısalır,
Qəlbinin zəifliyi hilal kimi artır.

Min zəhmətdən sonra yaraşmaz sənə ki,
Ürəyinə şeir yazmaqdan iki yüz qəm-kədər gətirəsən.

Bizim şeir deməyimizdən pis iş yoxdur,
Bu ona oxşayır ki, gözəl üzə çirkinlik vuraq.

Biz ixtiyarsız olaraq "Məclisi-üns"də toplaşmışıq,
Hər birimiz xəyalən özümüzü birinci hesab edirik.

Biz həmsöhbətlər vərəqlərə boş şeylər yazırıq,
Çünki bizim məclisdə hal əhli yoxdur.

Cəfər, niyə özünə haram işi peşə etmisən?
Görünür ki, haram sənin üçün halaldan daha xoşdur.

## RÜBAİ

Ey hörümçək, tor ümidində olma,
Bu zəif milçəyi xar etmə.
Sənə düşən qismətlə kifayətlən,
Tutmağı özünə şüar etmə.

Torunu məndən aç, ey hörümçək,
Hər gün mənim ayağımı bağlamaq nəyə lazım?
Qismətin evində hazırdır,
Hər zəif və xəstəni yaralamaq nəyə lazım?

## QƏZƏL

Nə yaxşıdır mən yenidən öz dildarımdan söhbət açım,
Aşiq odur, daim öz yarından söhbət açsın.

Eşq hər dəvə otaran üçün gizli bir sirrdir,
Karvan başçısı bilir ki, yükü nədən ibarətdir.

Aşiqi-sadiq orada bağ kəkliyi kimi durur,
Ürəkdən qan sovurub dimdiyini qızardır.

Namehriban dilbər mehrsiz və vəfasız olur,
Öz aşiqini daim öz əğyarı hesab edir.

Sınıq ürək neçə illərdən sonra sağalar,
Ümid var ki, təsadüfən öz me’marı gəlsin.

Ürək geri çəkilir qan çiləyən yarın qorxusundan,
Öz sərdarını görəndə ordu ürəklənir.

Ey Cəfər, öz şeirin kimi dirhəmsiz və müflissən,
Qəm etmə, gəda kimi öz diyarınla kifayətlən.

Cəfər, bu şeirləri dil əzbəri et,
Öz şeirlərindən sevinmə!

Nə yaxşıdır mən öz dildarımdan söhbət açım.
Aşiq odur, daim öz yarından söhbət açsın.

* * *

Həyat budursa, ölmək bundan yaxşıdır,
Bu qəm-qüssəni yox etmək yaxşıdır.

Acı ürəkli əldən şirin cam alıb içməyin nə xeyri?
Ürək əhlinin əlindən əcəl camı alıb içmək xoşdur.

Cəfər, incə ürəklilərin qəm yükünü öhdənə götür,
Qarışqanın çəyirtkəni vətən tərəfə aparması xoşdur.

**Bunları yazan Cəfər təxəllüslü Cəfər Hacı Səid Qasım oğlu Qarabaği 1255-ci ildə (1839-40) Şuşa qalasında anadan olub. Bəndənizin bioqrafiyası çox uzundur. Cənab Mir Möhsün ağa Nəvvabın fərmayişi ilə bir neçə nizamsız nəzmi, yazdığım sadə şeirlərdən buraya qeyd etdim. Ümid edirəm ki, zövq əhli onun eyiblərini bağışlayar, məni təshih edər.**

**1309-cu il (1891-92). Şuşa şəhəri.**

**Vər. 415a**

## MİRZƏ HEYDƏR* TƏBİB

**(şaban, 1309 – mart, 1892)**

**Cənab Mirzə Heydər Hacı Əliməmməd oğlu Qarabağın Şuşa əhalisindəndir. Onların əsli Hindarxı kəndindəndir. Fars və ərəb dillərini bilir. Məşğuliyyəti təbiblikdir. Yaşı təqribən qırxa çatar. Pərakəndə şeirləri var, divanı yoxdur. Şeir deməyə həvəsi var. Aşağıda qeyd olunmuş şeirlər onun təb'indəndir və öz dəst-xətti ilə köçürüb. Təxəllüsü Təbibdir.**

Munca, ey sərvi-rəvan, yüz naz edirsən, yüz itab,
Qana dönmüş könlümü gəh şad edib, gahi xarab.

İn'ikas etmiş şüayi-hüsni-ruyin çərxdə,
Gecələr bədri-münəvvər, sübh olanda-afitab.

Ruzigarımdan mənim yar etmədi halım sual,
Öz ləbi-lə'lindən istər kim, dil alsın bir cavab.

Hər zaman imkanü fürsət yoxdu, cana, vəslinə,
Firqətindən başa varmış taqətü aramü tab.

Kə'beyi-mehrab qaşın qibləgahımdır mənim,
Etmə, zahid, bu ibadətdən məni mən'i-səvab.

Qoy dolansın başına üşşaq, müddətdir sənin,
Həsrətindən künci-firqətdə çəkibdir çox əzab.

Çareyi-bimari-eşq yara söylərsən, Təbib,
Söhbəti-canan, dürdi-cam, səhbayi-şərab.

* * *

Daği-büryan eyləmiş vəslin bu dərhəm könlümü,
Yaxma yüz gəz atəşi-hicrana sən həm könlümü.

Gərçi sevdayi-təriqi-eşqə çoxlar düşdü, leyk,
Qeys tək divanəlikdə söylər aləm könlümü.

Qoy fəzayi-eşqdə bir ləhzə sərgərdan, rəqib,
Möhnəti-qəmdən nə çəkmiş, bilsin hər dəm könlümü.

---

* Təzkirənin çap nüsxəsində – Heydərqulu

Mən əzəl gündən girifrari-kəməndi-zülfünəm,
Çeşmi-xummarın müsəxxər etdi möhkəm könlümü.

Bülbüli-gül gülşəni-kuyində etmiş aşiyan,
Gül üzü şövqü bəlaya saldı kəm-kəm könlümü.

Əşki-didə verdi seylaba təni-bimarımı,
Qərqi-xunabi-qəmə olmuş müsəmməm könlümü.

Bir zaman qıl yad etsin vəsfi-ruxsarın Təbib,
Göz dikib didarına, sorsan bu bərhəm könlümü.

* * *

Bəndə urubdu bir sənəmi-xubru məni,
Üz vermədi görüm yüzünü rubəru, məni.

Məcnundan artıq eylədi şöhrət cünunluğum,
Səhraya saldı eşq onu, kubəku məni.

Uğrandı dil o türreyi-tərrara, ey səba,
Lütf eylə, ver nişan, arıyıb mubəmu məni.

Əyyami-hicr, fəsli-xəzan, yari-səngdil,
Olmuş yəqinim, öldürəcək arizu məni.

Əzmi-şikar edib yenə şəhbaz gözlərin,
Eylər baxanda hər tərəfə cüstiçu məni.

Düşməz xəyali-qeydi-səri-zülfdən könül.
Həbs eyləmiş əzəl günü bir mahru məni.

Eşq-əhlidir Təbib, ona tapşır məzacını,
Tapsın həyati-tazəvü tər, növbənö məni.

* * *

Bilmədim mən ləblərin ləli-Bədəxşan olduğun,
Badə tək ruhi-rəvan hər dərdə dərman olduğun.

Zülməti-zülfündə könlüm çəkdi zəhmət Xizrvəş,
Bilmədi ağzında pünhan abi-heyvan olduğun.

Şiveyi-çeşmi xumarın naz ilə min can alır,
Eyləməz insaf zalım könlümün qan olduğun.

Yusifə bənzər məlahətdə cəmalın, ey əziz,
Mülki-Misri-eşqdə kim, şahi-xuban olduğun.

Çün fəramuş eylədin rəsmi-vəfayi-yarlıq,
Bari tərk etmə mənimlə əhdi-peyman olduğun.

Aşiqin olmuş mərizi-möhnəti-dərdi-fəraq,
Rəhm qıl, bir çarə, qurtarsın bu qurban olduğun.

Kəsdi mehri-eşqi candan Təbibi-binəva,
İstəməz daim qəm ilə dilpərişan olduğun.

* * *

Dəmbədəm kim, möhnəti-hicrin qəmi-dil tazələr,
Xuni-dildən əşki-didə ruyə çəkmiş ğazələr.

Tari-zülfün vəsli-didara nişan vermiş səba,
Görməmişdim mən kimi heç doğru yoldan azələr.

Səs salıbdır karivani-eşqi-hüsnün könlümə,
Açılıb hər bir münafısdən ona dərvazələr.

Hüsn üçün qoymuş kənarında ləbin nəqqaşı xal,
Rəsmxətdir bu məgər, ləb üstə bir xət yazələr ?

Şikvə , ey məhparə, etmə ahü zarımdan mənim,
Atəş üstündə kabab hər dəm çəkər avazələr.

Kəştiyi-dil düşdü girdabi-qəmi-hicranına,
Badi-şürtə kəsdi ümmidi-nicat əndazələr.

Tiri-eşqin bəsdi, cana, bu Təbibin canına,
Aşinalıq fər'idir ülfət, ona ver cazələr.

* * *

Çox arzu edərdi könül bir görəm səni,
Leykən çəkib çox həsrətini gözlərəm səni.

Sərv qəddin ayağına göz yaşı cari edib,
Şümşad tək sevib boyunu, bəslərəm səni.

Ruyində türreyi-telini dəstə eyləyib,
Sünbül kimi basıb sinəmə, iylərəm səni.

Şəm’ camalın olmuşam əzəldən aşiqi,
Pərvanəvəş dönüb başına, islərəm səni.

İzhari-mətləb olsa, “ənəlhəqq” yarıdən,
“Yahu” deyib, qiyamətədək səslərəm səni.

Müşküldü aşinalıq edib, sonra ayrılıq,
Bu növ bivəfa olasan bilmirəm, səni.

Söylər Təbib, zərrəcə yox ləm’eyi-həyat,
Ey şəmsi-hüsn, tarı bilir, sevmərəm səni.

* * *

Bir ləhzə görmədim üzün ol sərvqamətin,
Çəkdim nə qədr var isə, cana, daği-həsrətin.

İqrar qılma məhşəri, zahid, əbəs yerə,
Hicran günü məaniyə gəl, gör qiyamətin.

Məcnun ki, kuyi-eşqdə sultani-eşq idi,
Mən tək müsəxxər etmədi mülki-məlahətin.

Xövfü hərasi-duzəxi rizvan qiyas edər,
Kafər görəndə atəşi-hicran hərarətin.

Ey dil, vəfadan urmagilən dəm vüsalda.
Var aqibət nihayəti bu şəkkər ne’mətin.

Tərki-məhəbbət eyləsə canan, nə hasilin,
Yox mərcə’i, ümidi-zaman nədamətin.

Əyyami-gül gəlir yetə bülbül muradına,
Fövti-təğafül eyləmə əyyam i-fürsətin.

Bir büt alıbdı könlümü razü niyaz ilən.
Gəlməz bəyana vəsfi-sənası məlahətin.

Bəs ki, Təbib, aləmi-qəm özgə haldır,
Fəxr ilə yaz sən eşqdə qəmlər hekayətin.

* * *

Saqiya, etmə təğafül, yetişib fəsli-bahar,
Cami-gülgunu gətir, dolduruban qıl sərşar.

Əvvəli-ordibeheştü həməlü fərvərdin,
Eydi-novruz tutub mah cəlalında qərar.

Sünbülü süsənü xeyrivü bənövşə, nərgiz,
Qalıb heyran gülə bir-bir deyəsən butimar.

Qələmi-sən'əti-xəllaq ilə nəqqaşi-səba,
Kaxü eyvani-gülüstani edib minakar.

Mö'cüzi-Musavü İsa gətirib əbri-bahar,
Yə'ni-əhyai-rəyahin yədi-bəyzayi-çinar.

Ərğəvan rəng çalır, şaxi-zümürrüd, guya,
Xuni-aşiqlə nigar əllərin eylibdi nigar.

Qıl tamaşa ki, səhni-çəməni-minayə,
Ərğəvan sanki zəmirani-zümürrüdasar.

Qönçə pirahənini çak qılıb nazından,
Açılıb, xəndə edir bülbülə manəndi-ənar

Var idi həsrəti-tubavü riyazi-rizvan,
Tağı-rizvani-cahan seyrinə yüz rəşk güzar.

Vərəqi-güldə yazılmış sifəti-lütfı-xuda,
Qəzəbi-iyzədə şahid düzülüb dövrünə xar.

Hər tərəf gül açılıb vəcdi-sürur ilə,vəli,
Nişi-xar ilə olub, xatiri-bülbül əfkar.

Mütrübü çəng nəvazəndeyi-təhvili-bərat,
Bərbəti-zirü bəmi övc qılır musiqar.

Bir tərəf laləvü gül, nəstərən, sərvi-rəvan,
Bir tərəf saz eləmiş nəğmeyi-qumrivü həzar.

Gəh təzəlzüldə qərənfir[*] əyilib hər yana,
Göstərirdi özünü mislinə misli-salar.

---

[*] Qərənfil

Cəm’ olub yer üzünə hurü pərivü qilman,
Xuşeyi-şaxi-dirəxt, dülü pərvin darar.

Nikhətü qalileyi-süsənü gül,
Səhni-gülzarı edib tibleyi-müşki-tatar.

Lalə camından içib badeyi-şövqi-vəhdət,
Badi-sübh ilə düşər hər tərəfə sərvi-xumar.

Vəsfinə valeh idi təb’i-gühərbar səna,
İczinə fikri-Əqalidis edərdi iqrar.

Belə mövsümdə şikəstəqədəhi-işrət idim,
Axtarırdım bütümü zövqi-yəmin ilə yəsar.

Nagəhan bir-birinə dəydi dəri-baği-nişat,
Bağban verdi mənə müjdeyi-təşrifi-nigar.

Şadmərg olmuş idim, zövqdən oldum bihuş,
Gətirib huşa məni eylədi canan güftar.

Həzzi-nəfs oldu tapıb qüvvəti-ərvah Təbib,
Başladı söhbəti-gilagi, segahü hisar?

**Mir Heydər Təbib Qarabağinin şeirləri tamam oldu.**
**Şaban, 1309 – mart, 1892**

**Vər. 421b**

## MOLLA İSMAYIL MƏHZUN

**(Şaban, 1309-cu il – mart, 1892)**

**Molla İsmayıl Məşədi Qasım oğlu Qarabağın Şuşa əhalisindəndir. Şuşa şəhərində anadan olmuşdur. Bu təzkirə yazılan vaxt yetmiş yaşı var idi. Uca boylu, yekəburun bir şəxsdir. Cavanlığının ilk çağlarında sərrac olub, sonra əttarlıq edirdi, indi də molladır; sənəti uşaqlara dərs deməkdir. Bəzən şeir də deyir. Divanı yoxdur, şeirləri pərakəndədir. Aşağıda qeyd olunmuş şeirlər onundur, öz dəsti-xəttilə yazıb. Təxəllüsü Məhzundur.**

### MƏHZUN TƏXƏLLÜSLÜ MİRZƏ İSMAYIL QARABAĞİ

Daim yaşayan, yeganə və bilici (Allahın) adı ilə,
Ki, bütün aləmin zikri onun sənasıdır.

Dili ağızda danışmağa o məcbur edib,
Onun hökmüylə həmçinin nitq peyda olub.

Ağıl verdi ki, (ondan) kömək diləyək,
Ki, hər bir sözünü başa düşək.

Ondan sonra çalışmaq təb'ini verdi,
Ki, öz qüdrətimiz qədərincə oxuyaq.

Xudavənda, səkkiz və dörd haqqına (12 imam),
Bizə sağlam təb və düzgün ağıl ver!

O vaxt ki, kamım acı olur,
Dil lal olur, əndam süst.

Dilimi aç ki, səni zikr edim,
(Dilim) şirin olsun.

Zikr edərkən dilə sitayiş etmək üçün qüvvə ver,
Öz mərhəmətinlə, onu unutma.

Məhzunu öz fəzilətindən məhrum etmə,
O vaxt ki, (o) nitqdən düşür.

* * *

Fələk öz əzəmətini günəşin nuru ilə göstərir,
Niqabını üzündən aç ki, cahan başdan-başa bəzənsin.

Saçlarının qaranlığı içərisində üzünün parlaqlığı görünür,
Yüz günəş və aydan daha parlaq.

Afərin o ustada ki, özünün mahir qələmiylə,
Belə xal, belə zülf, belə üz, belə surət yaratmışdır.

Fələk hər ay sənin üzün və qaşının misalı olaraq,
Ayı gah bütöv, gah da hilal göstərir.

Əgər torpağın üstünə sənin üzündən bir işıq düşsə.
Sakit vadidən daha çox parlaq olar.

Əgər sən o dünyada bu gözəlliklə özünü göstərsən,
O aləmdə minlərcə qiyamət qopar.

Min illərlə yüz Mani kimi rəssam olsa,
O, şəkli başdan-ayağa kimi bəzəsə də, sənin kimisini
yarada bilməz.

Səni bu gözəllikdə əgər Azər peyğəmbər görsə, ey büt,
Öz bütünü venidən yaradar.

Məhzunun ürəyinin ahından dünyaya bir zərrə düşsə,
Yaş və quru hamısı yanar, dünyanı od tutar.

* * *

Sərgəştəlikdə zülfi-pərişanə yetmişəm,
Zülfün havası ilə, pəri, şanə yetmişəm.

Biqürb bir əsiri-mühəqqər gəda ikən,
Qürbi-dərində şani-Süleymanə yetmişəm.

Tövfi-dərin səfasını səy ilə tapmışam,
Guya hərimi-Kə’bəyi-ürfanə yetmişəm.

Zülmati-küfri-zülfdə görgəc camalını,
Küffar içində küfrdən imanə yetmişəm.

Gülzari-hüsnün üzrə o gül arizin görüb,
Rövşən dil ilə rövzeyi-rizvanə yetmişəm.

Dürdür dişin, sədəf dəhənin, lə'l ləblərin,
Gövhər havası ilə gəzib, kanə yetmişəm.

Şəhdi-ləbin çəkidəsinə rah bulmuşam,
Mə'i-müin-çeşmeyi-heyvanə yetmişəm.

Bevtül-hüzndə məskən edən, dərd-qəm çəkən,
Yəqubvar Yusifi-Kən'anə yetmişəm.

Şamü səhər ki, mö'təkifəm kuyi-yardə,
Xüldi-bərinü hurivü-qilmanə yetmişəm.

Tə'ni-rəqib, cövri-fələk, möhnəti-fəraq,
Taq eyləyibdi taqətimi, canə yetmişəm.

Məhzunü xar sanma məni künci-fəqrdə,
Eyşü nişati-gənci-fıravanə yetmişəm.

* * *

Uzun illər keçər ömrüm səri-zülfün xəyalilə,
Olur sərgəştə daim dil həvayi-xəttü xal ilə.

Şəbi-hicran yanar canım, çıxar əflakə əfqanım,
Tökər qan çeşmi-giryanım təmənnayi-vüsal ilə.

Qaşın taqi hilalasa, üzün mahi-münəvvərdir,
Təəccübdür məhi-taban ola peyda hilal ilə.

Zəhi səhhardır çeşmin, üzari-al ilə hər dəm,
Firib ilə edər yəğma, vəli imanı al ilə.

Məgər ol xublar şahı çıxıb əzmi-şikar ilə,
Hərasından könül mürğü qalıb aşüffə hal ilə?

Çəkib əl taqi-əbrudən, gəzər mehrabı zahidlər,
Təmannayi-behişt eylər belə cürmü vəbal ilə.

Vüsalın iştiyaqında pərişanhalü Məhzunəm,
Nə xabü xür, nə araməm, keçər halım bu hal ilə.

* * *

Yenə fəsli-bahar olmuş məgər badi-bahar oynar?
Dəyər hər ləhzə gül üzdə pərişan zülfə, tar oynar.

Töküb siminüzar üzrə xəməndərxəm siyəh zülfü,
Sanasan piçü tab ilə gəzər gənc üstə mar oynar.

Səhər ki, sürməsa gözlər nigahi şux ilə bənzər.
Çıxıb gülzari-Çin üzrə bir ahuyi-tatar oynar.

Üzündə xali-mişkini turubdur kişvəri-hüsnü,
Səriri-hüsndə daim olubdur şəhriyar, oynar.

Behiştü hur vəslindən səfavü zövqi əfzəldir,
O dəm ki, yar yar ilə edib busü kənar, oynar.

Həmişə əhli-lal ilə fələk dövrü müxalifdir,
Çəkər rəncü təəb bülbül, gülün dövründə xar oynar.

Görüm şad olmasın, ya Rəb, rəqibi-bədsiyər daim,
Görə üşşaqlar halın, gülər leylü nahar, oynar.

Əya Məhzuni-dilxəstə, nədir güftari-sərbəstə,
Yarın qoynunda limudur və ya sibü-ənar oynar?

* * *

Nə xoşdur söhbəti yarın bahar əyyamı bağ ilə,
Nə çarə kim, ələ gəlməz əgər gəzsən çirağ ilə

Müsəffa cami-gülguni tuta sərgərm, məstanə,
Lətafətlə edə peyman, tuta dəstim əyağ ilə.

Könül mürgü olub pünhan siyəh zülfün arasında,
Bəsi müşkül olur peyda onu etmək sorag ilə.

Gəzər sərgəştə, üşşaqın tökər gözdən ciyər qanın,
Rəvadırmı rəqib axır gəzə kuyin damağ ilə?

Cəfayi-tə’ni-əğyara necə tab eyləyim axir,
Dili-Məhzunə hər saət çəkər min dağ, dağ ilə?

* * *

Nə xoşdur seyri-gülşən, mövsümi-gül novbahar ilə,
Dolanmaq səhni-gülzarı gül üzlü bir nigar ilə.

Gəzib səhni-gülüstanı, tapıb bir gənci-pünhanı.
Ola güftari-ruhani, nigari-gül'üzar ilə.

Qucub nazik belin hər dəm, əmib şəhdi-ləbi-lə'lin,
Gəhi nazü itab ilə, gəhi busü kənar ilə.

Nə xoş saətdir ol saət, necə fərxəndə taledir,
Ola əğyardan xali vüsali-yar yar ilə.

Döyüldür sərvi-azadə, məgər kim, nəxli-tubadır,
Ənarü sibü-limudən olub məmlöv bar ilə.

Yenə könlüm quşu titrər, qalıb xövfü həras ilə,
Məgər ol xublar şahı çıxıb əzmi-şikar ilə?

Siyəh zülfün arasında gəzər sərgəştə daim dil,
Bulunmaz rahi-asayiş belə tarik-tar ilə.

Tutubdur əbr tək zülfi sərasər mah rüxsarı,
Səni tari, səba, bari onu bir tarümar ilə.*

Sirişki-al ilə hər dəm çıxar əflakə əfqanı,
Görə biçarə bülbüllər gülü gülşəndə xar ilə.

Səba, səndən sora halım, əgər, yari-dilaramım,
Sölə zarü nizar olmuş həmişə əşkbar ilə.

Dikib göz rəhgüzar üstə, olubdu bəs ki, pabəstə,
Sənə Məhzuni-dilxəstə həmişə can nisar ilə.

* Eylə

**Vər. 427a**

## MİRZƏ SÜLEYMAN

**(12 şaban, 1309-cu il – 12 mart, 1892)**

**Molla Süleyman ibn Molla Əli ibn Molla Kəlbəli Qarabaği Qarabağın Şuşa şəhərində anadan olmuşdur. Bu təzkirə yazılan vaxt 26 yaşı var idi. Həlim, xoşrəftar, düz qamətli bir cavandır. Məşğuliyyəti müəllimlikdir,uşaqlara dərs deyir. Özü də şeir deməkdə təzədir. Hərdən bir şeir deyir. Aşağıdakı qəzəllər onundur, öz dəst-xətti ilə yazıb. Şeirləri öz adıyla deyir, təxəllüsü yoxdur.**

Könül, hər qanda kim, bir yar gördüm, bivəfa gördüm,
Yolunda gərçi can qoydum, vəli yüz min bəla gördüm.

Siyəhbəxt oldum ol gündən ki, meyli-xəttü xal etdim,
Pərişan ruzigar oldum, çü zülfi-müşkasa gördüm.

Bu həm bədbəxtlikdir, bir gül üzlü yara dil verdim,
Səfa bir ləhzə ondan görmədim, yeksər cəfa gördüm.

Driğa, görmədim olsun gülün həmsöhbəti güldən,
Gülü xara, rəqibi yara hər dəm aşina gördüm.

Nigara, sirri-eşqi xaneyi-dildə nihan tutdum,
Yaxıb qəm afəti yeksər, o sirri bərməla gördüm.

Könül itmişdi çoxdan, şanədən əhvalını sordum,
Dedi: Zənciri-zülfı-yaridə mən mübtəla gördüm.

Deyin ol yari-məhruyə: Süleymanın düşüb dərdə,
Ümidi-səhhət asarı tapılmaz, bidəva gördüm.

* * *

Pabənddir könül yenə bir şux dilbərə,
Bir gül'üzarü sərvqədü simpeykərə.

Zülfi-siyahı tək günümü qarə eyləyib,
Bilməm ki, netmişəm yenə ol mahi-ənvərə?

Bir ləhzə gər, görəm, sənəma, əyri qaşların,
Salmam xəyalımı dəxi mehrabü minbərə.

Mail olubdu tutiyi-könlüm, dilər müdam,
Lə’lü ləbi- nigar tökən şəhdü şəkkərə.

Ol sərvqəd xuram edə gər gülsitanara,
Yüz min şikəstlik verü sərvü sənubərə.

Üzrüm olar qəbul, könül, ruzi-həşrdə,
Yarım əgər bu hüsn ilə üz tutsa məhşərə.

Ruzi-cəzada gər mənə həq versə yarımı,
Meyl etməzəm nə huriyə, billah, nə kövsərə.

Tutdun təriqi-eşqi, Süleyman, keçirdin ömr,
Neylim ki, yetmədin o nigari-səmənbərə.

* * *

Könlüm sevər o yari-sitəmgər buxağını,
Həsrətlə qaldı, sormadım ol gül dodağını.

Çox arzu edərdi könül kim, onunla mən,
Ta qol-boyun olub, öpəm ol gül yanağını.

Can nəqdini yolunda nisar eylərəm, əgər,
Lütf eyləyib otağıma bassa ayağını.

Bir dəm rəqib qoymaz olam yar ilən, nedim,
Fikri budur, həmişə çəkim mən fərağını.

Könlüm əsirdir səri-zülfi-nigarda,
Rəhm et, səba, dağıtma könüllər yatağını.

Əvvəl məni vüsalilə şad eyləyən nigar,
Şimdi nəsib edibdi mənə qəm bucağını.

Müddətdi firqətində Süleyman əsirdir,
Ol şux kim, nədəndi bir almaz sorağını?

* * *

Yolunu gözləyirəm, yari-mehribanım, gəl,
Cəfayi-firqətə yox taqətü təvanım, gəl.

Camalının gülünü arzu edər hər dəm,
Bu əndəlibi-dili-zarü natəvanım, gəl.

Üzündən ayrı tökər gözlərim dəmadəm qan,
Ki, az qalıbdı tuta aləmi fəğanım, gəl.

Xəzani-hicrilə soldu bu gülşəni-ömrüm,
Pozuldu rövnəqi-gülzarü gülsitanım, gəl.

Mərizi- bəstəri-qəmdir könül fəraqında,
Yetiş harayıma, qoyma, qəm aldı canım, gəl.

Diyari-hicrdə kim, cismi-natəvan əriyib,
Həyat tapmağa yoxdur dəxi gümanım, gəl.

Yetibdi cana Süleyman fəraq cövründən,
Tərəhhüm eylə, gəl, ey cismə rəvanım, gəl.

* * *

Dedim: Ey məh, neçün zülfün üzündən bərkənar olmaz?
Dedi: Ey kordil aşiq, məgər gənc üstə mar olmaz?

Ləbindən sordum ol yarın dəhanın , söylədi: Vəh kim,
Bu elmi-qeybdir, mütləq, bəyanı aşikar olmaz.

Doyunca yara bax, ey gözlərim, qanlı sirişk az tök,
Təğafül etmə, huşyar ol, həmişə vəsli-yar olmaz.

Nigari-sərvqəddin gördüm ol limuyi-pəstanın,
Qələt-məşhur imiş kim, sərvdə derlər ki, bar olmaz.

Üzün görgəc, əzizim, gözlərim qan-yaş tökər daim,
Bəli, bu rəsmdir mütləq ki, yağmursuz bahar olmaz.

Nigarın zülmünə səbr et, Süleyman, çox fəqan etmə,
Nə qəmsiz aşiq olmaz, nə cəfasız bir nigar olmaz.

* * *

Yarım bizə bir gözucu şayəd nəzər eylər,
Alt-üst cdibən mülki-vücudi hədər eylər.

Ənbər qoxuyan saçlarını eyləsə çin-çin,
Töksə üzünə ahu baxışlım, nələr eylər?

Eldən qəmimi gizli tutardım, vəli çeşmim
Göz yaşı töküb, sirrimi xəlqə xəbər eylər.

Hicran gecəsi yad eləyib gülşəni-ruyin,
Könlüm quşu fəryada gəlib nalələr eylər.

Bir sözlə o daş qəlbli cananıma, aya,
Mümkünmü demək mətləbi, yaxud əsər eylər?

Eşq içrə Süleymanə budur daimi arzu,
Ta qəmzeyi-cananə fəda canü sər eylər.

## QƏZƏL*

Yarım lütf edib gözünün ucu ilə bizə bir nəzər etsə,
Vücud mülkümüzü tar-mar edər.

Ətirli qara saçlarını çinbəçin,
Üzünə töküb, ahu gözlüm nələr edir.

Elə ki könül yanğımı xalqdan gizlədirəm, gözlərim,
İsti göz yaşı ilə ağlayıb, hamıya aşkar edir.

Hicran gecələrində gül üzünü yad edərək,
Könül quşum naləyə gəlib, nəva edir.

Mənim o namehriban gözəlim bir sözlə,
Mümkündürmü ki, mənim mətləbimi bəyənsin?

Həmişə Süleymanın arzusu bu olub ki,
Özünü cananın qəmzəsinə fəda etsin.

* Həmin qəzəl sətri tərcümədə.Qəzəlin bədii tərcüməsi Hacı Mail Əliyevindir.

**Vər. 431a**

## MİRZƏ HÜSEYN ÇAKƏR

**Mirzə Hüseyn Çakər ibn mərhum Mirzə Kərim ibn Hacı Məhəmməd Qarabağın Şuşa əhlindən, Qurdlar məhəlləsindəndir. Şuşada anadan olub. Otuz yaşı var. Farsca savadı var. Peşəsi tacirlikdir. Təxəllüsü Çakərdir. Yazdığı şeirlər budur, öz dəsti-xəttiylə köçürüb. Yeni yazandır. (Cəmadiyəl-əvvəl, 1309 – dekabr, 1891)**

Bu nə ətrdir ki, yarımın qıvrım saçlarından gəlir,
Bəlkə çəməndən gül və nəstərən ətri (gəlir)?

O qara saçlar ki, yarın üzünə tökülüb,
Elə bil ki, yasəmən üstünə tökülən müşk topasıdır.

Ey gözüm, dost üzünə həsrətlə baxma,
Ki, o alçaq əcəb qarğa-sığırçına həmdəmdir.

Ey daraq, onun qıvrım saçlarına əl vurma,
Mənim dərdli könlümün vətəni o iki zülfdədir.

Vamiq, Xosrov, Fərhad, Ayaz və Mahmud,
Sən şirin ağızlının şəkər verən dodaqlarının aşiqidirlər.

O mövhum nöqtədən gələn abi-lə'lə,
Onun abi-lə'li demək olmaz, eynən süddür.

Sənin zülfünün qıvrımları (çini),
Çinə (Çin ölkəsinə) yüzlərlə həsrət verib.

Sənin dodaqlarındakı xal,
Xütən ceyranının göbəyidir.

Ey Çakər, onun qəmzə oxlarından birdəfəlik qorx,
Gözlərindən bir ox atarsa mənim canıma dəyəcək.

### QƏZƏL

Zülfün töküldü arizinə, oldu sayəban,
Guya bahar güllərini çulğadı xəzan.

Yox bir könül ki, qəmzən anı etməsin şikar,
Şahid bu kim, müjəndən axır qətrə-qətrə qan.

İstərdi mürği-dil tuta zülfündə aşiyan,
Dövri-rüxündə xalü xətin vermədi aman.

Şami-siyah xəlvət zülfündə sübhədin,
Çeşmin xəyalı məndə, gözəl, qoymadı təvan.

Çəkmiş əsirlər kimi zülfün səlasili,
Hər həlqəsində min könülü eyləmiş nihan.

Adəm yeri deyil, könül, andan həvasi kəs,
Cənnət qapısına dikilib mar pasban.

Qəmzən sipahı könlüm evin tar-mar edib,
Şahid bu hala sorsan əgər, göz yaşım əyan.

Ah eylədim ki, ahım odu çərxi yandırsın,
Ahım sütuni-çərx olub indi, işim fəqan.

Əbruyi-yarı qiblə bilib, səcdə eyləyib,
Oldur ki, tiri-qaməti-Çakər olub kaman.

* * *

Fəraqi-arizi-alın salıb od canə, billahi,
Könül dərdi-fəraqından dönübdür qanə, billahi.

Qalıb zülmati-zülfündə könüllər Xizr tək heyran,
Ləbində talib olmuş çeşmeyi-heyvanə, billahi.

Əzizim, gözlərin hifz et ki, çox qan etməsin axır,
Bu qədri qan edən, vəhm et ki, düşsün qanə, billahi.

Görən dəm xalını, zülfün, kəməndi-tar ilə tutmuş,
Salıb dama könül mürgünü, verməz danə, billahi.

Dəyib bəs ox ox üstə sineyi-məcruhə peykanım,
Dəxi yox tab edim ol navəki-müjganə, billahi.

Təvafi-kuyin eylər ruzü şəb bu binəva könlüm,
Olubdur şöleyi-rüxsarına pərvanə, billahi.

Yüz il təlim edən adabi-eşqi Qeysü Fərhada,
Özün aqil bilən Çakər olub divanə, billahi.

* * *

Aləm olar könül kimi viranə, doğrusu,
Gər tari-muyi-zülfə dəyə şanə, doğrusu.

Dövri-bərini zülf tutub əbri-halə tək,
Həsrət verir yüzün məhi-tabanə, doğrusu.

Gah qaşü tiğə, gah ol zülfi-əqrəbə,
Sinəm nişanədir, gahi müjganə, doğrusu.

Sallam nəzərdən abi-heyvan ilə kövsəri,
Dəysə ləbim o mənbəi-heyvanə doğrusu.

Yüz Yusifi o silsileyi-zülf əsir edib,
Bir yerdə saldı çahi-zənəxdanə, doğrusu.

Xaki-dərində sübhü məsa əşkdən gözüm,
Dönmüş mühiti-Qülzümü Ümmanə doğrusu.

Hər kim dərində can verə gər Cakərin kimi,
Ölməz yəqin, dübarə gələr canə, doğrusu.

## MÜXƏMMƏSİ-TƏZMİN

Ləbin, ey gül, məlahət gülşənində qönçeyi-xəndanə bənzətdim,*
Qaşın taqi-hilalə, xəncəri-bürranə bənzətdim,
Dolanmaqda özümü şəm'i qədin başına pərvanə bənzətdim,**
Tənimdə zəxmi-tiğin çeşmi-xunəfşanə bənzətdim,
Oxun kim, səf-səf ətrafindadır, müjganə bənzətdim.

Mükəddər olmadım bir ləhzə güftarın itabından,
Şəbi-hicranın içrə sübhədək yandım əzabından,
Dəvayi-dərdim oldu busə, neylədim, yox cavabından,
Bəqayi-ruhumu bildim xəyali-lə'li-nabından,
Həyatımdır dedim, bağrıma basdım, qanə bənzətdim.

Dedim, ey dil, usan bu fikirdən, bil qədrini canın,
Xəbərdar olsa sirrindən əgər şanə, tökər qanın,
Düzülmüş bağrıma basdım səfi-çeşmində müjganın,

* Təzkirədə bu misranın üstündə Nəvvab qırmızı xətlə yazmışdır: "İki hərf" artıqdır.
** Bu misranın altında isə yazılmışdır: "İki hərf ağırdır".

Tənimdən incinib çıxdı rəvan can kimi peykanın,
Neçün incinməsin kim, təndə zövqün canə bənzətdim?

Bərabər tutdu, ey məh, məh üzün rüxsari-al ilə,
Utanıb hər gecə dişrə çıxar bu, yox kamal ilə.
De, qəmzən dil kimi salsın ayağa, payimalilə.
Sökülmüş köksümü kim, doludur qəmzən xəyalilə,
Həramilər yatağı mənzili-viranə bənzətdim.

Könül, viranın içrə sevdiyin mehmanını gördüm,
Səriri-mülki-hüsnü naz olan sultanını gördüm,
Nisar olmuş ayağında dürü mərcanını gördüm,
Gözümdə bəslənib qiymət bulan peykanını gördüm,
Sədəfdə gövhər olan qətreyi-baranə bənzətdim.

Dəhanın dürrü olmuş xəlqara dürü göhər tə'ni,
Olub övsafi-hüsnün göydə xurşidü qəmər tə'ni.
Ləbin meygündin Çakər olub əhli-hünər tə'ni,
Füzuli, öldürür, hər dəm məni əhli-nəzər tə'ni
Ki, neçün yar lə'lin çeşmeyi-heyvanə bənzətdim.

**Mirzə Hüseyn Çakər mərhum Mirzə Kərim oğlu Qarabağinin şeirləri tamam oldu. (1309 – 1891-92)**

**Vər. 434b**

## MİRZƏ MUXTAR

**(Cəmadiyəs-sani, 1309-cu il – yanvar, 1892)**

**Mirzə Muxtar ibn Mirzə Ələsgər ibn Məhəmmədcan Qarabağın Şuşa əhalisindəndir. Şuşada anadan olub. Yaşı təqribən otuz beşə çatar. Rusca savadı var. Məşğuliyyəti müəllimlikdir, uşaqlara rus dilindən dərs deyir. Xoşrəftar bir cavandır. Bəzən şeir də deyir. Aşağıdakı şeirlər onundur:**

Əsiri-zülfünəm, mən tək qulami-Zəngibar olmaz,
Şəhidi-qaşınam, mən tək qətilü zəxmdar olmaz.

Xəta olmaz desəm qıvrılmış əfidir telin çin-çin,
Xalın hindü həbəş, zülfün kimi mişkin tatar olmaz.

Kəman əbruna tay olmaz, sinan müjganına əsla,
Müjən tək tirü qaşın kimi tiği-abdar olmaz.

Baxarmı sən kimi kəc-kəc Xütəndə ahuyi-vəhşi?
Gözün tək, ey gözüm nuri, dəxi nərgis xumar olmaz.

Açılmaz qönçə həsrətdən şükuftə gül dodağın tək,
Mənim tək gülşən içrə heç bülbüli-biqərar olmaz.

Gözəllik səndə olmuş bərqərarü paydar, ey dust,
Vəli hüsnü məlahət hər gözəldə paydar olmaz.

Sima’üş-şəmsə övc etmə, müğənni, bu dögül qanun,
Salıbsan şur, leykən şursuz çalma, hisar olmaz.*

Uduzdum nəqşi-əbrunə könül mülkün məhəbbətlə,
Ləbin eşqində can nəqdin, mənim tək bədqumar olmaz.

Şikayət eyləmə, Muxtar, yarının cövrü zülmündən,
Bu adətdir ki, aləmdə cəfasız bir nigar olmaz.

---

* Çapda bu beyt belə getmişdir:
Simaüş-şəmsə övc etmiş mənim bu naləvü ahım,
Salıb aləmlərə şuru, belə möhkəm hisar olmaz.

## NƏVVABIN QƏZƏLİNƏ NƏZİRƏDİR

Gül (gülün gəlini) elə ki, üzündən niqabı atdı,
Bülbül min nalə və fəqan çəkdi.

Çəğanəni vur, müğənni, saz və setarı dilləndir,
Nalə çək, qəmli bülbül, bahar fəsli yetişdi.

Ey saqi, nigarın xətrinə saf şərab ver,
Ki, ürək piyaləsi qəm şərabıyla doludur.

Elə ki, bülbüllər gülün üzünü hər tərəfdən gördülər,
O səbəbdən musiqar* ləhnində nəğmə qoşdular.

Sənin məst gözlərin öz əlində qaşlarının kamanına
qan içən xəncər qoymuşdur.

Sənin xumar gözlərin məni öldürmək üçün kipriklərini
nizama düzüb.

İtmiş könüldən soraq etdim, gördüm,
Ki, zülfün onu Mənsur kimi dara çəkib.

Gah zahid kimi Kə'bə paltarı geydim,
Gah da kilsədə rahib kimi zünnar bağladım.

Məgər sən yarın şəklisən, məgər sən Çin nəqşisən?
Belə bir surətdə  nəqşi-nigar heç kəs görməyib.

Belə ipək paltar geymiş nə adamdır ki,
Onu nəccar ağacdan yonub düzəltmişdir?

Nə Müştəri, nə Baki, nə Növrəs, nə Nəvvab,
Onların kəlamı ürəyimin güzgüsündən pası apardı.

Başqa saqidən söhbət açma, abi-kövsər saqisindən danış,
Ki, Muxtarın şəfa tapması onun əlindədir.

---

* Dimdiyindən musiqili səs çıxaran əfsanəvi quş.

**Vər. 437a**

## SEYYİD MİR ZEYNALABDİN QARABAĞİ

**Bəndeyi-həqir Mir Zeynalabdin Qarabaği Ağa Mir Seyyid Haşımın oğlu, Ağa Mir Fəsih Musəvinin nəvəsi hicri 1303-cü ildə (1885-86) 31 yaşında imam Rzanın ziyarətinə getmək istəyəndə dostlarıma yadigar olmaq üçün yazdığım "Səfərnamə" və başqa bir neçə qəzəli aşağıda təqdim etdim.**[*]

### "SƏFƏRNAMƏ"

Ey əzizan, bu sözə guş verin mərdanə,
Çün gəlib təb'imə, söylüm sizə bir əfsanə.

Ta mən ol şəhri-Qarabağdan oldum birun,
Yetişib qəbristanə, oturdum dilicanə.

Dilican vağzaladin bizləri bir gündə çəkib,
Ta yetim Səfərəli, gördüm açıb çayxanə.

Çay içib, rahət olub, bə'd gedib, bilet alıb,
Nisfi-şəb oldu, gəlib çün otuduq vaqonə.

Rahi-ahən dedilər, çox mənə düşvar gəlib,
Çün oturdum ki, nə gördüm, necə rahətxanə.

Ol qədr tünd gedirdi ki, qalırdım valeh,
Teyyül-ərzi vardır, ya ki, uçar mürğanə.

Sübh olunca bizi bir şəhrə yetirdi nagəh,
Badkubə dedilər, şəhr idi çox şahanə.

* * *

Şəhrin əhlinə yetişdim ki, tamami xəzpuş,
Bilmədim öz malıdır, ya ki, alı qərzanə.

Ta məəttəl oluban şəhrdə müddət qaldıq,
Şəhər əhli, dedilər, tez gələcək kəştanə.

Kəştilər gəldi o dəm, hər biri bir yerdə durub,
Hökm edib kəşti əmiri o zaman losmanə.

---

[*] Mir Möhsün Nəvvabın əmisi oğludur.

Gəlib əsbabımızı aldı, apardı içəri,
Özümüz də oturduq, kəşti düşüb ümmanə.

Neçə saat gedibən təşvişə düşdük ol dəm,
Çün şəfi' gətdik Hüseyni o zaman rəhmanə.

Kəşti aram tapıb, rahat olub, kəştinişin,
Şükr edib, həm də qılıb kəşti əhli hənnanə.

Tazə şəhri o qədər tərif edib xürdü kübar,
Yetişib şəhrə görəm şəhrdə var dörd xanə.

Nə dirəxti, nə ələfzarı, nə abı vardır,
Bir tərəf kuhə baxır, bir tərəfi ümmanə.

Balbulax söylədilər suyunu, içdim, ya rəbb,
Elə bu qismət ola Şümr ilə həm Sən'anə.

Bə'd qoydular bizi bir təbəqə, barc deyib,
Su təlatüm elədi, axırı yetdim canə.

Mixayliski zərifə yetişib gördüm mən,
Bir yerə oxşamadı ta ki, məgər neyranə.

Qızılabada gəlib, gördüm o dəm neçə kəsi,
Oranı abad eləyib, tabe'dilər İranə.

Furqona əyləşibən neçə nəfər həmdəm ilən,
Ta ki, düşdük o zaman məmləkəti-Turanə.

Hər dehə yetdik onun dilini bilmək düşvar,
Nə deyim mən belə məxluqa, belə insanə?

Gəldim ol Eşqabada sürət ilə rahət olum,
Çox çibinlik, birəlik, abü həva gərmanə.

Eşqabad xahiş edən, bu fikiri tərk eylə,
Bil, qələt eyləmə sən, gər gələsən Turanə.

Bura hər nə yığılıb cagəşü tiryakkəşdir,
Cümlə Şirazivü Yəzdivü baxın Sifhanə.

Gəlibən bu bid'ət yerdə salıb şəhri-rus,
Bura türkmən yeridir, lənəti-həq türkmanə.

Çarvadar danışıban, əzmi-Xorasan elədim,
Üç günə bizləri apardı o gün Qoçanə.

Qoçanədik o qədər enişü yoxuş getdim,
Yeriməkdən piyada axırı yetdim canə.

Söylədim əhli-Qoçanə: Tapılır burda araq?
Dedilər: Hər evə getsən, olusan məstanə.

İki gün orda qalıb, bə'd oradan köçdük.
Üzümüz düşdü əcəb dəşt çün biyabanə.

Üç gün, üç gecə sərasər o zaman yol getdik,
Gecə sərma oludu, ruzləri gərmanə.

Dördümüncü günü sübh idi, gəlib çarvadarım,
Söylədi: Düş salama, səcdə elə sübhanə.

Nagəhan düşdü gözüm günbədi-tilayə o dəm,
Qəlbdən pas gedib, xirələndi çeşmanə.

Ta zivarət oxuyub, bə'd dualər elədik,
Bəlkə qismət ola hər mömin müsəlmanə.

Çün sora olduq oradan iki fərsəx getdik,
Ta yetişdik dəri-dərvazeyi-Xorasanə.

Daxil olduq içəri, çün gəlibən neçə nəfər,
Dəstgir etdi bizi qafilədən düzdanə.

Əcz ilə söylədim: Axir günəhimiz nə ola?
Dedi: Biz tabeyik ol əmri-hökmi-divanə.

Əlqərəz, bir pənəbad aldılar, ordan keçdik,
Çün düşüb nəhr kənarilə bir xiyabanə.

Zöhr olunca o xiyaban ilə getdik, axır,
Dəmi-bəstə yetişib, lərzə düşüb əndamə.

Biri dünyanı dağıtsa, gəlibən bəstəgireh,
Kimsə tutmaz ətəyin, düşmüş ola yüz qanə.

Çox kəsi gördüm, onun börgünə vermişlə nişan,
Dutdum əhval, dedilər: Nökərik bu sultanə.

Dari-səhnə yetişib, busə edib payi-dəri,
Bəd təzim elədim zamini-qəribanə.

Dəri-səhn üstə qoyublar bir əlamət saət,
Eşidir sövtünü orda nə qədər var xanə.

Səhnin ətrafına baxdım ki, tamam mədrəsədir,
Hər birində bir axund məşğul idi Qur'anə.

Səhnara bir balaca günbədi-tila gördüm,
Hövzi mərmərdi onun, ismidi Səqqaxanə.

İki eyvani-tiladır, dəri, divarı tila,
İki güldəstə tila şölə salıb hər yanə.

Kəfşxanaya yetib, gördüm o dəm bir nəfəri,
Kəfş alıb, kəfş verir, heç eləməz səhvanə.

İstədim izn duası oxuyub, daxil olam,
Dəri-pada dayanıb düşmüş idim əbdanə.

Biri gəldi sölədi: Qoy sənə dəlil olum,
Söylədim: Get kənara, durma belə hərfanə.

Mən özüm yaxşı dəliləm, burada yox mislim,
Həm peyğəmbərdi babam, nisbətim çatar anə.

Daxil oldum hərəmə, bə'd ziyarət oxuyub,
Əcz ilə ərz edəlim zamini-qəribanə.

Ey verən mətləbini rumü-firəngü-həbəşin,
Həm olan zamin o gün ahuyi-biyabanə.

Həll elə müşkülümü, gəlmişəm ümmidinə mən,
Səni verrəm qəsəm ol zati-paki-Yəzdanə.

Uç dəfə şut eləyib, guşədə tutdum aram,
Həzər etdim o zaman hər tərəfə, hər yanə.

Bir zaman düşdü gözüm mərqədi-şahi-ərəbə,
Dürrü yaqut, gühər, lə'ldi, həm dürdanə.

Misli-rizvan kimi vardır hərəmin həşt dəri,
Həm məlaikdi, baxın onda duran dərbanə.

Çeşmlər kordu, bilməz o şəhin rütbəsini,
Ənbiyalar gəlibən cəm' olur Xorasanə.

Yeddi yüz nökərə birdən verilir şamü nahar,
Bil, qutarır nə qədər olsa zərü-simanə.

Müstəməh, görməmisən, ta nə deyim vəsfini mən,
Huşməndan gələ, acizdi vura mizanə.

Ey xuda, Seyyidə qiymət elə pabusi-Hüscyn,
Ta verə canın o dəm ol şəhi-şəhidanə.

* * *

Könlüm edər həmişə səni, dilbər, arzu,
Od urdu cismü canımara yeksər arzu.

Sən bir girami gövhərsən, mən fəqiri-eşq.
Müflis olan həmişə edər gövhər arzu.

Mən kafəri-məhəbbətəm, ey təl'əti-behişt,
Bicadı, gər behişti edə kafər arzu.

Gözdən salıb o nərgisi-bimarlar məni,
Müddətdi məst gözlərini gözlər arzu.

Şəha, nə mən müqəyyədəm ol zülfi-ənbərə,
Aləm edər o türreyi-mişki-tər arzu.

İslam görsə qamətini, bütpərəst olur,
Bütxanə içrə vəslin edər bütlər arzu.

Gəl bir xurama, ta ki. qiyamət əyan ola,
Seyyid o sərv qamətini eylər arzu.

* * *

Ey məhvəşim, edib günümü qarə, gözlərin.
Bülbül kimi gətirdi məni zarə gözlərin.

Qaşın çəkibdi xəncərini üstümə, nədən,
Hökm eyləyibdi qətlimə ol qarə gözlərin?

Kəc baxma, məhcəbin, eləmə bağrıqan məni,
Bağrım başın nədən eləyib parə gözlərin?

Bir baxmaq ilə aldı əlimdən qərarımı,
Saldı məni bu bəstəri-bimarə gözlərin.

Söylə ki, razı olmasın, ey sərvnazi-hüsn,
Aşiqlər içrə yalvaram əğyarə, gözlərin.

Rəbbim edib cəhim odunu Seyyidə haram,
Billah, yəqin məni salacaq narə gözlərin.

* * *

Əzizim, bir yaman dərdə əcəb könlüm düçar olmuş,
Qərarü səbrimi aldı, şəbü ruzim nə tar olmuş.

Mənə Məcnun kimi zəncir urub səhralara saldı,
Necə gör bivəfadır kim, gedib əğyara yar olmuş.

Nedim, məhrulərin yoxdur vəfası bu cahan içrə,
Mənim, billah, yuxum gəlməz, o məh məndən kənar olmuş.

Gülün cövrü cəfasın çox çəkər biçarə bülbüllər,
Nə mürvətdir cəfa çəksin gülün qoynunda xar olmuş?

Şərimdən məhv olub əqlim ki, rüsvayi-cahanəm mən,
Sənin eşqində, ey cana, bu çeşmim əşkbar olmuş.

Tamam aşiqlərin məşuqəsin gördüm kənarında,
Mənim də dilbərim, ey dil, əcəb məndən fərar olmuş.

Rəqiba, həq sənin yıxsın evin, məndən kənar etsin,
Yəqin bil, Seyyidin karı həmişə ahüzar olmuş.

* * *

Mail olubsan gözləri şəhlaya, ey könül,
Bel bağlama bu dəhrdə zibaya, ey könül.

Az qaldı dinimi ala Sən’an tək mənim,
Gəh çəkdi deyrə, gahi kəlisaya, ey könül.

Məcnuna Leyli neylədi, mə'lumdur sənə,
Yusif də Misrdə o Züleyxaya, ey könül.

Üşşaqın öldürür necə insafı yox bunun,
Mən nə deyim bu kafəri-tərsava, ey könül?

Hər kimsə gəlsə bir dəfə güftara yar ilən,
Qəlbi düşər bir özgə təmənnaya, ey könül.

Əhya edər bir ləhzə nəzər sala mürdəyə,
Bənzər bunun bu möcüzü İsaya, ey könül.

Şirin dil ilə bir dəfə dindirmədi məni,
Dərdi-dilim de qaməti tubaya, ey könül.

Seyyid yanır fəraq oduna, sən də hifz elə,
Salma özün bu zəhməti-bicaya, ey könül.

* * *

Sənin eşqində bu könül olub sədparə, ey dilbər,
Edən səndən səvay olmaz bu dərdə çarə, ey dilbər.

Necə gör şəkkə gəldim bu cahan içrə ki, rüsvayam,
Nedim, yoxdur əlacım, yalvarım əğyarə, ey dilbər.

Olum qurban o sərvqəddə mən, ey dilbəri-məhru,
Rəqibə razı olma aşiqin yalvarə, ey dilbər.

İki şəhla gözün bimarıyam mən, ey mələksima,
Əcəb daruydir vəslin sənin bimarə, ey dilbər.

Sənə yaxşı deməzlər mən öləm bu arzu ilən,
Nolu gəlsən mənimlə güftarə, ey dilbər?

Gər atsan tiri-müjganın, sınar ayineyi-qəlbim,
Necə peyvənd olur şişə, gər olsa parə, ey dilbər?

Yanır Seyyid fəraqında həmişə ahüzar ilən,
Ona lütfünlə bir rəhm et, elə nəzzarə, ey dilbər.

**Seyyid Zeynalabdin ibn mərhum Mirhaşım Qarabağinin şeirləri tamam oldu. (Rəbiül-əvvəl, 1309 – oktyabr, 1891)**

**Vər. 443a**

## MOLLA SALEH

### (Rəbiül-əvvəl, 1309 – oktyabr, 1891)

**Molla Saleh Qarabağın Zəngilan əhalisindəndir. Təxəllüsü Bülbüldür. Müşahidəmə görə, qırxyaşlı görünürdü. Zəif bədənli, xırda gözlü bir şəxs idi. Peşəsi rövzəxanlıq etmək idi. Nazik-incə səsi var idi. Bəzən şeir də deyirdi. Aşağıdakı şeirlər onundur. Bu şeirlərdən məlum olur ki, yazmağa təzə başlayıb.**

Taqi-əbrulərini görmüşəm, ey can, ölürəm,
Edərəm gözlərinə canımı qurban, ölürəm.

Səcdəgahımdı mənim qaşlarının tağı, yəqin,
Etməyən taət ona tapmayıb iman, ölürəm.

Qoy baxım gözlərinə, gözlərim olsun rövşən,
Olmuşam gözlərinə valehü heyran, ölürəm.

Məni bimar eləyib nərgisi-bimarlərin,
Gər ləbindir, sənəma, olmasa dərman, ölürəm.

Mürği-dil xalını görmüş, uça istər təndən,
Dama sal, zülfünü bir eylə pərişan, ölürəm.

Olma məğrur, gözüm, hüsnünə, bax aşiqinə,
Nə zərər, baxsa əgər çakərə sultan, ölürəm.

Məni öldürdü bu həsrət ki, rəqibim oturub,
Yar ilə söhbət edir xürrəmü xəndan, ölürəm.

Bülbüləm, gül üzünün həsrətiyəm, bircə dayan,
Görüm ol gül üzünü, can verim asan, ölürəm.

* * *

Ey yari-dilrüba, səni pünhanı görmüşəm,
Guya behiştdə nəxleyi-tubanı görmüşəm.

Mövzun qədini, şiveyi-rəftarını görüb,
Etdim yəqin ki, sərvi-xuramanı görmüşəm.

Qamət deyil, qiyami-qiyamətdir aşkar,
Görcək dedim: Qiyaməti-kübranı görmüşəm.

Təşbih edənlər ər-ərü şümşada qəddini,
Vallahi, mən əgər belə böhtanı görmüşəm.

Məcnunmisal çöllər olub məskənim mənim,
Ol vəqtdən ki, qaməti-Leylanı görmüşəm.

Can nəqdini nisar edərəm xaki-payinə,
Lazım deyil bu can mənə, cananı görmüşəm.

Bir Bülbüləm ki, şüğlüm olub naləvü fəqan,
Fəsli-xəzanda türfə gülüstanı görmüşəm.

**Bülbülün qəzəli tamam oldu,**
**rəbiül-əvvəl, 1309 – oktyabr, 1891**

**Vər. 444a**

## KAVALER QARABAĞİ ADI İLƏ MƏŞHUR OLAN SUFİ TƏXƏLLÜSLÜ KƏRBƏLAYİ MƏHƏMMƏD

**Kərbəlayi Məhəmməd Sufi Şirin bəy Qarabağinin oğludur. Şuşa şəhərinin Çuxur məhəlləsindəndir. Təxminən qırx beş yaşlı bir kişidir. Sağdır. Ucaboy, yoğunbədən bir şəxsdir. Şeytan sözünə aldanıb, cavanlığının əvvəllərində o biçarə nahaq qan tökdüyünə görə şəhərdən qaçıb, kazak və yolkəsənlərlə birlikdə dağda-daşda ömür keçirir. Şeir də deyərdi. Şeirlərindən bu bir bənd qəzəl əlimə keçib, aşağıda yazmışam.**
**Haşiyədə: Kərbəlayi Məhəmməd 1309-cu ilin ramazan əl-mübarək ayında (aprel, 1892) Arazın kənarında arvadını və qaynanasını öldürüb qaçır. Arvadının qardaşı onu təqib edir, tutur. Qollarını və başını kəsir. Bədəni biyabanda qalır. Nəhayət, bir şəxs onu dəfn edir.**

Hər dəm ki, yarım üzündən niqabı atır,
Aşiqlər o xoş haldan qiylü qala düşür.

Onun gözəlliyinin ziyası Musanın gözündə cilvə edir,
Dağlara yüksək səs salır.

Gah "ənəlhəq" söyləyir, Nilin dayanmsına əmr verir,
Gah öz həmsöhbətini həyəcana salır.

Sənin gözəlliyin bir ləhzə aşiqin gözündən uzaq olanda,
Səni istəyənləri qəmə, dərdə, məlala salır.

Kən'an ayı (Yusif) gah bazara meyl edər,
Gah əlindəki sapı zal–qoca şəklinə salır.

Elə ki, mütrib səni yad edib rəqsə gəlir,
Öz saçlarını gözəllik tənburuna salır.

Saqi əlindən şərbət dadan gündən,
Mədhuş Sufini vəcdə salıb.

**Vər. 444b**

## ƏBDÜL HÜSEYNƏLİ OĞLU RƏHZƏN

**Əbdül - Məşədi Murad oğlu Hüseynəlinin oğlu, Şəkərbanunun nəvəsidir. Qarabağ əhlindəndir. Şuşada anadan olub, Hacı Yusifli məhəlləsindəndir. Yaşı təqribən qırx, qırx iki olar. Cüz'i savadı var. Pərakəndə satiraları, cəfəng şeirləri və növhələri vardır. On il olar ki, Rusiya tərəfə gedib, o tərəflərdə ömür sürür. Aşağıdakı şeirlər onundur. Təxəllüsü Rəhzəndir. Ancaq deyirlər ki, indi dəyişib Şahin təxəllüsü götürüb.**

### QƏZƏL

Salıb məni qəmi-eşqin bir elə halə, balam,
Göz ilə görməyəsən, gəlmənəm xəyalə, balam.

Şikayəti-qəmi-hicranı birbəbir edərəm,
Yetişsə bir də əlim daməni-vüsalə, balam.

Qaşın şəbahəti tiği-Əliyyi-imrandır,
Yüzün Məhəmmədə bənzər, gözün hilalə, balam.

Siyahpuş olub, gizlənibdi zülfdə dil,
Yəqin kəmində vatıb arizində xalə, balam.

Təmami-xəlq edər Kə'beyi-xudayə sücud,
Əyibdi qibləyə qaşın, məni şimalə, balam.

Yenə xummar gözün ox çəkib, kaman tutmuş,
Yəqin veribdir onaləblərin piyalə, balam.

Olur günah, edən əmr davərə, Rəhzən,*
Sənə məhaldır üsyan gələ xəyalə, balam?**

* * *

Dərildim bəzmi-gülzari-nigarımdan alaqlar tək,
Saraldım cuybari-əşki-çeşmimdən calaqlar tək.

* Çapda bu misra belədir: "Günahkar olur əmr davərə, Rəhzən."

** Qəzəlin son üç bəndi təzkirənin, Nəvvabın qeyd etdiyi kimi, on altı vərəqdən sonra 461 a vərəqində yazılıb.

Xədəngi-qəmzəsi dəlmiş dili-zarı miyanından,
Dolandıqca olur piçidə zülfə tağalaqlar tək.

Rəqibin tişeyi-zülmilə dərgahından ol yarın,
Atıldı təxteyi-cismi-zəifim qamqalaqlar tək.

Müqabil mehri-ruyində sənə durmaq deyil mümkün,
Dolan şamü səhər zülfündə, ey dil, yapalaqlar tək.

Ləbi-lə'li içər əğyar ilə cami-meyi-gülgun,
Bu möhnətdə könül hər dəm dönər qanə, dalaqlar tək.

Salıb çahi-zənəxdanına guya qanlıdır könlüm,
Ayağına urub zənciri-zülfü qandalaqlar tək.

Həvayi-vəslinə bir sadə tiflin pir ikən düşdüm,
Qəmi-hicri töküldü üstümə qalaq-qalaqlar tək.

Üzülsə can qoyub əğyar dəsturül-əməl, Rəhzən,
Ayaq basmaz təbibim başım üstə yatalaqlar tək.

* * *

Bülbüli-dil meyl edib gülzar içində bir gülə,
Tutiyi-can arzumənd oldu bir şirin dilə.

Qönçeyi-lə'li-ləbi-canana meyl eylər könül,
Qana düşmüş tazədən təng olmaq istər hövsələ.

Mahi-gərduni müqabil etməzəm rüxsarına,
Gərçi ürf içrə olur təşbihi-naqis kamilə.

Mahru Üttara bu gün Müştəri heyran olub,
Zülfdə çin guyiya sarmaşmış Əqrəb Sünbülə.

Mürği-dil hər gülün üstə aşiyan etmək sevər,
Yalvarır gəh bağbana, gəh gülə, gəh bülbülə.

Cəbrəili-dil gətirmiş kuyinə bu Rəhzəni,
Ta* verə qurban Minayi-eşqdə İsmailə.

* Orijinalda "ya"

## RƏHZƏNİN, YƏNİ ŞAHİNİN MİR MÖHSÜN AĞA NƏVVABA CAVABI*

Yetişdi nameyi-namın məni-biyarə, ay ağa,
Əcayib mərhəm oldu bu dili-əfkarə, ay ağa.

Sizə əbdi-zəliləm mən, cənabın pak mövladır,
Nə qürbim var belə lütfilə bu əş’arə, ay ağa.

Nə fərmanın ki, olsa qulluğunda çakərəm, çakər,
Cənabın şə’ni üzmadır, bizik biçarə, ay ağa.

Sənin elmü sənin helmin kimə məqdurdur, mövla?
Deyil möhtac əqlü fəhminiz əxbarə, ay ağa.

Çirağı-hər şəbistansan və ya ki, nuri-imansan,
Günəşsən tihi-zülmətdə qəmu əbrarə, ay ağa.

Sizə Rəhzən olub bəndə, hüzurunda sərəfkəndə,
Dua qıl, ta ki, möhtac olmasın əğvarə, ay ağa.

* Bu qəzəl təzkirənin avtoqraf nüsxəsində yoxdur, çap nüsxəsindən götürülmüşdür.

**Vər. 445b**

## ƏLİ AĞA CAVANŞİR

**(Rəbiül-əvvəl, 1309-cu il – oktyabr, 1891)**

**Əli ağa Məhəmməd Qasım ağa Cavanşirin oğlu Kərim ağanın oğludur. Qarabağın Şuşa əhlindəndir. Şuşada anadan olub. Yaşı otuz beş olar. Rusca savadı var. Hacı Yusifli məhəlləsindəndir. Əli adı ilə bəzən şeirlər də deyir.Xoşxasiyyət bir cavandır.**

**Aşağıdakı şeir onundur:**

Sənin ahu kimi çeşmin mənə bir ləhzə ram olmaz,
Təəccübdür, bu gunə dərd ilə ömrüm tamam olmaz.

Həqiqətdə nə xoşdur kafərin qəlbində rəhm olsa,
Sənin qəlbində bəs rəhm eyləmək necə, həram olmaz?

Hüzurunda pərişan söylərəm, mə’zur tut, cana,
Cünuni-eşq əqlində yəqindir ki, nizam olmaz.

Səni dilbər nəvaziş eyləyə, əlbəttə, qədrin bil,
Qənimətdir, könül, məhvəşlərin lütfü müdam olmaz.

Mənə məşuqəsiz xüldi-bərin bağı cəhənnəmdir,
Hüzuri-yardən qeyri, həqiqət, xoş məqam olmaz.

Nə lazımdır mənə sazü nəvazü tarü həm bərbət,
Fəraqınla xarab olmuş könül heç şadkam olmaz.

Əgər kərrat ilə mə’zul qılsan xaki-kuyindən,
Əli bir yana getməz, çün onunçün nəngü nam olmaz.

* * *

Ey mahru, nə vəqtə kimi hayü hu çəkim?
Həmvarəyi-qumri dil açıb, ku-ku çəkim?

Hicrin sənin ki, dağ çəkib qəmli sinəmə,
Göz yollara dikib, haçana arzu çəkim?

Çün səndə rəhm yoxdu, mənə vacib oldu kim,
Şəkkər dodağü xali-ləbi mən giro çəkim.

Daim xəyalın ondadı kim. şövqü zövq ilə,
Xuni-Əliylə mümkün ola ta vüzu çəkim.

* * *

Vücudun olmasa, mən bu cahanı neylərəm sənsiz,[*]
Sənin zikrindən özgə dastanı neylərəm sənsiz?

Mənim könlüm açılmaz səndən ayrı, ey mələksima,
Gülü, bağü baharü gülüstanı neylərəm sənsiz?

Səri-kuyində olmaq xaki-pay'ın eyni fəxrimdir,
Bu hal ilə məni-xəstə cahanı neylərəm sənsiz?

O qara zülfdən, məstanə gözlərdən iraq yerdə,
Salam zəncirə ahuyi-Xətanı, neylərəm sənsiz?

Həqiqət, mən əgər bir busə ilə ağ buxağından,
Təməttöh tapmasam, abi-bəqanı neylərəm sənsiz?

Əli Məcnun kimi zənciri-zülfündən xilas olmaz,
Olub misli-cəhənnəm xanimanı neylərəm sənsiz?

* * *

Bir deyirmi görəsən aşiqi-məhcur idi bu?
Eşq peykanı dəyib, sinəsi rəncur idi bu?

Gündə min al eləyib, qəlbimə çox yarə urub,
Yoxsa zülm etmək üçün aləmə mə'mur idi bu?

Qabü-qövseyn kimi qaşları bir halə salıb,
Hər görən "heyf" deyib, gör necə məhcur idi bu!

Hər nə təqsirim ola, əfv eləyin, əz bəs ki,
Eşq divanəsiyəm, aləmə məşhur idi bu.

Əliyəm, eyləməyin çox mənə rizvan vəsfin,[**]
Kuyi-yarı görürəm, siz deməyin "kur idi bu".

---

[*] Bu şeiri Nəvvab səhvən Saların qəzəlləri ilə bir yerdə yazıb, sonra da özü qeyd edir ki, "aşağıdakı qəzəl Əli ağa ibn Kərim ağanındır, səhvən burada yazılıb."
[**] Bu şeir və bundan sonrakı qəzəl avtoqraf nüsxədə Əli ağanın qardaşı Hüseyn ağanın şeirlərindən sonra verilib.

* * *

Libasın nazilə dün gün o dilbər səbzfam etdi,
Nizamü işvəvü əyyarlıq rəsmin təmam etdi.

Götürüb dəstinə bir beydəqi-hüsn ol şəhi-xuban,
Çəkib səf ləşgəri-müjgandan türfə xuram etdi.

Kaman qaşı çəkib xəncər, siyəh çeşmi tutub peykan,
Büsati-cəngi bir qaşü göz ilə intizam etdi.

Piyada əzmi-bağ etdi, dili-üşşaq mat oldu,
Yığıldı xaneyi-şeşdərdə bu ləşkər dəvam etdi.

Mübariz üzdə ol daneyi-xal oldu mərdanə,
Kəməndi-zülfi-pürçini könül mürğinə dam etdi.

Kəsib rahi-qürizi hər tərəfdən qoydu həsrətdə,
Əsir olmağa şövq ilə dili-üşşaqı ram etdi.

**Vər. 446a**

## HÜSEYN AĞA CAVANŞİR

**Hüseyn ağa da Kərim ağa Cavanşirin oğludur, Əli ağanın qardaşıdır. Rusca da savadı var. Öz adı ilə şeir də yazır.**

**Aşağıdakı şeirlər onundur:**

Düşəndə yadıma zülfi-nigar qürbətdə,
Xərabə könlüm olur tarümar qürbətdə.

Tənim nizar, özüm zarü gözlərim pürxun,
Məni bu dərdə salıb hicri-yar qürbətdə.

Gecə sabaha kimi ahü zara mö’tadam,
Gözüm yolunda qalıb intizar qürbətdə.

Vüsalın ilə elə könlümü şikar, barı,
Bu növ’ qoyma məni dilfikar qürbətdə.

Fəraqi-zülfilə zarsan, Hüseyn, möhnətdə,
Urubdu yoxsa səni şahmar qürbətdə?!

**Vər. 447a**

## BAXIŞ BƏY SƏBUR

**Baxış bəy Əsəd bəyin oğludur. Qarabağın Şuşa əhalisindəndir. Bəhram bəy Fədainin kiçik qardaşı, Asinin bacısı oğlu və Zakirin nəvəsidir. 28 yaşlı xoşəhval bir cavandır. Farsca və rusca savadı var. Şuşada anadan olub. Şeirdə təzədir. Aşağıdakı şeirlər onundur. Təxəllüsü Səburdur.**

**Ramazan, 1309-cu il – aprel, 1892.**

### SƏBURUN NƏZİRƏSİ

Yenə təxti-hökumətdə şəhi-xuban məqam etdi,
Sipahi-hüsn mövcün səthi-rüxdə intizam etdi.

Yığıb başına müjganın sipahi-bihududu göz,
Könül mülkünü viran etməyə ol şəh qiyam etdi.

Rüxi-dil mürğünə xali-siyahın etdi çün danə,
Düzüb ətrafi-xalə həlqeyi-geysuni dam etdi.

Çəkib tirü kamanı qaşü gözdən Rüstəmi-dövran,
Kəməndi-zülfə dil padşahını qulam etdi.

Qoyub üz üstümə ol şux, rə’na yüz təravətlə,
Alıb can paytəxtin, möhnətin onda davam etdi.

Əsir etdi dilim çahi-zənəxdə zülfü bir müddət,
Ona rəhm eyləyib, axır ləbi təklifi-cam etdi.

İlahi, günbəgün xəndan qıl yarımın ləbi-lə’lin,
Ki, bir cam ilə biçarə Səburu niknam etdi.

* * *

Gəl, ey xəyalı tənimdə müdam olan, ölürəm,
Xəyali-lə’lin ilə bağrım oldu qan, ölürəm.

Gəl imdi başımın üstə otur ürəkli, sənə,
Edim bu dərdi-dilim ləhzeyi-bəyan, ölürəm.

Əcəb qaraldı günüm dudi-ah ilə şəbü ruz,
Fəraqi-zülfün edib zarü natəvan ölürəm.

Nolur vüsalınla eyləsən məni xürrəm?
Fəraqa yetmək ilə yetdi cana can, ölürəm.

Səbur idim, tükənib səbrü taqətim, etdim,
Xəyali-vəslin ilə tərki-xaniman, ölürəm.

* * *

Gün ruyinə ki, həlqeyi-zülfün səhab olur,
Eylə kənara, yoxsa bu aləm xarab olur.

Qoy bir baxım üzündə sənin xəttü xalına,
Qur'an hürufinə nəzər etmək savab olur.

Bərgi-çinar tək səri-zülfündə dil əsər,
Hərgah səbada zülfi-siyəh piçü tab olur.

Zülfün nə vəqt cilvə edib nərd oynayır,
Səthi-rüxündə cümleyi-ev bəstəbab olur.

Olmaz əcəb əgər dura əflak bisütun,
Onlara bəs ki, rişteyi-ömrüm tənab olur.

Gərçi Səbur vəsfi-rüxün yazmaq istəsə,
Vallahi kim, o vəsf tükənməz kitab olur.

* * *

Zülfün fəraqda mənə şəb gör nə tar olur,
Könlüm ənisi ol gecədə şahmar olur.

Bilməm nedim ki, dəysə səba tari-zülfünə,
Bişəkk, mənim bu könlüm evi tar-mar olur.

Gər gül edə müqabil özün gül camalına,
Eylə yəqin ki, xarı kimi xarüzar olur.

Xiclət çəkib səhaba girər aftab o dəm,
Məh tək cəbindən səri-zülfıın kənar olur.

Nərgis qaçıb, həras edib, bağda gizlənir,
Hər vəqt çeşmi-nərgisi-məstin xumar olur.

Eylər Səbur həlqeyi-zülfünara vətən,
Çünki qəribə mənzil olur, qanda tar olur.

* * *

Dərsin nə vəqtədək güli-ruyin rəqiblər?*
Aya olurmu kam alalar binəsiblər?

Can versəm, etmə mən' ki, çoxdan bu rəsmdir,
Məhbuba can nisar qılarlar həbiblər.

Şurü nəvaya gəldi könül arizin görüb,
Ari, gül üstə nalə edər əndəliblər.

Düşnam ləblərinə nə layiq, dedim, dedi:
"Dərman içində zəhr verərlər təbiblər".

Səbrü şəkibə etmə dəlalət məni, Səbur,
Sabir olurmu xasiyyəti-müztəriblər?

* * *

Mənə sənsiz, nigara, munisü qəmxar olubdur qəm,
Nə andan özgə bir yavər, nə ondan özgə bir həmdəm.

Görüm, ey dil, qəra gün olmasın bir ləhzə səndən dur,
Necə kim, hərfi-qaf olmaz olur ləfzi-qəradən kəm.

Qaşınla bəhs qılmaz əyrilikdə tazə ay, bəlkə,
Əyağın toprağından busə almağa olubdur xəm?

Deyil adəm səri-kuyində mənzil tutmağa layiq,
Fəzayi-xaki-payın feyzini bulmaz yetən adəm.

Səbur etməz təvafı-Kə'bəyə meyl, afəti-candır,
Dərindir səcdəgəh üşşaqə oldur Kə'beyi-ə'zəm.

* * *

Ruyin kimi gülşəndə nə gül, nə çiçək olmaz,
Xalın kimi nə müşki-Xütən, nə mixək olmaz.

Ey arizi-cananı görüb, "huri" deyən kəs,
İdrakına gəlməzmi, bu surət mələk olmaz?

---

* Aşağıdakı qəzəlləri Səbur təzkirəyə öz dəsti-xətti ilə yazmışdır.

Rəmzi-dəhənin qönçədən ilhah ilə sordum,
Bir sirr idi mövhum, dedi kim, demək olmaz.

Ey eşq, nə kim var qəmin, könlümə göndər,
Tifli-qəmə könlüm kimi rahət bələk olmaz.

Səbr eylə, Səbur, eyləmə nahəq yerə fəryad,
Pamali-qəmi-eşq olana bir kömək olmaz.

* * *

Qəmgin könüldə qaşlarının iştiyaqidir,
Mehrü məhəbbətin dili-zarımda baqidir.

Candan əziz saxla onu laləsan, könül,
Bağrımdakı o lalərüxün hicr dağıdır.

Qəmzən xədəngi sinəmə sancılsa, vəchi var,
Zinət verir ona qəm eşqin vüsaqıdır.

Çeşmin kənarına yazılan xətt budur, gözüm,
Bimar edən bunu o birinin fəraqıdır.

Ləli-ləbindi badi-həqiqətdə, yoxsa kim,
Zülmati nur, abi-həyatın bulağıdır?

Hər qanda bir qəm olsa, gəlir qəmli könlümə,
Guya rəmidə könlüm elə qəm yatağıdır.

Tərki-vəfavü əhd elədi yar, sən də et.
Nalə, Səbur, naləvü fəryad çağıdır.

* * *

Görər ki, bədnəzər ilə baxar sənə güllər,
“Və inna yəkad” [*] oxur hüsnünə ənadillər.

Sayəncə dillər edib tiri-ahın amadə,
Nə cür’ətə uzadır şanə zülfünə dillər?

Məgər ki, badi-səba dəydi zülfi-pürxəminə,
Ki, səhni-bağda pəjmürdə oldu sünbüllər?

---

[*] Qur’an, Əl-Qələm surəsi, 51-ci ayə.

Desəm dəhanına yox, var dəlili-mə’qulim,
Yəqin ki, yox var imiş, “yox" deyiblər aqillər.

Səbur, istəmə vəslin, fəraqa səbr eylə,
Ki, çoxdu sən kimi feyzi-vüsalə maillər.

* * *

Tərəhhüm eylə, nigara, bu qədr naz olmaz,
Olan camalına məğrur sərfəraz olmaz.

Kamali-hüsnünə layiq gərək ola xülqün,
Məgər eşitməmisən, bir gül ilə yaz olmaz?!

Gözündən umsa qaşın rəsmi-səcdə, kəc getmiş,
Ki, məst heç zaman maili-namaz olmaz.

Uzun zamandı könül zülfdən çəkər qəmü rənc,
Deyillər qara günün ömrü bəs diraz olmaz?

Səbura, ərzi-camal eyləyən pərivəşlər,
Deməz Səbüktəkinə hiç kəs Ayaz olmaz.

* * *

Ey mən kimi nigahına qurban cahan, cahan,
Yetdi zəvala mayeyi-ömrüm, aman, aman!

Hər ləhzə nazü işveyi-çeşmim füzun olur,
Bilməm nə der qulağına qaşın nihan, nihan.

Gəlməz bəyana vəsfi-rüxün bir dəhan ilə,
Oldur tənim xədəngin edibdir dəhan, dəhan.

Ümmidim aftabını tutmuş xüsufi-qəm,
Nuri-rüxündən eylə münəvvər zaman, zaman.

Bilsəm, Səbur, itliyinə layiq olduğum,
Kuyinə əzm qıllam üz üstə dəvan, dəvan.

## QƏZƏLİ-CİNAS

Dilbərim hüsndə fayiq neçə min ayə gəlir,
Sanma məh nuru müvafiq rüxi-minayə gəlir.

Ayəti-müshəfi-rüxsarını vird eyləyənə,
Hər zaman cilvəgəhi-eşqdə Minayə gəlir.

Məstü mədhuş olar el, nərgisi-məstin görsə,
Nə mənə tə'nə, nə töhmət meyi-minayə gəlir.

Daməni-vəslini haşa verərəm dəstimdən,
Səngdildir bəsi yarım gedə min ayə gəlir.

Səri-kuyində Səburun ola qurbanı qəbul,
Götürüb canını nə sidq ilə Minayə gəlir.

## TƏĞƏZZÜL

Saqiya, ver şərabi-ruhani,
Tərk edim məzhəbi-müsəlmani.

Sədqə eylim əyaq əyağinə,
Hasili-zöhdü dinü imani.

Yaxam olmaz rəha ridadən, gər,
Gərübalə etməsəm ani.

Bu nə dəlqü nə xirgə, nə səbhə,
Bu nə səccadə, nə duaxani?

Bu nə məscid, nə minbərü mehrab,
Bu nə aşüftəgi, nə heyrani?

Zahida, hazıram cavab verim,
Salsan ortaya bəhsi-üqbani.

Sən uzat "əlhəm" içrə "vələzzalin"*,
Mən çəkim zülfi-ənbərəfşani.

Mən edim virdü zikri-sağərü mey,
Əzbər et sən tamam Qur'ani.

Bağla sən səlsəbilə ümmidin,
Mən içim cami-rahi-reyhani.

Çəkim ağuşa dilbərim can tək,
Hur sevdası ilə ver cani.

* Qur'an, "Fatihə" surəsi.

Guşeyi-möhnətində tut aram,
Mən edim gəşt bağü bostani.

Sən apar həşrə mayeyi-zöhdün,
Mən də dəstimdə cami-səhbani.

Görəlim ta kimə inayət edər,
Lütfi-həyyül-qəyumi-rəhmani.

Baxalım, kim çəkər qiyamətdə,
Tutduğu fe'ldən peşimani.

Alsalar bir fülusə taətini,
Tərk qıllam meyi-müsəffani.

Xəlqə dersən: “Fənadürür aləm".
Tutmusan dört əl ilə dünyani.

Nəhyi-münkir söləsən aləmə faş,
Mürtəkibsən harama pünhani.

Tirədir zülfi-yardan qəlbin,
Gərçi saqqalın isə nurani.

Müxtəsər, pirü şərabəm mən.
Və'zini etmə tulü tulani.

Olsa məzmum badeyi-safi,
Niyə tərit edərdi həqq ani?

Mey kəsirül-fəvaid olmasa gər,
Nədi Quranda qövli-subhani?

Kövsərin nisyə, nəqddir badə,
Nisyəyə nəqdi kim edər fani?

Xaki-meyxanədir mənə məqsud,
Sənə qalsın behişt rizvani.

Künci-meyxanə bəs fəraqətdir,
Məscidin məcməi-pərişani.

Kəcbinəm dəyişirəmsə mehrabə,
Taqi-əbruyi-yari-zibani.

Hansı kütəhnəzər tutar həmta,
Tubiyi-xüldə qəddi-balani?

Nə dəlil ilə döndərim təqlid,
Yox ədalətdə saqiyə sani.

Saqivü mütrübə, olan aqil,
Nisbət edərmi hurü qilmani?

Bəs deyilmi bu faidə meydən,
Göstərir möcizi-Məsihani?

Hanı kövsərdə bu kəramət kim,
Verə əmvatə ruhi-payani?

İçsə bir cür'ə badə gər müflis,
Əxz edər şövkəti-Süleymani.

Zərfi-kövsərdə nə əlamət var,
Cami-mey tək olarmı nurani?

Sağər ol mübəttəl yədi-beyza,
Nəsx edər şöleyi-təcəllani.

Zahida, yox cavabi-mə'qulun,
Dərdi-sər vermə ləfvü hədyani.

Mənzilin künci-xanəgəhdi müdam,
Zəhi-mə'vayi-tari-zülmani.

Mürşidi-deyr qövlün eylə qəbul,
Varsa dinində dönmək imkani.

Yaranıb bizlərə behişti-bərin,
Sizə, bişübhə, nari-neyrani.

Nə gərək hər zaman rüku'ü sücud?
Mey edər həqqə vasil insani.

Tutmusan cəhl ilə təriqi-məcaz,
Ey təriqin həqiqə nöqsani.

Al əlimdən əyağ, nəhy etmə,
Ayeyi-layurədül-ehsani.*

* "...Rədd etməz" – Qur'an, Ən'am surəsi, 147-ci ayə.

Qürbi-həqqə şərab vasitədir,
Saqiya, ver şərabi-həmrani.

Mey ibarətdir eşqi-dilbərdən,
Deyil əngurun abi-cuşani.

Eşqdir xilqəti-cahana qərəz,
Eşq salmış nizama dövrani.

Ver əlarəğmi-zahid, ey saqi,
Badəni, yəni abi-heyvani.

Nuş edim yadi-mövti-zahidlə,
Belədir piri-deyr fərmani.

Kim desə badəni həram, deyir:
Pirimiz kim, həlaldır qani.

Ey Səbur, etmə bəhs zahidlə,
Başa salmaq çətindi nadani.

**QƏZƏL**

Səndən ayrıyamsa, gözümdən, canımdan ayrıyam,
Səndən kənaramsa, hər şeydən kənaram.

Sərv kimi uca qamətinə fəda olum,
Oturub həsrətlə göz yaşı tökürəm.

Məni həlak da etsən, lütfdən bağışlasan da,
Hər nə desən qəbuldur.

Dedin ki, hicran dərdinə səbr et,
Xidmət buyur - bacardığım qədər.

Məni qulun saymasan da, üzürlüdür,
Çünki mən Allaha itaət qayda-qanununu bilmirəm.

Səbur, sənin bu dediklərin boş sözdür,
Güman edirəm ki, sənin təb'indən deyil.

**QƏZƏL**

O adam ki, ay üzlü gözəlin üzünə baxmır,
Onu adam hesab eləmə, o, kor eşşəyə bənzər.

Gözlərimi sənin yoluna fərş etmişəm,
Bəsdir daha, göz yol keçidində dayanıb, səni gözləyir.

Sözlərindən zəhər damsa da, mənə nuşdur,
Şirinin acı sözü Xosrov üçün şəkərdir.

Sənə təsir edənə qədər cismim əridi,
Ah bu ahdan ki, istisi sənin ürəyinə təsir edə bilmir.

Təəccüb edirəm eşqə, o elə kimyagərdir ki,
onun sayəsində,
Qanlı göz yaşlarım, saralmış üzüm mənim
qızıl-gümüşümdür.

Ey ürək, onun eşqinin sirrini yüz cəhdlə gizlətmə,
Gizli saxlaya bilməzsən, aləmə məlumdur.

Allah eləməmiş, başımdan sənin eşqin çıxsın,
Qəminə dözürəm, ancaq dodaqlarının şövqü
hələ başımdadır.

## QƏZƏL

Sənin vüsal ümidin həyatından da xoşdur mənə,
Sənin xəyalından başqa bu dünyada məndə
bir şey qalmayıb.

Aləm heç olsa, bir qəm yemərəm,
Ya Rəbb, sənin bir tükünə də zaval gəlməsin.

Bu camal, bu gözəl surətlə sən, ey nigar,
Mümkündürmü ki, bir kəs məlahətdə sənə tay ola?

Ay günəşdən işıq alır, sən gör ki,
Sənin camalının şüası altında da günəş durur.

Səbur can versə, dünyanın namərdidir,
Ölümdən qabaq sənin üzünü görməsə.

**Vər. 453b**

## MƏKTUBİ-KƏMSƏLA

(şifrlənmiş məktub)*



---

* Altı beytdən ibarət olan bu şeirin oxunması şifrlənmiş formula əsasında yazıldığından xüsusi hazırlıq tələb edir. Müəllif bu şeirin tərcüməsini də təqdim etdiyindən onun surətini verməklə kifayətlənirik.

## MƏ'NAYİ-KƏMSƏLA

Salam olsun sənə, ey gül'üzarım,
Salam olsun sənə, ey tacdarım.

Günün xoş günbəgün olsun, Xudaya.
Günün xoş olmağıdır iftixarım.

Sənə əl tapmasın, ya Rəbb, küdurət,
Keçə bəlkə tərəblə ruzigarım.

Düşə rahın bu səmtə, nəzr qıldım,
Edim qurban yolunda yoxü varım.

Olub əlhəq xəyalından fəramuş.
Deməzsən var idi bir Bəxşi-zarım.

Soruş sən halımı lütfü kərəmlə,
Duadır ömrünə şüğlü şüarım.

* * *

Ey saqi, mənə tərifə layiq bir mey gətir,
Bir müddət məni gələcək haqqında fikirdən azad elə.

Fani aləmə, bu dünyaya bağlılıq,
Başıma girməz, əgər badəmdə mey olmasa.

Ömrümün yarısı gözəl və mey yolunda keçdi,
Nə olar, əgər o biri yarısı da bu minvalla keçsə?

Şəhər şeyxi içkini haram elan etsə də, nə qəm?
Piri-muğanın fikrincə, şərab içmək halaldır.

Gülüstanı gülün taxtına gətir.
Təmiz şərabla badəni doldur!

Bu vəziyyətdə mey camının nəş'əsilə ərşə qalxaram,
Dünya qəmini isə yalançı dünyaya endirərəm.

Nə bir kəsə ülfətim, nə bir kəsdən qorxum var,
Heç kəsdən də yeyib-içmək arzum yoxdur.

Nəzm gəlinlərinin gözəlliyini ərz etsəm,
Söz gəlininə illərin təravətini verərəm.

* * *

Dizaq şairlərinin həcvinə ağız açıram,
Ki, onların nəzmi şeir nizamını pozur.

Hamısı elmdən xəbərsiz, hamısı da qəribə geyimli,
Hamısı əxlaq işlərindən xəbərsiz.

Ələlxüsus şərh edim bəy Məhəmmədin şeirin,
Onun bütün şeirlərindən adamın damağına zəhər tökülür.

"Məclisi-üns"ə yalanla yanaşı qədəm qoydu,
Elm və fəzl kamalatından tağ düşdü.

Onun zahiri davranışı səba yeli kimi incədir,
Qəlbindəki həsədi isə yandırıcı bir şölədir.

Nə məntiq, hey'ət görüb, nə fiqh, üsul oxuyub,
Amma xalqın gözündə kitabları varaqlayır.

Öz alçaq təb'i ucundan adını molla qoyub,
Amma nikah ilə talağın fərqini bilmir.

Hərzə sözlər yaratmaq meydanında,
Cəhl meşəsinin şiridir, cahillərin başçısı.

* * *

Qırmızı şərabla dolu sürahini dolandır,
Ki, ey saqi, hadisələrdən xatirim qana döndü.

Həpənd müəlliflərin dərdi, zəmanə qəmi,
Mən miskinin səbrü qərarını alıb.

Sultanın zülmündən və kəndxudadan qorxmuram,
Həcv qələmiylə hər ikisini heç edərəm.

Yağləvənddən indiyə qədər heç kəs nazim görməyib,
Ki, onların hamısının işləri oğurluq və şübhəli işlərdir.

Bu kiçik boyunla şeirdən dəm vurma, Soltan,
Kiçik qəddə ahəngdar təb' ola bilməz.

Sənin şeir deməyindən əgər Xəyyama xəbər çatsa,
Ədiblər dəftərindən öz adını çıxarar.

Sənə yüz il ələf (ot) yemək rəvadır,
Hələ də üluf ilə üyunun fərqin bilmirsən.

Ürəyim ehtiyacdan od tutub yandı,
Meydən yanğımın üstünə səp, ey məlal (qəm) təbibi.

* * *

Bundan başqa biri fit çalıb deyir ki.
Nizaminin nəzmi, Zəhirin şeiri nədir ki?

Sələf şairlərindən (qalan) böyük söz ustası mənəm,
Mənim kəlamım Zəhirin kəlamından rövnəq alıb.

Onun hərzə danışığından xatirim qarışıb,
Lovğa iddiasından ürəyim tutuldu.

Bir gecə Sə’dinin ruhu yuxuma gəlib dedi:
Onun lovğa danışığından ürəyinə qəm gətirmə.

Bülbül adı qoymaqla qarğa bülbül olmaz,
Adi bir kol budağı gül şaxəsinə çatmaz.

Əgər əndəlib (bülbül) min il növhə deyə,
Cənnət gülü qəzələ təsir etməz.

Əgər onun nəzmindən pis iy gəlirsə, evb tutma,
Onun təbi şairlərin tullantısından yoğrulub.

İlahi, onun nəhs dili şeir deməkdən lal olsun,
Ki, onun pis ləhcəsi şeiri zavala gətirib.

* * *

Ey saqi, üzüm qızının üzündən örtüyü aç,
Dindarlıq mənim bu xatirimi pozub.

Mənim tutqun təb’imə onun üzündən işıq düşər,
Məqtə’siz şeir yazıb, onun həcvini işıqlandıraram.

Şeirin sirlərini, nəsrin qaydasını nə vaxt başa düşəsən,
Ki, sən, ey Hadi, olmusan cəfəngiyyat mənbəyi.

Sən vəzn və rəbt, kəlamın hüsnün və lütfün bilməzsən,
Cinas və qəlbi, məqtə və mətləni bilməzsən.

Nə müstəzad və tərcidən xəbərin var,
Nə də ki, müləmmə, fərd, qəsidə və misradan.

Şeir elmindən keç, özünə başqa bir peşə tap,
Bu kamal ilə sənə şeirdən fayda olmaz.

Məhşərdə üzün şeir qapısında qara olacaq,
Ey Hadi, əgər sən şeirdən tamah əlini çəkməzsən.

Başqa məşğələlər kimi şeir sənə əl verməz,
Get, o əfsun kitabları, o da rəml taxtası.

* * *

Qəzəl ceyranının ardınca qaçan Naiblə Rzadır,
Ancaq çox səy etsələr də, məqsədlərinə çatmırlar.

Çünki onların bilik atı mənim atım kimi ləngdir,
Ancaq qəzəl ceyranı iti külək kimi qaçır.

Bir də sənin qələmindən şeirə rəxnə düşsə,
Sənin bu zülmündən, Naib, gedəcəyim İrana.

Sənin əlindən şairlər xosrovuna şikayət aparacağam,
Ki, sənin Naibin şeir mülkünü viran edib.

Sən, ey şair, şeir demək xəyalından keç,
Şeir elmi halva deyil ki, asanlıqla yeyəsən.

Sənin təb nihalın qurudur, şeirin bar verməz,
Quru ağacdan heç kəs təzə bar görməyib.

Səndə Allahın kərəmi və lütfü yoxdur,
Necə ki, rəvan təb Allahın lütf və bəxşişidir.

Sənin qəddinə qurban olum, saqi, zülal şərabdan ver,
Ki, məst olub musiqiçi yolu gedim.

* * *

Ey sübh küləyi, mənim salamımı Səlimin yanına apar,
De ki, bu həmrahlardan özünə dost-yoldaş seçmə.

Ki, hamısı bütün naqis yalançı yolçulardır,
Həqiqət yolunun böyüyündən tə'lim almayıblar.

Vəfa müəllimlərindən ədəb çubuğu görməyiblər,
Cimin nöqtəsi kimi ağıl sətrindən kənar düşüblər.

Eşq yolunda onların ayağına daş dəyməyib,
Məhəbbətin ay işığında qərar tutmayıblar.

Ancaq şeir eşqə aşiqdir, eşq şeirə,
İki köhnə dost bir-birindən ayrılmaz.

Şeirdən eşq işıqlanar, eşqdən şeir,
Ki, onların hər ikisi bir işıqdandır, ancaq iki yerə bölünüblər.

O kəsdə ki, eşq yoxdur - qəlbi dəmirdəndir,
Məndən ona de ki, şeirdən, təb'i-səlimdən dəm vurmasın.

Əgər elm və kamalı kəsb etmək istəyirsənsə,
Mənim ətəyimdən tutmağı bacar.

* * *

Alimlər məclisinin başında oturan odur,
Dilinin şöhrəti şeirin ərşinə səda salıb.

Qələminin əsməsindən müşki-ənbər iyi gəlir,
Yelda gecəsi öz qaranlığını onun şeirindən alıb.

Qəlbi qaraların daxili onun elmindən nurlanır,
Onun əlinin arxasından Süha ulduzu* işıq alır.

Nə Hafizdir, nə Kamal, nə Cami, nə də Hümam,
Təb'inin gözəlliyində Sə'di və Yəğmanı ötüb.

Mərhəmət çəməninin gülüdür, elmin mədəni,
Səxavət bağçasının gülüdür, zəka mədəninin dürrü.

---

* Kiçik ayı bürcündə olan ulduz.

Onun şeirinin sütunu göylərin ən yüksək pilləsindən də
yuxarı keçib,
Onun kamalının dərəcəsi göyün günbəzinə çatır.

Səbur, sən də özünü çatdır onu ayağını öpməyə,
Ki, biz aciz quluq, Allah mərhəmətli.

Səbur, əgər sənin dediklərinə dəlil istəsələr,
Məni Dizaq şairlərinin tənqidçisi kimi tanıyın.

## YENƏ DƏ ONLARIN HƏCVİ

Yenə də yarın lə’l dodaqlarının havası mənim haşımdadır,
Saqi, mey gətir, bəsdir, artıq ürəyim kədərli oldu.

Bu böyük badə mənim dərdimi yüngülləşdirir,
Bu darıxan ürəyimin pasını ancaq badə apara bilər.

Mey ver ki, onun əvəzində canımı qurban verərəm,
Bu müamilənin məqsədi başqa mənadır.

Əgər mənim mey içməyimdən zahid məlul olursa,
De ki, su iç, sənin qəzəbin həddən artıqdır.

Ey zahid, sənin ayıqlığın dünya malı üçündür.
Dünya dərd çəkənlərin gözündə nazik bir tük kimidir.

O adam ki, ruhunda gözəl (yar) tələbkardır,
Məhəbbət sirrini öz qəlbində qorumalıdır.

Yarın ayrılığından xatirim təşvişə düşməz,
Onun üzünün surəti gözümün səthində çəkilib.

Yarın uzaq-yaxınlığından aşiq nə dilxordur, nə də qəmgin,
Bəli, yarın xəyalı həmişə onun bərabərindədir.

Saqi, mey, ney, gül və dildar arzusundayam,
Dünya bu dörd ünsürdən ibarətdir.

Saqi, yenə gəl, məni mey ilə sərxoş et,
Çünki həyat ancaq qırmızı sudan ibarətdir.

Məndən sonra qaç dızaqlılara de ki,
Yatmış şir ilə oynamaq yaxşı deyil.

Ey Hadi, sənin həcv yolundan qorxan deyilik,
Mənim halım “Tifl və cünəmbər” hekayətinə oxşayır.

Şeir şamının altında öz qara üzünü tutmusan,
Əfsus ki, şam öz ayağına işıq salmır.

Ey Bəyməmməd, istedadın olmadığından şeirdən əl çək,
Nə vaxta qədər xam xəyal edəcəksən ki, gözəl təb’im var?

Sənin söz gözəlin sənə heç vaxt ürək verməz,
Sən paxıllıq divisən, söz isə hurisifətdir.

Şeir bağçasına tərəf çox gəzdim,
Onun gülləri mənim qardaşımın sözlərindən daha solğundur.

İsfəndiyar öz bədəninə ox batmamağı ilə fəxr edərdi,
Rüstəmin gəz ağacından düzəlmiş oxuyla məğlub oldu.

Dizaqın o biri müəllifləri yadımdan çıxdı,
Bu da arif adamların yanında həcvdən də pisdir.

Öyüdümü eşit, Səlim, yaxanı kənar çək,
Kin şərabından məst olmuşam, əlim xəncərdədir.

Həcvdən dilimi bağladım ki, məndən küsməyəsən,
İndi onun əvəzində sən dönə-dönə mənə tə’nə edirsən.

Bax, qələmimin ucunun hədəfi olmaq istəyirsənsə, bil,
Bu elə bir oxdur ki, doqquz fələk də onunla bacarmaz.

Saqi, gəl ki, ümid gözüm yolda qaldı,
Mənbəyi-abi-kövsər hovuzunda olan sudan ver.

Halımı sənə izhar etməyə nə hacət, özün görürsən,
Lütfün kərəm mənbəyi yaradandır.

Hanı xoşbəxtlik ardınca gedən Xızr ki, könlümün
yolunu itirib?
Onun möhnətindən İsgəndərin məhəbbəti zəlil olub.

Səbur, müxlisin (Allahın) ətəyindən əlini üzmə,
Sirlər həqiqətinin vadisində o rəhbərdir.

Onun qələmi mə'na gəlinlərinin məşşatəsidir
(bəzəkvuranı),
Şeirin üfüqləri onun sözlərindən nurlanır.

Biz, həqiqətdə, qulağı sırğalı dostlarıq,
Dostluq şeir padşahının başının tacıdır.

Səbur, nə vaxtadək onun əlini öpmək üçün səbr edim?
Səbr etməklə nə vaxt hüzura yetişmək olar?

## YENƏ ONLARIN HƏCVİNDƏ*

Saqiya, ey vəfa səririnə şəh,
Saqiya, ey kəmal bürcünə məh,

Saqiya, ey füruği-mehrü süha,
Müştəri, Zöhrə ruyinə Cövza.

Ey üzi şəmsi-tarimi-çarum,
Vey səri-kuyi-qeyrəti-tarum.

Saqiya, ey zəmayirə məhbub,
Ey fəzayəndeyi-sürури-qülub.

Saqiya, qəm məni zəbun etmiş,
Könlümü hadisat xun etmiş.

Etdi cövri-sipehri-buqələmun,
Rəngimi zərdü əşkimi gülgün.

Gül zamanı nədir bizə qəflət,
Nə münasibdi dərd ilə ülfət?

Bu zaman kim, sepehri-nahəmvar,
Tərk edib gərdışi-cəfagırdar.

Səthi-gülşəndə xətti-rizə ilə,
Yazılıb eyşi-ləfzi səbzə ilə.

* Dizaq mahalı şairlərinin həcvi

Mənə bu gün sepehr mehmandır,
Etdiyi cövrdən peşimandır.

Qol-boyundur bu gün mənimlə fələk,
Saqiya, ey nigari-simbələk.

Fürsəti fövt eyləmə, zinhar,
Ələ al cami-badeyi-sərşar.

Gərdişi-çərxə etibar olmaz,
Mehri-ayini payidar olmaz.

Hər kəsə versə əfsərü dihim,
Şövkətü təxtü rəxtü kövhərü sim,

Aqibət müflisi-zaman eylər,
Təxtini-təxteyi-rəvan eylər.

Gəh sənə zəhrdir, gəhi tiryak,
Belədir rəsmi-gərdişi-əflak.

Çünki oldun zəmanədən hali,
Məclisi-meydən eyləmə xali.

Bəlkə qəmdən tapa rəha könlüm,
Ola açılmağa riza könlüm.

Ey səba, sən həm eylə bir imdad,
Eylə viranə könlümü abad.

Mən ki, daim əsiri-dərdü qəməm,
Bəsteyi-dami-möhnətü ələməm.

Dili-zarımda razi-pünhan çox,
Yara şərh etməyə ümidim yox.

Məndən ol azimi-fəzayi-Dizaq,
Eylə dildara şərhi-hali-fəraq.

Müxlisə müxlisanə eylə salam,
Söylə, key şahnazi-övci-kəlam,

Verdi nəzmin mənə həyati-əbəd,
Xəttin oldu ziyayi-çeşmi-rəməd.

Sözlərin oldu xəstə cismimə ruh,
Mərhəmi-dağı-dil, dili-məcruh.

Məni-məhzuni sən ki şad etdin,
Guşeyi-qürbət içrə yad etdin.

Olsa, ya rəbb, həmişə qəlbin şad,
Sərvətin cümlə qeyddən azad.

Olsa peyvəstə adətin işrət,
Olma nadanlar ilə həmsöhbət.

Bu nə Sultan, nə Kəndxuda, nə Qəra,
Bu nə Bülbül, nə Naibü nə Riza?

Hər biri kirdari-cəhldə şir,
Hər biri şeir şirinə nəxcir.

Ola, ya rəbb, həmişə Bülbül xar,
Güli-şeirə verir bəsi azar.

Şeirə rövnəq yerinə rəxnə salır,
Qeyrlərdən kəlami vam alır.

Şeir bəsdir ona ki, virdi-zəban,
Bu rübaini eyləyə hər an…

“Şaere-dozd makiyan manəd,*
Ke, beziraş nəhənd beyzeye-qaz.
Qaz axər besuye-ab rəvəd,
U bekune-dəride manəd baz.”

Şeirdən laf urarsa bəy Məmməd.
Küng ola nitqi bər həqqi-Əhməd.

Mənbəi-mühməlatdır Hadi,
Mədəni-ləğvyatdır Hadi.

Ey Səbur, olma şər’ə çox mötad,
Səndə həm nəzmə yoxdur istedad.

* “Oğru şair qırt toyuğa bənzəyir,
Hansının ki, altına qaz yumurtası qoyulur.
Qaz əvvəl-axır suya tərəf gedir,
Əziyyət yenə də ona qalır.”

## RÜBAİLƏR

Mənə rəhm et ki, xəstəyəm və qəm yüküm ağırdır,
Hərislik və tamah əlindən böyük əzab çəkirəm.
Onun ağzından öpüş istədim, tamahımı gör bir,
Heç olan şeydən çox böyük tamah umuram.

* * *

Ömür kaşanəsi ahımın tüstüsündən qaraldı,
Ömür evim göz yaşımın selindən parçalandı.
Qayıt, qurtar məni bu uzaqlıq intizarından,
Ömrümün bir ayağı gorda, bir ayağı viranədədir.

* * *

Ey hamıdan əvvəl və axır olan,
Ey hamıya aşkar və pünhan olan.
Məgər sənin qərəzin bu idi ki, məni yaratdığın andan,
Nakamlıq yatağında dərd ilə can verim?

## MÜƏMMA

Bir gül etmiş əlif qəddim həmçü yey,
Nalələr qıllam çu bülbül fəsli-dey,
Gər nişanın bilmək istərsən, budur:
İki kafü iki lamü iki hey.

## YENƏ DƏ

Ürəyim bir dildarın eşqiylə parçalanıb,
Adını açıq demək olmur.
Onun adının sirrindən agah oldum:
İki mim, beş əlif, dörd qafdır.

## YENƏ DƏ

Deyirlər ürəyini ondan alıb başqasına ver,
Bir ay üzlü görmədim ki, hüsndə yüz olsun.

## YENƏ DƏ

Əfsus ki, tutmaz oldu mənlə ülfət,
Ol növgüli-xəndan baharbehcət.
Adətdi, bahar olar, bitər ondan gül,
Bərəks düşüb, ismi-nigarıma bu adət.

## QƏZƏL

Bilmirəm mənim eşqim niyə belə oldu,
Onu bilirəm ki, könlüm eşqdən qan oldu.

Müsəlmanlar, müsəlmanlar, bir əlac,
Bir kafirin eşqindən dinim alt-üst oldu!

Rəqib sənin qarşında, mən uzaqda idim,
Qorxduğum gün gəlib çatdı.

Mey içdiyim üçün zahidin tə'nəsi yersizdir,
Ki, haqqın lütfü bu işdə mənə rəhnüma olub.

Bu gün mənim qətlimi sabaha qoydu,
Nə etmək olar, bu da bir alçaqlıq oldu.

Səbur səbr etməkdən fayda axtardı,
Ancaq səbr etməkdən işi heç oldu.

**Vər. 461a**

## FAXİR*

**Deyilənə görə, Qarabağ əhalisindəndir. Həyatı haqqında məlumat əldə edə bilmədim. Sonradan öyrəndim ki, Süleyman ibn Hüseynəli ibn Məşədi Muraddır. Ağa Əbdül Rəhzənin böyük qardaşıdır.**

Səhni-rüxündə tel-tel olub dam tellərin,
İstər məni qərz edə bədnam, tellərin.

Hurimisal vəslinə müştaqdır könül,
Etsə əgər bu xahişə əncam tellərin.

Aşüftəhal gər düşə zülfün o gərdənə,
Qoymaz ki, aşiqin ala bir kam tellərin.

Etdim üzari-müshəfə çün istixarə mən,
Xalü xət ilə ta nola fərcam tellərin.

Mişki-tatar, Maçinü hindü həbəş tamam,
Olmaz bərabəri o siyəhfam tellərin.

Meyli-gül eyləməz, gözəlim, gülşən istəməz,
Mənzuri bülbülün ola gülfam tellərin.

Faxir çəkir baharü gülsitan həsrətin,
Soldu və saraldı gülşəni-əyyam tellərin.

* Nəvvab əvvəlcə Faxirin kim olduğunu aydınlaşdıra bilmədiyini yazır, sonra isə qırmızı mürəkkəblə kimliyini qeyd edir.

**Vər. 461b**

## ŞAKİ ABDAL

**(Rəbiül-əvvəl, 1309-cu il – oktyabr, 1891)**

**Əl-həmdüllahi-rəbbül-aləmin ... Mən — Xəlil ibn mərhum Axund Molla Hüseyn ibn mərhum Axund Molla Xanməhəmməd Qarabaği Şuşa şəhərinə tabe olan Kəbirli mahalının Abdal kəndində doğulmuşam. Sənət və məşğuliyyətim mollalıqdır. Yuxarıda adı çəkilən camaatın və şəhərin cənub tərəfində Qarqar adı ilə məşhur olan bir sıra camaatın ruhani işləri ilə məşğul oluram.**

**İndi 1309-cu ilin rəbiül-əvvəl ayının iyirmisidir, yaşım əlliyə yaxındır. Başqa bir əsərim yoxdur, təkcə cavanlıq illərində yazdığım bir para mədh və sairədən başqa. Onları da buraya yazıram. Uşaq vaxtlarımda çox həvəs etdiyim ölkə və böyük şəhərləri seyr etməkdən məhrum oldum. Bəli, "bütün hərislər məhrumdurlar" hədisi düz və kamildir. Ona görə də Abdal kəndinin bir küncündə abdal (peyğəmbərə yaxın müqəddəs adam) kimi min hüzn və dərd ilə mənim halıma heç bir münasibəti olmayan yoldaşlar və kamaldan boş həmnişinlər ilə əhvalı pərişan, xəyalı dağınıq, gecə və gündüz - bəlkə də hər vaxt, qanadı sınmış bülbül kimi gah lal, gah da nəğmə oxuyan halda yaşayıram.**

### BAHARİYYAT

### (MÜXƏMMƏS)

Yeni könül quşu bahardan yeni bir təravət aldı,
Gülüstanlarda göyərçin "yahu" naləsinə başladı.[*]
Qumrular heyrət budağında çığırışmağa başlayıb,
"ku-ku" etdilər[**],
Bülbül qönçə və güldən dad aldı.
Biçarə aşiq bülbülün fəryadına öyrəşdi.

Büstanda sərv, şümşad, sənubər – nəbatat göyərdi,
Qarağac və ər'ər (ayilant ağacı) gülüstanda
göründülər.

[*] Yahu – göyərçinin çıxardığı səsdir, dərvişlərin "yahu" – "ay Allah" mənasında dediyi sözə oxşayır.
[**] Hanı-hanı .

Məcnun söyüd heyrətdən əyilib, başını aşağı saldı,
Dağlardan gülüstana tərəf xoş külək əsdi,
Biçarə bülbülü həsrət odu götürdü.

Yer üzü hər tərəfdən taləzar olub,
Lalənin qəlbi hicran odunun küləyindən yaralanıb.
Şadlığından süsən yarı vəsf etmək üçün dil açıb,
Yasəmən (yarın) üzü kimi, sünbül onun saçı kimi parlaqdır,
Güllərin yarpağı şeh damcılarından mirvari bağladı.

Bir müddət səyahət məqsədilə gülüstanları gəzdim,
Nagəhan gülşəndə qarşıma yeni bir gül çıxdı.
Şadlığından üzünü açıb, niqabı kənara atmışdı,
Onun camalının şöləsi ətrafa nur saçırdı,
Onun hüsnünün şöləsindən könlümün şamı alovlandı.

Bəh, Allah gör necə gözəl surət yaradıbdır,
Bəcahətdə əvəzi, lətafətdə tayı yoxdur.
Dürr dişli, lə'l dodaqlı, şəkkər ağızlı, tuti dilli.
Üzü xəttü xal ilə elə bəzənmişdi ki,
Guya cənnəti hindu qoşunu işğal edib.

Dedim: Ey gümüş bədənli, rəna nazənin,
Ey boyu tubaya, üzü yasəmənə oxşayan.
Bir rəhm elə, vəfadarlıq belə olmaz,
Hicran odunun qığılcımından, ey ay üzlü,
Səməndər kimi canım hər tərəfdən od tutub.

Nazənin ahu kimi nagəhan qarşıya çıxdı,
Ürək yarasına duz səpməyə başladı.
İstədi məndən yan keçib, qəlbimi bir də sanca,
Ətəyindən tutub, özümə tərəf çəkdim.
Dedi ki, sehrbaz səyyad ahunun ətəyindən tutdu.

Ox kiprikləri, ülgüc kimi iti qaşları hədəfdə,
Bütün gözəlliyi ilə zülfünü üzünə dağıdıb,
Elə bil ki, parlaq ay bulud arxasında gizlənib.
Əlimi sinəsindəki nara vurdum, dedi: Ehtiyatlı ol!
Bağban limu budağından nadir limu dərdi.

Mənə acıqlı, tünd bir nəzər saldı,
Dostluq binasına istədi ki, xələl yetirsin.
Yenə də sülhə gəlib, könlümlə əlaqəni düzəltdi.

Məmələrini əllərimə tapşıranda tez bu misalı dedim:
Yar narıncı əlimə verdi, əlimi ətir götürdü.

Ey könül, bir dəm bu əməllərdən keçməsən,
Məhəbbətpərvərlikdə aşiqi-sadiq ola bilməzsən.
Haqq yolunda can vermək vəfanın eynidir,
Öz ömrünü daim bir hakimin mədhinə sərf et,
Ki, hünərdə yetmiş batmanı bir qol ilə götürsün.

Sənin bu möcüzəli əlinə can fəda olsun, ya Əli,
Bu aləmin ruhu sənin ayağının altındakı torpağa
fəda olsun, ya Əli,
Mən cürət edib, sənə tərif deyirəm, ya Əli,
Sənin kamalının vəsfinin sonu yoxdur, ya Əli.
Hər kim sənin dərgahına üz tutdu, kama yetişdi.

Baharda gülşənin vəcdə gəlməsi Əlinin ehsanının lütfüdür,
Bir-birinin ardınca olan bu mərhəmət hədiyyəsi
Əlinin süfrəsindəndir.
Şaki Abdala olan lütf də Əlinindir,
Hər kim ki, həmişə ürəkdən Əliyə tərif deyir,
Yaxşılıq topunu vəfa çovkanına yaxşı qoyur.

## QƏZƏL

Əgər zənciri-zülfi-yar boynumda kəmənd olsa,
Könül azad olur qəmdən əgərçi paybənd olsa.

Xiyali-vəsli-ruyinlə könüldə eyş hasildir,
Hücumi-qəm əsər qılmaz müsahib dilpəsənd olsa.

Səri-kuyində ney tək naleyi-ahindən əl çəkməz,
Könül gər tiği-firqətlə müqəttə bənd-bənd olsa.

Bu viran cismimi soltani-ğəm təhdid edər hər dəm,
Vəlikən yoxdu pərva hesni-lütfündən gər bülənd olsa.

Kəmal əhli qalubdur vərteyi-heyrətdə sərgərdan,
Çəkər zillət bəli, aləmdə hər kim ərcmənd olsa.

Əsər qılmaz nəsihət cahilə bu rəsmi-dirindir,
Ki, şirin təlx olur kamında hər kim dərdmənd olsa.

Vüsali-şöhbəti-əhbabə çox müştaqdır Şaki,
Nolur, bir dəm gəda öz sərvərindən sərbülənd olsa.

## QƏSİDƏ

Fələkdən, ey könül, şaki olub, çox etmə əfğanı,
Budur çərxin təqazası ki, yoxdur əhdü peymanı.

Vəfa ummaq bu dünyadan kamali-cəhlə nisbətdir,
Mərizi-dərdi dünyanın bulunmaz hiç dərmanı.

Bu dünya ənbiyavü övliyaya kim, vəfa etməz,
Gərək xarü zəbun etsin bizim tək zarü nalanı.

Hədisi-"əl-bəlai-lilvəla"* bu əmrə şahiddir,
Cəzayi-səbrə vardır neçə ayati-Qur'anı.

Cəmi ənbiyayi-masəbəqdən bir təfəkkür qıl,
Xəyal eylə əzəl gündən səfiyüllahi-Həvvanı.

Olar kim, aşiqü məşuq idi xüldi-vüsal içrə,
İçirdi onlara saqiyi-dövran cami-hicranı.

Fələk cahü cəlalın gərdişi tək vajgün etdi,
Edib təslimi-divi-Əhrimən təxti-Süleymanı.

O İbrahimə kim, xaliq "Xəlilim" həm xitab etdi,
Ona həm şölələr qıldı müqabil nari-suzanı.

Behəmdüllah ki, lütfi-həq mükafati-təvəkküldən,
Şərari-nari-Nəmrudi edib gülzar rizvanı.

Vəfasın görməyib İsa ki, əzmi-asiman etdi,
Müsəllət eylədi Musa üçün Fironi-hamanı.

Fünuni-hər məqamata könül agəh gərək olsun,
Kəlami-müxtəsər xoşdur, nə lazım şərhi-tulanı?

Müəyyəndir, bəli, hər sübhə şam, şama sübh olmaq,
Nə müşküldür ki, təğyir eyləsin təqdiri-Yəzdanı.

Bəlavü möhnəti-əyyamə səbr etmək müdavadır,
Təhəmmüldən səva yoxdur bu dərdin özgə dərmanı.

Cəfayi-dəhrdən hər dəm dili-biçarə Şakidir,
Qalıb girdabi-möhnətdə, dəmadəm eylər əfqanı.

---

* "Bəla Mövladandır."

## QURBAN BAYRAMINDA BİR RUHANİ DOSTUMA QURBANLIQ QOYUN BAĞIŞLANMASI ÜÇÜN YAZDIĞIM ŞEİR

Ziyad olduqca firqət, ya əxa, meylim vüsal istər,
Sanasan bülbüli-şuridə gülzari-camal istər.

Görüb viran olunmuş mürği-dil mə'mureyi-vəsli,
Açıb balü pərin, pərvaz edib bir nonihal istər.

Hərarət suzəni çəkdikcə könlüm dəşti-firqətdə,
Ləbi-dildardən bir cür'eyi-şəhdi-zülal istər.

Məşəqqət atəşidir müştə'əl kanuni-sinəmdə,
Bu suzi-sinədən ihraqi-aləm ehtimal istər.

Mənəm kim, kəsrəti-ənduhdən ənbuhi-hicrətdən,
Üfuli-əxtəri-bəxtim səadətdən vəbal istər.

Əgərçi təb'i-namövzunumuz mövzun deyil, amma,
Bu mə'nidən xəbərdar olmağa bir əhli-hal istər.

Könül qurbana çox talibdi Minayi-müvəddətdə,
Sanasan kəbşi-məzbuhi Xəlili-zülcəlal istər.

Xəlilüllah kəbşi-qeybdən çün kamyab oldu,
Xəlilin, həm sənin, şah, lətifül-e'tidal istər.

Əgər məqdur olunmazsa bu istida həbibimdən,
Fəvaveyla ki, fikrim özgə əş'ari məqal istər.

Bu şərhi müxtəsər qıl, Şakiya, tuli-kəlam etmə,
Kəlami-müxtəsər xeyrül-kəlam olmaq kəmal istər...

**Vər. 469a**

## MƏŞƏDİ MƏHƏMMƏD BÜLBÜL

**Məşədi Məhəmməd Kərbəlayi İsmayıl oğlu Qaryağdının təxəllüsü Bülbüldür. Qarabağın Şuşa əhalisindəndir. Bu təzkirə yazılan vaxt 28 yaşı var idi. Farsca savadı var. Xoş görkəmli bir cavandır, yaxşı səsi var. Bəzən xanəndəlik də edir. Eyibsiz görkəmi var. Şeir deməyə həvəslidir. Aşağıdakı şeirlər onundur, öz dəst-xətti ilə yazılıb.**

**Rəbbi ül-əvvəl, 1309 – oktyabr, 1891.**

### TƏRCİBƏND

Yandırdı canımı qəmi-hicran, dilbərim,
Ey gözlərin fədası, dilü can, dilbərim.

Rüsvayi-dəhr olduq, əcəb, kama yetməmiş,
Zar ağlaram bu halıma hər an, dilbərim.

Bəxtim siyah, xəsm qəvi, taleyim zəbun,
Haşa, ola bu dərdlərə dərman, dilbərim.

Yüz dağ çəkdi ayrılığın qəmli sinəmə,
Laləmisal bağrım olub qan, dilbərim.

Sən kimi nazəninə qulam olsa, var yeri,
Yüz min gər olsa Yusifi-Kən’an, dilbərim.

Səndən sora gər özgəsinə baxsa gözlərim,
Dəysin ona o navəki-müjkan, dilbərim.

Heyhat kim, bu kişvəri-könlümdə hökm edə,
Sən kimi bir də bir şəhi-xuban, dilbərim.

Dəydi mənə dəyən, gözəlim, sən səlamət ol,
Tərk etmə öz həbibini, əhli sədaqət ol.

Xoş ol zaman sənlə, gülüm, mehriban idim,
Dilşad idim, vüsalına həm şadman idim.

Nə bimi-hicr var idi, nə tə’neyi-rəqib,
Nə tiri-dərdü möhnətə munca nişan idim.

Əğyarə zərrəcə yox idi səndən iltifat,
Nə mən bu gunə möhnət ilə natəvan idim.

Taraci-dəsti-xar deyildi o gül üzün,
Ümmid ilə o gül üzünə bağban idim.

Tutmuşdu xu könül səri-ku itləriara,
Sultan idim, yüz izzət ilə pasiban idim.

Şəm'i-camalına mən idim sübhədək baxan,
Pərvanəvəş nə qəm oduna mən yanan idim.

Va həsrəta ki, zülm ilə səndən ayırdılar,
Cana, vücudun ilə əzizi-cahan idim.

Dəydi mənə dəyən, gözəlim, sən səlamət ol,
Tərk etmə öz həbibini, əhli-sədaqət ol.

Mümkün bir olmadı sən ilə söhbət eyləmək,
Əğyardan kənara çəkib, xəlvət eyləmək.

Gəh dişləyib dodağını, azurdədil edib,
Gahi durub ayağa, sənə minnət eyləmək.

Gər naz ilən onu çəkmək niyaz ilə,
Xəşm eylədikcə sülhə dözüb, taət eyləmək.

Var bir vəsiyyətim sənə, ey şahi-gülrüxan,
Şərhində yoxdu məndə vəli cür'ət eyləmək.

Qəmzən oxunu kəsmə dili-natəvandan,*
Gər istəsən həmişə məni rahət eyləmək.

Zinhar, unutma eylədiyin əhdi bir zaman,
Lazımdı əhdi gözləməyə diqqət eyləmək.

Əğyardan kənara durub yad qıl məni,
Əğyar ilə məbada gedib ülfət eyləmək.

* M.M.Bülbül Qaryağdının "Tərcibənd"inin bu hissəsi naməlum katib tərəfindən təxminən 1879/80-cı illərdə yazılmış bir cüngdə (AMEA Əİ.B-353, vər.22b-23a) Natəvanın qəzəli kimi verilmişdir."Sevdiyim şeirlər" kitabının tərtibində başqa mənbələrlə yanaşı, həmin cüngdən də istifadə edilmişdir. Odur ki, həmin səhv orada da təkrar olunmuşdur. ("Sevdiyim şeirlər" "Gənclik", Bakı, 1978, səh.158)

Dəydi mənə dəyən, gözəlim, sən səlamət ol,
Tərk etmə öz həbibini, əhli-sədaqət ol.

Verdim o gün ki, zülfi-çəlipayə könlümü,
Etdim düçar yüz qəmü sevdayə könlümü.

Ətfali-möhnətü qəmü ənduh, dərd üçün,
Yazmış qəza, qədr qələmi dayə könlümü.

Matəm tutubla halına hər şam, hər səhər,
Zülfi siyahlar alıb ortayə könlümü.

Canım yanar fəraqa, gözüm tökməz əşki-xun,
Göndərmişəm o zülfdə müsəllayə könlümü.

Nəqdi-vüsal ilə nə olur şad eyləsən,
Ey qəlbi qara, yar alıb bimayə könlümü.

Gər parə-parə eyləsələr, əl götürmərəm,
Bəxş etmişəm əzəldə bir imayə könlüm,.

Əmri-məhaldır mənə səndən iraq olam,
Saətbəsaət ər salalar vayə könlümü.

Dəydi mənə dəyən, gözəlim, sən səlamət ol,
Tərk etmə öz həbibini, əhli-sədaqət ol.

Olsaydı gər vüsalına bir az ləyaqətim,
Hicrin bu qədr kəsməz idi tabü taqətim.

Cövrü cəfanı tərk edib, incitmə könlümü,
Gün-gündən artırır sənə cövrün məhəbbətim.

Hicran oduna canımı yansın əla əd-dəvam.
Rizvana sənsiz olsa əgər meylü rəğbətim.

Dinim yoxumdu, kafəri-kuyi-məhəbbətəm,
Qaşından özgə qibləyə gər olsa taətim.

Qaşındı qiblə, könlümə cənnət o gül üzün,
Hicrin cəhənnəmimdi, qədindir qiyamətim.

Əhdim budur: Vüsala yetib, can nisar edim.
Bundan savayı dəhrdə yox özgə niyyətim.

Bəxtim gətirdi başıma hər nə bəla ki, var,
Bir kimsədən zəmanədə yoxdu şikayətim.

Dəydi mənə dəyən, gözəlim, sən səlamət ol,
Tərk etmə öz həbibini, əhli-sədaqət ol.

Nigar dəstə tutub könlümü edər xəstə,
Neçün kim, incidir ol sərvnazımı dəstə.

Bu rəsmdir ki, gül-dəstə bağban eylər,
Qəribə haləti gör, gül özü tutub dəstə.

Ləbin hədisini guya görübdü, badə qaçıb,
Özünü şişədə bir növ ilə salıb bəstə.

Qəza rəqibi düzüb dövrünə, budur vəchi,
Tikan düzəllər, əgər gülbün olsa növrəstə.

Ləbin xəyalı, gözün həsrəti, üzün şövqü,
Qaranqu gecədə qan ağladır bu sərməstə.

Siyah türrələri kəc düşübdü qaş üzrə,
Görən der ki, bənövşə bitib hilal üstə.

Humayi-övci-məlahət, nəzarə qıl bir dəm,
Qəmində Bülbüli-məhzun qalıbdı pərbəstə.

* * *

Ey ləbi-lə'lin mərizi-eşq üçün abi-həyat,
Vey nihali-sərv qəddin nəxli ümmidi-nicat.

Ləblərindən kami-dil almaq mənə düşvardır,
Xizri-xətindən əlimdə, əzizim, olmasa möhkəm bərat.

Təndə hər bir oxların guya əlifdir canara,
Ey nigari-sərvqamət, at oxun, amma tən at.

Müflisi-eşqəm, nigara, ver zəkati-hüsnünü,
Şər'ən, ürfən müflisə, əlbəttə, caizdir zəkat.

Küfri-zülfün aldı məndən əqli, huşu güc ilə,
Dideyi-giryan buna şahiddi, xuni-dil səbat.

Gülşəni-eşqində Bülbül ruzü şəb qan-yaş tökər.
Ey gülü gülrux, səni tari, o zarə ver nicat.

* * *

O gündən kim, gözəl nəqşin qəza nəqqaşı çəkmişlər,
Səni ol cümlədən, ey məh, gözəllər başı çəkmişlər.

Vüsali-xali gəmdümgunə yetmiş nakəs adəmlər,
Tənuri-hicrdə yanmağa məni-külbaşı çəkmişlər.

Gözəllər gözlərin gözlər həmişə çün yaman gözdən,
Anınçün Zülfiqarasa göz üstə qaşı çəkmişlər.

Məni bu ağlamaqdan mən’ edəllər xəlq, bilməzlər,
Şərari-sinəni dəf’ etməyə göz yaşı çəkmişlər.

Xətadır nisbət etmək Yusifə sən tək dilaramı,
Anın vəchin sənə nisbət, əzizim, çaşı çəkmişlər.

Oğurlar qəmzə can nəqdin, qara zülfün edər pünhan,
Qara oğru yətağına qara sirdaşı çəkmişlər.

* * *

Yenə zar könlüm olmuş qəmü dərd mübtəlası,
Qəmü möhnətin, ilahi, məgər olmaz iştihası?

Ağarıb, düşübdü əldən, nə qara, nə ag seçməz,
O qədr sirişk tökmüş iki gözlərim qarası.

Mənim ahi-dərdnakım tutub aləmi sərasər,
Saqın, ey nigari-məhvəş, sənə dəyməsin xətası.

Sənə qeyr həmdəm olmuş, mənə dərdü qəmdı munis,
Nədən olmadı kim, olsun gülə bir gül aşinası?

Yox əcəb, gər uyqu gəlməz gözümə o məhliqasız,
Gəli hər zaman yerimdən “ənə vəhədət” sədası.

* * *

Görsə qəddin, sərv olur gülşəndə Məcnun tək çünun,
Bidi-məcnun tək qalır sərgəştəhalü sərnigun.

Ah bünyad eylədim, yansın fələk, düşsün yerə,
Ah, neylim, ahım oldu çərxə bir möhkəm sütun.

Çini-zülfə urmaq əl, billah, xətadır, ey könül,
Almamış ol müshəfi-ruxsari-dilbərdən füsun.

Mahrulər zülfünə ta inki pabənd oldu dil,
Ruzü şəb halın pərişan eylədi gərduni-dun.

Bülbüla, tökdükdə əşkin pak qıl rüxsardən,
Qorxuram kim, aşikari-qeyr ola razi-dərun.

## RÜBAİ

Ey dil, qəm etmə, gər səni dildar tərk edər,
Bu rəsmdir ki, aşiqə məşuqə ərk edər.
Hər bibəsirətin gözü görməz camalını,
Xəffaş gün şüasını nə növ’ dərk edər?!

**Vər. 473a**

## MOLLA MƏHƏMMƏD

**Kərbəlayi Molla Məhəmməd Qarabağın Bağbanlar kəndindəndir. Bağbanlar Qarabağın Şuşa şəhərinə aiddir. Atasının adı Mirzə Əhməd Təbibdir. Peşəsi mollalıq və ölü işlərinə baxmaqdır. Yaşı təxminən qırx olar. Bəzən şeir, növhə və sairə də yazır. Aşağıdakı şeirlər onundur. Təxəllüsü yoxdur, şeirləri Məhəmməd adıyla deyir. (Aşağıdakı) şeirlər öz dəst-xətti ilə vazılıb.**

**Zilhiccənin əvvəli, 1309 – 27 iyun, 1892.**

### MÜXƏMMƏS
### (beşləmə)

Mənim piyalə dostum dünən gecə kuzədən məst oldu,
Ürəkalan mütrib oynayıb oxuyurdu.
Piri-muğan badənin kənarında əyləşdi,
Qayibanə bir səs qulağıma bu səsi çatdırdı:
Müşk ətirli şərabı məhəbbət yolunda ver!

Ceyhun kimi gözlərimdən yaş axdı,
Eşqin rəmziylə yoğrulmuş könlüm qəmlidir.
Mən həqiqət şərabından məst olsam da, halım yerində deyil.
Min dəfə qanımı töksələr də,
Hər qan almada “Ya mən hu" eşidilər.

Meyxanə məclisində böyük söhbət var idi.
Vəhdət gözəli cilvələnib, öz üzünü göstərdi.
Dostlar hamısı şərabdan məst olmuşdular,
Saqi elə bir söz dedi ki, ürəyimi apardı.
Aşiqlə məşuq arasında tük necə yerləşər?

Hara baxsam da, zəmanə Kə’bəsi sənsən,
Aşiqlərin ürkək ürəklərinə aşiyanə sənsən.
Bütün aşiqlərin eşq yolunun bəhanəsi sənsən,
Hər əfsanəyə qulaq asıramsa, o sənsən,
Mənim hər qəmim gözəl dost haqqındadır.

Həmişə mey içənlərin ürəyinə sevinc qarışır,
Ürəkdən gözəlin məhəbbətini çıxarmasam, təəccüblü deyil.
Dost yanında nə şah, nə gəda, nə əsil, nə nəsəb?
Ərəb nə əcəb Qəznəviyə bu lətifəni deyib?
Daş-qaş taxtında oturub, vəslin yolunu axtarma.

* * *

Başım dosta tərəf, fikrim xəlvət bir evdə,
Sənin fikrinin tələsində tənha oturmuşdum.
Vəhdət gözəli mənim məqsədimin ətəyindən tutub.
Canımın qulağıyla qayibanə səsdən eşitdim.
Çox şükür ki, qalu* badəsindən məst oldum.

Leylinin vəslindən Məcnun məyus olanda,
Onun qəbrinin torpağını öpməkdən necə doya bilərdi?
Dost yolunda Səməndər fanusda yandı,
Onun naləsini fələk göylərə qaldırdı.
Onun sözünün əsl mənası “Allahdan başqası yoxdur” - deməkdir.

Dostun qəmini çəkmək üçün kişi olmaq lazımdır,
Hər ağacdan ətirli gül hasil olmaz,
Udu hər yerdə yandırmazlar.
Piri-muğan belə dedi, yadımdadır:
Aşiqsənsə, kişi ol, yanmaqdan qorxma!

Ey könül, Məhəmməddən vəfanın yolunu eşit,
Mürşidin qapısından səmimiyyət üzünü döndərmə.
Hümmət qanadıyla uç, özünü göstər,
Ali-əbanın xatirinə, ey yerin-göyün Allahı,
Qiyamət evinə üzü ağ gəlmək üçün kömək et!

## QƏZƏL

Sənin o gözlərində qəsdi-can əlaməti var,
Bu can sənindi, əzizim, mənə nə minnəti var?

Üzündə daneyi-xalındı dil təmənnası,
Mütiyi-adəm olub aqibət nədaməti var.

Bu nazü qəmzə, bu işvə, bu şiveyi-dilgir,
Behişti-ədndə hurilərə nə nisbəti var?

Görən zamanı üzün afitabi-aləmtab,
Girir səhabdə pünhan olur, xəcaləti var.

---

* Qalu – Allahın kəlamına işarədir.

Ləbini şəhdi-şəkər söyləyən xilaf eləyib,
Ləbin yanında, gülüm, şəkkərin nə ləzzəti var?

Sənə “gülüm” dedim, ey mahru, xəta elədim,
Çəməndə hansı gülün sən kimi təravəti var?!

Xilafi-qaidədir sərv, çox müərrəfdir,
O necə sərvdi, sən tək bu qəddü qaməti var?!

Məhəmmədin sənə can verməyə nə talibdir,
Məqami-eşqdə hər aşiqin nə qüdrəti var?!

* * *

Könlüm olubdu parə xədəngi-məlal ilən,
Allah rizası, qoyma mani böylə hal ilən.

Nitqin Məsihi-zəmanədi, bir gəl təkəllümə,
Qəlbim olubdu mürdə, qıl əhya məqal ilən.

Daim sabahadək gecə əncüm sayar gözüm,
Yeksandı sübhü şam mənə bu xəyal ilən.

Əlhəqq, kəsbi-hüsnünə heyrandı afitab,
Müddətdi ərşdə dolanır mahü sal ilən.

Lütfün mənə gər olmasa, yoxdur məzəmmətim,
Baxmaz gədaya şah bu qədr cəlal ilən.

Tavus hüsnün axırı, ey məhvəşi-cahan,
Aldatdı mürği-ruhumu bir danə xal ilən.

Eşqin məni-şikəstəni gör kim, nə vəch ilən[*]
Divanəvar edibdi beqəddi-kəmal ilən.

Eşqin Məhəmmədin necə gör əqlini alıb,
Divanəvar edibdi bu fəhmü kəmal ilən.

---

[*] Təzkirənin çap nüsxəsində bu beyt yoxdur. Görünür, müəllif və ya Nəvvab onu sonrakı beytlə əvəz etmişdir.

## YENƏ DƏ MOLLA MƏHƏMMƏDİN QƏZƏLİ

Mən əzəl gündən məstəm, ey dilbər, tədbir et,
Mən eşq divanəsiyəm, ayağıma zəncir vurma.

Ey gözəl büt, bilmirəm necə günah etdim,
Əgər taqsırım varsa, həlak qılıncını çıxarıb öldür.

Miskin aşiqin qətlinə qılınc çıxartmağın nə faydası?
Ürək alan nazın mənim üçün kifayətdir.

Rəqiblər mənə yol versələr,bir gün sənin xidmətinə çataram,
Hicran şikayətlərini bir-bir nəql edərəm.

Qəm yatağına düşmüşəm, eşq xəstəliyi məni öldürdü,
Sənin hicran qəmini yazmağa əlim gəlmir.

Qocalıq kimi bir bəlayə düşmüşəm,
Ürəyimin qanını beşikdəki uşaq süd əmən kimi əmirəm.

## YENƏ DƏ MOLLA MƏHƏMMƏDİN QƏZƏLİ

Dost xəyalı daim mənim başımdadır,
Yar fikrindən ayrı başqa bir işim yoxdur.

Onu görmək üçün başımı da versəm,
Heç vaxt dilbərin şövqü başımdan çıxmaz.

Məhşər günündən mənim nə qorxum var?
Məhşəri hər gün öz gözümlə görürəm.

Ey külək, əgər yolun mənim dostum tərəfə düşsə,
Soruş: Vəsl nə vaxt (bizə) müyəssər olacaq?

Ey vaiz, kövsər(suyunu) niyə vəsf edirsən?
Yarın ləlindən başqa mənim üçün kövsər suyu yoxdur.

Mən dostdan ayrı çox qəmlər dadmışam,
Məcnun da mənə çata bilməz.

Ömrümdə bir xoş gün görməmişəm,
Ya Rəb, necə də nəhs gündə anam məni doğub!

Bu axır vaxtda Məhəmmədin üzünə nəzər sal,
Ey yar, neçə vaxtdır ki, bu küçədə nökərəm.

* * *

Düşübdü bəxtim, əzizan, ümidgahım ilən,
Xədəngi-hicrinə tab etməyə bu ahım ilən.

Fəraqa səbr elədim, canə qəsdü xabı həram,
Şikayət eyləmədim bir belə güvahım ilən.

Nisarı-can eləmək məqdəmində asandır,
Vüsal hasil ola bircə qibləgahım ilən.

Müyəssər olsa yetəm xidmətində dilbərin,
Nə güftgu edərəm ol camalı mahım ilən!

Zəmanə içrə əzəldən əcəb mükərrəm idim,
Həmişə fəxrim idi malü izzü-cahım ilən.

Dağıldı izzü cəlalım, gədasifət gəzərəm,
O gün ki, aşiqəm ol yari-xoşnigahım ilən.

Xəyali-xalın ilən xab görmərəm gecələr,
Sabahadək edərəm cəng xabgahım ilən.

Fəraq silsiləsinə könül düçar oldu,
Nə gunə vəslə yetim taleyi-siyahım ilən?!

* * *

Fələk kinlə məni səndən uzaq saldı,
Ey nigar, səndən ayrı düşəni axtar!

Qaranlıq gecələrdə rahatlığım yoxdur,
Çünki hicran küncündəyəm, bəsdir əziyyət çəkdiyim.

Lalə üzlünün eşqindən ürəyimdə bu nə yara, bu nə yanğıdır?!
Dostun istədiyi bu idi ki, mənə layiq görüldü.

Ayrılıq bəlası qəm ləşgərini mənim üstümə çəkdi,
Məni Mənsur kimi ölüm ayağına çəkib apardı.

Sənin üzünü görmək üçün gözlərim həmişə yoldadır,
Ey rəhmsiz gözəl, gözümün nuru getdi.

Vəsl xəyalı hara, mən hara, kafirlər hara?
Vəsl ümidi hara, bəsdir, huri aşiqiyəm.

Leylinin eşqiylə Məcnun çöllərə düşdü,
Onun eşqi bir şey deyildi, mən ondan daha məşhuram.

Min dəfə qara torpaqla üstümü örtsələr də,
Sevdiyimin məhəbbətini könlümdən çıxarmaram.

* * *

Gecə-gündüz yarın üzünü görmək eşqi başımdadır,
Yarın üzünü görməkdə mənim başqa məqsədim var.

Gözəllər, əgər həqiqətən nəzər salsan,
Kimsəsizlərin qətli üçün xəncərə təhrik edirlər.

O qədər halsızam ki, bilmirəm yarın əlində,
Zəhər şərab camıdır, ya ki, abi-kövsər.

Zahid səhərə qədər behişt fikrindədir, alov qorxusunda,
İşə bir bax ki, səhər açılıb, gözüm hələ də qapıdadır.

Ruhumun quşu neçə vaxtdır ki, sənin zülfünə əl vurub,
Əli anasının ətəyində olan uşaq kimi.

Ey şah, itaət başı həmişə sənin ayağındadır,
Hətta bütün dünya şahları qarşına gəlsələr də.

Dilbərimin ehsan evi abad olsun,
Onun camalını hər iki gözümdə görürəm.

Bəsdir, təbib, mənə artıq zəhmət vermə,
Dilbərimin küçəsinin torpağı mənim dərmanımdır.

Bilirəm ki, dostun zəncirindən qurtula bilməyəcəyəm,
Eşqin zənciri aşiqin boynunda olsa yaxşıdır.

* * *

Həbiba, noldu bais kim, məni aləmdə xar etdin?
Qara gözlüm, məgər bir qeyr aşiq ixtiyar etdin?

Nəzərdən məhv edib, bəzmi-nişatımdan əyaq çəkdin,
Qara gözlüm, məgər əğyar bəzminə güzar etdin?!

Həmişə fəxr edərdim məhrəmi-qürbi-vüsal oldum.
Qara gözlüm, nədən miskini kuyindən kənar etdin?!

Məni bədgulərim bietibar etmiş hüzurunda,
Qara gözlüm, nədən qövli-rəqibə etibar etdin?!

Nə müddət daği-hicranın dili-zarım nihan tutdu.
Qara gözlüm, nədən bu sirri xəlqə aşikar etdin?!

O qədr şükr qıldım, hicr ənduhi kənar etdim,
Qara gözlüm, nədən canım qami-hicrə düçar etdin?!

Əzəl gün xidmətində seyri-gülzara qədəm qoydum,
Qara gözlüm, nədən qeyr ila seyri-laləzar etdin?!

Vüsalın nəş'əsilə bəzmi-eyşə rövnəq artırdım,
Qara gözlüm, nədən bu bəzmi-eyşi tarmar etdin?!

Şəfəqgun eyləmişdi şəm'i-hüsnün külbeyi-tarım,
Qara gözlüm, nədən bu xanəgahım tirə-tar etdin?!

Edib biganəlik tərkin, mənimlə həmdəm olmuşdun,
Qara gözlüm, nədən biganəlikdə iştihar etdin?!

Qədəm qoydun bu gün naz ilə bəzmi-eyşi-xubanə,
Qara gözlüm, nədən xubani-dəhri şərmsar etdin?!

Na müddətdir dili-zarım olub pabəsteyi-zülfün,
Qara gözlüm, nədən zənciri-eşqi üstüvar etdin?!

İçib peymaneyi-eşqin xumarü laübal oldum,
Qara gözlüm, nədən miskinini munca xümar etdin?!

Həmişə fəxr edərdim sayeyi-lütfündə dövr etdim,
Qara gözlüm, nədən lütfün kəsib, zülmün şüar etdin?!

Məhəmməddir sənə dirinə çakər, ey büti-ziba,
Qara gözlüm, nədən ol pirdən tərki-nigar etdin?!

* * *

Nə ruzi-vəsldə əhdin mənimlə möhkəm olaydı,
Nə öylə möhkəm olaydı, nə böylə bərhəm olaydı.

Nə gəlməyəydi cahana bu cismi-zarü fikarım,
Na olmayaydım anamdan, nə cəddim Adəm olaydı.

Nə görməyəydi camalın bu çeşmi-əşkfəşanım,
Nə firqətində, nigara, bu qədr pürnəm olaydı.

Nə olmayaydı səri-kuyin üzrə mənzili-qürbim,
Nə indi ol səri-kuyə rəqib məhrəm olaydı.

Nə sən kimi qədi-ər’ər görəydi çeşmi-zəmanə,
Nə qamətini görəydim, nə qamətim xəm olaydı.

Nə eşqin ilə müxəmmər olaydı bu dili-xunin,
Nə eşq olaydı, nə aşiq, nə yarü həmdəm olaydı.

Nə öylə vəslin olaydı mənimlə, ey güli-behcət,
Nə böylə firqəti-cansuzü-möhnətü qəm olaydı.

Nə keçməyəydi fələkdən bu qədr şöleyi-ahım,
Nə cana atəşi-hicrin belə müsəlləm olaydı.

## DÜNYANIN VƏFASIZLIĞI HAQQINDA (beşləmə)

Xoş o kəsə ki, dünyanın murdarlığından özünü pak edir,
Həqiqət gözü ilə baxıb, yaxşını-pisi dərk edir.
Ürəyindən hərisliyi və tamahı təmizləyir,
Çox kəslər var ki, əmlakı ilə fəxr edər,
Fələklə müqayisədə bunlar hamısı heçdir.

Ey könül, mənasız olan qızıl-gümüş üçün heç coşma,
Qənaət xəzinəsinin kürkünü geyin.
Dünyadan köçməyə hazır ol, tale şərabı iç,
Ey ağıl sahibi, bu haman alçaq dünyadır ki,
Şahların kəllə kasasını torpaqla doldurur.

* * *

Bəsirət gözünü aç, sələflərə nəzər sal,
Əcəl qəminin oxuna neçə kəslər hədəf oldular?

Dünyanın çox xəzinələri tələf olubdur,
Nə Yəmən əqiqi, nə qızıl-gümüş, nə saxsı,
Bunları yığanların hamısı dəlidir.

Ey əzizlər, baxın görün zəmanə necə keçir,
Aşiqlər məşuqə yolunda candan keçirlər.
Yaxşının, pisin, çirkinin, gözəlin zamanı keçir,
Dünyanın axırı belədir, belə də keçəcək,
O kəs aqildir ki, öz könlünü şad edir.

Ay qardaş, haqq yoluna düşmək nə yaxşıdır,
Torpaq olanadək torpaq kimi başı aşağı ol,
Ölüm qasidindən qafil olma, dərini çıxarar.
Boş əl ilə dost evinə necə getmək olar?
Könül mizbanı töhfə görəndə şad olar.

Ey könül, qəflət badəsindən arzu camını niyə içirsən?
Bütün var qüvvəni fəqrü fənaya sərf et!
Cahan mülkinin tarlasına əməl toxumu səp.
Xəbərdar ol, əcəl peyki yaxınlaşıb, çatır,
Könlünün açılması üçün əlini yüyənə qoy!

Bəhlulluq qaydasını öyrən, özünə qürrələnmə,
Bu evdə heç bir nəfəs sahibi qalmayıb.
Tamah əlini yığışdır, bu mülkdə əbədi bir şey yoxdur,
Divanədir o kəslər ki, xeyir görmək istəyirlər,
Alçaq dünya üçün sinələrini dağıdırlar.

Dünyanın harasına baxsan, qəm görərsən,
Aqil o kəsdir ki, səxavətlə kərəm əlini açsın.
Qənaət mülkünün aşiqi Cəm şövkətini neyləyir?
Xoş o kəsin halına ki, bu qəm evində,
Ümid əlini göyləri yaradana tərəf uzada.

Ey Məhəmməd, umid əlini Muxtara tərəf uzat!
Onun ətəyindən əl çəkmək mümkündürmii?
Cəza günündə günahları bağışlamağı ondan xahiş etmək olar.
Gözünü aç, və'd olunmuş mə'rəkə günü çatır.
Sənin gözün o mə'rəkədə nəmli olacaq.

**Vər. 474a**

## İBRAHİM TAHİR

**(Rəbiül-axir, 1309-cu il – noyabr, 1891)**

**Tahirin adı İbrahimdir. Bu təzkirə yazılan vaxt 22-23 yaşı var idi. Xoş əhvallı, düz əxlaqlı bir cavan idi. Məşədi Əbdül Qarabağinin oğludur. Şuşa şəhərinin Çuxur məhəlləsindəndir. Sənəti tacirlikdir. Farsca savadı var. Şeir deməyə çox həvəsi var. Təxəllüsü Tahirdir. Aşağıdakı şeirlər onundur, öz dəsti-xətti ilə yazılıb.**

Yarın qıvrım zülfünü yad edən vaxt,
Özümü əqrəbin caynağına salıram.
Ya Rəb, heç kəs mənim kimi eşq dərdinə düçar olmasın,
Naləden bütün aləmi bizar eylərəm.
Eşq hədisi mənün yanımda bir şey deyil,
Ancaq təəccüblüdür ki, hamı üçün təkrar edirəm.
Bu dünyada çoxları qızıl-gümüşlə fəxr edir,
Mən gecə-gündüz dildar ilə fəxr edirəm.
Tahir, qaranlıq hicran gecələrində kimsəsizlikdən,
Öz dərdimi ancaq divara izah edirəm.

* * *

Qorxuram ki, əcəl kinlə mənim kəfənimi tiksin,
Ey sənsiz köynəyim və libasım parçalanmış.
Baharda sənin cəmalını görməyəndə,
Mənim iki gözümdə nəstərən gülü xardır.
Uzun gecələrdə o qıvrım zülfün həsrətindən,
Bədənimdə olan çoxlu yaralar daha da artır.
Mənim yaralı sinəmə o qədər ox vurmusan ki,
Oxlar bədənimdə tük kimi göyərdi.
Tahir, nə nəhs gündə doğulmuşam,
Yoxsa ki, qəm mayasından mənə süd veriblər?

* * *

Sənin hicrini ölümə bərabər yaradıblar,
Vüsalını isə ömrü artıran kimi yaradıblar.

Sənin eşq yolunda mən kafir olmaram,
Sənin eşqini də salavat qəbilindən yaradıblar.

Başdan-ayağa qədər sənin bütün hərəkətlərin
yaxşıdır, xoşdır,
Ey canan, səni nə xoş hərəkətli yaradıblar?

Sənin xoş ləblərin həyat suyunun yerləşdiyi o
qaranlıq mənbədir,
Onların arasında həyat suyu yaradıblar.

Sənin vəsl gecəni şikəstə Tahir üçün,
Bərat gecəsinə oxşar təntənəli bir gecə
kimi yaradıblar.

* * *

Mənim halım sənin zülfün kimi pərişandır,
Bu qədər yersiz mənim cismimə od vurma!
Sənin dodaqların həyat verən kövsər bulağı kimidir.
Sənin qəddin cazibəliyi ər-ər ağacından alıb.
Mən bir daha badə içməyə meyl etmərəm.
Çünki sənin saf dodaqların ən təmiz badədir.
Allah xatirinə, dodaqlarından mənə bir neçə öpüş ver.
Məndən bu qədər qorxub çəkinmə!
Tahir, acizliyinin sirrini öz yarına sövlə,
Ey mənim halım sənin zülfün kimi pərişan.

* * *

Sənin üzün uzaqdan ay kimi cilvələnir,
Ancaq sənin camalını görməyə imkan olmur.
Sənin qara gözlərindən canımı qurtara bilmirəm,
O hər iki qara məst mənim qətlimə hazır durubdur.
Üzün səhər kimi aydın görünür,
Zülfün zülmət gecə kimi qaranlıqdır.
Üzün hicabda olanda bulud arasındakı aya bənzər,
Gecə görməyən adamların nəzərində tale olmaz.
Tahir, sən o cəfakar yarına de ki,
Qiyamətə kimi sənin qəmindən şad olmayacaq.

* * *

Sənin lə’lin gözlərimdən ürəyimin qanını axıtdı,
Sənin ayrılığından canıma düşən od daha da şiddətlənib.

Bu gün öz zəmanəmin Qeysi mənəm,
O səbəbdəndir ki, quşlar başımda yuva salıb.
Canımı sənin üzünün qəmindən necə azad edim?
Sənin ayrılığının qəmi ürəyimi öz yerindən didərgin salıb.
Biz bəhanəsiz onun qədəmlərinə can fəda edərik.
Ləbindən bir busə istəyəndə o yüz bəhanə elədi,
Tahir, o şəkər ləbli nigarda vəfa axtarma,
Könlümü naz və qəmzə oxuna nişanə edib.

* * *

Sənin ki, belə hüsnün var, minlərlə könül ovlayar,
Könül qönçə kimi sənin üzünün yaşlarından qan udar.
Ey can, könlüm bahar fəslini istəməz,
Sən harada olsan, könlümün baharı da orada olar.
Sənin surətinin fikrilə bilmirsən ki, səhər-axşam,
Qəm bağında könlüm lalə kimi dağdar olub?
Axşamdan səhərə kimi sənin iki qara zülfün üçün,
Ürəyim ilan kimi qıvrılır, ey mələk üzlüm.
Şikəstə Tahirə demə ki, “mənə könül vermə”,
Bu surət ki, səndə var, səni min könül ovlar.

* * *

Gördünmü, ey könül, nigar əhdə vəfa eyləmədi.
Bir busə ilə mənim könlümün dərdinə dəva eyləmədi.

O cəfalar ki, sənin nazının əlindən çəkirəm,
Dünyada onu kafər kafər üçün əda eyləmədi.

Zülfünün torundan qafil ikən ömrüm bada getdi,
Zülfünün toruna dövran məni bir gün mübtəla eyləmədi.

İstədim sənin ayrılıq əziyyətindən bir dəm kənar olam,
(Ancaq) dövran məni bu fəraq dərdindən ayırmadı.

Tahir, cəfakar yara özünü fəda et,
Kim öz canın məhəbbət yolunda fəda eyləməyib?

* * *

Dünyada eşq kafiriyəm, mənim dinlə nə işim?
Heç bir şey bilmirəm, mənim dini təriqət yolum budur.

Ay göydə olsa da, mənim ayım yerdədir,
Mənim ay (üzlümlə) göydəki ayın fərqi ancaq budur.

Üzümü gözəllərə çevirib, niyə namaz qılmayım?
Meykədənin ağsaqqalı mənə deyir ki, sənin qiblən budur,

Sənin küçənin Kə'bəsi həmişə aşiqlərə məskən olub.
Necə ki, Allah evinin Kə'bəsi əziz adamlara məskəndir.

Sənin ağlar Tahirin, ey yar, surətinin hicrindən öldü,
Yarın aşiqə vəfası məgər belə olar?

* * *

Dodağının kənarındakı xal nə xoşdur, odda olan üzərlik kimidir,
Nə xoşdur sənin iki sərxoş gözlərin, ürək alan lə'l dodaqların!
Sənin qılıncın Təhmtənin–Rüstəmin qılıncı kimi mənim qanımı axıtdı,
Oxun Gəyarişin* oxu kimi ürəyimdən keçdi.
Mən xəstənin ahının odundan bütün xalq yandı,
Sən mənim ürəyimi gör ki, odla necə xoş ünsiyyət bağlayıb.
Ürəvim sənin hicran qəmindən sıxılıb,
Qəlbim sənin saçın kimi pərişan olub.
Sənin üzünü görmək həsrətiylə ağlar Tahirin ölür,
Dərdindən xəstə olana rəhmin gəlsin.

* * *

Bu nə vəlvələdir sənin gözəlliyindən dünyaya düşüb?
Bəlkə sənin üzünə tökülən çin-çin zülfündəndir?
Mənim işlərim ki, belə qarışıb,
Elə bil ki, üzünə zülfün dağılıb.
Gözümdən axan qan getdikcə artır,
Ona görə ki, sənin əksin mənim ağlar gözlərimə düşüb.
Sənin üzündə axan tər xoşa gələn mirvarilər kimi görünür,
Elə güman edirsən ki, qırmızı gülə şəbnəm düşüb.
Əzəldən mənim xatirim heç bir fərəh görməyib,
Pərişan könlüm qəmə düşüb.
Bu dünyada gözəl cəlalət sahibi çoxdur,
Sənin kimi gözəl ədəb sahibi bu cahana az gəlib.
Heç cürə Tahirə nicat yolu yoxdur,
O sənin qara saçlarının toruna bərk düşübdür.

---

* Keyqubadın ikinci oğlu.

* * *

Mənim ürəyim kimi sənin zülfünə düşən başqa bir ürək az tapılar,
Mənim başım kimi sənin yolunda qurban olan baş az tapılar.
Mehrin qəm fəzasında mənə bir dəlildir,
Azmış adama sənin eşqin kimi yol göstərən az olar.
Qara saçlarının bəndinin zünnarı olmuşam,
Mənim kimi sənin zülfünün toruna az kafir düşər.
Sənin dodaqların olmasa, bal mənim üçün öldürücü zəhərdir,
Şipşirin dodaqların kimi şəkər az tapılar.
Gül sənin surətində müqayisə olunmazdır,
Üzün kimi qırmızı gül az olar.
Alnında zülfün şahmar kimi qıvrılıb,
Zülfün kimi qıvrım saç az olar.
Çox kəslər, ey Tahir, hicran qəmində kədərlidirlər,
Sənin kimi ağlar, qəmli, kədərli az olar.

* * *

Xoşbəxtəm ki, gümüş bədənli, gözəl üzlü cananım var,
Belə bir yar dünyada yoxdur ki, mənim vardır.
O gündən ki, onun astanasında yer tutmuşam,
Nə cənnət bağçasına meyl edirəm, nə də çəmən arzusundayam.
Onun zülfünün bir telinə dedim ki, niyə bəxtim kimi qarasan?
Dedi ki, bu rəng mənə müşki-Xütəndən mirasdır.
Könlümə dedim ki, bir də onun qıvrım zülfünün toruna getmə,
Dedi: Əlini məndən çək, başımda vətən eşqi var,
Bütün aləm düşmənim olsa da, ürəyimdə qorxum yoxdur.
Çünki dünyada sənin astanan kimi təhlükəsiz yerim var,
Niyə məni kasıb bilirsən, ey can, sənin yolunun azuqəsi,
Qanlı gözümün ətrafında çoxlu qiymətli mirvarilərim vardır.
Məni birdəfəlik bu sonsuz hicran dərdindən xilas et,
Sənin başının tükləri qədər ürəyimdə dərd var.
Tahir, yardan ayrı gecə-gündüz qan ağlayıram,
Bu nə oddur ki, mən yanıram, bu nə yardır ki,
mənim vardır?

* * *

Sənin cəfa xəncərindən ürək qana bulanıb,
Sinəmdə zülfünün sevdası artıb.
Mənim könlüm sənin zülfünlə bacarmır,

Çünki sənin zülfünün qıvrımları əfsunludurlar.
Ürək qanını göz yaşı əvəzinə axıdıram,
Göz yaşımın quruması ürəyimin hərarətindəndir.
Sənin zülfünün pərişanlığı başıma düşüb,
Sənin zülfündən vəcdə gələnə cünun zənciri lazımdır.
Qəmli Tahirin ürəyi sənin dərdindən qana döndü,
Başqalarının məhəbbəti onun xəstə könlündən kənardadır.

* * *

Sənin məst gözlərindən ayrı gözlərimin yuxusu yoxdur,
Ağlamaqdan gözlərimdə yaş qalmayıb.
Sənin zülfünün həsədindən bağda sünbülün ətri gedibdir,
Sənin camalının xoş rəngindən gül xəcalət çəkir.
Mən hicran gecəsində sənin qəmlərini saymaqda acizəm,
Ona görə ki, sənin dərd-qəminin hesabı yoxdur.
Sənin zülfün öz qıvrımlarını mənim cismimə tapşırıb,
Mənim bədənimdə olan qıvrımlar sənin saçındakı
qıvrımlardan artıqdır.
Sənin üzünün nurundan ağlar Tahirin gözləri tutulub,
Ona görə ki, onun gözlərinin günəşə tabı yoxdur.

* * *

Mənim sınıq könlüm onun qəmindən parçalandı,
Fəqan, bir dəm onunla həmdəm olmadım!
Uzun gecəni onun qıvrım zülfünün xəyalı ilə oldum,
Onun qarışıq zülfü kimi qıvrıma düşdüm.
Sənin üzünün hicrində gözlərim qan ağladı,
Sənin yolunun üstündə qönçə onun (göz) yaşı
hesabına açıldı.
Gülüstanda qızılgülün üzünün rəngini görəndə,
Sənin üzündəki yaşdan onun şəbnəmi çəkildi.
Əgər Tahirin ürəyində sənin xəncərindən yara varsa,
Sənin dodaqlarının fikri onun könül dərdinin dəvasıdır.

* * *

Nə vaxt ki, üzünün fəraqında nalə çəkirəm,
Ahımla ayın dövrəsinə halə çəkirəm.
Eşqin şəriətində qara paltar yoxdur,
İstəyirəm öz göz yaşımla paltarı isladım.

Sənin camalının şöləsindən gözlərim tutuldu,
Gözlərimi günəşə necə tutum?
Könlüm quşu sənin kimi qara zülfünlə ünsiyyət edib,
Çətin ki, başqa zülfün xəyalın edim.
Tahir, eşq hədisini xalqa çox demə,
İstəyirəm ki, onun eşqinin şərhini müxtəsər edim.

* * *

Hərgah könül onun mehri-camalına yaxın olsa,
Viranə könlüm ali-behişt kimi olar.
Bilmirəm onun xidmətində nə eləmişəm,
Məni görəndə alnı düyünlənir.
Elə ki, könlümü onun kəkilinə verib, yalandan dindən danışıram,
Onun saçının hər bir tükü din və iman yolkəsəni olur.
Yar dükanımın qarşısından keçəndə,
Dükanım səfadan behiştə dönür.
Başqasının şəkəri ağzımda zəhər dadı verir,
Onun əlindən zəhər boğazımda şirin su olur.
Mənimlə əhd etdin, əhdə vəfa etmədin,
Cana, məgər gözəllərin vəfası belə olar?
Tahir, hicrdən ömrün bada getdi,
Sənin pənahın dünyanı yaradan Allahdır.

* * *

Yarım öz evindən parlaq çıxır,
Elə bil ki, buludun altından ay çıxır.
Sənin üzünün şöləsi mənim gözümdə yaş qoymadı,
Göz yaşım ürəyimin qanına bulaşıb çıxır.
Ey əcəb, sən necə sadə, şirinsən,
Danışan vaxt dodaqlarından şəkər tökülür.
Sənin qəmindən arıqlayıb saraldım, hilala döndüm,
Ağlamaqdan başımın tükləri tüstü kimi qalxdı.
Ey Tahir, elə bil ki, sinəm atəşkədədir,
Hər nəfəsdə oradan yüz qığılcım çıxır.

* * *

Gecə sənin fəraqında o qədər iztirab çəkdim ki,
Ürəyimin qanını gözlərimdən su kimi axıtdım.
Qıvrım saçlarının sayını tapa bilmədim,

Bütün ömrüm boyu gecə-gündüz onu hesabladım.
Sənin dodaqlarından uzaqda mən yazığın rahatlığı yoxdur,
Sənsiz nə qədər çalışdımsa yata bilmədim.
Könlüm səndən ayrı qərar tutmur,
(Könlümün) boynuna sənin saçlarını ip kimi doladım.
O şəkər dodaqlı nigar mənə rəhm etmədi, Tahir,
Onun atəşində ürəyimi kabab etdim.

* * *

Ey dodağı bal, şəkər, üzü günəş,
Sənin zülfünün fikrindən canımda yüz düyün var.
Hicran gecəsi dərd- yoldaşım, ahım isə çırağımdır,
Sevda fikri təamım, qanlı göz yaşım şərabımdır.
Nərgiz gözlərin sehirli, aydın, qaşların iti xəncərdir,
Üzün gümüş kimidir, kəkilin təmiz müşk.
Sənin odlu üzünün xəyalından, ey şəhərə vəlvələ salan,
Sənin kirpiklərinin oxunda mənim ağlar
ürəyim kabab oldu.
Məcnunun dövrü getdi, Tahir, indi əsrin
Məcnunu özüməm,
Ona görə şadam ki, Məcnunun naibi mənəm.

* * *

Ey gözəllər padşahı, sənsən padşahım mənim,
Səndən özgə bu dünyada bir pənahım olmaz.
Qiblə namazına meylim yoxdur, çünki,
Sənin küçən hər gecə mehrabım, səcdəgahımdır.
Sənin mələk olmağına mən çox şübhə edirdim,
Gördüm, yəqin etdim, ürəyimdən şübhə getdi.
Könlümə dedim ki, zülfün qıvrımından necə keçinirsən?
Dedi: Aman bu olduğum yerin darısqallığından!
Tahir, yaxşı gözələ baxmaq günah deyil,
Onu görməklə bütün günahım getdi.

## TAHİRİN AZƏRBAYCANCA QƏZƏLLƏRİ

Kim mənim tək fikri-zülfündən belə məcnun olur,
Ruzü şəb həmdərdi-vəhşi, məskəni hamun olur?

Gər desəm ər-ərdürür qəddin sənin, səhv etmişəm,
Sərvü ər-ər, dilbəra, qanda belə mövzun olur?

Mürşidi-meyxanə qəm dəf'inə mey təcviz edər,
Mən bu qana dönmüşü içkəc, qəmim əfzun olur.

Təxti-naz üzrə gedərsən xabi-nazə naz ilə,
Firqətində hali-aşiq bilməyirsən çun olur?

Arizin dövründə xalın öylə rə'nadır sənin,
Həsrətindən gülşən içrə lalələr dilxun olur.

Söylə, yəğma eyləsin könlüm o çeşmi-məstinə,
Xəlq içində məst olan hər barədən mövzun olur.

Mərhəmət çeşmilə bir bədbəxtə gər qılsan nəzər.
Ol kəsin bişəkkü şübhə taleyi məmnun olur.

Nə təəccüb, Tahirin olsa qiyamət sözləri,
Qaməti-rə'nayə, maildir, sözü mövzun olur.

* * *

O dil ki, şifteyi-ləzzət olmasın, nolsun?
Ki, bir nigar ilə həmsöhbət olmasın, nolsun?

O dil ki, işrətü eyş ilə keçsin əyyamı,
Əsiri-dərdü qəmü möhnət olmasın, nolsun?

O tiri-qəmzələri tökməsinmi qanı yerə,
O çeşmi-məstdə xoş halət olmasın, nolsun?

Demin ki, zülfi-xəmi afəti-dilü candır,
Kəməndi-zülfü anın afət olmasın, nolsun?

Cəfavü cövri-nigar ilə xoş keçsin Tahir,
Cəfa nigarlərə adət olmasın, nolsun?

* * *

Şişə içrə qan olub könlüm mənim dildarsız,
Böyləmi keçsin günüm, ya Rəb, günəşrüxsarsız?!

Sərf qıldım hər nə varım var isə gülrüxlərə,
Şimdi onlarsız mənə müşküldü varım varsız.

Dərd çox, həmdərd yox, şərh eyləyim əhvalımı,
Keçdi ömrüm, barilahə, dəhrara qəmxarsız.

Nərgisi-xummarın ilə bir nəzər qıl könlümə,
Müztərib əhvaldır bimarımız bimarsız.

Tahira, sal boynuna yarın müsəlsəl zülfünü,
Ruzigarın tirə bulmuş türreyi-tərrarsız.

* * *

Dilbəra, hicri-rüxündən karım ahü zardır,
Neyləyim, zülfün kimi bu ruzigarım tardır.

Cəlb edibdir könlümü o nərgisi-məstin sənin,
Dərdimə dərd artıran o nərgisi-xummardır.

Görməsəm bir dəm səni, könlüm bəsi lərzan olur,
Arizin çünki səfabəxşi-dili-əfkardır.

Kəsb edər beyza rüxündən çərxdə xurşidü mah,
Zülməti-zülf içrə ruyin mətləi-ənvardır.

Yoxdu, Tahir, aşiqə dünyada bir eydi-əziz,
Aşiqin eydi-əzizi yar ilə didardır.

**Tahir Qarabağinin şeirləri tamam oldu.**
**1309-cu il – 1891-92.**

**Vər. 487a**

## MİRZƏ ƏLİ AŞİQ

**Mirzə Əli Molla Zeynalabdin Sağərinin oğludur. Qarabağın Şuşa əhalisindəndir. Qırx beş yaşı var. Məşğuliyyəti mollalıq və müəllimlikdir, uşaqlara dərs deyir. Qurdlar məhəlləsindəndir. Təxəllüsü Aşiqdir. Düz əxlaqlı bir kişidir. Pərakəndə şeirləri var, divanı yoxdur. Aşağıda qeyd olunmuş şeirlər onundur, öz dəsti-xətti ilə yazılıb.**

**Zülqədətül-həram, 1309-cu il – iyun, 1892.**

**Mirzə Əli Aşiq 1321-ci ilin səfər avında rəhmətə gedib.[*] (may, 1903).**

Surətgərin nə yaxşı çəkib surət, afərin!
Səd afərin bu surətə, ey surətafərin!

Məxluqlar hamı yaranıb abü xakdən,
Adəmlər içrə yoxdu belə xilqət, afərin!

Bu qaş-gözdə, hüsndə, həm naz-qəmzədə,
Yusif yetirməyib sənə bir şirkət, afərin!

Xoşxülq, xoştəbiət, xoşləhcə, xoşzəban,
Öyrətdi sanei nə gözəl sən'ət, afərin!

Öldürməyi fəraqda, əhyası vəsldə,
Hiç kəsdə yoxdu dəhrdə bu xislət, afərin!

Yoxdur müzayiqə, əməsən ləblərin müdam,
Ruzi-əzəl yarandı bu xoştinət, afərin!

Bu zinət ilə getsən əgər payi-məhşərə,
İqrar edər bu hüsnünə yüz cənnət afərin!

Adətdi lütf aşiqə məşuqə etməyi,
Gəl, eyləmə bu adəti sən bid'ət, afərin!

Nari-fəraq ilə məni yandırdın, ey sənəm,
Kəsdin nədən bu Aşiqdən vəslət, afərin!

---

[*] Mirzə Əli Aşiqin vəfat tarixini Nəvvab sonradan, mətnin yuxarıdan sol küncündə qeyd etmişdir.

* * *

Deyin ol Yusifə, laf urmasın hüsnü lətafətdən,
Əgər yar ilə bəhs etsə, düşər, billah məlahətdən.

Bu bir İsanəfəsdir, xalqı əhya eyləyir hər an,
Əsərdir qaməti, xəlqə qiyam etsə qiyamətdən.

Nədir tuti gələ güftarə bu qalü məqal ilə,
O şirin ləblərin yanında naqisdir fəsahətdən.

Yəqin gülzara seyr etmiş büti-siminbədən dilbər,
Salıb əfsürdə açmış gülləri hüsnü təravətdən.

Gözün çox qəsdi-can eylər, məni sən imtahan etmə,
Verir canın yolunda Aşiqin, cana, sədaqətdən.

* * *

Fələk məni elədi qəmlərə düçar, ölürəm,
Şikəstə könlümü dərd etdi tarü mar, ölürəm.

Məni qurtar bu bəladən özün, xudavənda,
Fəraqi fövt elə, gəlsin o növbəhar, ölürəm.

Mənim kimi cahanda var görəsən bir bədbəxt?
Olubdu dərdü qəmim xəlqə aşikar, ölürəm.

Bu dərdə yoxdu dəva, dərdimiz dəvasızdır,
Əlacıdır belə dərdin o türfə yar, ölürəm.

Nə yaxşıdır, verəsən dil könül sevən yara,
Ürəkdə olmaya bir qeyri-intizar, ölürəm.

Amandı, Qeyssifət qılma sən bu Leylanı,
Salıb bu dağlara, qılma dağdar, ölürəm.

Nə çatmaz əl, eləyim ərz dərdi-hali-dili,
Nə yoxdu tabü təvan, dildə bir qərar, ölürəm.

O zülfdən mənə bir tel səbayə ver, göndər,
Siratdır, aparım qəbrə yadigar, ölürəm.

Könül bir özgə nigara olubdu bənd, Aşiq,
Çəkilsə gərçi bu söz küçələrdə car, ölürəm.

* * *

Ey dil, oyan nə qəflətdir, bu nə xabdır,
İqdami-eşq etgilən, ey dil, səvabdır.

Mişkin telinə, arizi-alinə qıl nəzər,
Pişanisi ərəqləri vəh, vəh, gülabdir!

Qılmış qıyam yar, qiyamət zamanıdır,
Ey dil, cavab verginə, ruzi-hesabdır.

Dil mürği, damdan sənə yox bir gürizgah,
Şahmar zülf boynuna möhkəm tənabdır.

Bədməst çeşminə məzə hazır edib könül,
Bu dağdar, parə ciyərdən kəbabdır.

Ol tirə zülf aləmi zülmat eyləmiş,
Amma rüxün bu tirədilin afitabıdır.

Bu rahi-eşqdə mənə qalib nə Qeysdir,
Aşiq bu rahlərdə əcəb sərhesabdır.

* * *

Nə eylədim sənə, ey gül, kuyində xar oldum,
Yanında bəxtiqara mülki-ahü-zar oldum?

Tükəndi ömr fərağında, çatmadım vəslə,
Zəif can ilə yüz min qəmə düçar oldum.

O tiri-qəmzələrin birbəbir dəyib cana,
Şəhidi-eşq olub, ahulara şikar oldum.

Könüldə qaldı bu dərd, girdi can qəbr içinə,
Cahani-fanidə mən həsrəti-nigar oldum.

Məzəmmət etdi mənə xəlq ah-nalə əlindən,
Bahar ğişi kimi çeşmi-əşkbar oldum.

Bu xublarda vəfa yoxdu, dil, kənara çəkil,
Qulaq vermədi azurdə, qəmküsar oldum.

Könül, ciyərləri Aşiq tamam qanə dönüb,
O gün ki, maili-lə’li-ləbi-nigar oldum.

* * *

Nə vaxta qədər o gülzarın ayrılığında ah çəkəcəyəm?
Hicran atəşi məni gecə-gündüz yandırır.

Ya məni hicrandan qurtar, ya da canımı al,
Mənim bu duamı qəbul et, ey qadir Allah!

Dostlar, öz halımdan heç xəbərim yoxdur,
Onun fərağında bu gözəl bahar da keçdi.

Dünən gecə yuxuda onu gördüm, dedi ki,
məndən uzaq ol,
Get yerində otur, məhşərədək qərar tut.

Yuxunu yozmaqdan mənim ölümüm məlum oldu,
Bu yaxında mən ölərəm, onda hər şey məlum olar.

Tari-zülfdən dünyada bir ləzzət görmədim,
Şirin eşqinin xosrovları kökündən tarimar olsun.

Aşiqin işi dünyada başqalarından ibrət almaqdır,
Könlü tutqun xəstə ürək ağrısıyla dünyadan gedirdi.

* * *

Gözəllərə baxmaqda səbrü qərarım getdi,
Dad onun qəzəbli qaş və gözlərindən.

Könül, eşqin düz yolundan narazı olma,
Zahidlərin qövlü fe'li ürəyi aldada bilməz.

Bizim günəşimizə bax, zülfdən özünə hicab edib,
O yüksək göyün günəşinə bax, o hicabsızdır.

Yarın fəraqında şam kimi yandım,
Ey Xuda, haçan onun vəsli mənə qismət olacaq?

Əgər qiyamətdə Allah səni mənə qismət etsə,
Behiştdən əsla abi-kövsər, alma-nar istəmərəm.

Qiyamət ayağına bu gözəllikdə ayaq bassan,
Məhşər dəyişər, yarın günü başqa olar.

Yüz min dərdim var, dərdimin dərmanı sənsən,
Aşiq öz dərdinə təbibdən çarə istəməz.

* * *

Dost meyinin camından elə məst-xumar oldum ki,
İki dünyadan da xəbərim yoxdur, nurdur, ya od.

Məst ayılar, onun nəş'əsi də tez gedər,
Günləri sayıram, nəş'ə mənim məst başımdan getmir.

O vəfalının küçəsində ölsəm necə səadət olar,
Kaş ki, yarın qapısında məni məst dəfn edələr.

Mənim afitabım, xurşidim və mehrimsən,
Sənə ar olsun ki, bu qaranlıq gecədə Allahın
yanına gedirəm (yəni ölürəm).

Əgər sən mənim dildarımsansa, bir anlığa gəl, mənim
ürəyimi al,
Söylə, könlümün qəmindən nə xəbərin var, ev dildar?

Sənin zülfünün qaranlığından aşiqlərin ürəyi qaradır,
Gecə-gündüz ah edirəm ki, mənə yar olsun.

Nigarla birlikdə könlünü işıqlı etmək istəyirsənsə,
Aşiq, bu yarın ətəyindən heç vaxt əl çəkmə.

**Vər. 490a**

## NƏCƏFQULU BƏY BAHARLI

**(6 zilqə'də, 1309-cu il – 2 iyun, 1892)**

**Nəcəfqulu bəy Mirzə Məhəmməd Həsən bəy oğlu Baharlı Qarabağ vilayətinin əhalisindəndir. Baharlı Şuşaya tabe olan kəndin adıdır. 33 yaşlı, düz əxlaqlı bir cavandır. Mirzə Vəli Vidadinin övladlarındandır. Bəzən şeir də yazır. Aşağıda yazılmış müxəmməs onun şeirlərindəndir. Təxəllüsü Şeydadır.**

### MÜXƏMMƏS

Ey qaşı kaman, kirpiyi ox, ləbləri mərcan,
Şəhdi-ləbi-lə'lin məni-biçarəyə dərman,
Yaqut ləbindən mənə sən eylə bir ehsan,
Ləbin ləbim üstünə qoy, ey növgüli-xəndan,
Gülbərgi-tərin eyləgilən xar ilə yeksan.

Dərdi-qəmi-hicr içrə mənim çoxdu məlalım,
Hansı birini şərh qılım, ey güli-alım?
Aşüftə edən zülfi-siyahındı xəyalım,
Çarə nə olur dərdimə, səndəndi sualım,
Əlhəq bulunu şəkkəriləbdən mənə dərman.

Övqat keçərdi qəm ilə, leyk vüsalın,
Röyada görərdim gecələr əksi-camalın,
Səd şükr Xudaya ki, dönüb fıkrü xəyalın,
Tərfi-gülü büstanə gəlir sərvü nihalın,
Can məqdəminə indi gərəkdir ola qurban.

Dün şərh elədim dərdi-dilim piri-muğanə,
Zülfı-siyəhin qissəsi çün düşdü bəyanə,
Aşüftə, pərişan elədi halımı şanə,
Döndərdi üzarın həvəsi bağrımı qanə,
Ney kimi nəvayə gəlib uşşaq edər əfqan.

Ey mehri-münəvvər, sənə övsaf nə hacət,
Hər yerdə camalın süxəni türfə hekayət,
Söz çoxdu, budur müxtəsər, ey kani-lətafət,
İnsafa gəlib, eylə özün bircə ədalət,
Ver indi icazə, olalım ta sənə mehman.

Əsbabi-tərəb məclisara ta ola bir dəm,
Tarü neyü bərbət çalınıb, dəf urula həm,
Sərməst ola zahid, ləbi-meydən ola xürrəm,
Saqi oluban, mey verəsən sən mənə hər dəm,
Ağuşuma mən onda çəkərdim səni çün can.

Buyi-səri-zülfün yetirib bad dəmağə,
Şövqi-güli-ruyin məni qalxızdı bu tağə,
Şeyda kimi səbbar olumu kimsə bu dağə?!
Bülbül kimi qonsam, gözəlim, şaxə, budağə,
Görüb deyələr: Aşiqi-güldür bu pərişan.

**Səh. 240**

## MİRZƏ YƏHYA BƏY QARABAĞİ *

**Sərkar Yəhya bəy Həsən bəy oğlu Hacıbəyzadə Məhərrəm bəy Məriz təxəllüsün nəvəsidir.**

**Qarabağ şairlərindəndir. 28 yaşlı xoşxasiyyət bir cavandır. Şeir də yazır. Təxəllüsü Şeydadır. Azərbaycanca və farsca hər cür şeiri, o cümlədən 19 qəzəli, elmin və biliyin faydası haqqında 6 milli şeiri vardır. Və öz əliylə yazdığı milli müxəmməsini böyük təzkirəyə daxil etmişəm. Və bir neçə şeiri ixtisarla bu təzkirəyə yazdım.**

### ŞEYDANIN
### AZƏRBAYCANCA QƏZƏLİ

Ürəkdə inqilabi-çərxdən ahü fəğanım var,
Necə ahü fəğan etmim ki, min dərdi-nihanım var?

Sızıldar ney kimi könlüm nəfəs çəkdikdə hər saət,
Mənimlə baqidir bu nalə ta cismimdə canım var.

Səba, yarın səri-zülfün dağıtma bu səyaq ilə,
Mənim də cə'di-geysu içrə axır aşıyanım var.

Fəraqi-yarda hər gecə-gündüz, bəlkə hər saət,
Qəmü ənduhi-hicr ilə dü çeşmi-xunfəşanım var.

Mənə göstərmə sərvi-paybəst, ey bağban, şərm et,
Mənim gülzari-dəhr içrə belə sərvi-rəvanım var.

Səri-zülfündə könlüm atəşin rüxsar dövründə,
Tutub məskən Səməndərvəş od üzrə, gör, məkanım var.

Məni mən' eyləyir Şeyda, əcəb ol yar eşqindən,
Belə sanmış əlimdə ixtiyar ilə inanım var.

---

* Göründüyü kimi, Nəvvab təzkirənin avtoqraf nüsxəsinə Şeydanın ancaq bir müxəmməsini daxil etmişdir. Onun aşağıdakı qəzəlləri təzkirənin çap nüsxəsində olduğu halda, avtoqraf nüsxəsində yoxdur. Odur ki, onları da buraya əlavə etməyi lazım bildik. Nəvvabın yuxarıda Yəhya bəy Şeyda haqqındakı qeydindən, xüsusən Nəcəfqulu bəy Şeyda müxəmməsini avtoqraf təzkirəyə yazması qeydi bizə onu deməyə əsas verir ki, adları ayrı olsa da, Yəhya bəylə Nəcəfqulu bəy Şeyda eyni şəxsdir.

## YENƏ ŞEYDANIN QƏZƏLİ

Sənəma, yarə de qəlbim sənə mən yar olalı,
Paybəndəm səri-zülfündə giriftar olalı.

Sübhədək nara yanar cismi-zəifim gecələr,
Xabgahım məni-biçarə üçün nar olalı.

Munisim möhnətü qəmdir, işim əfqanü nəva,
Çəkərəm bu sitəmi aşiqi-əfkar olalı.

İstərəm vəslə yetəm, bəxti-siyahım qoymaz,
Netmişəm bəxtimə bu dəhrdə mən var olalı ?!

Bu qədr qarə günə tab eləmək müşküldür,
Tapmadım bir əsəri-zu' günüm tar olalı.

Dərdimi ərz elədim cümlə təbibə, dedilər,
Bir gözəl eşqidi bu aləmə izhar olalı.

Canımı bir kələf etdi, mələka, şux rüxün,
Yusifi-Misr kimi rövnəqi-bazar olalı.

Misli-Məcnun düşüb çöllərə divanəsifət,
Sənə Şeyda, gözəlim, aşiqi-didar olalı.

## ŞEYDANIN FARSCA QƏZƏLİ

Ömrümün gülü soldu, iki yüz min əfsus,
O şux gülzardan xəbər gəlmədi, əfsus.

Qəddi kölgəsində qəddim qalxmadı,
Gözümdən çay təki yaş axdı, əfsus.

Məgər Yusifim qəm quyusuna düşdü, ya Rəbb?!
Gözümə ağ gəldi gözləməkdən, əfsus.

Ayrılıq oxun sinəmdə etmişdim pünhan,
Eşqin dağı etdi aşkar, əfsus.

Qoymuşam başıma məcnunluq tacın,
Hamı məni daş-qalaq edir, əfsus.

Sənin ürəkaçan şeirinə müştəri oldu Şeyda,
Etibar büsbütün əldən getdi, əfsus.

**Vər. 492a**

## KƏRBƏLAYİ ƏLƏKBƏR SAFİ

**Kərbəlayi Ələkbər Məşədi Məhəmməd Hüseyn Qarabağinin oğludur və təxəllüsü Safidir. Mərhum Şəhidin qardaşı oğludur. Mömin bir kişidir, sənətkar əhlindən hesab olunur. Yaşı əlliyə yaxın olar. Bədəncə zəifdir. Bəzən şeir də deyir. Aşağıdakı şeirlər onundur, öz dəsti-xətti ilə yazıb. Rəbiül-əvvəl ayı, 1309-cu ildə (oktyabr, 1891).**

## SAFİ QARABAĞİNİN KƏLAMINDAN

Gətir təqrirə, ey dil, şükri-həqqi, heyyi-yektani,
Edən mövcud bir "kün" əmri ilən pəstü balani.

Xudayi-laşərikü ləmyəzəl ol qadiri-sane',
Nümayan cümlə əşyadan olur ayati-rəhmani.

Vücudi-xaliqi-mə'budi hər dəm göstərir əşya,
Bəsarətlən baxan kəs neylər, aya, qeyr bürhani ?

Məhəmməddir həbibi, külli-məxluqə odur sərvər,
Xuda şə' nində nazil eyləyib Yasinü Tahani.

Gedib meracə peyğəmbər, keçib cümlə fələklərdən,
Müzəyyən eylədi nə'leyni ilən ərşi-ə'lani.

Sədayi əvni-minni guşinə yetdikcə ol sərvər,
Məqami-qürbə yetdi teyy edib qövseyni-övnani.

Necə şərh eyləyim, bilməm mən, aya, vəsfi-mövlani,
Əliyyi-aliyi-ə'la, vəliyyi-əmri-sübhani?!

Necə bu əqli-naqis seyr qılsın övci-mədhində,
Tutarmı bir səbuyə doldusan gər bəhri-ümmani?!

Kamalü mərifət heç kəsdə yoxdur şə'ni mövlavə,
Bu sözdə cəm edib xətmi-rəsəl əlavü ədnani.

Tanır xaliq səni, həm mən, səninlə mən də Allahi,
Məni Allah ilən, həm sən tanırsan həqqi-ürfani.

Kərəm qıl, tut əlimdən bir zaman, ya şahi-dəryadil,
Xilas et vərteyi-qəmdən kənara mən pərişani.

Vəsiyyi-Mustafa bifəslsən sən saqiyi-kövsər,
Qüdumi-pakın “əs-Səlmanu minna” etdi Səlmani.*

Vücudi-ətharin gər olmasaydı küllü nas içrə,
Rəsuli-həzrəti-həq heç kəsə verməzdi Zəhrani.

Sənin hübbündə gər olsaydı yekbədən cin ilə insan,
Xudayi-ləmyəzəl xəlq eyləməzdi narü neyrani.

Sənin ismi-şərifin nəqşi-xatəm oldu, ya mövla,
Odur bais ki, dutdu aləmi hökmi Süleymani.

Sənin nuri-mühübbündən təcəlla yetdi Musayə,
Yıxıldı, qəşş edib, rövşən gözündə turi-Sinani.

Sənin iyminlə məxluqat olur mərzuq, edir sabit
Vücudun nöqteyi-pərgar tək bu günün imkani.

Kəlamüllahi-natiq həm şəhi-təxti-sülunidir,
Odur kəşf eyləyən Qur’andaki əsrari-pünhani.

Lisanüllahü eynüllah, cənəbüllahdür həqqa,
Onun şə' nində şamil innəmadır, nəssi-Qur’ani.

Vücudi baisi-icadi-aləmdir bu mövlanın.
Odur qismət edən məhşər günü firdovsü neyrani.

Sənə ixlası kamil olmasa dünyada hər şəxsin,
Qədəm  qoymaz behiştə, seyr qılmaz baği-rizvani.

Sənə, övladına hər kimsə qail olmasa, şəksiz,
Yanar düzəxdə İslam olsa ismi, olmaz imani.

Sənin tiği-şərərbarın salar od canına yeksər.
Edər fani, təmamən göndərir neyranə ə’dani.

Vuranda mərhəbə çün Zülfüqar ol fatehi-Xeybər,
Yetişdi Cəbrailə ol zamanda hökmi-Rəbbani.

Sərafil ilə Mikali götür təcil ilə yetcək,
Olar dutsun qolun, sən şəhpərini eylə fərşani.

---

* Hədisdir: “Səlman bizdəndir”.

Keçər yerdən, ölər hər gavmahi zərbi-tiğindən,
Vura bu şəst ilə gər Zülfüqar ol şiri-yəzdani.

Məgər şiri-xuda hardaydı, aya, bilmirəm, yaran,
O gün kim, Kərbəladə mövc edirdi zülm tufani.

Yenə, ey şiə, düşdü yadıma ol növcəvan Əkbər,
Düşəndə çün atından səslədi şahi-şəhidani.

Sədayi- “ya əba ədrəkni” yetdi quşinə ol dəm,
Minib çün zülcinahə axtarırdı səhni-meydani.

Yetişdi qətlgahə bir zaman ol şahi-ləbtəşnə,
Nə gördü, qan içində Yusifin ol piri-Kən’ani.

Düşüb biixtiyar atdan yerə ba dideyi-giryan,
Basıb ağuşuna can tək qədi-ol sərvi-rənani.

Dedi: “Səndən sora gəlsin, oğul, lə’nət bu dünyayə,
Baban qurban sənə, sənsiz baban neylər bu dünyani!”

Götürdü başını, qoydu dizinə, tökdü göz yaşın,
Silib qanın o dəm Əkbər, açıb ol çeşmi-şəhlani.

Dedi Əkbər: “Sənə var bir sözüm, ey şahi-biyavər,
Gedəndə xeyməgahə sən çağır biçarə Leylani!

Oğulsuzdur anam, çün deyil bəm ali-tahadən,
Baba, sən əmmamə tapşırgilən ol didəgiryani”.

Bu söz çox ağladıb yalqız Hüseyni, şiələr yox, yox,
O məzlumun sözü afaqə saldı nari-süzani.

Yetiş, ya Mürtəza, fəryadına ol hövli-məhşərdə,
Qəmu hüzzar ilən sən Safının kim, çoxdu üsyani.

* * *

Ta əzəl mehri-rüxün bəs ki, dili-zarə düşüb,
Sirri-pünhaniyi-eşqim əcəb izharə düşüb.

Dami-zülfünlə könül mürğünü seyd etmək üçün,
Daneyi-xali-siyahın güli-ruxsarə düşüb.

Dəmbədəm qarət edib sehr ilə can almaq üçün,
Qəmzə ol çeşmi-siyəhməsti-xətakarə düşüb.

Güli-həmra dögü gülşəndəki xəndan güllər,
Əksi-ruvindi kim, ayineyi-gülzarə düşüb.

Gün deyil rövşən edən şəhrləri, bəlkə sənin,
Pərtövi-nuri-camalın dərü divarə düşüb.

Bu nə insaf ilə qismətdi ki, sən eyləmisən,
Vəslin əğyar ilə, hicrin məni-xunbarə düşüb?

Şəkkəri-lə’li-ləbin vəsfini zikr etmək üçün,
Safinin sözlərinin şöhrəti bazarə düşüb.

* * *

Qədin sərvi-sənubərdir və ya xüld içrə tubadır?
Yüzün xürşidi-rəxşan tək müniri-aləmaradır.

Ləbin lə’li-Bədəxşandır və ya çün qönçeyi-xəndan?
Zənəxdan cahi-zəmzəm, dişlərin çün dürri-yektadır.

Gözün səyyad tək qoymuş kamana tiri-müjganın,
Könül seydinə çıxmış, şəhr içində gör nə qovğadır!

Təalillah, zehi dil bəndi-surətdir cahan içrə,
Təmamən xəlqi-aləm valehü şövqi-tamaşadır.

Səni bu hüsnlə gər görsə Yusif, məhv olur şəksiz,
Ki, gün çıxcaq kəvakib məhvi-nuri-aləmaradır.

Təkəllüm qıl, səni tarı, məni sən salma gözdən kim,
Ləbin bu qalibi-biruhimə misli-Məsihadır.

Tərəhhüm qıl, mənə bir busə lütf et lə’li-nabindən,
Mərizi-eşq üçün innabi-ləb eyni-müdəvadır.

Məzəmmət eyləmə, naseh, məni çün ixtiyarım yox,
Könül mürği uçub, pabəsteyi-zülfi-çəlipadır.

Saqın, ey məhliqa, sən Safinin ol ahü zarindən,
Gecə ta sübh oluncan sinəsindən şölə peydadır.

* * *

Könül, yarə eylə ərzi-halını izhar,
Ki, dərdi-eşqinə şayəd əlac edə dildar.

Tut əldə damənini, öp ayağını hərdəm,
O xakipayını qıl kühli-dideyi-xunbar.

Fəğan ilən sözünü söylə ol sitəmkarə,
Sirişki gözdən elə cari misli-əbri-bahar.

Düşübdü başıma sevdayi-zülfı-mişkinin,
Edibdi məskənimi kuhü dəşt Məcnunvar.

Həvayi-zülfü rüxünlə olub günüm qarə,
Nedim, olub mənə yeksan həmişə leylü nəhar.

Bu qədr etmə cəfa, salma aşiqi gözdən,
Məgər olur elə – mə’şuq həmdəmi-əğyar?

Bu rəngi-zərdimə bax, bir zaman soruş halım,
Çıxar səmayə könüldən şərari-atəşbar.

Vüsalın olmadı qismət mənə çü, ey dilbər,
Fəraq oduna yanar daim in dili-əfkar.

O gül camalına həsrət qalıb, edər nalə,
Həmişə Safıyi-dilxəstə həmçü bülbüli-zar.

* * *

Eşqin edib əcəb məni divanə, ey sənəm,
Məcnun kimi salıbdı biyabanə, ey sənəm.

Qəddin kimi çəməndə hanı sərvi-dilrüba?
Tə' nə edər üzün güli-xəndanə, ey sənəm.

Yusif sənə müqabil olub, etsə bəhsi-hüsn,
Sal sən onu o cahi-zənəxdanə, ey sənəm.

Xəlqi tamam valeh edər sərv qamətin,
Hər dəm edəndə cilveyi-məstanə, ey sənəm.

Hər kəs baxıb camalına təhsin qılmasa,
Baxmaz məgər ol ayəti-sübhanə, ey sənəm?

Olsan əgər müsahibi bu qəmli könlümün,
Meyl eyləməz nə hurivü qilmanə, ey sənəm.

Vəslin əgər müyəssər ola xəstə canıma,
Yox ehtiyacı rövzeyi-rizvanə, ey sənəm.

Zülf içrə könlümün quşu bəs ki, aşiyan tutub,
Mə'nus olubdu gör necə sö'banə, ey sənəm.

Qoyma yana fəraq oduna, yoxdu taqəti,
Gəl, rəhm qıl bu Safiyi-nalanə, ey sənəm.

* * *

Zülfün telidi boynuma zəncir, dilbərim,
Qaşın çəkibdi qətlimə şəmşir, dilbərim.

Lə'li-ləbin havası ilə qan olub könül,
Daim edər o naleyi-şəbgir, dilbərim.

Hərdəm üzünə gün düşübən kəsbi-nur edər,
Bağ içrə misli-adəmi-gülgir, dilbərim.

Səyyadi-eşq gər gəzə dünyanı sərbəsər,
Düşməz əlinə sən kimi nəxcir, dilbərim.

Bir ləhzə iltifata gəlib halımı soruş,
Könlüm evini gəl elə təmir, dilbərim.

Safi sənin camalına müştaq(dır), ona,
Bir busə ver, gəl eyləmə dilgir, dilbərim.

* * *

Dil tutdu vətən zülfi-şikən pürşikən içrə,
Müjgan oxilə urma onu sən vətən içrə.

Yox lə'l ləbin kimi, əzizim, Yəmən içrə,
Sən şivədə ahu ola bilməz Xütən içrə.

Ol daneyi-xali-siyəhin dövri-rüxündə,
Çün daği-şəqayiq ki, düşübdür çəmən içrə.

Aldım ləbini ağzıma, gördüm məni-nalan,
Məmzuc olunub şəhddi guya ləbən içrə.

Cəllad gözün tökdü mənim qanımı nahəq,
Bari öz əlinlə məni qoy sən kəfən içrə.

Gördüm qədi-sərvi, nə əcəb barvər olmuş,
Püstanını yarın, könül, ol pirəhən içrə.

Mən Safıyi-divaneyi-məcnuni-zamanam,
Söyləllə mənim adımı hər əncümən içrə.

## MÜSTƏZAD

Sənsiz gecələr ərşə çıxar ahü fəğanım,
ey ruhi-rəvanım.
Hicranına yox munca dəxi tabü təvanım,
ey afəti-canım.
Qıldı məni divanə sənin hüsni-camalın,
həm şövqi-vüsalın.
Fəryadıma yet, var sənə aləmdə gümanım,
ey Yusifi-sanım.
Ol daneyi-xalın həvəsiylə dili-nalan,
gün mürği-xoşəlhan.
İstər ki, bu dəm tən qəfəsindən çıxa canım,
ey püstədəhanım.
Zülf içrə düşüb dama, olub hali-pərişan,
daim edər əfğan.
Kaş ola fəda sən kimi canana bu canım,
ey sərvi-rəvanım.
Güftarə gəlib eylə təni-Safini əhya,
sən misli-Məsiha.
Ahuyi-Xütən, simbədən, qönçə dəhanım,
ey tutizəbanım.

## QƏZƏL

Ey camalı günəş kimi nur verən,
Və üzünün gözəlliyi “şəms vəzzüha”ayəsi kimi əyan olan.

Ey qönçə ağızlı sərvinaz, ay üzlü şux,
Bütün xalqın canı sənin qəddinə fəda olsun.

Sənin belə cilvələnməyin,
Bu dünyaya qiyamət gününün şurunu qaldırır.

Ey səba, bir dəm güzar edib canana xəbər ver,
Könlümün bu ağlar halından.

Ey gözəllik tacdarı, nə olar, bir dəfə,
Lütf ilə mən gədaya nəzər sal!

Mənim yaralı sinəm üçün təbib,
Sənin şirin ləbindən başqa bir dərman demədi.

Əlim bir gecə ətəyinə çatsaydı,
Mən daha qiyamətə kimi cəfadan nalə etməzdim.

Heç vaxt düşmən qorxusuna görə ayaq çəkmərəm,
Yarın küçəsindən, ayırsalar da başımı bədənimdən.

Safi səbri əldən verdi, nə etmək olar?
Bir də o bivəfadan vəfa istəmə.

* * *

Onun qara saçlarını, ey daraq, belə kobud getmə,
Onun bir ənbər tükü qırılsa, aləm xarab olar.

Ey könül, onun xalından belə qafil olma,
Onun rüxsarının dövrəsindəki zülfün toruna bax.

Ürəkləri oğurlayıb, zülfünün qıvrımlarında sakin edər,
Əgər o ay üzlü qaniçən gözləriylə baxsa.

Onun ayrılığından canım boğazıma gəlib, mənə
bir rəhm elə,
Ey səba, canana onun ağlar aşiqindən bir xəbər çatdır.

Əgər o daş ürəkli yar mənə acı cavab desə,
Bəli, mənim yanımda onun sözü baldan da şirin olur.

Şükrlə canımı onun ayağı altında qurban edərəm,
Onun üzündəki şamın parıltısından gözlərim işıqlansa.

Onun zülfünə heç bir vaxt toz qonmamalıdır,
O sənəmin yoluna hər ləhzə Safi öz qan ağlayan
gözlərindən su səpir.

**Vər. 498b**

## XOSROV BƏY POLADOV

**(Cəmadiəs-sani, 1310-cu il – dekabr, 1892)**

**Xosrov bəy mərhum İbrahim bəyin oğlu və Əli bəyin nəvəsidir. Qarabağın Şuşa əhalisindəndir. Şuşada anadan olub. Abdulla bəy Asinin qardaşı oğludur. Qasım bəy Zakirin nəticələrindəndir. Xoşsifət bir cavandır. Qırx beş yaşı var. Farsca və rusca savadı var. Hərdən şeir də deyir. Şeirdə təzədir. Xosrov adıyla deyir. Aşağıdakı şeirlər onundur.**

Urma, məşşatə, əlin zülfə, pərişan olsun,
Neçə min qümşüdə dil onda nümayan olsun.

Getdi dilbər, nə durubsuz dəxi, ey didələrim,
Görüm, Allah, bu sınıq könlümü viran olsun.

Könül iblissifət zülfünara gizlənmiş,
Bəlkə ta məskən ona rövzeyi-rizvan olsun.

Meyi əğyar ilə gülşəndə içib, görmə rəva,
Qönçəvəş hicri-ləbində ciyərim qan olsun.

Rəhm qıl, Xosrovunu hicr oduna yandırma,
Vəslini eylə səbəb nari-gülüstan olsun.

* * *

Xurşidə səcdə eyləmək, ey dil, səvabdır,
Torpağa düş ki, ismi-nigar Aftabdır.

Təsxir edibdi beyti-xudanı məgər nigar,
Kim, ruyi Kə’bə, zülfi-siyahı hicabdır?

Şəbnəm deyil gül üzrə düşən, bülbüli-həzin,
Sübhün dəmində tökdüyü əşk gülabdır.

Güli-ruyi-yarda yazılıb xəttü xal ilə,
Bir busə ləbdən ummağa yüz qan cavabdır.

Ya şanə zülfü, ya ki, səba dərhəm eyləyib?
Vəchi budur, könül, belə pürpiçü tabdır.

Xosrov, oyan, deyirlər ki, şəkkərləbin gedir,
Qafil, nə yatmısan, bu nə şirin xabdır?!

**Vər. 500a**

## MƏŞƏDİ MÜRTƏZA

**Məşədi Mürtəza Qarabaği Kərbəlayi Əsgərin oğlu və İbrahim Xəlilin nəvəsidir. Onların əsli Qazyan kəndindəndir. Ancaq Qalada yaşayırlar. Mürtəza Şuşa qalasında doğulub,[*] 35 yaşı var. Qarasifət, kosa, arıq bir şəxsdir. Ona görə də təxəllüsünü Rusiyah (qarasifət) götürüb. Təzə yazmağa başlayır. Bir elə savadı yoxdur. Məşğuliyyəti tacirlikdir. Şeirləri də aşağıdakılardan ibarətdir, öz imla və inşası ilə yazılıb.**

**Cəmadiəl-əvvəl, 1309 – dekabr, 1891.**

**1310-cu ilin zil-hiccə ayında (iyun, 1893) vəfat etdi.[**]**

Xoş ol zaman ki, səninlə nə söhbətim var idi,
Hərimi-qürbi-vüsal içrə işrətim var idi.

Hanı o günlərimiz qol-boyun sabaha kimi,
Misali-şaxeyi-gül xeyli ləzzətim var idi.

Nə meyli-huri edərdim, nə abi-kövsərdən,
Neçün ki, şəhdi-ləbin kimi şərbətim var idi.

Sücudi-razü niyazım qüdumi-pakın idi,
O xaki-məqdəmdən çünki türbətim var idi.

Yetişsə bir də əlim daməni-şəfaətinə,
Nisari-can edərəm, çünki həsrətim var idi.

Yazıb qəza rəqəmi ayrılıq aralığıma,
Ziyarət etməyə pabus minnətim var idi.

Məni bu laləruxün eşqi dağdar eləyib,
Zebəs ki, arizi-gülnara ülfətim var idi.

Şərari-şö'leyi-ahım qurutmuş afaqı,
Səbəb ki, naleyi-Məcnuna nisbətim var idi.

Nə cürm sadir olub Rusiyahi-qəmkeşdən,
Məni bağışlagilən, çünki tövbətim var idi.

---

[*] Nəvvab təzkirənin çap nüsxəsində onun Qazyanda anadan olduğunu yazır.
[**] Bu cümlə Nəvvab tərəfindən sonradan əlavə olunub.

Fəraqi-pərtövi-hüsnün gətirmiş aşiqi canə,
Edib dil kişvərin qarət, qılıb məmuri viranə.

O geysuyi-müənbər tirəvü tar eyləmiş könlüm,
Ze cə’di-türreyi-mişkinədir eşq əhli divanə.

Alıbdır qövsdən tərhi kamanəbruyi-aşiqküş,
Xəyali çünki qan tökməkdi, vermiş izn müjganə.

Alıb tiri-şəhabindən həmin müjganlar məşqin,
Düzülmüş çöhreyi-çeşmə, dönüb hər biri peykanə.

Məni mən’ eyləmə, zahid, rəhi-eşq içrə mə’zurəm.
Əsiri-çeşmi-şəhlayəm, dürüstü mərdü mərdanə.

Qılıb xali-siyəh mənzil ruxi-gülzari-həmradə,
Açıb tər qönçəsin ləblər, dönüb həm baği-rizvanə.

Zəbani-şəkkərəfşanın olub çün püsteyi-xəndan,
Düzübsən həm nizam ilə cəvahir cayi-dəndanə.

Alıb qəndi-mükərrərdən məmən tə’limi-Şirini,
Həvasilə xiridaram mətai-nari-püstanə.

Məni gözdən salıb, ey büt, rəqibə mehriban olma,
Sənin eşqində heyranəm, yəqin bil, türkü türkanə.

Mənim tək Rusiyəhdən kəsmə lütfün, ey şəhi-xuban,
Mənə bir busə lütf eylə, bemərgəm, rindü rindanə.

* * *

Könül, vəsl ilə hicran olmasaydı,
Fəraqi-gül’üzaran olmasaydı,

Nə Məcnun Qeys ikən Məcnun olurdu,
O Leyli xanəviran olmasaydı.

Nə bülbül növhəvü əfgan edərdi,
Əgər səhni-gülüstan olmasaydı.

Açılıb qönçələr solmazdı, hərgiz,
Fəğani-əndəliban olmasaydı.

Nə Yəqub eyləməzdi çeşmin i’ma,
Əgər çah ilə zindan olmasaydı.

Edərdi Rusiyəh gövhərfəşanlıq,
Əgər min dərdi-pünhan olmasaydı.

* * *

Məni-həzini, ey Xuda, etmə cüda cananıma,
Qılma naməhrəm məni bu dilgüşa sultanıma.

Sən məni məhrum qılma kuyi-canandan, xuda,
Eşqini əfzun elə, məmlöv qıl bu canıma.

Aşiqi uşşaqdən qılmaq cüda düşvardır,
Təndə yoxdur tab qılsın zilləti-hicranıma.

Rəhmdən dur olma ancaq, qönçəvəş dərdimə yet,
Bais olma, səngdil, bu naləvü əfğanıma.

Məh camalından kənarə at niqab, etmə hicab,
Kim, bulut lazım deyil bu mahi-növtabanıma.

Qeyri-səndən kimsə yox nami-pəri cim, hey, əlif,
Nuni-sakitin salıb qövqa təni-üryanıma. (Cəhan).

Mim, rey, tey, zat, əlif eşqində sərgərdandır,
Qıl tərəhhüm, lütf elə bu dideyi-giryanıma. (Mürtəza)

Bir gədadır, qönçələb, mail olub güftarına,
Döndərib ya nuş ver, qoy minnətin kim, canıma.

Eşqdən, billah, götürməz, əl ölüncə Rusiyah,
Gündə min dəfə batam şəmşir ilə gər qanıma.

* * *

Görəndə şuxi-rə’nanı düşər lərzə, bədən titrər,
Gedər əqli, qaçar səbri, zəbanü həm dəhən titrər.

Görə hər kim bu xünxarın məqali-şəhd güftarın,
Dəyəndə bir-birə ləblər misali-yasəmən titrər.

Şəbi-sərmadə xab içrə gəzəndə nari-püstanın,
Məmə əldə, bədən ürpər, dəyib ta pirəhən titrər.

Qoyub əl piçi-nafə bir yavaş növ ilə təprədsən,
Ze sər ta pa həmə ə’za, libasü həm bədən titrər.

Girib gülzarda vəqti-səhər mə’şuq ilə aşiq,
Edib bazi, tuta güşti nigar ilə, çəmən titrər.

Məzara yarsız getsəm, yəqinimdir, məzar içrə,
Dəruni-qəbrdə, billah, məzarım, həm kəfən titrər.

Xurü xanın kəsildi, Rusiyah, məhparə zövqündən,
Olub cismin müqəvva tək nə güftar, nə tən titrər.

* * *

Hicrin salıbdı dərdə məni, yoxdu çarəsi,
Əflakı yandırır şöleyi-ahım şərarəsi.

Müjgani-çeşmi-nərgisi-məstanın eyləyib,
Qılmış nişəst sinədə peykan yarəsi.

Küncü kənari-çeşm ilə imasi məhvəşin,
Almış qərarü səbri-dili kəc nəzarəsi.

Nəzrindi, bu ciyərlərimi itlərinə ver,
Təqsim qıl, hər itə bir öfgə parəsi.

Sən’ansifət salma məni küfrə, səngdil,
Düşvardır dinə yetişmək dübarəsi.

Mən aşiqəm o hüsnünə, şərh etməyim ziyad,
Mə’şuqə aşiqin bəs olur bir işarəsi.

Ey Rusiyah, bu naleyi-bicadan əl götür,
Xaki-qüdumi-yara döşənməkdi çarəsi.

* * *

Könül məmurəsin edib kəc ruzigar, artar,
Çəkib əl rövnəqi-bəxtim, qılıb məndən fərar, artar.

Düşübdür taleyi-fərrux yenə bu əncümi-nəhsə,
Qəmər daxil olub Əqrəb içində bərqərar, artar.

Çəkib hər bir tərəfdən üstümə ləşgəri-qəza fövcün,
Yığılmış xani-yəğma tək, dəmadəm hər nə var, artar.

Dilər dil qurtara qeydi-mərəzdən, müqtədi olmaz,
Könül istər rəha olsun, dəmadəm ahü zar artar.

Ki, məndən pişəki ixrac edib fərzəndi-dilbəndin,
Ona əfsus qılma, çünki hər il bir məzar artar.

Əgər sənduqi-ənduhə qoyam mən büqçeyi-könlüm,
Gərək karım fəğan olsun, gözümdən əşkbar artar.

Mənə xoşdur keçənlər, qurtaraq rəncur qeydindən,
Bu ünvan ilə ənduhum həzar olsa, həzar artar.

Təbibin dəsti-çəngindən qutarmaq çox olub düşvar,
Buyur hərfi-günagun ki, hər gün bişümar artar.

Nə qədri nüsxəbənd olsa, birinin yoxdu imanı,
Deyir daruyə bir qiymət, ən axir bir dinar artar.

Keçə hər kim yaxası nüsxəbəndin dəst-çənginə,
Qutarsa, əldə nəleyni şitab eylər, fərar artar.

Bu yanda naleyi-vay-vay, o yanda xövfi-əttaran,
Ki, mə’kuli meyl etsəm ki, guya zəhrimar artar.

Qaralıq meyl edib bəxtim neçün ki, Rusiyahəm mən,
Keçib həddi-qaralıqdan , tutub bir özgə bar artar.

* * *

Nigarım, qaməti-rəna, əcəb naz ilə bəslənmiş,
Ki,ləblər qönçə tək şəbnəm düşüb, guya ki, tərlənmiş.

Məgər baği-cinanda olmuşuz sirab kövsərdən,
Alıb tə’lim huridən və ya qəsr içrə əylənmiş?

Çəkilmiş nəxli-tuba tək qədi şümşad dilcunun,
Təzərvi-baği-rizvan tək gülüm bəs nərdə dənlənmiş?

Düşə gər qəbrim üstə məqdəmin, mərqəd olur münşəq,
Olur təsvir bərpa dər qiyamət, mürdə səslənmiş.

Deyirlər xəlq: İsadır, tanır məhparəsin aşiq,
Sölər kim, bu nə İsadır, dəmi İsadən öyrənmiş.

Nə qədri əcz qıldım, dil, bu eşqin düşmə daminə,
Nə qədr pəndin etdim, bilmədin kim, narəva sölənmiş.

Dedim: Düşmə xəyalə, mahrudən xeyr bulmazsan,
Əcəb qövqalara düşdün ki, bəhri-qanə bülqənmiş.

Düşübsən türreyi-zəncirə, billah, çarə bulmazsan,
Sözümə şimdi baxmazdın, çəkil get, cani oxlənmiş.

Qalıbdır Rusiyəh bu vadiyi-qəmlərdə Məcnun tək,
Cünuni-paybənd olmuş, qəmu dillərdə söylənmiş.

* * *

Barilahə, bu siyəhzülfi-səmənasadı bu?
Ya ki, əf'idir bu tirə, ya şəbi-yeldadı bu?

Məxzəni-ahənrübadır, ya dəmi-bu əjdaha,
Bu kəşakeşdə yəqin ki, nərgisi-şəhladı bu.

Bu qəmərdir, rövşanə qılmış cahanı təl'əti,
Arizi-məhparəyi-şuxi-mələksimadı bu?

Bağı-rizvandır bu gülşən, türfə açmış qönçələr,
Ya ləbi-şəkkərfəşan, ya laleyi-həmradı bu?

Bu sədəfdir qönçələb, yainki mirvaridir?
Dişlərin dürri-Ədən, ya lölöi-laladı bu?!

Vəh, nə qamət, bu nə gərdən, sa'ədi-simindir,
Ya ki, Musada görünmüş bir yədi-bevzadı bu?!

Rusiyahə qıl inayətlər, soruş əhvalını,
Xaki-kuyində sənin bir aşiqi-şeydadı bu.

**Səh. 232**

## MOLLA İBRAHİM

## (1309-cu il – 1891-92)*

**Molla İbrahim bin Məşədi Allahverdinin 80 yaşı vardır. Şuşa şəhərindəndir. Peşəsi ölü yumaq, şəbih çıxartmaq, şeir yazmaqdır. Divanı yoxdur. Şeirlərindən bu bir neçə sətir əldə edilib.**

**...Barat bayramında Gövhər ağanın (Allah onun günahlarını bağışlasın) vəqfnaməsinə uyğun olaraq İki məscid həyətində cənab Nəvvab Mir Möhsün Ağanın vəkaləti ilə hörmətli şəxslərə ehsan verilən vaxt Molla İbrahim Nəvvaba yazıb:**

Könül istər əlim yetməz, nedim, bir şiş kəbab olsun,
Bu şərt ilə yanında ol kəbabın narşərab olsun.

Gəlüb hücrə qabağından keçəndə ol ətə baxdım,
Rəvadır ətdən ötrü qan udum, didəm pür ab olsun?

Qocalıq haləti, billah, məni salmış əcəb dərdə,
Rəvadırmı, ağa, qəlbim mənim beylə xərab olsun?

Bu ehsanı görəndə kimdü səbr etsün bu dünyada,
Ola Rüstəm və ya Bərzu və ya Əfrasiyab olsun?

Nə zər, nə zuri-bazum var, keçib həştadidən sinnim,
Ola hər kimdə bu möhnət, gərək yırtıqcorab olsun.

Keçər rahi-xudada sahibi-nemət təamından,
Fəqirə rəhm edən, ya Rəb, cahanda kamiyab olsun.

Tərəhhüm vəqtidir, ağa, tərəhhüm eyliyən azdır,
Gərək rəhm eyliyən Nəvvab tək nayibməab olsun.

Odur ağa, odur mövla, odur rəhmü kərəm kanı,
Kərəm əhli onun kimi gərək valacənab olsun.

---

* Burdan başlayaraq ikinci fəslin sonuna qədər olan materiallar təzkirənin əlyazma nüsxəsində yoxdur. Çap nüsxəsindən əlavə olunmuşdur.

**Səh. 233**

## HƏSƏN LƏLƏ

**(1309-cu il – 1891-92)**

**Həsən Lələ bin Hüseynqulu Şuşadandır. Yetmiş yaşı var. Peşəsi yeyib-içmək və şadlıq məclislərində bədahətən şeirlər demək və oyunla məşğul olmaq (dəf çalmaq) idi. Heç bir savadı olmamasına baxmayaraq, qafiyəni bilir və şeir deyirdi. Aşağıdakı şeirlər onun dediklərindəndir:**

### HƏSƏN LƏLƏNİN ŞEİRİ

Gözüm genə bir gözləri məstanə düşübdür,
Məst olmağının şöhrəti dəstanə düşübdür.
Zahidlərə bax, məscidü mehrabə üz vurmuş.
Mən rindi-xərabəm, mənə meyxanə düşübdür.

Mən aşiq idim, şövqü onun var idi məndə,
Öz aşiqinin gərdənini saldı kəməndə,
Ağ üzdə qara haşimi xalları görəndə,
Sərraf gözüm ləli-Bədəxşanə düşübdür.

Qurbanın olum, saqi, məni salma nəzərdən,
Müşkildi doyam sən kimi rənayi-gözəldən,
Pərvanə oda yanmağı adətdi əzəldən,
Pərvanə canım atəşi-hicranə düşübdür.

Vəh-vəh, nə əcəb zib veribdir bədəninə,
Əsla belə şux gəlməyibdir ruyi-zəminə,
Olmaz belə qamət, belə gərdən, belə sinə,
Guya ki, mələk rövzeyi-rizvanə düşübdür.

**Novruz bayramında təbrik etmək üçün Həsən Lələ Nəvvabın evinə gəlir, qapıdan girən kimi salamdan sonra Nəvvaba xitabən bədahətən bu şeiri deyir:**

### HƏSƏN LƏLƏNİN ŞEİRİ

Könül bu Şişə şəhrində,
Belə müəzzəm ağa sevmiş,
Bu dərdli sinəyə, billah,
Dəva sevmiş, şəfa sevmiş.

Dutubdur aləmi sadən,*
Məni məst eyləyib badən,
Nə hasil beylə sevdadən?
Şəhənşahi gəda sevmiş.

Səlam olsun cəmalinə,
Cəmali-bakəmalinə,
Xoşa ol kimsə halinə
Əliyyəl-Mürtəza sevmiş.

Gətir biqəş olan badə,
Dutum qüvvət mən üftadə,
Nə dərdi var bu dünyadə,
Məhəmməd Mustafa sevmiş.

Mənim zənnimdən ə'lasən,
Əcəb-Nəvvabi-valasən.
Qamu əşxasə övlasən,
Həsən miri-hüda sevmiş.

* Sədan

**Səh. 235**

## ASƏF LƏNBƏRANİ

**Bu şəxs Lənbəran kəndində anadan olmuşdur. Təxəllüsü Asəfdir. Lənbəran Qarabağ Şuşasının tabeliyində olan kənddir. Müxtəlif (pərakəndə) şeirləri vardır. Divanı yoxdur. Şeirlərindən bəzisini nəzərdən keçirdik. Onlardan bir qəzəli aşağıda göstəririk:**

Neçə illərdi könül bu xaki-dərdə can üzər,
Bir üzülməz riştəni gör kim necə asan üzər.

Dərki-tədbir ilə peyvənd eyləmək mumkün degil,
Bir əməl sərriştəsin kim çərxi-sərgərdan üzər.

Çak-çak olmaq gərək xari-nədamətdən müdam,
Kim ki, bu gülzardən bir qaç güli-xəndan üzər.

Tiri-barani-qəm oldum eşq qövqasında çox,
Ox dəgər, ox sındırar, peykan dəgər, peykan üzər.

Atəşi-möhnət bizi gündən-günə mum etməsə,
Müştimiz kuh endirər, əngüştimiz sindan üzər.

Gövhəri-tale ki, əldən düşdi anı bulmağa,
Mərdümi-çeşmim iki qəvvasdır kim,qan üzər.

Asəfi-pakizəəlhanın nisari-şeirinə,
Rişteyi-nəzmi-Sürəyyanı fələk yeksan üzər.

## YENƏ DƏ ASƏF

Çox səadətdi yetə yar əli dildar əlinə,
Ya ki, dildarın əli yetmiyə əğyar əlinə.

Əl uzatdım ki, edəm şanə o zülfi-siyəhı,
Bilmədim, verdim əlimi genə şəhmar əlinə.

Ox ki, qurtardı kəmandan, gedəcək, çarəsi yox,
Dəxi gəlməz o gedən tir kəmandar əlinə.

**Səh. 236**

## BAĞADİ SAKİNİ CƏNAB ƏBDÜLMƏCİD ƏFƏNDİNİN DUA VƏ MİNACATI

Bir əbdi-siyəhruyü günəhkarü xəciləm,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla.
Aludeyi-üsyani-əliləm və zəliləm,
Ya Rəb, məni sən Hevdəri-Kərrarə bağışla.

Ol vəqtidə kim, məhşəri-divan olacaqdı,
Başlarda beyin cuşə gəlüb, qan olacaqdı,
Qismət kimə cənnət, kimə neyran olacaqdı,
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla.

Bir müznibi-asi qulunam, çoxdu günahım.
Məhşərdə gəvahımdı mənim ruyi-siyahım,
Sənsən ki, mənim padşahım, püşt-pənahım,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla.
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Bir vəqt ki, mən olmuş idim tabe'i-şeytan,
Həm fisqi-fücur əhlivü həm sahibi-tüğyan,
İndi olubəm etdigim əf'alə peşiman,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla.
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Hərçənd bu əyyamdı əyyami-cəhalət,
Yox mən kimi bir kimsə ola əhli-zəlalət,
Məhşərdə məni eyləmə bədnam, xəcalət,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla.
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Hərçənd ki, bir müznibi-züllamü cəhuləm,
Yoxdur əməlim, layiqi-dərgahi-məluləm,
İxlaskeşi-ali-Əli, nəsli-rəsuləm,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla.
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

Sərgəştəvü heyranəmü avarə Məcidəm,
Həm müznibü həm mücrimü biçarə Məcidəm,
Üftadeyi-dərgah, yüzi qarə Məcidəm,
Ya Rəb, məni sən Əhmədi-Muxtarə bağışla.
Ya Rəb, məni sən Heydəri-Kərrarə bağışla.

**Səh. 238**

## MİRZƏ ƏLİ HACI ABBAS AGƏH OĞLU

## (1331–1912-13)

**Mirzə Əlinin təxəllüsü Mühərrirdir. Farsca və türkcə savadı vardır. Hər cür şeir yazır. Divanı yoxdur, yaxşı xətti var. Yaşı 45 olar. Aşağıdakı şeirlər onun xəyalının məhsuludur.**

### MİRZƏ ƏLİ MÜHƏRRİRİN FARSCA QƏZƏLİ

Vəfa yolunda can-başımdan keçdim, ey dost,
Gəl, gəl ki, nökərinəm sənin, gəl, ey dost.

Əgər haqsızcasına xəncərlə töksən qanımı,
Tök, ürəyimin qanı sənə qurban, ey dost.

Ehtiraslılar qəlbinin güzgüsünə sən nəzər salma,
Həqiqətən hamı əyri görünəndir, ey dost.

Hökmün nəyə olsa, əhdim ona olsun,
Bundan sonra sənə “lə"’ (yox) sözün deməərəm, ey dost.

Eşqinin şəhidi əlindən əgər zəhər içsə,
Sədaqətindən şəfa tapar, ey dost.

Mühərrir, cana, məhəbbət üzündən bax gəldi,
Cani-dildən sənin ayağına, ey dost.

**Nəvvab Seyid Möhsün ağa naxoş olan vaxtda Mirzə Əli Mühərrir bu əbyatı 1330 tarixində (1911-12) yazıb, cənabi-Nəvvaba göndərib, əhvalpürs olub.**

İste’dadlı ədib, bövük Nəvvab,
Əsil-nəsəbdə göylərdən də üstün.

Fəzilət və kəramət bağının meyvəsi sənsən,
Səxavət ağacının budağı sənsən.

Mələklər şahının oğlu sənsən,
Allah lütfünün dəryasının dürrü sənsən.

Eşitdim ki, o əziz vücudun,
Abü həvadan xəstəlik tapıb.

O qadir Allahdan istəyirəm ki,
Sənin canının əziyyətini mənim gözümə versin.

Sənin düşmənlərini zəlil etsin,
Onların hər iki gözünə bəla oxu batsın.

Sənin varlığın millətə lazımdır,
Lakin buna xeyir-dua da vacibdir.

Haqdan sənin görüşünü arzularam,
(Haqq) xeyirli gözlərinə işıq versin.

Mühərrir ürəkdən xeyrini istər,
Təkcə üzdə yox, həm də arxada.

**Səh. 242**

## MİRZƏ ƏHMƏD SABİR

**Mirzə Əhməd bin mərhum Kərbəlayi Abbas Qarabağın Şuşa şəhərindəndir. Zəif cüssəli xoşxasiyyət bir cavandır. Qırx yaşı var. Sənəti müəllimlikdir. Şeir də deyir. Təxəllüsü Sabirdir. Şeirləri, qəzəl və növhələri çoxdur. Aşağıdakı şeirlər onun xəyalatındandır.**

### SABİRİN QƏZƏLİ, 1331 (1912-13)

Qəmində çərxi-çarümdən keçən fəryadi-ahim var,
İnanmazsan əgər İsa kimi adil güvahim var.

Gedim mən hansı Kə'bə, Kə'beyi-kuyindən əfzəldir,
Dutum yüz hansı mehrabə, qaşın tək qibləgahim var.

Düşüb çahi-zənəxdaninə könlüm, ol şəhi-qafil,
Diməz qeydi-məzəllətdə bir əbdi-rusiyahim var.

Baxub əbruyi-canana qılarsan səcdə mehrabə,
Get, ey zahid, sənin ixlasına çox iştibahim var.

Əlimdə camü badə dutmuşam meyxanələr küncin,
Günəhdən zərrə bakim yox, ləbin tək üzrxahim var.

Gözüm yaşın töküb qan etmə bağrım, ey kəmanəbru,
Saqın tiri-fəğanımdan, onun tək dadxahim var.

Əyağın kəsməgə əğyari-bədkirdarın ol kuydən,
Səlamət daşlarından hər tərəf bin sidri-ahim var.

Başımda taci-möhnət padşahi-kişvəri-fəqrəm,
Qabağımda çəküb səf dərdü qəmlərdən sipahim var.

Bəlakeş Sabirəm, səbrim tükənmiş hicri-ruyində,
Gözüm yaşına rəhm et, dutalım kim, çox günahim var.

**Səh. 244**

## MİRZƏ XOSROV ŞAYİQ

**Rəhmətlik Mirzə Əli Aşiqin oğlu Mirzə Xosrov, Molla Zeynalabdin Sağərinin nəvəsidir. Təxəllüsü Şayiqdir. Peşəsi müəllimlikdir. Ara-sıra şeir də yazır. Aşağıda verilmiş milli şeirlər onun ilhamının nəticəsidir.**

Ey vətəndaşlar, gəlin elm əxz edib aqil olaq,
Qeyri millətlər kimi hər elmdə kamil olaq.

Elm xurşidə məsəldir, çün ziyabəxşi-cəhan,
Cəhli-zülmətdən çıxıb, elmə tərəf mayil olaq.

Elmə müştaq olmıyan insan degil, vallahi, bil,
Elm ilə lazımdı biz məqsədlərə nail olaq.

Elmdən qeyri bizə bir çarə yox, qardaşlarım,
Şövq ilə təhsili-elm eylüb hamu qabil olaq.

Talib ol elmə, kənar ol cahili-nadanidən,
Biz neçün təhsili-elmə bu qədr kahil olaq?

Hər zaman elmə bizi əmr eyləyib xətmi-rəsul,
Bizlərə lazım gəlür fərmaninə amil olaq.

Əcnəbilər elm ilə getdi qabağa, bir baxın,
Bəs məgər insafdır, biz bu qədər qafil olaq?

Bali-elm ilə uçur əflakə misli-şahbaz,
Nə rəva, biz nuri-elmə cəhl ilə hayil olaq?

Şayiqa, İslamda lazımdı olsun ittifaq,
Cəhl bəsdir ta bekey cəhlə uyub cahil olaq?

سمهر احوال مصنف قاصر میر محسن نوّاب آقا میرزادهٔ قراباغی

میر محسن نوّاب بن غفران پناه میر احمد بن میر فرزند بن میر فصیح بن میر صوبد

اعلی الله مقامهم است و میر فصیح مرحوم همان است که در جانب جنوبی شهر

شوشی مقبره دارد و زیارتگاه اهالی شهر مذکور است و نوّاب در تاریخ

۱۲۴۹ در شهر شوشی تولّد یافته و در هفت سالگی به تحصیل علوم مشغول

شده تا در علوم عربی و فارسی و ترکی مهارت رسانیده در سه زبان تصنیفات

وضع نموده نثراً و نظماً از جمله جفر جامع مرتضوی که بیست هشت اقلیم

و هر اقلیمش ۲۸ شهر و هر شهرش ۲۸ محلّه و هر محلّه اش ۲۸ خانه

و در هر خانه اش چهار حرف مفرده و خواص این کتاب بسیار است از جمله مثلاً

هرگاه شخصی سوزنی را از یک حرف از حروفات جفریّه فرو برد از صفحهٔ اوّل

یا دوّم یا سیّم هر کدامی از صفحات که بوده باشد در آخر صفحهٔ کتاب از همان

حرف سوزن بیرون خواهد آمد مثلاً در صفحه اوّل از خانهٔ اوّل شخصی

M.M.Nəvvabın öz xətti ilə yazılmış bioqrafiyasının əvvəli, vər. 235a

**Vər. 505**

## Ü Ç Ü N C Ü  H İ S S Ə

## KİTABIN XATİMƏSİ

**Qarabağın vəfat etmiş və həyatda olan şairərinin öz adlarına müvafiq həcv, satira və sairədən ibarət pərakəndə şeirlərinin təqdim edilməsi. Rəcəb ayı, 1309-cu il (fevral, 1892).**

**Bu rübaini Katib Mirzə Məhəmməd Xarrat Qulu Yusifiyə yazmışdır:**

Ey Pərnazzadənin oğlu!
Qorxuram axırda səndən bir xeyir çıxmasın.
İmam Əlini sən necə tərif edə bilərsən ki,
Sən ki, indi öz atanın yerində oturmusan?

**YUSİFİN KATİBƏ cavabı:**

Bəli, Pərnazzadənin oğluyam,
Dünyada sənin kimi atasız deyiləm.
Əgər atanın qəbrindən nişan istəyirsənsə,
Onun baş daşı mənim….dir.

**CƏFƏRQULU xan buyurmuş:**

Saqiya, məclisara, çay gətir.

**NÖVRƏS demişdir:**

Mütriba, çəngü neyü nay gətir.

**Abdulla bəy Asinin babası həllac olduğu üçün demişdir:**

Mən ki, şair deyiləm dünyadə,
Mənə bir toxmaq ilə yay gətir.

**Xoy əhlindən Molla Əhməd adlı bir həkkak var idi. Şuşa şəhərinin zərif, zarafatcıl adamları onunla şuxluq edərdilər. (Molla) bir gün Yusifi Xarrat Qulunun dükanına gəlir. Orada dörd nəfər şair var idi. Mollaya xitab edib deyirlər.**

**Talib bəy dedi:**

Ey elmsiz, əmmaməli axund,
Bizim bu söhbətimizdən heç təşvişə düşmə.

**Yusifi dedi:**

Ağzının dövrəsindəki bığ-saqqalın,
Zibilxananın qapısını möhkəm edib.

**Salar Mirzə Hüseyn dedi:**

Məndən incimə, əgər bığına.... çəksəm.

**Molla Əhməd hər üçünə tərif dedi:**

Zəmanə çaqqalları toplaşıb,
Başlarını dalıma yerləşdiriblər.

**Rövzəxan Molla İsmayıl bəy təzə əmmamə qoyduğu vaxt Cəfərqulu xan Cavanşir buyurmuşdur:**

**Mərhum Cəfərqulu xan:**

Axund, sənə nə sayaq xoşdur?
Əmmamə və ya papaq xoşdur?
Başa sarınan əmmamələrdən,
Yaşıl, ya sarı, ya ağ xoşdur?

**Molla İsmayıl deyib:**

Çay yox, çörək yox bu dudmanda,
Bir naxışlı boş otaq xoşdur.
Gər cür'ətim olsa, xan, deyərdim,
Bir xəlvət otaq, uşaq xoşdur.

**Mir Möhsün Nəvvabın oğlu Mir İbrahimin on üç yaşı var idi və bir gün mənim mənzilimdə Mirzə Məhəmməd Katib əyləşdiyi vaxt bu Miriş daxil olub Katibə salam verdi:**

**Miriş:**

Katib əmi, sənə salam eylərəm,
İzzətini böylə tamam eylərəm.

**Katib dedi:**

Kəsərəm mən o solaxay əlini,
Bu yazmağı sənə haram eylərəm.

**Miriş:**

İki bölləm başının kasasını,
Yarısını tasi-hamam eylərəm.

Aşiqi-sadiq, o biri yarısın,
Məşuqənin bəzminə cam eylərəm.

**Katib:**

Qulaqların biçaq ilə kəsərəm,
Şairliyi sənə tamam eylərəm.
Katib uşaq deyil, sənə qoşula,
Yoxsa səni yolux-hümam eylərəm.

**Miriş:**

Çıxardaram məşuqəni əlindən,
Əlin dutub, bağa xüram eylərəm.
Ənqa kimi Miriş qanad açanda,
Şahin Katib, səni himam eylərəm.

**Mirzə Ələsgər Növrəs cümə günü axşam öz evlərinə gəlib görür ki, bozbaş asıblar. O zaman bu fərdi söyləyir:**

Cümə (günü) axşamı hər evdən aş ətri gəlir,
Ancaq bizim evdən bozbaş ətri gəlir.

**Sənəti xarrat olan ustad Qulu Yusifi bir gün Talıb bəy Zeynalabdin bəy oğlunun hakim olduğu vaxt onun yanına gedib, bu fərdi Talıb bəyə yazır. Talıb bəyin xoşuna gəlir və xarrat Yusifiyə bir at bağışlayır.**

**Yusifi:**

Əgər ki, at-eşşəkdə məşhuram,
Ancaq hər ikisindən xəbərsizəm.

**Bir gün şairlər bizim "Fəramuşan"da toplaşmışdılar. Məşədi Əyyub Baki və Mirzə Əli Aşiq bir fərd üçün uzun-uzadı mükalimə etdilər. O dedi, mən dedim, bu dedi, mən dedim. Axırda sözü o yerə qoyduq ki, hər kəs bədahətən bir fərd yazsın, hansı yaxşı alınsa və həmin fərdə oxşasa, bilərik ki, onundur, o fərd budur:**

Xurşidə səcdə eyləmək, ey dil, savabdır,
Torpağa düş ki, yarın adı Aftabdır.

**Hər biri bir fərd yazdı. Bakinin yazdığı şeirin məzmunu oxşadı. Sonra Baki qələmi alıb bədahətən bu beyti yazdı:**

Aşiq qoyan təxəllüsünü bu cənabdır,
Yüz şivə ilə yazdığı hədyan cavabdır.

**Aşiq də bu fərdi yazdı:**

Hədyanı yazmağı bacarar şairani-dəhr,
Dərhəm olan bu Baki püriztirabdır.

**Mirzə Əbdül Şahinin özündən belə eşitmişəm ki, "cavanlığımın cəhalət vaxtında Əli Əkbər adlı bir nəfər ilə dostluq edirdim. Bir gün öz yoldaşlarımı gəzmək məqsədilə şəhərdən kənarda olan çaya yola saldım. Özüm şəhərdə qalmışdım ki, dostumu da götürüb yoldaşların dalınca gedim. Nə qədər axtardımsa, ondan bir əsər tapmadım. Axır taqətim tükəndi, əliboş, yoldaşlara tərəf yola düzəldim. Amma hirsdən yolda öz-özümü məzəmmət edirdim, cəfəng sözlər deyirdim. O cümlədən öz könlümə xitab ilə Azərbaycan dilində bir neçə fərd dedim:**

Könlüm, sənə yüz yol demədim mən köpək oğlu?
Məf'ullara bağlama bel sən köpək oğlu.

Düzləri gəzib tapmayıban enişi endik,
Gözünü keçib, yoxuşa diklən, köpək oğlu.

Zülfi-siyəhin tuğ qılıb boynuna salma,
Bir də onu görəndə küçüklən, köpək oğlu?

Nə onda vəfa, məndə həya, səndə nə qeyrət,
Sən məndənü mən ondan, o səndən köpək oğlu.

Zülf içrə səni eylədi bir tari müqəyyəd,
Derdin məni bəs saxlamaz ölkən, köpək oğlu.

Şahin, dənini özgə dəyirmanda üyüt, keç,
Tikdirmə dəyirman, demə ay dən, köpək oğlu.

**Bir gün çoxlu camaat olan xüsusi bir məclisdə Nəvvab Mir Möhsün, Məhəmməd ağa və Mirzə Ələsgər Növrəs həmsüfrə idilər. Nəvvab yeməyə əl vurmadı, Məhəmməd ağa əllərini yusa da, yemədi. Nəvvab üzünü Növrəsə tutub dedi: "Əgər bir fərd deyə bilsən ki, orada həm sənin yeməyin, həm Məhəmməd ağanın əllərini yuyub ancaq yeməməsi olsun, sənə bir abbası verərəm, əgər mən desəm, sən verərsən".**

**Növrəs dedi: "İndi mənim başım yeməyə qarışıb, sən de. Nəvvab bədahətən bu fərdi dedi:**

**Nəvvab:**

Ağa əllərini yudu, ancaq yemədi,
Növrəs hamısını yeyib apardı.

**Növrəs Nəvvaba yazıb mürəkkəb xahiş edir:**

Zülfi-siyəhlərdən, sərkar Nəvvab,
Qaralıb ağ günüm, çəkərəm təəb,
Yazaram sərasər zülfi-zülməti,
Əta etsən əgər qədri mürəkkəb.

**Nəvvabın qarınqulu və halvaxor mollalar barədə Cəfərqulu xan Arifə yazdığı cavab:**

Ey əlsiz ayaqsız molla,
Ey ayağı başından uca olan,
Nə vaxta qədər dərbədər gəzəcəksən,
Halva yemək üçün.
Ey (başdan ayağa) mədə (olan) molla!

Ey girdə və uzun molla,
Qovurma yeyən soğan molla,
Boynundan asılsın hərislik zünnarı,
Dolma yemək üçün(dür).
Ey (başdan ayağa) mədə (olan) molla!

Elə ki,səba küləyi əsir,
Molla belə səslənir:
Ey mədədən ibarət olan mollanın övrəti,
Oyan, qulaq ver, ey dığa,
Halva yemək üçün.

Övrət qalxır dam üstünə,
Səslənir ki, ey xam insanlar,
Oyanın ki, məclis qurtardı,
Gəlir varlının, kasıbın səsi,
Halva yemək üçün.

Bu gecə nagəhan gördüm,
Xoş bir yuxuda halva-çörək.
Şipşirin və zəfəranlı,
Qadan mən alım yortkinan,
Halva yemək üçün.

Alıb rütubət canımı,
Soyuq qurudub qanımı,
Təbib deyib dərmanımı,
Saz etmişəm yorğanımı,
Halva yemək üçün.

**Vər. 516a**

## BƏZİ SƏBƏBLƏR ÜZÜNDƏN ŞEİRLƏRİ BU TƏZKİRƏYƏ DÜŞMƏYƏN ŞAİRLƏRİN ADLARI

**5 ramazan əl-mübarək, 1309-cu il – 3 aprel, 1892**

## BU TƏZKİRƏ YAZILAN VAXT HƏYATDA OLMAYAN QARABAĞ ŞAİRLƏRİNİN ADLARI

1.**Aşıq Əli Kəlibri Qarabaği** - Qarabağda sakin olub və mərhum Molla Pənah Vaqifin müasiri idi.

2.**Əli ağa** - Molla pənah Vaqifin böyük oğlu, mərhum İbrahim Xəlil xanın qardaşı Mehrəli bəyin oğlu Məhəmməd bəy, bu kitabın əvvəlində Vaqifin əhvalında deyildiyi kimi, onu atası ilə birlikdə qətl ediblər.

3.**Rafe'** təxəllüs — deyirlər ki, Qarabağ əhlindəndir, mənə ki, məlum olmadı.

4.**Sabit** təxəllüslü - onun da əhvalı aydınlaşmadı.

5.**Mirzə Sadiq** - Qarabağ əhalisindən olduğu məlumdur. Ancaq əhvalı və əsli-nəsəbi mənə aydın olmadı. Sonradan nəciblərdən biri mənə belə dedi ki, Mirzə Sadiq Mehmandarzadələrdəndir. Mən onu tanıdım. Uca boylu, 60 yaşlı bir şəxs idi. Pərakəndə şeirləri var.

6.**Əsəd bəy** - O da, Qarabağ əhalisindəndir. Ancaq nəsəbi və əhvalı məlum deyil. Sonradan — Bəhram bəy Fədayi dedi ki, mənim atamdır. Aşıq Pəri ilə şeirləşməsini birinci hissədə yazmışam.

7.**Mehd**i - Qarabağ əhalisindəndir, əhvalı məlum deyil.

8.**Baba bəy** — Qarabağın Cavanşir mahalının tanınmış şəxslərindəndir. Pərakəndə şeirləri var.

9.**Mustafa bəy Əsəd bəy oğlu** — Qarabağın Şuşa əhalisindəndir. Tanınmış bir şəxsdir, şəhər nəciblərindəndir. Şeir deyərdi, ancaq mənim əlimə bir şey düşmədi.

10.**Mirzə Bəybaba Tahirzadə** — Qarabağın Şuşa şəhərinin tanınmış şəxslərindəndir. Gözəl xətti var idi. Şeir də deyərdi. Əlimə keçdi, ölmüş şairlər sırasında yazmışam.

11.**Fərrux Məşədi Məsih oğlu Divanbəvi** - Qarabağın Şuşa əhalisindəndir. Deyilənə görə, mətin şeirləri var, ancaq mənim nəzərimə çatmayıb.

12.**Cəfərqulu** — Fərrux Məşədi Məsih oğlunun ən kiçik qardaşıdır. Pərakəndə şeirləri var idi.

13.**Fayiz** — Qarabağ əhlindən olub. Abdal kəndindəndir. (Azərbaycanca) pərakəndə şeirləri var.

14.**Mirzə Kərim Hacı Məhəmməd oğlu** - Qarabağın şəhər əhlindəndir. Pərakəndə şeirləri var idi.

**Vər. 522a**

## QAFQAZ ŞƏHƏRLƏRINDƏKI ŞAIRLƏRIN HƏYATDA OLUB-OLMAMALARINDAN ASILI OLMAYARAQ, ADLARI, TƏXƏLLÜSLƏRİ VƏ OLDUQLARI YERIN ADI

**Şəvval əl- mükərrəm, 1309-cu il – aprel, 1892**

**Ali dərəcəli seyidlərin ən kiçiyi olan mən – Mir Möhsün Nəvvab Qarabağ şairlərinin əhvalı və şeirlərini toplayandan sonra istədim ki, Qafqaz şəhərlərinin də şairlərinin əhvalı, nəsəbı və şeirlərini ələ keçirib toplayıb, bu təzkirəyə daxil edərək, zəmanə ariflərinin və dövran şairlərinin hüzuruna çatdırım. Lakin bəzi maneələr üzündən öz məqsədimə çatmadım.**

**Birincisi, ona görə ki, bəzi şairlərin təxəllüsü və adı məlum deyildi, başqalarının ad və ləqəbi məlum, əhvalı və nəsəbi aydın deyildi. Bir başqalarının isə ləqəbləri məlum oldu, şeirləri ələ keçmədi. Bəzilərinin də adı, ləqəbi, şeirləri, olduqları yer haqqındakı məlumatlar səhv çıxdı.**

**Ancaq onların məşhurlarından bəzilərini oxucuların hüzurunda aşağıdakı qaydada ərz və izhar edirik.**

### BİRİNCİ NÖVBƏDƏ ŞAMAXI ŞƏHƏRİNİN, YƏNİ, ŞİRVANIN BİLİK SAHİBLƏRİ:

1.**Allahi**, təxəllüsü **Arif.**

2.**Məsih Şirvani.**

3.**Mirzə Nəsrullah Hacı Əbdülqasım oğlu**, təxəllüsü **Bahar**, Şirvan əhalisindəndir.

4.**Nabi Əfəndi**, deyirlər ki, o da Şirvan əhalisindəndir.

5.**Ağa Bağır Şirvani.**

6.**Əhməd Şirvani.**

7.**Mirzə Baba Zülali Şirvani.**

8.**Seyid Əzim Şirvani, təxəllüsü Seyid.**

9.**Zöv'i Molla Mahmud,** sünni əhalisindəndir, şirvanlıdır.

10.**Zühuri- Molla Baba Şirvani.**

11.**Molla Əbdüləli Hacı Molla Nəcəf oğlu Şirvanlı** — Rövzəxan. İyirmi səkkiz yaşlı bir cavan idi. Sənəti rövzəxanlıq etmək idi və bəzən ticarət də edərdi. Pərakəndə şeirləri var idi. Bir tərcibənd yazmışdı, farsca, Allah-təalanın tövhidinə, çox gözəl idi.

12.**Əxtəri Şirvani.**

13.**Zəbih Şirvani.**

14.**Bixod, Molla ağa Şirvani.**

15.**Salik, Ağa Məhəmmədbağır Hacı Məhərrəm oğlu.**

16.**Sabit, Hacı Cabbar Hacı Səfərəli oğlu Şirvani.**

17.**Səfa Şirvani.**

18.**Raqib Şirvani** ki, adı **Məşədi Qafar Hacı Məhəmməd Səid oğludur**.

19.**Qabil, Kazım bəy Hüseyn bəy oğlu.**

20.**Mirzə Müşfiq Şirvani.**

21.**Molla Abbasəli Şirvani,** rövzəxandır, Növrəs onu həcv etmişdi, o da məzəli bir həcvlə cavab vermişdi.

Yuxarıda qeyd olunmuş şairlərin əksəriyyətinin şeirləri, qeyd olunduğu kimi, pərakəndə halda idi.

## GƏNCƏ ŞƏHƏRİ ŞAİRLƏRİNİN ADLARI

1. **Mirzə Mehdi, təxəllüsü Nacidir.** Deyirlər ki, həkim bir şəxs idi, təbiblik edərdi. Müəllimlik də edərdi. Ancaq şeirlərini mülahizə edib belə qərara gəldim ki, məlahətli və gözəldir. Farsca və türkcə (azərbaycanca) çoxlu həcvlər, satira və yumoru var idi. Belə ki, Asi, Növrəs və Yusifi Qarabağini həcv etmişdi. Onlar da ona çoxlu həcv yazmışdılar, hamısını oxumuşam. Rüsvayçılıq etmişdilər. Bir dəftərdə gördüm, min beytə qədər şeir olardı. Deyirlər ki, Naci İran əhalisindəndir. Gəncədə yaşayır. Başqalarının fikrinə görə, Gəncə əhalisindəndir. Aydınlaşdıra bilmədim.
2. **Mirzə Şəfi Gənceyi, Vazeh təxəllüslü.**
3. **İbrahim bəy Pürpələng**, deyirlər ki, Gəncə əhlindəndir, pərakəndə şeirləri var idi.
4. **Əliqulu ağa Ziyadxanzadə**, Gəncə əhalisinin nəciblərindəndir, pərakəndə şeirləri var idi, oxudum.
5. **Şeyx Gənceyi və**
6. **Şeyxzadə Gənceyi,** pərakəndə şeirləri var.
7. **Molla Zal, Gənceyi** kimi tanınır, pərakəndə şeirləri var idi.
8. **Mirzə Məhəmməd Həsən.**
9. **Miskin təxəllüs.**

Bunların hər ikisi gəncəli kimi tanınır. Pərakəndə şeirləri var idi, oxumuşam.

10. **Mustafa bəy, Nasir** təxəllüslü, Qazaxın Gəncəyə tabe olan Şəmsəddin əhalisindəndir.
11. **Sabit Əfəndi,** Qazağın Şəmsəddin əhalisindəndir.
12. R**əncurə** təxəllüs də Qazax əhalisindəndir, şeir deyən bir qadındır.

## İRƏVAN ŞƏHƏRİ ŞAİRLƏRİNİN ADLARI

1. **Əsir İrəvani**
2. **Xəstə İrəvani**
3. **Miğ İrəvani**
4. **Əli İrəvani,** pərakəndə şeirləri var ıdı, oxudum.
5. **Lə'li İrəvani**
6. **Nizari İrəvani**

## ORDUBAD ŞƏHƏRİ ŞAİRLƏRİNİN ADLARI

1. **Hacı Mirzə Rəhim Ordubadi**, təxəllüsü **Qüdsi**. Pərakəndə şeirləri var idi, oxudum.
2. **Fəqir Ordubadi**
3. **Sidqi Ordubadi**

## DƏRBƏND ŞƏHƏRİ ŞAİRLƏRİNİN ADLARI

1. **Fayiz Dərbəndi, Molla Əhməd**, sənəti rövzəxanlıqdır, çoxlu şeirləri var idi, mərsiyə, növhəcat, qəzəllər və s. oxudum. Bir neçə il əvvəl Qarabağa gəlmişdi. Altmışa yaxın yaşı var idi. Uca boylu, zəif bədənli, çox zarafatcıl və məzəli bir kişi idi.
2. **Qumri, Mirzə Məhəmməd Tağı**, Dərbənd əhalisindəndir. Cənab Seyyid əş-şühəda əleyh əs-salamın müsibətindən yazdığı kitabı məşhurdur.
3. **Bülbül** təxəllüslü, Dərbənd şəhəri əhalisindəndir. Pərakəndə şeirləri var idi.

## BADİKUBƏ ŞAİRLƏRİ

1. **Səməndə**r təxəllüslü, Badikubə əhalisindəndir. Pərakəndə şeirləri var idi, oxudum.*
2. **Abbasqulu ağa**, **Qüdsi** təxəllüs. Keçmiş zamanlarda dövrünün ən arif adamlarından idi. Farsca, ərəbcə, rusca savadı var idi. Rəğbətli şeirləri var. O mərhumun əsərlərindən farsca yazılmış müxtəsər bir qrammatika kitabını görmüşəm.

## QUBA ŞAİRLƏRİ

**Mirzə Məhəmmədəli Molla Qasım oğlu, Qubalı, təxəllüsü Xürrəmi.**

## LAHIC ŞAİRLƏRİ

**Haci Qulamrza Hacı Məhəmməd Əli oğlu Lahic, Təxəllüsü Xadim.**

## LƏNKƏRAN ŞAİRLƏRİ

**Mirzə Əli Kərbəlayi Fətulla oğlu Lənkərani.** Təxəllüsü **Safi.** Deyilənə görə, 35 yaşlı cavandır, ərəb və farsca savadı var. Ərzi-əqdəsdə tələbələrə dərs deyir.

* Mirzə Səməndər Dərbənd şairlərindəndir. Sonralar Bakıda yaşamışdır. Ona görə də, Nəvvab onu bakılı hesab etmişdir.

Şeir də söyləyir. 1309-cu ildə (1891-92) Qarabağa təşrif gətirmişdi. Bir neçə gün Aşağı məsciddə vaizlik etdi. Doğrudan da, əvəzsiz bir alim idi. Mən mübahisə məclislərinin əksəriyyətində iştirak etdim, çox elmlərdə onu mahir və bilikli gördüm. Mənimlə də dostlaşmışdı. Onun üçün bir dəst üçlük üstürlab satdım, öz əsərlərimdən bir cild "Musiqi risaləsi" və bir cild "Kitabi-Şəmsül-hidayə"ni ona bağışladım.

## QAFQAZ ƏHALİSİNDƏN TANIMADIĞIM ŞAİRLƏRİN ADLARI:

1. **Rafe'**
2. **Fazil xan**
3. **Molla Haşım,** təxəllüsü **Məddah.** Şeirlərindən bəzisini oxumuşam, cəfəngiyyat idi. Bunlar bir yana qalsın, şeirlərinin məzmun və ibarələrindən onun əqidəsini də anlaya bilmədim.
4. **Məhəmməd Hüseyn xan**

## ADLAR GÖSTƏRİCİSİ

### Şəxs adları

**Təxəllüslər**

**Coğrafi adlar**

**Əsər və kitab adları**

**Ədəbi məclislər**



* Təzkirədə bu məclisin adı həm də "Fəramuşan", "Fəramuşxanə", "Əhli-Xamuşan" və "Xamuşan" kimi təqdim olunmuşdur.
** Təzkirədə bu məclisin adı həm də "Məhfəli-Üns" kimi təqdim olunmuşdur.

## MÜNDƏRİCAT

